*Bu kitab "Qazi Bürhanəddin. Divan" (Bakı, Azərnəşr, 1988) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*


Tərtib edəni: **Əlyar Səfərli**

Redaktoru: **Samət Əlizadə**

**894.3611 - dc 21**
**AZE**
**Qazi Bürhanəddin. Divan.** Bakı, "Öndər nəşriyyat", 2005, 728 səh.


Azərbaycan anadilli şerinin böyük nümayəndəsi, XIV yüzillikdə yaşamış qüdrətli şair Qazi Bürhanəddinin "Divan"ı doğma dilimizdə yazılan və günümüzə qədər gəlib çatan ilk şeir divanıdır. Qazi Bürhanəddin Azərbaycan divan ədəbiyyatının özülünü qoymuş, klassik poeziyanın ilkin gözəl nümunələrini yaratmışdır.

Böyük bir tarixi vəzifəni şərəflə yerinə yetirən şairin yaradıcılığı Həsənoğludan sonra, İmadəddin Nəsimidən əvvəl mədəniyyət tariximizdə yeni bir olamətdar hadisə sayıla bilər. Qazi Bürhanəddin poeziyasının baş mövzusu sevgi və gözəllikdir. Bu poeziyada igidlik, bahadırlıq, alp-ərənlik motivləri də çox qabarıqdır.

Anadilli ədəbiyyatımızın ilk gülüstanı olan Qazi Bürhanəddin divanı xalqımızın bədii zövqünün, gözəllik və nikbinlik dünyabaxışının bəhrəsi kimi təravətli və cazibədardır.


**ISBN 9952-416-73-2**




Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ÖN SÖZ

Azərbaycan anadilli şerinin ilk böyük nümayəndəsi Qazi Bürhanəddin Əhmədddir. XIV yüzillikdə yazıb-yaratmış şair dilimizi şeir, sənət dili kimi yeni bir zirvəyə yüksəltmişdir. Böyük bir tarixi vəzifəni şərəflə yerinə yetirən Qazi Bürhanəddin Azərbaycan divan ədəbiyyatının özülünü qoymuş, klassik poeziyanın ilkin gözəl nümunələrini yaratmışdır. Onun yaradıcılığı Həsənoğludan sonra, İmadəddin Nəsimidən qabaq mədəniyyət tariximizdə yeni bir əlamətdar hadisə sayıla bilər.

Qazi Bürhanəddin 1344-cü ildə Qeysəriyyədə anadan olmuşdur. O, soyca Oğuzların Salur boyundan çıxmışdır. Bir ehtimala görə, ulu babası Xarəzmdən köçüb gəlmişdir. Onun özü də bir qəzəlində Xarəzmi belə yada salır:

Bənə Xərəzm oldu nəğmən ilə,
Düşəli yaduma Xərəzm hər dəm.

Şairin adı Əhməd, ləqəbi Əbülabbas və təxəllüsü Qazi Bürhanəddindir. O, bir yerdə öz adını belə çəkir.

Hüsnünün eşqi nicə Leyliyi Məcnun eylədi,
Bəs nə əcəb k'ola gər bir Əhmədi Səlman edər.

Qazi Bürhanəddinin ata-babası nəsillikcə qazilik etmişdir. Onlardan Cəlaləddin Həbib, Hüsaməddin Hüseyn, Siracəddin Süleyman Qeysəriyyə qazisi kimi ad qazanmışdılar. Şairin babası Siracəddin Süleyman Ərtənə bəyliyinin qurucusu Ələddin Ərtənənin sarayında yaşamış, bəyliyin siyasi həyatında ayrıca xidmət göstərmişdir. Atası Şəmsəddin Məhəmməd də zəmanəsinin tanınmış bir qazisi sayılırdı. Anası isə Səlcuqlar dövrünün böyük simalarından Cəlaləddin Mahmud Mustafanın oğlu Abdulla Çələbinin qızıdır.

Kiçik yaşlarından anasını itirən Qazi Bürhanəddin atasının himayəsində yaşamışdır. 1356-cı ildə ölkədə qarmaqarışıqlıq baş verdiyinə görə o, atası ilə Şama gedir, ancaq çox çəkmir ki, yenidən Qeysəriyyəyə qayıdır. Atası sarayın qazisi kimi fəaliyyətə başlayır.

Şərəfli bir ailədən çıxan Qazi Bürhanəddin uşaqlıqdan mükəmməl təlim-tərbiyə almış, zəmanəsinin əsas elmlərini kamil şəkildə öyrənmişdir. O, xüsusilə ox atmaqda, qılınc oynatmaqda, at minməkdə və şahmatda məharət göstərmişdir.

1358-ci ildə Qazi Bürhanəddin atası ilə Misirə gedərək təhsilini davam etdirmiş, fiqh, tibb və s. elmləri öyrənməyə çalışmışdır. Sonra isə məşhur alim Qütbəddin Razidən dərs almaq üçün Şama getmiş, təbiət, ilahiyyat və



riyaziyyat elmlərini oxumuşdur. Qazi Bürhanəddin bu illəri yada salaraq bir şerində yazırdı:

Görmədi gözüm xali kibi dünyadə şamə,
Gördüm Misiri buncavü vardum neçə Şamə.

Şair on doqquz yaşında Məkkədə yaşamış, atasının ölümündən sonra isə Hələb şəhərinə getmişdir. 1365-ci ildə Qeysəriyyəyə qayıdaraq Ərtənə oğullarından Məhəmmədin qızı ilə evlənmiş və çox çəkmədən qazilik mənsəbinə yüksəlmişdir. On ildən artıq bu vəzifədə çalışaraq bir sıra tədbirlər həyata keçirmişdir. Ərtənə hökmdarı Məhəmməd bəyin ölümündən sonra hakimiyyətə keçən oğlu Əli bəy kiçik olduğundan bütün dövlət işlərini Qazi Bürhanəddin aparmışdır. Bu illərdə ölkədə ən böyük hadisə türkmən-moğol və qaramanlıların hücum edərək Konya, Sivas şəhərlərini alması idi. O, bu döyüşlərdə xüsusi şücaət və igidliklər göstərdiyinə görə böyük şöhrət tapır və 1378-ci ildə vəzir rütbəsini qazanır. Qazi Bürhanəddin 1381-ci ildə bir hökmdar kimi taxta çıxaraq öz adı ilə adlanan dövlətin əsasını qoyur.

On yeddi il hakimiyyət sürən Qazi Bürhanəddinin həyatı mübarizə və çarpışmalarda keçmişdir. O, ölkədə nizam-intizam yaradaraq Qaraman, osmanlı və türkmən tayfalarını birləşdirməyə çalışmışdır. Mərkəzi hakimiyyətə tabe olmayan Qeysəriyyə hökmdarını məğlubiyyətə uğratmışdır. Şair divanında bu hadisəyə belə işarə edir:

Gözlərümüz yaşını axıdup irmağ edübən,
Qeysəriyi dəxü bu yaş ilə Bağdad edəlüm.

XIV yüzillikdə Əmir Teymurun təhlükəsi bütün Yaxın və Orta Şərq ölkələrini bürümüşdü. Qazi Bürhanəddin öz ölkəsini ondan qurtarmaq üçün tədbirlər hazırlayaraq Məmlük sultanı Bərquqla yaxınlaşır. O, bir şerində bu münasibətlə yazırdı:

Tolu sun bizə cami irür canuma kanı,
Yetür göklərə namı, qul et Rum ilə Şamı.

Teymura qarşı mübarizə aparmaq üçün Şama gələn Bərquq burada Qızıl Orda xanı Toxtamış ilə Osmanlı sultanı I Muradın elçilərini qəbul edib tədbir hazırlayırlar. Qazi Bürhanəddin özü ilə Məmlük sultanının birləşməsini belə mənalandırırdı:

Oldı müsəxxər bizə çü Şam ilə Rum,
Düşmənə dəmür bolduх, dostlara mum.

Nər kişilər yürisün yollarına,
Çün dosta mübarəküz, düşmənə şum.

Bu tuyuqda şair Şam deyəndə Məmlük hökmdarını, Rum deyəndə isə osmanlıları nəzərdə tuturdu. Teymuru isə öz düşməni sayır və ona qarşı dəmir kimi dayandığını bildirirdi.

Öz şeirlərində Qazi Bürhanəddin aldığı qala və şəhərləri də xatırladır, ayrı-ayrı döyüşlərinə işarələr edir. O, bir qəzəlində Amasiyada yerləşən Simali qalasını almasını belə xəbər verir:

Nola əgər fəth oldi isə bizə Simalu
Ki, görməmiş ola göz xubi işbu simalu.

1392-ci ildə Qazi Bürhanəddin Osmanlı sultanı Bayazid ilə Qəstəmonda Çorumlu səhrasında üz-üzə gələrək, onu məğlubiyyətə uğradır. Teymurdan da çəkinməməsi, qüvvətli bir düşmənlə cəsarətlə mübarizə aparması onun nə qədər yenilməz və igid bir insan olduğunu göstərirdi.

1394-cü ildə Qazi Bürhanəddin Əmir Teymura qarşı fəaliyyətə başlayaraq onun elçisini öldürtdürür, Məmlük sultanı Bərquq, Osmanlı hökmdarı I Bayazid və Qızıl Orda xanı Toxtamışla birləşərək öz ölkəsini xilas edə bilir. Şair-hökmdar bu münasibətlə kəskin ruhu ilə seçilən bir tuyuq yazmışdır:

Əzəldə haq nə yazılmış isə bolur,
Göz nəni ki, görəcək isə görür.
İki aləmdə haqa sığınmışuz,
Toxtamış nə ola, ya Axsax Teymur.

Bu tuyuq göstərir ki, Qazi Bürhanəddinin Toxtamışdan da xoşu gəlməmiş, lakin ümumi düşmənə qarşı onunla birləşməli olmuşdur.

Qazi Bürhanəddin ömrünün sonuna qədər Qəramən, Amasiya, Ərzincan, Türkmən əmirliklərinə qarşı vuruşaraq onlara qalib gəlmişdir. 1388-ci ildə Amasiya əmirini məğlub edərək Turhal qalasını almışdır. Şair bir qəzəlində sevgilisinin süzgün baxışlarını Turhal qalasına atılan mancanaq daşlarına bənzədərək həmin döyüşə işarə edir:

Cövr oxları ki, qəmzən könül evinə atar,
Məncəniq taşlarıdır ki, yeni Turhaldurur.

Başqa bir qəzəlində o, Ərzincan səfərini yada salır:

Xaluna görəli canum əzmi-Hindistan edər,
Könlümi əcəbləmə gər qəsdi-Ərzincan edər.



Qazi Bürhanəddin 1398-ci ildə Ağqoyunlu bəylərindən olan Qara Yoluq Osman bəy ilə müharibədə öldürülmüşdür. Şairin qəbri Sivas şəhərindədir.

Qazi Bürhanəddin ağır və çarpışmalarla dolu bir həyat keçirmişdir. Orta əsrlərin tarixçiləri ona "Əbülfəth" (zəfər və qələbə sahibi) adı vermişlər. Onun saray tarixçisi Əziz ibn Ərdəşir hökmdarın bütün səfər və döyüşlərində yaxından iştirak etmiş, şairin həyatını, yürüş və döyüşlərini təfsilatı ilə qələmə almışdır. Tarixçi Qazi Bürhanəddini ağıllı, bilikli və ədalətli bir hökmdar kimi səciyyələndirmişdir. Çoxlu qala, körpü, mədrəsə binaları tikdirməsindən danışmış, qalib ordunun soyğunçuluq etməyə aman verməadiyini qeyd edərək onu işıqlı, uzaqgörən bir şəxsiyyət kimi qiymətləndirmişdir. Əziz ibn Ərdəşirin Q.Bürhanəddinin həyatını "bəzm və rəzm"də (eyş-işrət və savaşda) keçən bir həyat kimi mənalandırması da yersiz deyildir.

Qazi Bürhanəddinin ölümündən sonra onun yeganə oğlu Elməddin Əli Çələbi atasının yerinə hökmdar olmuş və atasının qatili Qara Yoluq Osmana qarşı mübarizə aparmışdır. Sonradan Bayazid Ağqoyunlu Qara Yoluq Osmanı məğlub edərək onun torpaqlarını öz dövləti ilə birləşdirmişdir. Beləliklə də, Qazi Bürhanəddin dövlətinə son qoyulmuş, Sivas, Toqat, Niksar və Qeysəriyyə şəhərləri Bayazidin əlinə keçmişdir.

Orta yüzilliklərin qaynaqlarında Qazi Bürhanəddin bir şair və hökmdar kimi yüksək qiymətləndirilir. Təzkirəçi və tarixçilərdən Taşköprüzadə (XVI əsr) "Şəqaiqün-nümaniyyə", Xoca Sadəddin (XVII əsr) "Tacüt-təvarix", Katib Çələbi (XVII əsr) "Kəşfüzzünun" əsərində Qazi Bürhanəddindən ancaq bir şair kimi bəhs açırlar.

İstedadlı bir şair olan Qazi Bürhanəddinin şeirləri sevilmiş, ürəklərə yol tapmış, əsrlərin qaranlıqlarından keçərək günümüzə qədər gəlib çatmışdır. XIX yüzillikdən başlamış bir sıra dillərə çevrilmiş, haqqında dəyərli məqalə və yazılar meydana gəlmişdir. 1895-ci ildə rus şərqşünası P.Melioranski "Vostoçnıye zametki" jurnalında "Qazi Bürhanəddin Sivaslının divanından parçalar" məqaləsində onun divanından məhəbbətlə danışmış, 12 tuyuq, 20 rübaisini rus dilinə tərcümə etmişdir.

Amerika lisan məktəbi müdiri F.Qodsel 1922-ci ildə yazdığı "Qazi Bürhanəddin tuyuqları" adlı məqaləsində Azərbaycan şairini tuyuq ustadı kimi təqdim etmişdir. Cənab Şəhabəddin bu əsərə yazdığı girişdə şairin həyatını, dövrünü və yaradıcılıq yolunu tədqiq etməyə çalışmış, yeni nəticələrə gəlmişdir.

Məşhur ingilis şərqşünas alimi Gibb 1900-cü ildə yazdığı "Osmanlı ədəbiyyatı tarixi" əsərində ilk dəfə olaraq Avropa oxucularını Qazi Bürhanəddin sənəti ilə tanış etmişdir. O, şairin əsərlərindəki lirizm və təbiiliyi əsas məziyyət kimi göstərir, şeirlərindən nümunələr gətirir.

Türk ədəbiyyatşünaslığında Qazi Bürhanəddin poeziyasının tədqiq və nəşri XX əsrin əvvəllərindən başlamışdır. F.Köprülü ilə Şəhabəddin Süleyman

"Yeni Osmanlı tarixi ədəbiyyatı" kitabında şairin həyat yolunu işıqlandırmaqla yanaşı, mənzumələrində "bəşəriyyət qoxusu" olduğunu bildirmiş və divandan nümunələr nəşr etdirmişlər.

Amerika alimi prof. L.Levon 1922-ci ildə Qazi Bürhanəddinin dörd qəzəlini, tuyuq və rübailəri ilə birlikdə ingilis dilinə tərcümə edib çapdan buraxmışdır. O, şairi öz zəmanəsinin qılınc və qələm sahibi kimi yüksək tutaraq yazırdı: "Əsrinin bütün görkəmli adamları kimi Q.Bürhanəddin də qılınc və qələm sənətini mükəmməl öyrənmişdi. Bir tərəfdən minicilik idmanı üçün at üstündə gəzir, bir tərəfdə xətti-siyaqat təmrini ilə məşğul olurdu və mizraq oyunlarından yorulduqca türk, ərəb, əcəm şeirlərinin mütaliəsinə başlayırdı. Mümtaz qazi, mümtaz vəzir, alim və şücaətli hökmdar, həqiqi igid və şair oldu. Əşarı məsti-şərab və məsti-məhəbbət ilə tərənnüm edilmiş ilhamati-qəlbdir... Zira, son təhlildə Qazi Bürhanəddin bir eşq şairidir, gah Füzuli kimi yanıq, gah Nədim qədər şux, gah Alfred de Mussetdən daha səmimidir".

F.Köprülü 1922-ci ildə "Dərgah məcmuəsi"ndə Qazi Bürhanəddin barəsində ayrıca bir məqalə yazmış, onun dini mövzuda deyil, dünyəvi mövzularda qəzəllər yazmasını təqdir etmişdir. 1924-cü ildə "Divani-Füzuli"yə yazdığı ön sözdə isə Qazi Bürhanəddin şerinin dil-üslub və ideya-fikir xüsusiyyətlərini belə işıqlandırır: "Əsərlərində şəklin və lisanın ibtidailiyinə və rəkakətinə rəğmən səmimi və çox canlı xüsusi bir əda vardır. Dünyanın faniliyini eşq ərləri nəzərində iki cahanın bir kasə hökmündə olduğunu, məşuq və aşiqin vəhdətini tərənnüm etmək surəti ilə bir az İran mütəsəvvüflərinin təsiratını göstərən bu şairin mənzumələrində hər günkü həyatdan alınmış səmimi milli məfhumlar da vardır ki, o qaba sətirlər altında kəndisinin cəngavər, cəsur ruhu görünür".

1926-cı ildə "Mənşəyindən onuncu hicrət əsrinə qədər türk ədəbiyyatı nümunələri" əsərinin girişində isə Qazi Bürhanəddin dünyəvi və səmimi şeirlər müəllifi kimi səciyyələndirilir. "Əlli altı sənəlik ömrü daimi bir cidal və bir mədd və cəzr olan Bürhanəddin, hissi həyatında da siyasi həyata qədər coşqun, hicranlı və atəşlidir. Şeirlərindəki lirizmin ən qüvvətli bir təcəllisini, onun hərarətli yazılarında görürük. Cəngavər ruhu, qüdrətli iradəsi və olqun mütəfəkkirəsinin gərgin bir tənbur teli kimi inləyən narın həssasiyyətiylə imtizası, Qazinin ədəbi şəxsiyyətini hüsulə gətirir".

Türk alimi Vəsfi Mahir Qocatürk isə Qazi Bürhanəddini Nəsimi və Nəvainin ustadı kimi təqdim edir. Nəsiminin öz sələfinin şeirlərinə nəzirə və cavablar yazdığını, onun şerinin bədii gözəlliklərindən öyrəndiyini ədəbi nümunələr əsasında aydınlaşdırmağa çalışır. O, belə nəticəyə gəlib çıxır ki, Nəsiminin nəzm dili Qazinin şeir dilinin təkamülüdür. Ədəbiyyatşünas Ə.Kabaklı "qəhrəmanlıq, eşq və təsəvvüfi atəşli bir ruhla ifadə edən sərdar şair" adlandırır, onun qəhrəmanlıq poeziyasını türk xalqlarının ədəbiyyatında milli bədii-poetik ənənələrin yeni bir təzahürü kimi mənalandırır.



Adlarını çəkdiyimiz araşdırıcılardan başqa Ə.N.Tərlan, S.Nüzhət, M.Ergin, H.Mazıoğlu, N.S.Banarlı, Ə.Alpaslan və başqaları da Qazi Bürhanəddinin şəxsiyyəti, yaradıcılığı, əsərlərinin ədəbi təsir dairəsinə dair dəyərli fikir və mülahizələr irəli sürmüşlər.

Qazi Bürhanəddinin divanının foto-faksimilesi 1943-cü ildə İstanbulda nəşr edilmişdir. 1980-ci ildə isə M.Ergin şairin divanını tam şəkildə çapdan buraxmışdır. Onun bu nəşri şairin ədəbi irsinin öyrənilməsi və nəşri tarixində yeni bir əlamətdar hadisə sayıla bilər. Burada bəzi söz və ifadələr dəqiq verilməsə də, şeirlərin mətni əsasən düzgün və etibarlıdır.

1977-ci ildə Ə.Alpaslan Qazi Bürhanəddinin yüz qəzəlini, yeddi rübai və səkkiz tuyuqunu seçmələr adı altında təqdim etmişdir. Onun əsərə yazdığı geniş ön söz və şeirlərin şərhləri dolğun və inandırıcıdır. Tədqiqatçı Qazi şerini yeni bir baxımdan incələmiş, rübai və tuyuqların bədii məntiqini, məna tutumu və dəyərini lazımi səviyyədə işıqlandıra bilmişdir.

Alimlərdən A.Krımski, M.Quluzadə, İ.Stebleva və başqalarının Qazi Bürhanəddinə həsr etdiyi məqalələr bu gün də öz elmi dəyərini saxlayır. Şairin divanından nümunələr ilk dəfə bu sətirlərin müəllifi tərəfindən 1976-cı ildə Bakıda nəşr edilmişdir. Ali məktəblər üçün yazılan "Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı" dərsliyində onun haqqında ayrıca oçerk verilmişdir.

Qazi Bürhanəddin poeziyası dünyəvi və bəşəri ədəbiyyatımızın kamil bir nümunəsidir. Onun yaradıcılığının baş mövzusu sevgi və gözəllikdir. Eşq və gözəllik nəğməkarı olan şair öz şeirlərində orta əsr insanının sevincini, məlahət və cazibədarlığını zövq ilə qələmə almış, onun könül sərbəstliyinə, mənəvi azadlığına tərəfdar çıxmışdır. Şadlıq, nikbinlik, dünya və həyata yüksək bir münasibətin ifadəsi, həyatın maddi və mənəvi gözəlliklərindən kam almağa çağırış Qazi Bürhanəddin şerinin əsas pafosunu təşkil edir. Sevgilinin işıqlı, könülaçan surətini yaradan sənətkar bir rəssam kimi onun zahiri görkəmini canlandırır və insani simasına görə də onu gözəl-göyçək görmək istəyirdi. Qazi Bürhanəddin gözəlin saçını, qaşını, üzünü, dodaqlarını, boyunu, belini vəsf edərək, insan gözəlliyini təbiət gözəlliyindən mənalı və cazibədar sayırdı.

Şairin lirik qəhrəmanı gerçək duyğu və düşüncələri ilə sevilir, rəğbət doğurur. Heç şübhəsiz ki, Qazi Bürhanəddinin poeziyasındakı bu nikbinliyin kökü onun dünyagörüşü, dünya və zaman münasibəti ilə bağlı idi. Daha doğrusu, nikbinlik – onun bədii idrak forması olub öz qidasını həyatdan alırdı. Qazi Bürhanəddinin ictimai aləmdəki uğurları onun nikbin duyğularına qol-qanad verirdi, onu insansevər, həyatsevər bir şair kimi ucaldır, kamala çatdırırdı. Dünyəvilik, gerçəklik, xəlqilik sənətkarın həm məfkurə tərzində, həm də bədii dil və üslubunda, deyim və duyum anlayışlarında aydın şəkildə özünü göstərirdi. Anadilli ədəbiyyatımızın ilk gülüstanı olan Qazi Bürhanəddin divanı xalqımızın bədii zövqünün, gözəllik və nikbinlik dünyabaxışının bəhrəsi kimi

təravətli və cazibədardır. "Onun şeirləri Azərbaycan xalqının bədii mədəniyyətinin inkişaf səviyyəsini, ideya və sənətkarlıq xüsusiyyətlərini öyrənmək cəhətindən qiymətlidir. Bürhanəddin yaradıcılığında xalq poeziyasının, ictimai dövrün təsiri aydın nəzərə çarpmaqdadır" (M.Quluzadə).

Qazi Bürhanəddin sənətin mayasını gözəllikdə axtarırdı. Şairə görə sevgilini vəsf etməyən söz-şeir adi bir küləkdir, ona şeir demək olmaz:

Ol göz ki, yüzün görməyə, göz demə ana,
Şol yüz ki, tozun silməyə, yüz demə ana.
Şol söz ki, içində, sənəma, vəsfün yox,
Sən badi-həva tut anı, söz demə ana.

Qazi Bürhanəddinin sevgi duyğusu və eşq anlayışı yaşanılmış hisslərin ifadəsidir, təbii, səmimi və cəlbedicidir. Şairə görə yanmış könülləri səsləndirən, həyata qaytaran, ağladan-sızladan eşqdir. Sevən ilə sevilənin varlığı ali, yüksək bir məhəbbətlə bağlıdır. Göylər, yerlər yenilməz bir eşqin təntənəsindən ibarətdir, eşq səfa və şəfa mənbəyidir. Hər zərrədə eşq olduğundan yaradan sevgili kimi gözəl və ünyetməzdir, kainat isə onun vurğunudur.

Şair eşq fəlsəfəsini gerçək məqamlarda da üzə çıxarır, insani məhəbbəti təbliğ edir. Onun şeirlərində aşiqin mənəvi-cismani sağlamlığı sevgidən asılıdır: sevgi ürəkdə qanı suya, göz yaşını qana, üzün gümüşü rəngini qızıla döndərir. Ürək kiçik, eşq dənizi isə oddur, buna görə də vəfalı, istəkli aşiqin qəlbi bu oda, hərarətə dözə bilmir, daima alışıb-yanır. Sevgilisindən etibar, sədaqət uman aşiq sevdiyi gözəli vəfasız dünyada vəfalı olmağa, az ömründən mənalı istifadə etməyə səsləyir:

Gəl, gəl ki, səndən özgə bu dərdün şəfası yox,
Dərdüm dəxi yoğ isə bu eyşün səfası yox.
Bu az ömürdə qılma bizə hicr ilə cəfa
Qılğıl vəfa ki, işbu cəhanun vəfası yox.

İnsan gözəlliyinin vurğunu olan Qazi Bürhanəddin sevgilisinin dirilik suyuna bənzər dodaqlarını, inci dişlərini, sərv boyunu, gül bədənini, nərgiz gözlərini, qara tellərini, ay üzünü, ağ güllərə oxşar sinəsini özünəməxsus bir təravət və ehtirasla vəsf edir:

Ləbi-lə'lünü sənün can dedilər gerçəkmi,
Xəti-nəsxüni ki, reyhan dedilər gerçəkmi?
Ləbün andum idi, toldı ağızum şəkkər ilə,
Kimə dedim isə yalan dedilər gerçəkmi?



Totağun şəkərinün rəngini qızıl gördüm,
Çünki sordum anı qandan dedilər gerçəkmi?..
Tazə güldən dəxi nazük görürəm tər tənüni,
Bağruni qatı çü sindan dedilər gerçəkmi?

Sevgilinin dodaqları cana (ruha) bənzəyir. Gözəlin ağzı görünməz dərəcə kiçik və can kimi gözə görünməzdir. Aşiq sevdiyi yarının dodaqlarını ananda belə ağzı şəkərlə dolur, ancaq kimə deyirsə, inanan tapılmır. Üçüncü beytdə şair bədii tənasüb (bədii mütənasiblik) və hüsni-tə'lildən (səbəbin gözəlliyi) istifadə edərək gözəlin al dodaqlarından söz açır. Son beytdə "bədəni gül kimi zərif olan yarın ürəyi sindan kimi qatıdır" – deyərək bədii mübaliğə işlədir.

İgidlik, bahadırlıq motivləri Qazi Bürhanəddinin poeziyasında çox qabarıqdır. Həyatı döyüş və qəhrəmanlıqda keçib gedən şair ərləri, igidləri döyüş meydanlarına çağırır, haqq-ədalət uğrunda vuruşlara səsləyir, döşəkdə ölən igidi murdar sayır:

Özünü əş-şeyx görən sərdar bolur,
Ənəlhəq də'vi qılan bərdar bolur,
Ər oldur haq yoluna baş oynaya,
Döşəkdə ölən yigit murdar bolur.

Şairin fikrincə, onun yaşadığı dövran qoçlar dövranıdır. "Gün batardan gün doğana dəkin" eşq ərləri döyüş meydanlarında savaşıb-vuruşur, seyran edir, çarpışırlar. Qazi Bürhanəddin düşmənləri ilə qoç kimi döyüşən belə ərənləri, igidləri alqışlayır, onların şərəfinə söz qoşur:

Ərənlər düşmənləri avlaşurlar,
Qəmzələr bir-birini qovlaşurlar.
Bən qulıyam dünyada ol nərlərün
Ki, bu dəm meydanumda kükrəşürlər.

Meydana atılıb, yağı eli ilə çarpışan, düşmənləri ilə aslan və qaplan kimi vuruşan ər igidlər Qazi Bürhanəddinin sevdiyi qəhrəmanlardır. O, mərdliyi, yenilməzliyi, "əranə və şiranə" təbiəti sevib bəyənir:

Ərənlərün hər işi əranədür,
Qaplanlar tutduğu il şiranədür.

Qazi Bürhanəddin yemək-içmək, yaxşılıq günü yar olan, ancaq ər günündə dönənləri naməd sayır, igiddə səmimiyyət və düzlüyü ən gözəl keyfiyyət hesab edir:

Yar oldur ki, yar ilə həmdərd ola,
Yarından yüz qaytaran yar sərd ola.
Yemək-içmək, yaxşılıx günin görən,
Ər günində gər dönə namərd ola.

Şairə görə özünü ər, ərən sayan kişinin yeri meydandır, "erkək kişi" nər kimi döyüşə atılmalı, çətinliklərdən qorxmamalıdır:

Ərənlər öz yolunda ər tək gərək,
Meydanda ərkək kişi nər tək gərək.
Yaxşı-yaman, qatı-yumşax olsa xoş,
Sərvərəm deyən kişi ərkək gərək.

"Var canum yigitlərə qurban olsun" – deyən Qazi Bürhanəddin öz döyüşçülərini sanki döyüşə aparır, yağını alaca ördəkləri ovlayan şahin kimi ovlayan, ər günündə başından keçən, düşmənə aman verməyən qeyrətli, qorxmaz, cəsur qəhrəmanları göylərə ucaldır, sevdirir, bütün dünyaya örnək göstərir.

Qazi Bürhanəddinin qəhrəmanlıq şərqiləri əski dastan-epos ənənələrimizdən, bahadırlıq nəğmələrimizdən, o cümlədən də "Dədə Qorqud" boylarından güc alır. Minillik Azərbaycan ədəbiyyatı tarixində onun kimi ər, ərən, igid, şir, aslan, qaplan, qılınc, qalxan, qoç, qağan və s. döyüş söz və istilahlarını işlədən və igidlik əhval-ruhiyyəsini dönmədən təbliğ edən ikinci bir şairə rast gəlmək çətindir. Bədii yaradıcılığı ictimai-siyasi amal və məsləkinə xidmət edən şairin döyüş şərqilərinə bu qədər əhəmiyyət verməsi qanunauyğun idi, zəmanənin öz tələblərindən doğurdu. XIV yüzillikdə Azərbaycanda qəhrəmanlıq poeziyası sevilir, təqdir olunurdu, bahadırlıq mövzuları ədəbiyyatda yeni bir vüsət qazanmışdı.

Ayrı-ayrı igid ərləri, qoç və qaplan ərənləri sevib öyən Qazi Bürhanəddin son tuyuqunda qoşunların, yeniçərilərin döyüş lövhəsi ilə divanını tamamlayır:

Qoşunlar bir-birinə qaxşaşmaşda,
İki aləm çərisi çaxşaşmaşda.
Topumuz bolmısar xalqa ümid,
Bu cahan xalqı işi oxşaşmaşda.

Qazi Bürhanəddin divanı qəzəl, rübai, tuyuq və müfrəd-tək misra kimi klassik şeir şəkillərindən ibarətdir. Bu poetik şəkillərə özünəməxsus məna verən şair onlarda gözəlliyi, sevgilinin vəsf və tərənnümünü baş mövzu sayırdı:



Bən səni sevərəm, sevisərəm,
Bu sözü türkcə qoyux deyəlüm.
Vəsfüni gəh qəsidə, gəh qəzəl,
Gəh rübaivü gəh tuyux deyəlüm.

Milli bədii-poetik ənənələrdən faydalanan Qazi Bürhanəddin ana dilində ilk dəfə olaraq tuyuq şəklində şeirlər yazmışdır. Bəllidir ki, türk xalqlarının qədimdən şeir vahidi dördlük sayılırdı. Şifahi və yazılı ədəbiyyatda rəngarəng dördlüklərin yayılması da təsadüfi deyildir. Bütün bunlara baxmayaraq, dördlük formaları bir-birindən öz şəkli-poetik xüsusiyyətlərinə görə seçilir. Tuyuq rübai və manilər kimi qafiyələnsə də, öz xüsusi bəhri ilə başqa dördlüklərdən ayrılır. Tuyuqlar bir qayda olaraq rəməlin fAilAtün fAilAtün fAilAt ölçüsündə yazılır. Böyük özbək şairi Əlişir Nəvai tuyuğu iki beytdən ibarət cinaslı şeir biçimi adlandırırdı. Tuyuq sözünün özü də əski poetika kitablarında imali və cinaslı söz mənasında işlənmişdir. Bəzi ədəbiyyatşünaslar tuyuq istilahını duymaq və toy sözləri ilə də əlaqələndirirlər.

Azərbaycan ədəbiyyatında tuyuq janrının banisi Qazi Bürhanəddin və Nəsimidir. Ancaq hər iki şairdə həm cinaslı, həm də cinassız tuyuqlar vardır. Qazi Bürhanəddinin cinaslı qafiyələri olan tuyuqları əski biçimi ilə səciyyəvidir. Belə tuyuqlardan birində o, Bağdad şəhərinin müharibələrdə dağılması və yenidən qurulmasını əks etdirərək tuyuğun klassik bir nümunəsini yaradır:

Şol quş ki, tutğan quşnı azad qılur,
Sanma ki, dünyada ol az ad qılur.
Bağdadı kim viran qıla bilür,
Ol yenə bu viranı Bağdad qılur.

Qazi Bürhanəddin şeri Azərbaycan şifahi və yazılı ədəbiyyat ənənələri, türk xalqlarının poetik uğurları üzərində kamala çatmışdır. O, Balasaqunlu Yusif, Yunus Əmrə, Əhməd Yəsəvi, Əli, Həsənoğlu poeziyasından ilham almış, onların deyim və ifadə tərzindən faydalanmışdır. Bu da bir daha təsdiq edir ki, Azərbaycan anadilli ədəbiyyatının kökləri, milli ənənələri çox qədimdir. Özünəməxsus, orijinal yaradıcılıq siması olmayan bir xalq Qazi Bürhanəddin kimi sənətkar yetirə bilməzdi.

Qazi Bürhanəddin öz şeirlərində Ənvəri, Xəyyam, Səlman Savəci, Sədi, Hafiz, Kəmali İsfahani və b. adlarını çəkir. O, bir beytində Ənvəri və Kəmali İsfahanini belə xatırladır:

Bəs sən ayı görəli irdüm Kəmalə anca ki,
Hüsnünü vəsf etməkçün oldı zehnüm Ənvəri.

Şair bir sıra şeirlərini Sədi və Hafizin qəzəllərinə nəzirə yazmışdır. Qazi Bürhanəddinin bəzi bədii və fəlsəfi kəlamları hər iki şairin qəzəlləri ilə yaxından səsləşir.

Bütün bunlarla yanaşı Qazi Bürhanəddin yaradıcılığının əsasında canlı xalq dili və doğma ədəbiyyat ənənələri durur. Onun şeir dili bulaq suyu kimi saf və gözəldir. O, əski şərqi-nəğmə ənənələrindən çox faydalanır, öz şeirlərində bu milli bədii-poetik gözəllikləri yeni bir təravətlə canlandırır. Şair bir nəğməsində qədim şərqilərin bəzəyi olan alliterasiya hadisəsindən belə faydalanır:

Gəl, gəl görəlüm, gəl görəlüm, gül görəlüm biz,
Bir nəğmə gətür ortaya bülbül görəlüm biz.

Başqa bir şerində yenə samit səslərin səs gözəlliyindən məharətlə istifadə edərək şerə musiqi ahəngi aşılayır:

Yara, yara yara kim yar olasın,
Necə işbu gülə bir xar olasın.

Qazi Bürhanəddin şeirdə cinas yaratmağa ayrıca məna verir. Cinaslı ifadə və qafiyələrlə şerin səs-söz bəzəyini artırır:

İrdi Qara dənizə bu göz qanı,
Görməgə günəş yüzini göz qanı?

Ümumiyyətlə, Qazi Bürhanəddin şerində səs və söz oyunu, təkrarı, ahəngi çox qüvvətlidir. Onun şeirləri bu baxımdan xalq şərqilərindən az seçilir. Qazi Bürhanəddin elə şeirlər yaradır ki, onlarda ərəb və fars sözləri çox azdır. Bəzən də bütün şeir doğma dilimizdən gələn sözlər üzərində qurulur. Məsələn:

Aparun bəni yara, görişəyüm,
Yüzümi ay yüzinə sürişəyüm.
Totağı qanum içdi bən qanını,
Ol qanı anun ilə sorışayum.
Gözə göz, yüzə yüz canum aparur,
Ağız-ağız anunla sorışayum.

Qazi Bürhanəddin dünyagörüşünə görə saray-mədhiyyə ədəbiyyatına qarşı durmuş, öz məfkurəsi və bədii dil xüsusiyyətləri ilə fərqlənən yeni bir şeir yaratmışdır. O, şeirdə mədhiyyəçiliyə qarşı çıxaraq insan gözəlliyini vəsf və tərif etməyi üstün tuturdu:



Özgələri mədh edənlər görəli şah yüzini,
Bir yeni tumar edüb, yudular əski dəftəri.

Gözəllik və sevgi nəğməkarı olan Qazi Bürhanəddin şerinin bu baxımdan özünəqədərki şairlərin əsərləri ilə səsləşməsi də təbiidir. Onun aşağıdakı beyti məna cəhətdən Həsənoğlunun məşhur qəzəlini yada salır:

Ləbün ilə, şəha, oldı şəkər Misirdə kəsad,
Fəridi-eşq olanun sözi necə ola ziyad.

Həsənoğlu kimi Qazi Bürhanəddin də bu beytdə gözəlin şirin dodaqları – sözü Misirdə şəkər kasadlığı yaratdığını, şəkəri hörmətdən saldığını bildirir.

Qazi Bürhanəddin yanğısı olmayan sözü – şeri bəyənmir və onu boş-boşuna əsən küləyə bənzədirdi. Şairə görə şeir yandırıb-yaxmalıdır:

Şol söz ki, suzi olmaya badi-həvadurur,
Suzi gərək ki, ola cahanda sözüm bənüm.

İncə, zərif bir zövqə malik olan Qazi Bürhanəddin klassik poeziyanın nadir və rəngin ifadə vasitələrindən bacarıqla istifadə edə bilir, bədii fikrini yüksək bir şeriyyətlə, yadda qalan məcaz və surətlərlə təcəssüm etdirir. O, bir şerində bədii təkrirdən faydalanaraq şerin ifadə gözəlliyinə zinət vurur:

Könül ilə dedüm ana könül ilə dinləmədi,
Könül eylədünsə eylə, könül ilə, könül ilə.

Bu beytdə şair "könül" sözünü beş dəfə, həm də ayrı-ayrı mənalarda işlətməklə şerin bədii məntiqini qüvvətləndirir.

Qazi Bürhanəddin şerində bədii fikri təcəssüm etdirən ifadə vasitələrindən biri də ləffü nəşr (yığma və yayma) poetik fiqurudur. Bu təsvir üsulunda bənzəyənlə bənzədilən sözlər misra və beytin ayrı-ayrı tərəflərində sıralanır. Məsələn:

Nay ki, əsli saz ola sazını naya bənzədəm,
Kirpügi ilə qaşını ox ilə yaya bənzədəm.

Bu beytdə kirpiyi oxa, qaşı yaya bənzədən şair tərəfləri yan-yana işlətmir, ləffü nəşrə məxsus bədii mütənasibliyi qoruyub saxlayır.

Qazi Bürhanəddin şeirlərində "rəddül əcuz ələs-sədr" bədii üsulundan da məqsədəuyğun şəkildə faydalanır.

*Əcuz* şeirdə misranın sonu, *sədr* isə əvvəlidir. Bu bədii vasitədə beytin əvvəlindəki söz və ifadə beytin sonunda da öz əksini tapır. Orta əsr poeziyasında bunun altı növü vardır və Qazi Bürhanəddin də onlardan yerli-yerində istifadə edə bilir. Məsələn:

İmarət olalı eşqün xərab oldı könül,
Könül xərabalığıdır bu gün imarə bizə.

Bu beytdə şair birinci misrada "xərab oldı könül" ifadəsini ikinci misrada "könül xərabalığı" məqamında işlədərək əcuz və sədr bədii üsulu ilə şerin bədii məntiqi və mütənasibliyini tamamlayır.

Qazi hüsni-təlildən də bol-bol istifadə edərək bədii duyğu və düşüncələrini yeni bir təravətlə ifadə edir. Məsələn:

Nərgis cigəri dağ durur gözi alından,
Al qana boyandı ləbi alı ilə lalə.

Beytdə deyilir ki, onun gözünün hiyləsindən nərgizin ciyəri yaralandı. Lalə də dodağının qırmızılığından al-qana boyandı. Şair burada hüsni-təlil yaradaraq nərgiz gülünün ortasının tünd rəngdə olmağını sevgilinin gözünün hiyləsi, lalənin al qana boyanmasını isə dodaqlarının qırmızı rəngi ilə əsaslandırır. Bədii gözəlləşdirmə səbəbi ilə şerə təravət gətirir, fikrini ifadəli şəkildə təcəssüm etdirir.

Təbiətin al-əlvan gözəllikləri də Qazi Bürhanəddin şerinə yeni bir təravət verir. Şair təbiət mənzərəsini bir rəssam kimi yaradır, sevən aşiqin sevgi duyğuları ilə həmahəng canlandırır:

Yer yaşıl, ağac ağ oldı, gül qızıl,
Yar əlin al, bağubana qul yazıl.
Gül bulıd ağladuğına gül bigi,
Şəbnəm ol günəş yüzi içün əzil.
Gah nərgis tək göziyçün xəstə ol,
Gah sünbül tək saçı içün tağıl.

Qazi Bürhanəddinin bəzi şeirləri aşıq qoşma və gəraylıları kimi dil, ifadə və deyim baxımından canlı, təbii və söhbətvarı səciyyə daşıyır. Kiçik lirik lövhələr yaradan şair şux, oynaq mənzərələrdə sevgililərin görüşünü yeni bir təravətlə qələmə alır:

Dedüm ki, ləbün, dedi nə şirin söylər,
Dedüm ki, belün, dedi nə narın söylər.



Dedüm ki, canum cümlə fədadur saçuna,
Dedi ki, bu miskin hələ varın söylər.

Bu rübaidə sanki aşiq öz sevgilisi ilə dərdləşir, sevişir, ürək döyüntülərini bildirir. Ona görə də, bu rübai gerçək, real sevgi duyğularının təbii və səmimi ifadəsi kimi mənalı səslənir.

Gözəl bədii üslub və deyimi, ideya və məna tutumuna görə Qazi Bürhanəddin şeri özündən sonra bir sıra şairlərin yaradıcılığına nəcib təsir göstərmişdir. Azərbaycan şairlərindən İmadəddin Nəsimi, Şah İsmayıl Xətayi, Məhəmməd Füzuli, Molla Pənah Vaqif, Nəbati və başqaları onun bədii üsul və vasitələrindən faydalanmış, məhəbbət və gözəllik ideyalarından ilham almışlar.

Məhəmməd Füzulinin "Doğru derlər hər zaman bir aşiqin dövranıdır" misrası Qazi Bürhanəddinin aşağıdakı beyti ilə necə də səsləşir:

Yevü yedürğıl, alü bağışlağıl,
Hər zaman bir yigidin dövranudur.

Yaxud da Xətayinin "Bahariyyə"si Qazi Bürhanəddinin aşağıdakı tuyuğunu yada salır:

Qışladan başladı dəprəndi oba,
Qönçə yenə könləgin qıldı əba...

Vaqifin "Sevdiyim" rədifli qoşmasında müvafiq misralar Qazi Bürhanəddinin aşağıdakı misralarını xatırladır:

Gisuların aşüftə görürəm könlüm tək,
Bənzər ki, pərişan edən anları həvadur.

Bu misalların sayını artırmaq da olar. Bütün bunlar göstərir ki, Qazi Bürhanəddinin seirləri ideya-bədii baxımdan kamil, gözəl sənət əsərləridir. Onun yaradıcılıq ənənələri əsrlər boyu ədəbiyyatımızda davam və inkişaf etmiş, bir sıra xalqların poeziyasında əks-səda tapmışdır.

Qazi Bürhanəddinin divanı Londonda Britaniya Muzeyində (4126) saxlanılır. Divanın bu yeganə əlyazmasını XIX yüzilliyin sonlarında İstanbulda yaşamış ingilis səfarətxana işçisi Tomos əldə edib 1890-cı ildə Britaniya Muzeyinə aparmışdır.

Şairin divanını tərtib etməyin çətinliyi bir də ordadır ki, divanın bircə əlyazması vardır. Bu hərəkətli nüsxəni 1393-cü ildə Qazi Bürhanəddinin sağlığında onun saray xəttatı Xəlil ibn Əhməd yazıb hazırlamışdır. Ancaq

görünür ki, divanın əlyazması sonradan şairin özü tərəfindən oxunub düzəldilməmişdir. Bəzi yerlərdə xəttat üç nöqtələr qoyur, habelə hərflərin hamısı hərəkə və nöqtəli deyildir. Müəyyən sözlər yanlış yazıldığından bəzi yerlərdə misra və beytlərin vəzni pozulur. Hərəkələrin qoyuluşu və yazılışında da fərqlər çoxdur.

Divanda əruzdan əsasən məqsədəuyğun şəkildə istifadə olunmuşdur. Ancaq şeirlərdə imalə və zihaflar (uzatma və qısaltmalar) çoxdur. Bunun bir səbəbi də o idi ki, XIV yüzillikdə əruz hələlik ədəbiyyatımızda sabitləşə bilməmişdi, heca ilə əruzun hüdudları tam ayrılmırdı. Şairin işlətdiyi qafiyələrdə də sərbəstlik vardır, şeirlərdə göz qafiyəsi ilə də çox qarşılaşırıq. Bir şeirdə eyni söz bir neçə yerdə qafiyə məqamında işlədilir.

Qazi Bürhanəddin divanı 608 səhifədən ibarətdir. Burada qəzəllərdə təxəllüs yoxdur. Divanda klassik divan tərtibi prinsipi gözlənilmir, şeirlər əlifba sırası ilə yazılmamışdır. Divan həcmcə on yeddi min misradan ibarətdir. Daha doğrusu, divanda 1319 qəzəl, 20 rübai, 108 tuyuq və bir neçə müfrəd vardır.

Azərbaycan ədəbiyyatı tarixində Qazi Bürhanəddinin şeir divanı ana dilində yazılmış və günümüzə qədər gəlib çatan ilk şeir divanıdır. Bu sətirlərin müəllifi həmin divandan seçmələri 1976-cı ildə, onu tam şəkildə isə 1988-ci ildə çapdan buraxmışdır.

Əsəri nəşrə hazırlayarkən divanın foto-surəti, foto-faksimilesi və M.Ergin nəşrindən faydalanmışıq.

*Əlyar Səfərli*





* * *

Suxtə könüllərə qıldı yenə car eşq,
Ey neçə aşiqləri qıldı yenə zar eşq.

Qıldı yanaxlarumi cümlə mü'əsfər məgər
Anun içün eylədi cədvəli bərkar eşq.

Gərçi ki, məxmur edər ləbləriylə cani,
Şükr ana ki, gözlərin eylədi xummar eşq.

Küfrini gisusunun canumuz iman bilür,
Bağlayalı belümə bir qara zünnar eşq.

Toldı könüldə hava, qomadı xali məkan,
Lacərəm oldu qamu bu dərü divar eşq.

Aşiqü mə'şuqənün eşqlədir varlığı,
Baxıcağ ol ortada yinə günahkar eşq.

Xəstəyə olan şifa, əhdinə qılan vəfa,
Məclis içində səfa gül bitürən xar eşq.

Biz necəsi eşq ilə olmayalum bir çün,
Biz yoğ ikən vəhdətə eylədi iqrar eşq.

Vərzişi-eşq eyləsə bizçiləyin kişilər,
Nola çü vərziş qılur günbədi-dəvvar eşq.

* * *

Nigarına bu gözlərdən nəsibi qanı üşşaqun,
Ki, hər dəm ləblərünçün dökilür qanı üşşaqun.

Mübərqə olubən şaha nühüftə qıla hüsnüni,
Nəvası rastı yoxdur məgər ki, canı üşşaqun.

Belün kibi xilal oldux, ağızın tək xəyal oldux,
Xəyalun olalı, şaha, bu dəm mehmanı üşşaqun.

Gəl ey eşqinə quşanan, dilü can ver, cəfa cövr al,
Gəh assı, gəh ziyan eylə, budur dükkanı üşşaqun.

Əgərçi amm imanın tamam eylər şəhadətlər,
Kəmalə irməyə sənsüz, şəha, imanı üşşaqun.

* * *

Ləbün meyilə bir dəm dimağ əgər tər ola,
Gərək ki, sözlərümüzdən cahan müəttər ola.

Gözüm nəmi nəmə əksük qomaz vəli yarın,
Yaşuma gər nəma nur isə dəxi xoştər ola.

Qoya bilürsə başı ayağına xəlqi-cahan,
Gərək ki, zülfi kibi cümlə sərbəsər sər ola.

Hava dimağuma urdı əcəb dəgül şimdi,
Bu göz yolundan əgər yaşlarum müqəttər ola.

Xəyaluna taparam bütpərəst xud dəgüləm
Nirəyə baxar isəm surətün müsəvvər ola.

Məgər ki, bu könülüm arzuyi-əkər edər
Ki, daima ağızumda ləbün mükərrər ola.

Nigara lə'li-ləbün aşiqi durur bu könül,
Key isə cənnətün içində hovzi-kövsər ola.

Sabah turu gəlib yüzünə baxan gözlər,
Gərək ki, ğəm çərisi üsdinə müzəffər ola.

Nigara, rast deyəlüm çü sərvün oldu rəvan,
Qiyamət oldu gərək qamu sərvə sərvər ola.

Dəm olmadımı dəmündən ki, bir dəm ola ana
Neçə-neçə qapudan taşra həlqeyi-dər ola.

Oduna çünki Bərahim eşqilə düşə dil,
Xəyalunun bütini yonmağ ilə Azər ola.



Günəş ilə gecənün ictimai yox ya nəçün
Bu qara zülfi nigarun yüzündə dərxur ola.

Bu rast qəddüni çüngi görürsə dutma əcəb,
Əgər müxalif edüb sazını mühəyyər ola.

Nigara udu saçun qıldı yenilə qanun,
Kanun[1] xəyaliylə dil həmişə micmər ola.

* * *

Nələr gördüm, nə şərh edəm nigarun yüzi alından,
Səni bilməyən anlamaz yəminini şimalından.

Başumda ləşkəri-sevda çü düzdi xəyl xanəsin,
Əcəb dutma, əgər bu tən xəyal ola xəyalından.

Əgər divanə oldum bən, anun əqlinə nə nöqsan,
Və gər nöqsan olur bəndə, nə əksilür kəmalından?

Bəni zülfeyni qılıyla salıb bəndə oda saldı,
Bilməzəm, nə qopısar anun qil ilə qalından.

Günəşdür yüzi dildarun, ilahi müstəqim olsun,
Könüli saxlasun Allah anun yüzi zəvalından.

Visalə doyımaz canum, fəraqə taqəti yoxdur,
Fəraqun odu həm yegdür visalun ehtimalından.

Bənəm Leyliyə Məcnun, bəs nedərəm günəşü ayi,
Cana Leyli izi-tozi gey ola ay camalından.

Bu dünyada bənüm sən sənü ol dünyada sənün bən,
Qaçan isə asılısar bu qolum tubi talından.

* * *

Saqi, tolu sun neçə-neçə zöhd ilə pərhiz,
Mütrüb, yenə düz nəğmeyi-udi-tərəbəngiz.

[1] Ki anun

Dil sinənə bağlandı, can asıldı ləbündən,
Hər mövləvi gərək düzə bəndü şəkəraviz.

Mələkdə ağız böylə necə ola dürəfşan,
Ya huridə heç böylə qaçan ola dilaviz.

Nazük tənüni bilimezəm canmı, bədənmi,
Hələ sanuram bən ani ruhi-bədənamiz.

Xuni-cigəri gözlərüm axıda zərurət,
Çün hindu gözün aldı ələ xəncəri-xunriz.

Şol lə'li-ləbün cilvə qılur isə cahana,
Başdan-başa Sürxab axıda xitteyi-Təbriz.

* * *

Baxsa şairlər yüzünə, hüsni-mətlə görsələr,
Zülfüni saçsan yüzə, mahi-müqənnə görsələr.

Ağlasam gözlərümi əyni-müdəmma anlasan,
İnləsəm bu tənümi şəmi-müddəmmə görsələr.

Lə'lini sən ağzuma urub isırsan ləbümi,
Cümleyi-əhli-nəzər nazük mürəssə görsələr.

Ağlasam, inilesəm, yansam tapunda, ey nigar,
Mütrübü mey şahidü şəm ilə məcmə görsələr.

Sən gecə düşmisənü gündüzlə gözümdə xəyal,
Bir hüzur əhli qanı vəqti-müvəzze' görsələr.

Xızra lazım nəydi qaranulıxda istəmək,
Abi-heyvanə sənün lə'lüni mənbə görsələr.

Qət'i-bədguyun dilində qət' edərəm bən sözü,
Əhli-dil başların oynar, hüsni-məqtə görsələr.



* * *

Əyni-şəfa durur bənə gözündəki iləl,
Görməz gözə göz ani ki, gözündə var səbəl.

Qıldum qərar zülfinə ki, qıl qılam təni,
Ədvar içində böylə qanı qövl ilə əməl?!

Behram gözünün, şəha, tirinə yox xəta,
Gər səd həzar hiyləylə dəf edə zühəl.

Zülfüni tara ki, ola asan bu müşkülüm, –
Ki, sənə yaraşur, şəha, şol əqdü işbu hal.

Uçmaxda çün yüzünələ huriyə nə məcal,
Ol təndə ki, tapun ola hər ruha nə mahal?!

Gər varlığumi bir nəzər ilə alur isən,
Hazır durur niqabını qaldurü al əl-əl.

Şirin qılur xəyalı ləbinün bu eyşümü,
Xəmr etdi gözləri nə ki, varlıxda buldu xal.

Qalumda qılca heç məhək əyb bulmaya,
Qəlbümdə qəlb qanda bula bilə hər dəğəl.

Vəslün şüai mürdəi gər zində qılmaya,
Bu fəsl içində bəllü durur cədy olur həməl.

* * *

Dilbəra, insafa gəlgil neçə-neçə dilbəri,
Bən yüzüni görəli xud dilbəriyəm dilbəri.

Bən ayağuna fəda baş qoymuşam xeyli durur,
Sən bu halumi bənüm bəs anlamağıl sərsəri.

Boyuna tubi nə nisbət bir quru ağac durur,
Kim gətürə belə dilə sərvi, yaxud ər'əri.

Bən sən ayı görəli irdüm Kəmalə anca ki,
Hüsnünü vəsf etməkçün oldu zehnüm Ənvəri.

Şiə əhlindəri dəgüləm leyk vardur bu qədər
Ki, Hüseyni lə'lün içün axıduram Cə'fəri.

Dünyada daxi nə dilər şol kişi ki, dər bahar,
Suna ayağ əlinə mə'şuqeyi-xoş mənzəri.

Özgələri mədh edənlər görəli şah yüzini,
Bir yeni tumar edüb, yudular əski dəftəri.

Nə rəvadur ki, görə lə'li-ləbüni hər dəgəl,
Bilməgə anı bənüm tək kişi gərək Cövhəri.

İnci dişinün xəyalı düşəli könlümə,
Yüzümə yalduzlamışam sərbəsər abi-zəri.

* * *

Canumı eşqünə satdum dəxi bəha nə gərək,
Bana xo yoluna can verməgə bəhanə gərək.

Nigara, qamətünə qılmışuz könüli fəda,
Zira ki, sərvi-rəvanə rəvan rəvanə gərək.

Dükanə baxmadı, bazarı olmadı könülüm,
Və leyk lə'li-ləbünçün varam dükanə gərək.

Qanumı ləbləri içdivü düşdü arayə qan,
Canum dəxi quşanuban bu qana qanə gərək.

Nigara, zülfüni tağıd, qarası çoğ olsun,
Ya ada, ya sana layiq çəri yasanə gərək.

Kənarı andanü andan kənarə isdəməgil,
Məyanə dərdi-dil əhli işi məyanə gərək.

Çü lütfüni bilürəm gər günah qıldım isə
Yazana qılma cəfayı, cəfa yazanə gərək.



* * *

Dərdməndüm dərdə timar isdərəm,
Xəstəyəm gözüni bimar isdərəm.

Bir nəzər qılsan nola əhvaluma
Zi dəlü əsrüki me'mar isdərəm.

Qaşıdur mehrabü yüzi qiblədür,
Bəs neçün zülfini zünnar isdərəm.

Gözlərümün köşəsidür odağun
Anun içün ana idrar isdərəm.

Canü tən, əqlü dilü varlıx verüb,
Yara qul oldum, bir iqrar isdərəm.

Dəgüləm bazarı bizar olmazam
Ta ki, canum ola bazar isdərəm.

Ta ki, bir gəz dəxi düşə ol nəzər,
Daima əflakı dəvvar isdərəm.

Cövr əlindən canü dil qurtarmağa,
Ənbəründən iki tatar isdərəm.

Gisun içində azar canum vəli,
Sən bəni görgil ki, azar isdərəm.

Sevərəm zülfünlə ağızuni bən,
Ömrüm uzun eyşümi tar isdərəm.

Gözü uyır lə'l söylər sevərəm,
Fitnə xüftə, baxtı bidar isdərəm.

Qıl yarar canum ki, irə belinə,
İncə yola girməgə yar isdərəm.

Gözi qıldı könül elini xərab,
Gəzmişəm bən el ilə şar isdərəm.

* * *

Çin edəlüm saçı çini xətaya saldı bəni,
Səbəb nədür əcəba ki, cəzaya saldı bəni.

Dodağı busə dedivü həvalə qıldı yüzə
Əgərçi nəqd idi vəchi bir aya saldı bəni.

Gözüylə ki, könül xəstədür davam umaram,
Təbib bilmədi nəbzi, davaya saldı bəni.

Könüli kəndüyə qullab ilən götürdi saçı,
İrağa atmağ içün qaşı yaya saldı bəni.

Nə dəm durur ki, mis altun dəgül vücudun ilə
Fəda olmaz oduna, kimyaya saldı bəni.

* * *

Dökər gözüm yaşın səylab hər dəm,
Qılur yer yüzini sirab hər dəm.

Könül Təbrizinə gələli ol şah,
Axıdur gözlərüm Sürxab hər dəm.

Səmai çərxi neylədi canuma,
Gözümi eylədi dolab hər dəm.

Qaçan qonuşam ol mah ilə deyü
Əlümdə zicü üstürlab hər dəm.

Ləbün eşqinədür meyxanələrdə
Ki, içərlər şərabi-nab hər dəm.

Ləbün əfsuninün mö'cüzliginə
Müqirdür cümleyi-əhbab hər dəm.

Hicab oldu yaşum kirpüklərümə
Qaçan yol bula anda xab hər dəm.



* * *

Xub cahanda çox vəli nazikü dilrüba gərək,
Cana vida qıluban eşqinə mərhəba gərək.

Bən kim olam ki, dəprədəm bir qılını gisusun,
Başın əlinə alıban ol iş içün səba gərək.

Qonça ağızın açmağa kimün əli irişisər,
Atəşi-eşq məvsümi irişibən bəva gərək.

Ta ki, səfa girə ələ Kə'bə yüzində ol bütün,
Cünnə dəxi qəba olub yenə qəba əba gərək.

Dərdi ilə çü əsrükəm dürdi ilə yazam xumar,
Pəs nedəlüm çü xəstəyüz dərdümüzə dəva gərək.

* * *

Şəha, reyhanmı şol xəttün mühəqqəq,
Ya kafür üsdinə ənbər mürəqqəq.

Nə dürdür şol ki, dərxər görürüz biz, –
Ki, aydan müştəri olmuş müəlləq.

Nə hurisin qüsurun yox, nigara,
Ki, cənnətdür tamu sinünlə əlhəq.

Zənəxdanunda könlüm çaha düşmüş,
Müsəlsəldür canum zülfündə mütləq.

Ağızun nüktəsi şirinü nazük,
Saçun mə'nisi piçapiçü müğləq.

Əlünə ayinə al, yüzünə bax,
Kiçi barmax necə qılmış ayı şəq.

Şəha, şahin gözün apardı könli,
Sanasın bədənəyi qapdı başaq.

* * *

Sərxoş gözü bilür ki, məstaneyi-eşqəm bən,
Bir aqili-mə'niyəm divaneyi-eşqəm bən.

Hər bixirədün sözi ki tə'nə qılur bana,
Səndən bəni ayırmaz, əz xaneyi-eşqəm bən.

Cananəyə bən canı çoxdur ki, rəvan etdüm,
Canum bənüm oldur ki, cananeyi-eşqəm bən.

Gəncineyi-hüsnini pünhan edəli dildə
Gökçəkligə bay oldur, viraneyi-eşqəm bən.

Rövşən bu durur, yanmax oldu yüzinə vacib,
Şəm olmağa hər cana pərvaneyi-eşqəm bən.

* * *

Can olur isə bari cananeyi-eşq olsa,
Məst olur isə kişi məstaneyi-eşq olsa.

Gözlərüm axıdur dür, sərraf gətür urdur,
Dürdanə olur isə dürdaneyi-eşq olsa.

Hər bir kişi dünyada ərlikdən edər də'va,
Mərdanə olur isə mərdaneyi-eşq olsa.

Hərçənd ki, hər şəmə pərvanə düşər olur,
Yoldaş bizə bu yolda pərvaneyi-eşq olsa.

Qıldı ləbi ol yarun şərbətlərini hazır,
Divanə içün liykən divaneyi-eşq olsa.

* * *

Bana ki, uş dilbəriyəm neçə-neçə dilbəri,
Canı al, əl verənün tutma işini sərsəri.

Bən Hüseyni can verürəm görəli vəchi-Həsən,
Gör nə düzmişdür yaşum bu yüzdə zərri-Cə'fəri.



Olma Zəhhak, ey nigarın zülmi çox qılduğuna
Tutma irax kəndözündən Gaveyi-ahəngəri.

Dil dənizi mövci çox oldı, vücudi saxlama,
Gər qərar isdər isən salğıl dənizə ləngəri.

Dəm gəlür ki, dəm ururam şaha eşqündən sənün,
Dəq dutalarmı, əgər kükrər isə nər çəngəri?

Şol kişi gərək ki, iqdam eyləyə bu eşqə ki,
Sol əlində başı ola, sağ əlində xəncəri.

* * *

Dil saçun arasında azar isə, nə qılam?!
Can başuma sevdanı yazar isə, nə qılam?!

Bazarumı gərm edəm zarılığ ilə sana,
Zarımdan əgər dilbər bizar isə, nə qılam?!

Əfkar edə zülfündə bu əql ki, şeydadur,
Biçarə könül əgər əfgar isə, nə qılam?!

İqrarım ana ol ki, qılmaya bana inkar,
Bənüm dəlü könlümə inkar isə, nə qılam?!

Cədvəl axıdur gözüm ayağına şol sərvün,
Dolabı bu gözümün bərkar isə, nə qılam?!

* * *

Gər gümanün var isə qəmzələri yarasına,
Sən doxi bənciləyin ver könüli, yara sinə.

Şol ki, yarı ləbinün yaralar onalda bilür,
Nə güman qəmzələri ilə yürək yarasına.

Oxu cəvşən dələrü yarasıvü dəmrani yox,
Dil ki, uğraya ana ol bilə ki, yarası nə.

Ğazi gözün çü şəhid eyləyə aşiq könülün,
Eşq ilə gərək irürə sənəma yarasına.

Şişədür könülümü səng durur yar dili,
Şişə çün səngə ura, kəndözüni yara, sına.

* * *

Görmək ağızı nöqtəsin nuri-bəsər dəgülmidir?!
Yanağını ay anlamax hüsni-nəzər dəgülmidir?!

Nəqşi-camalı dilbərün gözdə xəyal bağladı,
Könülinə məhəbbətüm nəqşi-həcər dəgülmidir?!

Yürək oduna dilədi, su saça gözlərüm yaşı
Gəl, baxa dur ki, şimdi ol dəxi bitər dəgülmidir?!

Könülə uğrayan həva irdi saçuna zərrəsi,
Ayineyi əlünə al, zirü zəbər dəgülmidir?!

Gərçi qəza durur anun eşqi bu dəlü könülə,
Yürəgümə toxunan ox tiri-qədər dəgülmidir?!

Şimdi anun havasına xütbə oxunur aduma,
Yüzdə bu gözlərüm yaşı sikkeyi-zər dəgülmidir?!

Ani ki, iki hacibün qıldı cəmalun əlinə,
Əgri otur və toğru de, ədli-Ömər dəgülmidir?!

Nola əgər qarıncalar çoxdı ləbün şərabına,
Höqqeyi-lə'lda tolu şəhdü şəkər dəgülmidir?!

Gərçi ki, əql qocadur, lə'li-ləbünə iricək,
Tərk edübən bilülərin əmcək əmər dəgülmidir?

* * *

Qatı gələ ləbün cəvbər der isəm,
Mükərrərdür əgər şəkkər der isəm.

Bənünə nöqteyi-ənbər dedüm bən,
Həmişə deyəyüm dərxur der isəm.



Yüzündə hüsn elmin oxumuşam,
Bənə tə'n etməgil əzbər der isəm.

Könül Misrində çün sənsən, əzizim,
Rəvadur Yusifə çakər der isəm.

Tənünə yasəmin derəm həmişə,
Əcəb tutma miyan lağər der isəm.

Mələk təsdiq edə gör bitəkəllüf,
Sana mə'şuqi-xoşmənzər der isəm.

Bana fəxr ola ayağun tozıyçun,
Həmişə mədh əgər bəsər der isəm.

Dəmür döyməz oduma sana qoymaz,
Yeridür könlünə mərmər der isəm.

Necə sər sərvün içün oynamışlar,
Sana layiq durur sərvər der isəm.

* * *

Gözlərindür hüsn içində ey nigarın alalar,
Necə bir sehr ilə əqlü canü könül alalar!

Bən ki, üşşaqın nəvasını nühüftə qıluram,
Bu sipahan pərdəsində nə rəvadur çalalar.

Bəhri-hüsn olmuş cəmalun, dil gərəkdür aşina
Ki, cəvahir bulmağ içün ana qarşu talalar.

Hürivü pərivü insanü fəriştə cümləsi,
Çün niqabun götüresin, sana valeh qalalar.

Əhli-ürfan bir nəzərdə nə idügini bilübən,
Can adın sənün qatında anmağa uyalalar.

* * *

Dimağumda xəyalündür müsəvvər,
Ləbün zikri bu dilümdə mükərrər.

Şəha, gisuna uğrayan səbadan,
Dimağumun məşamıydı müəttər.

Ləbündən bir xəyal etdi könülüm
Ki, oldu gözlərümdən ol müqəttər.

Qəzayisə rizadur bana eşqün,
Çü olmış idi əzəldə müqəddər.

Vücudum xakü gözlərüm yaşı ab,
Odum eşqün həvasiylə müxəmmər.

Könüldə zülfi eşqin bildi aləm,
Çıxar qoxusı, oda düşsə ənbər.

Şəha, üşşaqdan qıldum nühüftə
Ki, şəhnaz lə qılursın mühəyyər.

Yüzüm zülfünün ayağına toprax,
Nedərəm xət ki, yazarlar müzəvvər.

* * *

Bu gün yenə səndən sənə fəryad edisərəm,
Bidadını ərz eyləyibən dad edisərəm.

Bən varlığumı bəndə verüb gisularına
Kəndözümi bu növ ilə azad edisərəm.

Gözüm yaşını Şətt edərəm, aləmi Bağdad
Andan gerü könülümi dilşad edisərəm.

Yad etdi bəni, etmədi yad ol ləbi-meygun,
Yad etmədügini hələ bən yad edisərəm.



Hər bir məlikün dünyada bir şəhri olur bən
Könül şarını sənə qəmabad edisərəm.

Gər zülfi başın oynar isə badi-həvaya,
Səhl ola ki, bən varlığı vər bad edisərəm.

Bən nam ilə, namus ilə arımı qoyıban,
Namus edübən dünyada bir ad edisərəm.

* * *

Bülbül yenə çağırdı ki, fəryad yad ola,
Qəddün yenə salındı ki, şümşad şad ola.

Gözün əgərçi, zülmünü irürdi qayətə,
Umum budur ləbün ilə, bidad dad ola.

Sərvün ayağı bağluvü nəy, bağludur beli,
Qəddün kibi kim, ola ki, azad zad ola.

Nəvruzdur sənün ilə bir eyş edəm gərək
Ki, dünya əhli görəvü ə'yad yad ola.

Badi-səba saçun ilə oynayalı, şəha,
Bildük ki, işbu dəhri-qəmabad bad ola.

* * *

Səhərdə canuma irən nəsimi,
Ana zər bənzədiməzəm nə simi.

Nə'im edən cahimi sənün ilə
Cahim edər bana sənsiz nə'imi.

Nə mimi aç, nə simi gösdər andan,
Nə sini gösdərürsən bu nəmimi.

Nə hadis oldu ki, qıldun dili rəd,
Çü mövtindür, ana zülfün qədimi.

Günəşdən yüzə bəxl etdün nə içün,
Dəriğ etdün şəmamündən şəmimi.

Necə bu qəhri-hazır işlədürsin,
Əlünə al axır lütfi-əmimi.

Yükündüm dedi, hazır qıl ğərimün,
Çağırdum ya ğərami, ya ğərimi.

Gözündədür könül məcruhü xəstə,
Nə çarə çünki lə'lündür həkimi.

Bana bu yara yara tə'nə dəgül,
Qanı gösdər gözəldən bir səlimi.

* * *

Yar bizüm ilə yenə gör ki, nə al eylədi,
Ta ki, yaşum qan ola, yanağın al eylədi.

Ağızını görəli dirligüm oldı güman,
Belini gösdərəli bəni xəyal eylədi.

Canumı aldı gözi, könlüm apardı təzi,
Şəhdü şəkər tək sözi əqlümi lal eylədi.

Hicrinə doymazam, vəslinə irimezəm,
Şol sənəmün ki, yüzi bədri hilal eylədi.

Hüsni ki, həq lütfidür bizə həram edübən,
Gözləri aşiq qanın nişə həlal eylədi.

Yel dəxi avarədür tolaşalı zülfinə,
Yeridür ol ana çün qil ilə qal eylədi.

Gərçi kabab eylədi eşqi oduna canı,
Ağızınun yarını bizə zülal eylədi.



* * *

Yüzüni gər görə idi sitarə,
Çəkəydi yüzinə qarşu sitarə.

Gözün bimarıyam, divanə oldum,
Nə çarə, lütfün olmaz isə çarə.

Yürəkdə qomadı qan qara gözün,
Bəladur canuma bu gözi qarə.

Qılalı ixtiyar ani könülüm,
Qomadı ani hərgiz ixtiyarə.

Bizi bizdən apardı çarəmüz yox,
Nə dərdi-yara, nə dərdi-diyarə.

Ləbün qandığı içün qana hər dəm,
Nə lazımdur ki, bənizüm sararə.

Günahum ol ki, anı sevmişəm bən,
Günaha həm günah olur kəfarə.

Həzaran dil pərişan var saçunda,
Qaçan gələ bu dil anda şümarə.

* * *

Bu nə hüsnü bu nə xəttü bu nə qəddü nə bəladur,
Cəmalün rövzəmi, ya rəb və ya firdovsi-ə'ladur.

Saçun ənbərdürür, liykən ana kafur xidmətkar,
Ləbün yaqutdur, illa ki, lö'lö ana laladur.

Qaşun peyvəstə bizümləvü qəddün rastdur liykən,
Gözünə yaxşı baxıcax qiyas oldur ki, aladur.

Yüzi gül, gözidür nərgis, təni bərgi-səməndən tər,
Vəli kirpükləri cadu, yürəgi səngi-xaradur.

Xəti Xızr, ağızı Məryəm, sözü İsa, ləbi Yəhya,
Özi Yusif, gözü Musa, zəhi Adəm, zi Həvvadur.

* * *

Sağlıx, sənəma, aşiqə dinarü dirəmdür,
Sanma ki, səni sevənə hiç nəsənə kəmdür.

Hicrün ilə irmaxlar axar işbu gözümdən,
İrmaxlar axıtmaz isə, bu göz dəxi nəmdür.

Dün gecə yüzüm basa, gözə gəldi xəyalün,
Səndən bizə, şəha, nə ki gəldisə qədəmdür.

Ayru düşəli, şəha, tapundan gözümə gəl,
Gör ki, bu cahan ləzzətinün sonı nədəmdür.

Şol arizü zülfə, sənəma, ənbərü kafur,
Nə nisbəti var, dünya duralı çü xadəmdür.

Hüsnünə sığındı, sənəma, bu dəlü könül,
Atmasun anı ahu gözün səydi-hərəmdür.

Ah ilə qorəm yoğ idi hərgiz gözü ilə
Canuma axın qıldı, anun gözi qərəmdür

* * *

Tərəb atına, nigara, könül çü bağladı zin,
Gərək ki, mə'rəkəsinə fələk qıla təhsin.

Kimün ki, yasını qurdu səadəti-əbədi,
Oxun kimə atar isə, anun dutun yasin.

Şunun ki, qışını yaz eylədi çələb, nola gər
Çoxa sayar isə lütfi ilə anun azin.

Gəlün ki, oxuyalum fəth içün bu fatihəyi
Ki, neçələr oxuya düşmən üsdinə yasin.

Çü fil bəndini əsb ilə bağladı dövlət,
Nə qıla düşməni-kəjrəv ki, oynaya fərzin.



Ədu tərəqəsi bənzər şuna ki, haşa eşək,
Salar palanını yerəvü götürür xərzin.

Kimün ki, kisəsi var qoltuğunda dünyada,
Bizə əgər sorar isən yarası yarəsin.

* * *

Təngi-şəkəri lə'li-ləbün təngə gətürdi,
Tutisini bu könlümün ahəngə gətürdi.

Könülümi bən qomış idüm könli yoluna,
Çarə nədürür, şişeyi çün səngə gətürdi.

Qurdı qaşı yayınıvü gözlədi gözü ox,
Məgər ki, bu türkiləri ol cəngə gətürdi.

Canumı saçı qılı yaxar od kibi çün,
Qanun budur, hər neyi ki, çəngə gətürdi.

Vergil əlinə, saqi, tolu camivü anla,
Şol lütfi ki, ol badeyi-gülrəngə gətürdi.

* * *

Hər bir dəğəlün oyını sərbazi dəgüldür,
Yar yoluna qomax kişi sər bazi dəgüldür.

Nə çəkdügümi gər der isəm ömr varınca,
Belün qılı ilə, sənəma, azı dəgüldür.

Cövrün taşını könülümə necə atarsın,
Bir serçədurur, ahəni-şirazi dəgüldür.

Çərx oxu kibi qəmzəsi yarmaz cigərümi,
Yürəkdür axır, atduğı bir yazı dəgüldür.

Bin aşiqi gözləri şəhid eyləməyincə,
Də'visi budur dünyada ki, Ğazi dəgüldür.

* * *

Gözün apardı könüli ə'yandur,
Və liykən qaşlarun sahibqirandur.

Qıl olmax səhldür belün qatında,
Və liykən ol qılun barı girandur.

Təcəllisinə Tur tağı doyımaz,
Çü üşşaqə xitabı ləntərandur.

Nihayətdür belün ana kim, irər,
Məgor ol ki, havada bigirandur.

Xəzani-eşq irişdi könülə,
Vəli gözdən axan abi-rəzandur.

* * *

Dil necə deyə sevdügümüzi səni dildən,
Getmədi səni görəli zikrün, şəha, dildən.

Dişlərüni deyəli sözümdür düri-mənzum,
Söz ki, belün içün deyəm, incə ola qıldan.

Adəm ana deyorəm ki, ola narü həvadən,
Adəmmidür ol ki, dəm ura ab ilə gildən.

Yüzi günəşi sayəsidür ruh dedigüm,
Bulmadı həyat ol ki, irax düşdi bu zildən.

Şah yoluna saldum atumı mat evinə bən,
Uran ruhunu ruhuna nə fikr edə fildən.

* * *

İşvəsi ol nigarun dilmi qodı bu təndə,
Ya söyləməgə dərdin dilmi qodı bu təndə.

Eşqün oduna yanmaz hüsnün şüai hərgiz,
Nöqtə qodımı canda, qılmı qodı bu təndə.



Sayəndə bulduğumı bən saya bilimezəm,
Günəş yüzün şüai zilmi qodı bu təndə.

Oddur havası anun, göz yaşı seyl oldı,
Ol yelü ol su, ol od, gilmi qodı bu təndə.

Sən yüz göz ilə dilə ki, yar dilüni dilə,
Nə dilər isə qılsun, dilmi qodı bu təndə.

* * *

Könül bulmadı bu dənizə sahil,
Necə ki, eylədi qəti-mərahil.

Mücavir olmış idux eşigində,
Yönəlmədin dəxi ol yola məhmil.

Nə dil var bəndə ki, dilə gələ ol,
Məgər bir dəm gəlür olursa dil-dil.

Nigara, bir qıluna dəgməzəm bən,
Təfəhhüs qılmışam gisuni qıl-qıl.

Yanaram bən tutaxlarunla dəm-dəm,
Yüzünlə gün-günü saçunla yil-yil.

Ləbündən bir təbəssüm anlamadum,
Gözümdən axmayınca xuni-sail.

Şəha, saidlərindən binəsibəm,
Bana irmədi isə bu həmail.

* * *

Qədəm basalı yoluna qədəm-qədəm yanaram,
Tapunda şəm kibi uşda dəmbədəm yanaram.

Cahanı tən dilərəm bən ki, oduna yanam,
Bu varlığ ilə yanarsam, oduna kəm yanaram.

Yaxamı heç qomaz əldən, yaxam əlindədürür,
Əl urmadın yaxama, demədin yaxam yanaram.

Camalı günəşi çün toğa hüsn gögündə,
Məcalum olmaya kandan[1] yana ədəm, yanaram.

Gözümün irməz əli ki, nəzər qıla yüzünə,
Və gər göz ucu ilə özgəyə baxam, yanaram.

Dil könləgi ətəgini, yaxasını bilməz,
Dildar anı od ilə nə yaxasını bilməz.

Yürək tamarından gözi nəştəri qan alur,
Bir seyl oluban ol tamar axasını bilməz.

Pünhani atar kirpügi oxlar yürəgümə,
Göz yaşı, bəniz sarusı çaxasını bilməz.

Özümdə qomadı özü yüzümdə dəxi yüz,
Hərgiz özi bu yüzümə baxasını bilməz.

Gümrahdurur bu dəlü dil gisularında,
Sövda adını boynuma taxasını bilməz.

* * *

Artuxrağ oldı eşq odu, dilər ki, kəf qıla,
Ol oda varlığını qamusun ələf qıla.

Dürdanə istəyən dənizə qərq edə özin,
Xüşk ola ol ki, quruda qəsdi-sədəf qıla.

Dildar ilə xoş ol və zəmanəyə qalmağıl,
Dutma hesaba hər nə ki, piri-xərəf qıla.

Ey əql, tutma dəq dilə can versə yar nə,
Zira şərəfdürür necə ki, ol sərəf qıla.

[1] Ki ondan



Nəşr etsə saçını, qəti təşvişə düşərəm,
Cəm ola xatirüm yenə qaçan ki, ləf qıla.

Şaha, şəkərün nırxını ərzan edə lə'lün,
Gər bir dəm ura mürdə tənin can edə lə'lün.

Təng idi ləbün söyləməyəli könülümi,
Qorxum budur öksüzə ki, bir qan edə lə'lün.

Gər bir dəm ilə mürdə tənə ruh irürə,
Mümkin ola ki, bir dəxi imkan edə lə'lün.

Bir nüqtə əgər lütf eşidürsəm ağızundan,
Müşkillərimi qamusın asan edə lə'lün.

Gərək ki, gümiş qalmaya, altun ola işüm,
Gər lütf ilə könlümə ehsan edə lə'lün.

Altun nişə qılur bənizümi biliməzəm,
Eyb olmaya gər yaşumı mərcan edə lə'lün.

Sevdazədəsiyəm saçunun uşda pərişan,
Gərək ki, bənüm dərdümə dərman edə lə'lün.

* * *

Şəkkər ləbüni sun bizə, ey yar, bu gecə,
Gər yox der isəm, uş yürəgüm yar bu gecə.

Söhbət dilərəm sənün ilə könlüm içində
Kim, tuymaya halumuzı dəyyar bu gecə.

Belündə çü varlığı fəna eyləyə könül,
Dəxi nəmi oğurlaya əyyar bu gecə.

Gözün Həsənü lə'li-ləbün oldı Hüseyni,
Gözlərüm olur Cə'fəri-təyyar bu gecə.

Saqi, tolu ver ayağı, əlüməvi gör ki,
Bəndə nə qopar dünyada əsrar bu gecə.

* * *

Bu gecə qıldı tale bizə yari
Ki, tale oldı eşq ərinə yari.

Xızır tək eyşümüz səbz ola əgər
Cana eynül-həyat olursa yari.

Ləbi gər yari verməzsə canuma,
Məgər ki, haqdan ola bizə yari.

Gərək ki, ixtiyari ana verəm,
Əgər sevdüm isə ol ixtiyari.

Oyana dövlətüm ol gecə ki, ol
Döşəgüm üsdinə gələ o yari.

Bən ol bariyə ki, bar olmuşam qul
Ki, belindən salar boynuma bari.

Anun yoluna gül tək açıluram,
Batarsa ayağuma hicri xari.

* * *

Bəndən bəni aldı gözün, zülfündə yitirdüm bəni,
Biçdün, götürdün bənligi, həm bəndə yetürdün bəni.

Zülfüni görəli könül oldı pərişanü tağux,
Gərçi irax saldun isə, yaxına götürdün bəni.

Getmiş idüm saçun ilə badi-hava yolunda bən,
Şimdi ayağı tozuna uş yenə gətürdi bəni.

Gizləmişəm özümi bən gisularında çoxdurur,
Şimdi özün dilər isən, yetür özüni bul bəni.

* * *

Şol büt əgər bizüm ola, sanki olur cəhan bizüm,
Gər ana olmaya fəda, bəs nəmüz ola can bizüm.



Şöylə boyadı yüzümi, ay yüzünün xəyalı ki,
Ayağumuza baş qoya, görür isə xəzan bizüm.

Kəf ura tolu cam mey alıcaq ələ, sanasın,
Cür'ələrimüz icdigün bilimədi rəzan bizüm.

Varlığumuz necə ki, var hüsnünədür fəda sənün,
Yaxşı, yaman deyüməzüz, yaxşı sizün, yaman bizüm.

Cövhəri-fərdi-lə'lünün otuz iki dürin gözüm,
Nəzm edər altun üstinə mə'dən ilə dükan bizüm.

* * *

Yüzün hədiqəsi, şaha, rəşki-cinan imiş,
Qoşa qaşun bu dövrdə sahib-qiran imiş.

Bəhram olursa cadu gözün, olmaya əcəb,
Kirpüklərün çü oxlarü qaşun kəman imiş.

Sən hasili-zəmanəsinü tapuna irən,
Mehdi olur isə nola sahib-zəman imiş.

Oda yanası könülüm içün bilimədüm
Ki, şol ləbani-lə'l arasında qan imiş.

Canumı hüsn vəsl içün əzəldə alıcax,
Nola ləbini tutar isəm, çün zəman imiş.

* * *

Nigara, budurur tapunda azum
Ki, çoxa yazıla eşqündə azum.

Həqiqət budurur halüm bənüm ki,
Dəxi olmaz eşügündə məcazum.

Belündən halumı bil ki, bilür ol,
Ləbündən sor ki, necə oldı razum.

Qədündən bil ki, toğruyam yolunda,
Saçundan anla sevdayi-dirazum.

İrax yaxın çü qəmzən gönüli yarmaz,
Nə vechə oturur bu ehtirazum.

Yürək qanında qüsl eyləməyincə,
Qaşun mehrabına olmaz nəmazum.

Aluram yüz səfa, bir qara taşdan,
Məqamunda çü qapundur hicazum.

* * *

Xəmiri-mayəmüzi xəmr ilə çələb əzəli,
Tolu ayağı içərüz zi badeyi-əzəli.

Qələm-qələm ola əgər yazar isə mislin,
Bu ləvhi-dildə nigarun cəmalini yazəli.

Tamar yürək tamarından həzar qətreyi-xun,
Bu fitnə gözlərini işvələr ilə süzəli.

Düşər könülüm ayaxdan, gedər bu göz əldən,
Yola baxub tələbindən görəli ol gözəli.

Yummışam əli özümdən bir aşinalığ ilə
Xərabü məst bu dənizə düşibən yüzəli.

* * *

Hammamda nə şe'r ki, deyilə tər düşər,
Zira axar suya, sanasın ki, şəkər düşər.

Güldən gülab necə qopar anda bilinür
Ki, gül yanaxlaruna həya ilə dər düşər.

Sözüm mütəvvəl olur, əgər sərvüni anam,
Ağzuna nöqtə gər der isəm, müxtəsər düşər.



Əhli-xirəd könülləri yoluna qoyıcax,
Bizüm kibi dəlülərə həm tərki-sər düşər.

Can gəlicək dilər ki, könülüm xəbər sora,
Necə xəbər verə bilə, çün bixəbər düşər.

Kirpügün oxuna canı amac qılmışam,
Zira ki, atduğı yerə əvvəl nəzər düşər.

* * *

Hicr ilə bəni ol yar necə yaxısar axır,
Gözüm yolına anun necə baxısar axır.

Tutam ki, anun eşqin kimsənəyə diməyə,
Bənizüm sarısı anı xəlqə çaxısar axır.

Könül qapusını bən bağlar isəm ol yana,
Gisuları halqası qapu qaxısar axır.

Bərdar dilər qıla gisuları canumı,
Can boynına zülfini əvvəl taxısar axır.

Gözümə məcal olsa görməgə cəmalüni,
Neçəyə dəkin qan-yaş axısar axır.

* * *

Dəlüsiyəm zülfünün silsilə dəprətməgil,
Ta diyəməm halumı qıl qıla dəprətməgil.

Belün ilə incəyəm, ağzun ilə təngdil,
Kəndünə bax, halumı bil, belə dəprətməgil.

Can verəyüm qəmzənə, gərçi ki canıdur ol,
Dil der isəm gözünə, dil dilə dəprətməgil.

Can anı dilər ki, yaş yolına ona rəvan,
Şayəd ana der isəm silsilə dəprətməgil.

Ol der isə gisusi canuma şol dəm ola,
Hər qılına der isə qıl qıla dəprətməgil.

Söyləyimədi dilüm lə'li-ləbün vəsfini,
Dedüm ana kəndüdən dil dilə dəprətməgil.

Şunda ki, qıldum fəda güllümi ən küllünə,
Tən tənəvü can cana, dil dilə dəprətməgil.

* * *

Yaxma Xəlilün dilində atəşi-Nəmrud,
Olmaya atəşgədə bu xaneyi-mə'bud.

Çəngi-nəvayı qoma ki, yumşana könli,
Tağları inlətmədimi nəğmeyi-Davud.

Cud yoluna vücudi tərk edə könlüm,
Xasə ana k'olmaz isə olmaya məvcud.

Şol suyı sunğil bana ki, od ola fe'li,
Ta ki, ola tiztər bu atəşi-məvqud.

Hicrün ilə yanduğuma şükr qıluram,
Vəslün ilə aqibət olur isə Mahmud.

* * *

Rəsmi-cəfadur, nigara, adəti-mə'hud,
Oldı dəmi ki, irürə vəsləti-məv'ud.

Pərtəvi-hüsni idi ki, gördi məlayik,
Adəmi-xakiyi kəndülərinə məscud.

Müşk saçunı görəli məcmərə düşüb,
Ud dimağına bax ki, necə çıxar dud.

Nurdurur eşqi odı safi könülə,
Yaxmaya hərgiz Xəlili atəşi-Nəmrud.

Cəvrü cəfa xoşdurur çü eşqi-əzəldə,
Yazılmış ola bir kişiyə taleyi-məs'ud.



* * *

Çal bu nəva pərdəsində nəğmeyi-tənbur,
İrər isən bu hicaza sə'y ola məşkur.

Gözləri mərdümliginə gözləri olan,
Düşməz olursa xətaya, olmaya məğrur.

Oxlar atar gözləri ki, taşları yarar,
Xəstəyə urur özini olamı məğdur.

Kirpüginün qət'ü vəslini təfərrüc qıl,
Bənciləyin necə məst ola belə məstur.

Rəf edəli hüsn rayətini cəmali,
Qıldı gözin nəsb ki, qıla dili məksur.

* * *

Şuna yetdi nigarına nizari
Ki, görəsin yerümizə məzari.

Ağızun nüqtəsin tuymadı həssan,
Bilün nazükligin bilməz Nəzari.

Ana könlək gərəkdür yasəməndən
Ki, geyinmişdür ax güldən izari.

Saçınun hər qılıdur eşqümə yol,
Hava yola gətürür hər azari.

Gözi guşəsinə can oldı mehman
Ki, mərdümligidür ox pa vüzari.

Şaha, kirpükləründən anladum bən
Ki, xunidə olur imiş üzari.

Yanağunun ləbi lə'lün qatında,
Suyı yox, məgər utanı, qızari.

* * *

Şəha, şəhla gözün içün diyümezəm bən ax, qara,
Nə zülf ola məgər ol gözə bir ağ ilə göz qara.

Məgər ud etdi həmsərlik sənün zülfün ilə, şaha,
Ki, özin gördi micmərdə oda yanmış, yüzi qara?

Qərəz axda, qarada yox, yar ilə birlik istərlər,
Şol axlıx ki, rizası yox, yarın anda dönə qara.

Gözün şahini qılursa könül kəbki ilə bazi,
Məcal olmaya bu avda, nigara, hiç şunqara.

Şaha, sor nə nəfir edər ki, bu dairədə ney içün,
İkilikdən ura bir dəm anun eşqində nəqara.

* * *

Əgər zülfündən, ey dilbər, diləyəm ki, dəm uram bən,
Nə dünyi qala, nə üqbi, qamusin vər həm uram bən.

Nigara, eşqün odından dəm olmuşdur bu yüregüm,
Budur dərdüm k'ani[1] oda ləbünçün dərdəm uram bən.

Bana şol cadu gözlərün atar bir ləhzədə yüz ox,
Hisabə gərçi ki, dildə ol oxları kəm uram bən.

Çü eşqün odı tutuşdı bu varlıxda nolısardur,
Əgər gözüm yaşı ilə bu köynügə nəm uram bən.

Fəna sikkəsin almışam, nigara, eşqün əlindən,
Gərək varlığa ol nəqşi qəviyü möhkəm uram bən.

* * *

Tolu vericək əlümə sən, saqi, nə dersin,
Almaya ələ adınımı, saqına dersin?

[1] Ki ani



Bən varlığumı oynamışam külli yoluna,
Yoxlıxmıdurur uş bəndə qalan baqi, nə dersin?

Ləb xüşk idügüm sordı ləbün bildi nədəndür,
Şimdi umaram bir tolu ayaqi nə dersin?

Can at salıban oldı piyadə rüxin içün,
Üyürürdüm, ey şah, qapuna yayaqi, nə dersin?

Şəh yoluna can oynayana lütf gərəkdür,
Can oynamışam bozma bu yasaqi, nə dersin?

* * *

Ləblərinün əsrükligi gözümdə degülmi?
Eşqi çiçəgi bitdi bu yüzümdə degülmi?

Bən atəşi-eşqindən anun yanə dururam,
Peydadur anun sözi bu sözümdə degülmi?

Özin nə qılur bizüm ilə, özinə desəm,
Leykin degüləm bən dəxi özümdə, degülmi?

Gözünlə görürəm, sənəma, bəndə fənayi,
Zira ki, görürlər suçı üzümdə degülmi?

Qaldı gözüm ardınca nigarın zira ki, ol
Anladı xəyalini bu gözümdə degülmi?

* * *

Şəba, şol nöqteyi-xalun günəş yüzində ayətdür,
Şəkər lə'lündən urur dəm, bu nə şirin bekayətdür.

Ləbindən bir əm istədüm, mürəssə eylədi camin,
Mey imiş dərdümə dərman, nə şirin istimalətdür.

Saçunun sağışıncadur, şəha, üşşaqi büsnünün,
Vəli bir nöqtə ağzundan qamusuna kifayətdür.

Qoxusı şöylə gəlür ki, xilafi yoxdurur sərvün,
Qədüni göricək ditrər dəlili istiqamətdür.

Əgər səbr edə gözlərün nəzər qılınca atmağa,
Bu yaralu könülümə bu dəxi himayətdür.

* * *

Bir dəm irürdi yenə yürəgümə peyki-səhər,
İşlədügini anun necəsi işləyə səhər.

Ani ki, gözün edər bu yürəgümə gözə göz,
Bilə halını anun əhli-dilü əhli-nəzər.

Gər olam mum anun eşqinə sudum nə ola,
Ki, könülində tutar hicrümi çün nəqşi-həcər.

Dün gecə basdı xəyalı yüzümə gəldi gözə,
Ayağı basduğı yerlərə yüzüm döşədi zər.

Yürəgüm kirpügün alında sanasın,
Nəştəri qanqı tamara ki, irişə qanı tamər.

* * *

Bağdadi-camalunçun gözüm çü şət olmuşdur,
Qan dənizinə könül talmağa bət olmuşdur.

Təsbihi hilal ayun qaşlaruna əgridür,
Zülfünə xəta mişkin nisbət qələt olmuşdur.

Hüsnün dənizi mövci salduğı qiranına,
Ənbər tününə girüb uş xalü xət olmuşdur.

Belün qılına qulam qalum budur anda ki,
Ehmali-cəmaliyə ol qıl məhət olmuşdur.

Hər nerdə ki, varlıx var yoxlığa girmişdür,
Sən sanma ki, ağzunda bu dəm fəqət olmuşdur.



* * *

Sən binüm ilə yar ikən, ey şəqrəqəqiqi,
Saldun yenə ayruxlar ilə buğraqəqiqi.

Bir cami-meyi əlünə bən verməz idüm,
Şimdi çəkər oldun tolular sağraqəqiqi.

Sən ingən idün şimdi nə ingən qaçar oldun,
Kükrər ikən uş qarşuna bu buğraqəqiqi.

Yəxnisidürür cadu gözünün dəlü könlüm,
Bağrum çü kabab oldı sana toğrəqəqiqi.

Eşq oxunı atmayısaram cüz bənişanə,
Sən bu yola necə ki, gərək oğraqəqiqi.

* * *

Ləbi lə'lündən almışam, nigara, zövqi-təhqiqi,
İnildümdən irişmişdür müsənniflərə musiqi.

Nə tammış ləbləründən bu şəraba ki, qan əsrükdür,
Anunçün tolu içərüz ayaxları ələr-riqi.

Təsəvvüf əhli bulalı səfalarını yüzündə,
Kimi səccadəsin satar, kərü qoz kimi əbriqi.

Cigər qanını gözlərün yürək odiylə su qıldı,
Əcayib karxanədür nidərlər qər'ü ənbiqi.

Şəha, məşşateyi-miskin saçunı gərçi cəm edər,
Nəsimi-sübh hər dəmdə irürür cəm'ə təfriqi.

* * *

Vardı, sənəma, könlüm gözlərünə dərd uma,
Dərman yenə həm oldur könüldəki dərdümə.

Bağladı, şaha, eşqün könülümə yüz şeşdər,
Tutam ki, gələ şeşlər, çarə nə bu nərdümə.

Bən eşqi havasında bir ah edisərəm ki,
İrməyə hava hərgiz his bab ilə kərdümə.

Bir gecə xəyalunı biribi bu gözümə,
Görsün ki, nə qılursın hər ləhzədə mərdümə.

Bir ləhzə əgər səndən kəndümə olam məşğul,
Adəm bigi olam ki, meyl eylədi kəndümə.

* * *

Qılalı qaşları mehrabına dil pənc namaz,
Başladı gisuları qafileyi-rahi-diraz.

Binəva rast qaçan qıla sazi-səfər,
Xasə ki, ola müheyyər besəri-rahi-hicaz.

Tən əlin aldı, ayax basdı könülün elinə,
Mülki-canı alısar gün öküşi ilə az-az.

Hüsnüni vəsfə gotürməz nə kinayət, nə zəmir,
Eşqüni şərhə irürməz nə həqiqət, nə məcaz.

Belüni büri, dilərsən ki, xəyal olmaya hiç,
Açma ağzunı dilərsən ki, hiç açılmaya raz.

* * *

Ayıx görimədüm heç anun gözlərini bən,
Bənzədimədüm aya anun yüzlərini bən.

Günəşdürür cəmalivü yoxdur aya məcal,
Çün görmişəm bu cəmdə yılduzlarını bən.

Peyvəstə gözlərün ilə hərgiz bulımazam,
Sahib qiran qaşlarun içün qərini bən.

İmani-şəm yandura könlüm ləbün içün,
Can ilə ola ki, oyaram işbu dini bən.

Hər nəsnə ki, saçında kəmin ilə anladum,
Şimdi deyüməzəm qamusından kəmini bən.



* * *

Dil özüni qani ilə qıldı nəmazi,
Qıldı o daz ilə yüzünə nəmazi.

Qıldı bu səvdayi ki, saçuna tolaşa
Ta məgər ola ki, bula ömri-dərazi.

Eşq nəvasi ilə nühüftə könülüm,
Mayə ola olmaz, olur isə bicazi.

Olmaya öldürimeyən sana nəfsin,
Kim ki, şəhidün olur isə ola ğazi.

Buni həqiqət bilün ki, yüzini görən,
Qılmaya eşqi duasını məcazi.

* * *

Aşiq olan yar yolına yanə gərəkdür,
Yana bilicək bu yola, ya nə gərəkdür.

Uş dökərəm gözlərinə qarşu qanumı,
Yavrı şahin qana dadanə gərəkdür.

Gər qəbul edə gözi qəmzələri ilə,
Canı fəda qılmağa bəhanə gərəkdür.

Qomadı xalivü düzdi yüzinə xalin,
Düşməgə şol tuzəğinə danə gərəkdür.

Bən ataram bu canumı qaşı yayına,
Atıcınun meyli hem kəmanə gərəkdür.

* * *

Xətayimidürür gözün nigarına əcəb çindən,
Səvab oldur könülə ki, oxı çıxmaya içindən.

Düri mənzum edər şe'rüm ləbindən söylər olursam,
Pərakəndə qılur müşki açarsam sözi saçından.

Əgərçi damdur zülfi, vəli quş danəyə düşər,
Nə deyəyüm ki, nə çəkdi könül hinduyi-gülçindən.

Nə vəsl ilə bəni buldum, nə hicr ilə nigarını,
Olüm bənə yikirəgdür həqiqətdə bu üçindən.

Məgər aya nəzər qıldum ki, gözün tolu qılmış ox,
Yeridür bu gözə hər nə ki, yoluğursa suçından.

* * *

Bu nə sevdadur saçından yenə canum başına,
Əql ilə könül bilədür sanma canum başına.

Yaş yüzümdə gər nişan etdiysə nola eşq içün,
Andan axan seyl əgər uğrarsa tağa aşına.

Şöylə müstəğrəqdürür qaşına peyvəstə könül –
Ki, məcalı yox ki, başı gircir isə qaşına.

Yüzünə toğru turuban, şəha, gözüm baxımaz,
E'timadı yaşına vardur ki, ana yaşına.

Yürəgi içində taşısa taşıdur yasəmin,
Canü əqlü dil anunçün bizdən ana taşına.

Qulluğı nəqş eyləmişəm dildə hüsnün görəli,
Necə ki, ömrüm var isə surətün nəqqaşına.

* * *

Yenə götürdi ələm qafiləsalari-eşq,
Köçdü yenə uş gedər bu dərdü divari-eşq.

Hər nə ki, yük götürür sür'əti əksük olur,
Quş ola gərək könül çün götürür bari-eşq.

Əvvəl içəndür gözüm eşq qədəhlərini,
Caridür anun içün gözümə idrari-eşq.



Münkir olursa nola xalq bu də'vamizə,
Var isə sözümüzə zərrəcə iqrari-eşq.

Yürəgümi yarıban aça idüm içini,
Taşra düşə qorxaram andağı əsrari-eşq.

* * *

Hiç özin dirəmədi zülfün ilə dəlü könül,
Qıla bənzətdi özin yüzün ilə dəlü könül.

Özini sində yetürdi bulmadı dəxi hiç,
Özini bula məgər özün ilə dəlü könül.

Ənbərin ola nə yir ki, ayağun basar isən,
Sini məgər ki, bula izün ilə dəlü könül.

Can yaşı gər yedi qat yerlərə irürdi isə
Ahı gögə irürə suzun ilə dəlü könül.

Müşk bazarını saçun, sənəma, qıldı kəsad
Şəkərün nırxını həm sözün ilə dəlü könül.

* * *

Qiyamətdür boyun, ey şah, dayim,
Saçun bölükləri ana əlayim.

Ləbünçün tar könülüm qərqi-xundur, –
Ki ta ola ana lə'lün mülayim.

Yalunuz bən dəgüləm eşq əsiri, –
Ki, tağlarda inilərlər həmayim.

Şəha, bir dəm dəmündən qıl dəmidə, –
Ki, yerdən turı gələlər rəmayim.

Ayağun tozuna başlar fədadür,
Fidi olursa başlara ə'mayim.

Müdam axa gərək qan-yaş gözümdən,
Çü eşqün odu oldı dildə dayim.

Nəticəndür sənün şol bikri-fikri, –
Ki, saxlamış könülində kərayim.

* * *

Bu nə xətadur ki, uş zülf qılur çin ilə,
Bu yenə nə şivədür bir yeni ayin ilə.

Şəmiyəm ol dilbərün nuruma qılmaz məded, –
Kim ala şəmün başın aləti-şəmin ilə.

Can necə ayru düşə səndən, ey can, çünki həq,
Əqd edə sənün bana eşqüni kəbin ilə.

Gözünə döyməyə göz leyk gərək ki, görəm
Dideyi-xudbini bən çeşmi-xudabin ilə.

Eşqün odiylə axar gözlərümün suyu çün,
Canda müxəmmərdürür badi-həva tiynilə.

* * *

Necə bir şol cadu gözün qəsdi-canü dil qıla,
Necə bir şol incə belün bu tənümi qıl qıla.

Gözlərüm gəmisi ləngər saldı qan dənizinə,
Qərqi-xun olsun əgər əzmini basa hil qıla.

Şol günəş yüzünə qarşu bən hilali olmuşam,
Ola bu əksüklüyi kim, hüsnünüz kamil qıla.

Necə qıla bir könül ki, hər qılıyçün zülfinün,
Kirpüginün hər qılından bir dəmi-sail qıla.

E'tidali-qamətündən ədl umar dəlü könül
Ki, məgər sərvini bizdin yanaya mail qıla.



* * *

Hicr ilə zarü nizarəm uşda bən,
Zülfi ilə biqərarəm uşda bən.

Şəm kibi sararuban ağlaram,
Tana çıxarub yanaram uşda bən.

Şe'rə dönmüşdür tənüm belün ilə,
Od içümdə çün fənaram uşda bən.

Qəmzən oxiylə ləbünün meyinə
Gəh qanaram, gəh qataram uşda bən.

Ləblərünün yadına xuni-cigər,
Necə ki, içərəm xumaram uşda bən.

Eylə qarandur canum vəslünə ki,
Varlığı bir-birinə qaram uşda bən.

Gül ərəq qılur görəli yüzüni,
Ol həyadən şərmsarəm uşda bən.

* * *

Eşqi odı dilbərün bu başa çıxarsa,
Ola əcəb ol od ilə başa çıxarsa.

Taşa taşun gözləri cigər qani ilə,
Hüsni cəmali şüayi-taşa çıxarsa.

Ani ki, gizləmişəm bu tar könlümdə,
Yedi fələkdən yuxaru aşa çıxarsa.

Tapuna can verməgə bəhanə gərəkdür,
Qılma ana te'nə gər şabaşa çıxarsa.

Könüli sal bəndə qara saçlarun ilə
Dik gözünün oxlarına qaşa çıxarsa.

* * *

Ya rəb, irür şol günə ki, yara irişəm,
Fürqətinün dənizini yara irişəm.

Də'vət edər gözləri fənaya könüli,
Cəhd edərəm tezcügəz ki, cara irişəm.

Həlqeyi-dər qaxaram qapuya gecə ki,
Həlqeyi-zülfi-siyahkara irişəm.

Qızaru irişəli gözümə yanağı,
Cəhd edərəm ola ki, sarara irişəm.

Yazmadı göz yazduğını bu cigərümdə,
Başda nə ki, yazludur nə çarə irişəm.

İncə beli yolı incədürü uzundur,
Dövlət ola, anda gər kənara irişəm.

Aldı keyik gözlərilə könlümi bənüm,
Vardum idi yə'ni ki, şikara irişəm.

* * *

Fitnei-axir zəmanə oldı bu qamət,
Tur uru salın bəgüm ki, qopa qiyamət.

Qanumı çox içdilər anun əsəridür.
Mərdümi-çeşmünə oldı isə səqamət.

Eşq səpişkəndürür könüli, ey mə'şuq,
Qılma səni sevdügünə bunca məlamət.

Bən qomazam irməgə yenə sana bəni,
Yoğ isə səhl idi ortalıxda məsafət.

Olmaz isəm bən nedim bir gecə sana,
Aqibətül-əmr işüm ola nədamət.



Söylə ki, mö'ciz gözünə nöqtə ağızdan,
Ver ləbüni ağzumavü anla kəramət.

Atdum özüm buldum isə nur ə'la nur,
Fani əgər oldum isə xeyrü səlamət.

* * *

Gözlərümün yaşları necə ola carı,
Necə sinünlə tolu ola bu məcarı.

Çərxi-fələk devr qıldı dairə madar,
Görimədi günəş cəmal kibi mədarı.

Gözləri məxmur idivü lə'li-ləbi tək,
Suvarımadı kimərsənə bu xumarı.

Zər qıluram yüzümivü qalmadı zorum,
Zirü bəm ilə qıluram uşdaya zarı.

Vəsli-mübərqədürür nova bu canuma,
Gər qıla üşşaq fəth işbu həsarı.

* * *

Şərh edimeyə ləbüni dilüm ola lal,
Gözlərümün yaşı anun içün ola al.

Bən xo sənə bağluyam, bu dam ilə danə,
Nəyə gərəkdür ki, düzdi zülf ilə bu xal.

Eyddürür bənə bədr yüzüni görsəm,
Aşiri-zi'l hiccə nə, ya əvvəli-şəvval.

Bir görürəm kəndüzümi yar ilə dayim,
Əhval əgər müxtəlif görür isə əhval.

Bir nəfisə qalmışam ki, varlığum oldur,
Sizə fidi ruzü həftəvü mah ilə sal.

Könlümi bir qılı ilə zülfi-siyahı,
Saldı məzadına ki, məzid ola dəllal.

Kirpügünün qəmzəsi yürəgümə fəssad,
Ayağunun toprağı bu gözümə kəhhal.

Malı fidi eylədümü keçdim eməldən
Getməz isə bu əməldən irişə amal.

* * *

Qara könül gisularına düşər isə,
Kirpügün arıları ana üşər isə.

Mümkin ola ki, irə qədinə əlüm gər,
Başuma sevdası ırmağı aşar isə.

Tifldür eşqi könülümün beşigində,
Görəsin anı nədür, iki yaşar isə.

İncədürür dil beli yolına varımaz,
Bən vururam saçı qılını qoşar isə.

Eylə ki, can vermişəm yolına belünün,
Əcəb əgər bu beli kişi aşar isə.

Açıla həft uçmağun qapusı bənə gər,
Dügməsini yaxanun əlüm şəşər isə.

Ənbəri sevdasını ki, xam sanuram,
Eşqinün oda ilə nola bişər isə.

* * *

Yerdə görübən zülfin əlüm saqına sundum,
Ə'fi sanuban zira əlüm saqına sundum.

Zülfi kibi müşkin ilə oğramadı yolum,
Andan bərü ki, bən əlümi aqına sundum.



Ayinə yüzində könülüm eşqini rövşən
Gördüm dəxi lə'li-ləbinə, baqına sundum.

Şəftalusını dirməgə irməz idi əlüm,
Yüz sürmək içün ayağına saqına sundum.

Mey toludurur lə'liləbün cam bizə sun,
Sor lə'li-ləbündən k'ana, ey saqi, nə sundum?

Saqi tolu tutmış əlinə lə'l ayağını,
Divanəsiyəm nola gər ayaqına sundum.

* * *

Girməz ələ bu dünyədə gər dilər isən yar,
Kəndözüni bu dərd ilə, ey dil, ərisən yar.

Çün dil didilər bu könülə kirpüg ilə dil,
Əsirgəmə, sözümi eşid, dilər isən yar.

Təşnəlik odına, ey könül, yan bulamazsın,
Ağzından anun almaz isən dil ərisən yar.

Mə'şuqəyə dedüm ki, əgər hüsn ilə yendün,
Ərənlərə baxma nola çün dil ərisən yar.

Ya ruh demədin dəxi can tapuna varur,
Bir rəmz ilə dək dəpgil, əgər dilər isən yar.

* * *

Çü güldə hüsni-cəmalini dilbərün yazalar,
Xətin görürlər isə qamular gərək azalar.

Kişidə ki, ola bir can gərək ki, gözə düşə,
Əgərçi cəhd edübən xublar gözin süzələr.

Saçı qılına yapışub bu yolı bən varuram,
Hidayət anlarun ola bu yolda ki, azalar.

Səvab ola çü düşə gözlərinün oxı səvab,
Xətaya yazmayalar çünki bir oxı yazalar.

Yüzi ilə saçı tək olmaya gecə-gündüz,
Cəhan öziylə saçı qılını əgər üzələr.

* * *

Olamı rəva gözi qıla yara könüldə,
Kim deyə gözi qılduğını yara könüldə.

Gözləməmişəm cüz ki, sənün eşqüni, şaha,
Gəz başdan-ayağına dəgin ara könüldə.

Nəqş etdi, şəha, hüsnünü eşqün könülümdə,
Şöylə ki, gözün eylədi yara bu könüldə.

Cana ki, bərahim idi eşqünün odına,
İrişdi saçun ənbəri sara bu könüldə.

Biçarə könül yaxdı özin lə'l yolına,
Həm andan ola çarə bu biçarə könüldə.

* * *

Gecə-gündüz bənüm işüm zar ola,
Qorxaram fitnə gözün bidar ola.

Səndən özgəyə baxımaz gözlərüm,
Görməyə məgər səni naçar ola.

Necə qurtara bilə gişi könül,
Çünki mə'şuqi büti-əyyar ola.

Zəhr içün tiryakı qoymax olamı,
Lacərəm ki, gül qatında xar ola.

Gah mehrab ola qaşlarun bənə,
Gah zülfün belümə zünnar ola.



Də'viyi-zühdü nəmazuna sənün,
Taş bağırun mucibi-inkar ola.

Eşqə bürhan gösdərür yüzün əgər
Bir nəfəs lütfün bizümlə yar ola.

Qanqı dindədür rəva bu hal ki,
Bən xumarü ləblərün xəmmar ola.

Çün xəyalün qıldı gözümdə məqam,
Vacib oldı ki, ana idrar ola.

Kim ki, bizari ola bazaridür,
Kim ki, bazar isdəyə ba-zar ola.

Şol könüldə ki, sən olasın, şəha,
Diləməzəm ki, dəxi dəyyar ola.

* * *

Doyımaya bu yürəgüm odına ahın,
Gər irürsə həva vücudına ahın.

Könlümi qapdı gözün alımazam əldən,
Şöylə ki, yaz kəgligin zəbun edə şahin.

Daneyi-xalünə düşdi bu dəlü könül,
Adəmilixdür, nola, bağışla günahın.

Dil saçına vardı, dəgdi gözi oxına,
Gördi siyahını anlamadı sipahın.

Kəndözini bilməyən qaçan bilə Rəbbi,
Biliməyən səni bulamadı ilahın.

Xoş görəlüm sənün ilə fəsli-xəzanı,
Sun bərü cam ilə tolu abi-rəzanı.

Ruhi-rəvan sun rəvan əlümə, ey ruhum,
K'oynayayum yoluna bu ruhi-rəvanı.

Olmadımı dəm ki, bir nəfəs sana irəm,
Necə çəkəm ayrulığ ilə nigəranı?

Eşqün ilə bən ziyanı sud dutaram,
Sağışa götürməzəm bu sudü ziyanı.

Yazınına gəlmədin vücudumi yaxar,
Görimədüm bu bəni yaxanı ya xanı?

Canum içində yerini düzdi könülüm,
Sanmaz idüm yar ilə ola bana canı.

Bir dəm umaram ki, ola yar ilə bir dəm,
Ol dəmi gətür ver talana dükanı.

* * *

Gör ki, nə vermiş ilah fəsli-xəzana,
Gör ki, nə pür eyləmiş zər ilə xəzana.

Qıl sanuban belüni saçuna tolaşdum,
Qıl nə qılursan, bəgüm, bu yoldan azana.

Cami-zücaciyi göz cigər qanı ilə,
Görəli pür meyl qıldı abi-rəzana.

Şükr edərəm görəli cəmali-nigarın,
Alnuma bənüm bu yazuları yazana.

Canumı saldum saçınun ətəginə ki,
Ömri uzundur, ola ki, ömrüm uzana.

* * *

Günəş, sənəma, bənzəyüməz yüzünə, derəm,
Aybını yüzünün yenə həm yüzünə derəm.

Bən bəgümə bin bəgə həm carlamışam ki,
Bəndə olalar cümlə sənün yüzünə, derəm.



Şəha, yüzünün yüz yüzi var bu iki yüzüm,
Toprağ ola yüz vəch ilə bir yüzünə, derəm.

Yüz hüsn ola səndə ki, umar hər biri yüz can,
Bir canı necə yetürələr yüzünə, derəm.

Gər varmısa peyvəstə qaşıyla qara gözi,
Günəş yüzi bənzəyə idi yüzünə, derəm.

* * *

Qopdı yenə könülümdə zəmzəmeyi-eşq,
Söylənür oldı içümdə dəmdəmeyi-eşq.

Hər nə ki, hökm etmiş idi gəldi başuma,
Sübhi-əzəldən bərü bu məlhəmeyi-eşq.

Varlığumun cümləsini gəldi apardı,
Varlığuma qonaq olalı həmeyi-eşq.

Lə'li-ləbün hər nə ki, qodı könülümdə,
Dökdi gözüm camına bu qumqumeyi-eşq.

Salalı hüsnün atın vücudum elinə,
Düşdi atınun öninə bu rəmeyi-eşq.

Eşqi dəlü könülümə salu dəgülmi?
Canü könül eşqi ilə dəlü dəgülmi?

Qaşı ilə gözləri könülümə qarşu,
Kimisi oxluvü kimi yalu dəgülmi?

Talsa nola gözlərümə yüzi xəyali,
Gözüm axıtduğı incü lö'lö dəgülmi?

Varlığuma varlığun əgər tolu oldı
Noldı cəhan sənün ilə tolu dəgülmi?

Odlu idi eşqüni yürəgümə qodun,
Sun totağun ağızuma sulu dəgülmi?

* * *

Lə'ldürür ləblərün vəli şəkəridür,
Al yanağun tazə-tər zirvədi – təridür,

Əzmi-səfər qılalı şikarə bu gözlər,
Quşca canum anlara nəməridür.

Canumı qıl eyləyüb belinə gəmişdüm,
Dövlətə irmoz olur iso xətəridür.

Könülümi yaxmayınca toğmadı eşqüm,
Zira həva kimiyasınun hocəridür.

Eşq ilə xoşlıx ki, işbu dəmdə görürəm,
Ağızunun nəfəsi gözün nəzəridür.

* * *

Düşəli lə'li-ləbünün xəyali çeşmə, bəgüm,
Əcəb dəgül qan ilə oldı isə çeşmə, bəgüm.

Nihayətə irər ol hüsn ki, apara canı,
Çü qayətə irəsin, irdi, həddən aşma, bəgüm.

Saçun girehlərinə bən tolaşmışam çoxdur,
Cəfa atma binübən bana ulaşma, bəgüm.

Könüli gisularun bəndinə çü bağladun,
Cigərdə qəmzələrün oxlarını şeşmə, bəgüm.

Yüzün çü məzhəri-nuri-cəmaldür, şaha,
Günəşi gisularun ənbəriylə yaşma, bəgüm.

* * *

Arif oldur ki, bulımaz yar qatında özini,
Eşq bir bazardur ki, anda satılmaz özini.

Ənbəri kafurdan hüsnündə seçməyin kişi,
Dünyasında necə bilə gicədən gündüzini.



Kim ki, ata kəndü varlığını şəmsün nurına,
Sə'd isə, nəhs isə bilə kəndünün yılduzını.

Hüsninə zülfindən özgə irməgə yoxdur səbəb,
Uzun isə nola tutun hər bir işün uzını.

Yüzini hər kim ki, qıla xak yarı yolına,
Yar yolında bilə gərək hər işün hər yüzini.

* * *

Şəha, gözünün dərdi bu dəm cana dəvadur,
Lə'li-ləbünün qam dəxi cana şəfadur.

Gisuların aşüftə görürəm könülüm tək,
Bənzər ki, pərişan edən anları həvadur.

Bir pərdəsərada nola gər iniləyəm bən
Ki, bülbüli-divanə dəxi pərdəsəradur.

Canuma bəla türki gözi qəmzələridür,
Gəlməz sağışa gisuları, zira qəradur.

Ağzun yarına qulamü gözün yarasına
Ki, ol ikisi nə ki qılur isə, yaradur.

* * *

Əgər oğrarsa gözündən könülüm, şəha, yaraya,
Ləbündən sorarəm k'ana əcəb dəxi nə yaraya.

Tənüm şöylə düzilmişdür belünə ki, xəyal oldur
Ki, şimdən sonra dəxi qıl gərək girməyə araya.

Gözümdən lə'l ilə lö'lö ayağuna dökərəm bən,
Günəş yüzündə bilürəm ki, yoxdur meyli-pirayə.

Sənün ilə bir olmışam araya kimsənə girməz,
İnanmazsan xəyalüni biribi könlə k'araya.

Əgər əksilə, gər arta yüzi günəşə qarşudur,
Kişi ki, günəşi sevə, gərək bənzəyə yaraya.

* * *

Çü nəqş eylədi ol xaliq bu surətdə həyulasın,
Misal eylədi, deyəsin, ana firdövsi-alasın.

Zihi məvludi-fərrux rüx ki, ruh andan həya qılır,
Bu nə kafürü ənbərdür ki, həq eylədi lalasın.

Görəli sərv ilə sünbül pərişandurü ditrərlər,
Biri zülfi-səmənsayın, birisi qəddi-balasın.

Bənümlə toğrudur boyı, vəli kəc düşdi qaşları,
Alaca görürəm dayim anun caduyi-şəhlasın.

Gözindən ayağ içicək ki, can ağzuma irişür,
Umaram nüql içün püstə vəlikən şol mühəllasın.

Bu gün bildüm ki, cismə can sənün eşqünlə bağlanmış,
Bu mə'lulə irişdürün yenə əsbabi-ulasın.

Bu eşq içində tövhidə mühəqqəq ilədüm olam,
Zəmandur, lasına irdüm, vəli bulmadum illasın.

* * *

Dirilün, aparun bəni yaruma,
Şol ləbi şəhdü kirpügi aruma.

İkimüz birüzü yaruyam bən,
İrirün bu yaruyı ol yaruma.

Azar oldı könül xəyali ilə,
Göstərün ol büti bu azaruma.

Bən yüzindən oxıduğum mə'ni,
Vurdı yüz tə'nə işbu əzbərümə.

Zülfüni yelə verməgil, şəha,
Düşməsin fitnə işbu ləşkərümə.



Könül oldı həvan ilə cövhər,
Bir cila isdərəm bu cövhərümə.

Gözümi hüsnün ilə rövşən qıl, –
Ki, urur sikkə aduna zərümə.

* * *

Eyb eyləməgil yaşumı gər ala dönərsə,
Şol lə'li-ləbün könülümi ala dönərsə.

Bən sənün ilə müttəhidəm yoxdur ikilik,
Əhval nəzəri nola bu əhvala dönərsə.

Könlüm quşı bir oğradı qurtıldı tuzaxdan,
Yüz gəz tutılur geysu ilə xala dönərsə.

Yar hüsninə satdı gözi varlığumı bənüm,
Bir can ola bu ortada dəllala dönərsə.

Sögmək ki, ləbündən çıxavü mədh ola bana,
Nola, şəkərün ağusı gər bala dönərsə.

* * *

Nigara, oluram bən səndən irax,
Ki, ayrıldum tapundan səndən irax.

Günəşdən düşən irağ ay olur bədr,
Hilal olmışam uş bən səndən irax.

Bənüm ayinüm oldur ki, yoğ olur,
Düşən ayru ayından səndən irax.

Çigərdən özgə hiç nəsnədə turmaz,
Çıxan ox şol yayından səndən irax.

Qara göz ilə çün candan çıxardun,
Çıxarma bari dindən səndən irax.

* * *

Şəha, hicrün ilə zaram, irax səndən, irax səndən,
Firaqun ilə yanaram, irax səndən, irax səndən.

Nigara, xüftə gözündən ki, məstəm, olmışam məxmur,
Anunçün gecə bidaram, irax səndən, irax səndən.

Gözündən qanıdur yaram, buyurmaz isən, ey yar, əm,
Gərək ki, yürəgüm yaram, irax səndən, irax səndən.

Bənə əm desə ləblərün, nola, çünki təbibümdür,
Çü hicranunla bimaram, irax səndən, irax səndən.

Tapundan ayru bazaram, özümdən dəxi bizaram,
Firaq odıyla yanaram, irax səndən, irax səndən.

* * *

Şöylədürür bu könül ki, özini bilməz,
Aşiq olan könül xud özini bilməz.

Suzişi olmayana suz işini dimən,
Göz yaşı dəxi könüldə suzmı bilməz.

Şöylə gözüm ilədür cəmalı anun bir,
Ki, bu gözümdən kimsənə yüzini bilməz.

Yüzinə qaçan ki, gözi tuş ola aşiq,
Ayruğı nə bilə çünki, özini bilməz.

Zülfi ilə yüzinə kişi ki tuta xu,
Anlayımaz gecəsini, ruzını bilməz.

* * *

Zülfünlə dəlü könül aşüftə degilmidür?
Fitnə gözün əsrükdür, hiç xüftə dəgülmidür?

Qiymətini lə'lünün sordum yenə kəndüdən,
Hiç ağzını açmadı pəs, süftə dəgülmidür?



Nakərdeyi-əltafın bən kərdəyə sayaram,
Nagüftə ağzından çün güftə dəgülmidür?

Yürək qanı izini yetirdüm ağzına,
Zənnün nə durur k'anda bünhüftə dəgülmidür?

Qaşları ilə yüzin görəli üç ay oldı,
Fikrün nədürür, mahi dü həftə dəgülmidür?

* * *

Bu mövsümün əhli-dili ol gül gülə qarşu,
Tolu içəsin, şad olasın bülbülə qarşu.

Yüzün güli üşküftə ola qala şüküftə
Ki, nə yüz ilə açıla hər gül gülə qarşu.

Mül ver bizə saqi tolu ki, nərgizdür məst,
Salma bü dəlü könül işin mülmülə qarşu.

Dök cama süralı qanın əsirgəmədin ki,
Hər qul qula səcdə qıla ol qülqülə qarşu.

Gözüm kibi cam olmaya məclisdə, nigara,
Ki, necə ki, dökə meyi, dər dəm tola qarşu.

* * *

Bülbül ünin işitdi, qavqaya çəkər bu dil,
Gül qoxusını aldı, səhraya çəkər bu dil.

Gül yoluna gözlərüm qızardalı eşqini,
Nərgisləri yolına sevdaya çəkər bu dil.

Gisuları binmişdir hər ləhzə nəsim atın,
Xəttinə varur bənzər yaya ya çəkər bu dil.

Bən anavü könülüm könülinə qomışam,
Bır əhli-dil anlasa nə qayə çəkər bu dil.

Bir busa umar ləbdən yüzin yüzə dəgşürür,
Anlasalar anı ki, hər aya çəkər bu dil.

Bən sinəmi sınayu açdum bu nəsim içün,
Yaxama yapışuban yaxaya çəkər bu dil.

Can tihi-məhəbbətdə heyrandurü sərgərdan,
Qalmadı məni bunda səlvaya çəkər bu dil.

* * *

Canuma bir bəla idi səmayi
Cəmalün ki, xəcil qılur hər ayi.

Sən ayi sevərəm zira ki, rövşən
Sevər əhli-dili rövşən Sənayi.

Çü uyxu görməzəm, düş deyüməzəm,
Xocəndi kibi gözündən riyayi.

Oduna yanmışam külli dəxi yox,
Əgər atar isə səhmi-xətayi.

Gözün tiri-qədərdürür könülüm,
Riza ilə qəbul eylər qəzayi.

Dilü əql ilə can verdüm bəvana,
Saçun əqd etdi bu bey'ü şərayi.

Qədün tək rasta bən işbu yolda,
Xocəndi kər qılursa iftirayi.

* * *

Gəl, gəl, görəlüm, gəl görəlüm, gül görəlüm biz,
Bir nəğmə gətür ortaya bülbül görəlüm biz.

Güldür yüzünü mül totağun söhbətümüz gərm,
Bu işimüzi pəs nişə mülmül görəlüm biz?



Biz yanaruz oda, sənəma, bənlərün ilə
Ənbərdürür ol, daneyi-fülfül görəlüm biz.

Biz gül yanaruz odına hər cüz dəxi həm,
Hər cüz'ümüzi ol yola bir kül görəlüm biz.

Bir nəğmə di ey mütribü sun, saqi, bir ayax
Ki, ğülğül eşidəlümü qülqül görəlüm biz.

* * *

Qanı dil ki, gözünlə parə dəgül,
Bu könül axı səngi-xarə dəgül.

Zülfünə düşməyincə necə ola,
Məgər ol ki, gözi qarə dəgül.

Can canuna irərü tən ləbünə,
Bu könüldür ki, hiç karə dəgül.

Hiçdür hiçü hiçdən dəxi hiç,
Şol könül çünki eşqbarə dəgül.

İşbu meydan içində könlüm tək,
Bir könül dəxi şəhsüvarə dəgül.

Anda kim könülüm top urmışdur,
Dəxi könül irə qubarə dəgül.

* * *

Bu ali eşqünlə, ey yüzi Həsən,
Şol Hüseyni ləblərün olsun əsən.

Şol xəttünlə rast bənə ruq'ə yaz,
Bənüm olsun sərvi-bustani-çəmən.

Cana dedüm bir əmin şol le'l içün
Ki cəhanda olmaya onı əmən.

Xəttuni gördüm ləbündən soraram,
Qanda buldı ənbər ol bərgi-səmən?

Dedi ki, məgər irürdi ol süheyl,
Bu əqiqə dün gecə buyi-Yəmən.

* * *

Yara, yara yara kimi yar olasın,
Necə işbu gülə bir xar olasın.

Tolaşdum zülfinə dün gecə dedüm,
Necə Mənsurə sən bər-dar olasın.

Dedüm bülbülə ki, eşqündürür hiç,
Bu bazarunda gər bizar olasın.

Ləbindən bir ayax içdük tolu sən,
Nola gər məxzəni-əsrar olasın.

Əzəldən eşq baziylə gəldük,
Key isə sən dəxi sər-bar olasın.

Gözüm cədvəllər axıtduğı budur
Ki, sən bir gün bənə bərkar olasın.

Bizüm otağumuza gəldügün yox,
Məgər kim dəmbədəm azar olasın.

Tapundan birlik umarız qaçan ki,
Der isən yarunam əğyar olasın.

Ləbindən cami-mey pür çəkü qurtıl,
Necə gözi ilə bimar olasın.

Şükür ki, şəkkər axar ləblərindən, ey dilbər,
Şükür ki, gisuların saçdı aləmə ənbər.

Kim idi həlqeyi-zülfinə dilbərün tolaşan,
Həva ilə qapuya qaxmayınca həlqeyi-dər.



Həva ki, qıldı pərişan nigar gisusını,
Nə lazım ola dili qıldı isə zirü zəbər.

Necəsi qanmaya ləbləri yürəgüm qanına,
Necə susarsa ləbi aşiqün yürəgi qanar.

Qədünə qarşu ney olup belümi bağlamışam,
Ola ki, atəşi-eşqün bitürə bir şəkkər.

* * *

Ey şəm, bizi tap dəxi odlarına yaxma,
Ey bədr, yüzün gösdərübən tezcək oyaxma.

Ey ruh, necə nazik isən hər cəsədə sən,
Saxla özüni, mail olıb hər nəfəs axma.

Eşqüni sənün əqlə-könülə dimədüm bən,
Hər ləhzə anı qəmzən ilə aləmə çaxma.

Sənə baxalı baxmadı hiç özgəyə gözüm,
Səni sevənün sən dəxi hər suçına baxma.

Biz xud qələndərüz, bu savü avına girdük,
Səndə bu həvəs yox isə bu qapuyı qaxma.

* * *

Nələr edərsin bizə hay sən nigar olmamış,
Kimdür sənün yoluna zarü nizar olmamış.

Lə'li-ləbün eşqinə çoxlar içərlər süci,
Bəndən özgə kişi yox, anda xumar olmamış.

Ləblərüni göribən qurımayınca qanlar,
Keyiklər göbəgində müşki-tatar olmamış.

Dəgməyincə yürəgi kirpügün oxlarına,
Hərgiz güli-suridə suzənü xar olmamış.

Həm sayədürür canum hicrün qəminə çoxdur,
Ləblərün arası tək hüsni-civar olmamış.

* * *

Çeşmüm pürabü gözlərümün xabı yoxdurur,
Qatunda gözlərüm yaşınun abı yoxdurur.

Bən nariyəm ki, abi degüləm həvanuza,
Xakidə gözlərüm kibi hiç abi yoxdurur.

Dil gərçi dəlüdür bu gözə-qaşa düşəli,
Sanma anun ki, məscidü mehrabı yoxdurur.

Yüzümdə zə'fəranını suvardı qan ilə,
Gözdən əgərçi könülə dolabı yoxdurur.

Xalis nigari-eşqinə sikkə uran zərə,
Şol qəlb ola ki, qalibi-qüllabı yoxdurur.

* * *

Gözündurur bu dərdümə dərman bi'aynihi,
Dərdüm bu ki, verəm gözünə can bi'aynihi.

Qəmzəsi nəfy qılurü isbat işvəsi,
Gözləridür məgər bənə iman bi'aynihi.

Nərgis çəməndə gözlərünün qaravaşıdur,
Xadimdurur bu gözümə mərcan bi'aynihi.

Ağzunı açmayınca kişi gözi görmədi,
Yaqutü lö'lödən ləbü dəndan bi'aynihi.

Ruzi-qiyaməti sən anun qamətində gör,
Gözümdən anlağıl dəmi-tufan bi'aynihi.

Xətti bimislihi sanasın Xızrdur anun,
Çün yarı oldı çeşmeyi-həyvan bi'aynihi.

İnsan olan gözinə necəsi qapılmaya,
Çün hər gözində əglənür insan bi'aynihi.



Yaş irmağını irmağa kimün məcalı var,
Çünki gözüm yaşı ola ümman bi'aynihi.

Odü sudur gözüm ilə könülüm arası,
Düşdi ikisi arasına qan bi'aynihi.

Qaşları ilə eyd qılur könülüm vəli,
Qəmzəsi qıldı canumı qurban bi'aynihi.

Qaşları hacib olalı bu könül elinə,
Rövşəndürür, gözləridür can bi'aynihi.

* * *

Dəm degülmi ki, sərv bara gələ,
Yarun incə beli kənara gələ.

Gözi könli ki, yaralar, nə əcəb,
Oxı yaş dənizini yara gələ.

Nişə urur çəmən yüzinə saçun
Ki, bənəfşəsi yüzi qara gələ.

İntizari-xoyali qan axıdur,
Gözlərümdən ki, ta pinara gələ.

Yeg ola yeg zülali-heyvandan,
Gər ləbündən tolu xumara gələ.

Göz qarara gəlür saçun anıcax,
Bəs necəsi könül qarara gələ.

Ləbləründən nigara dür dökərüz,
Qanda bir böylə şe'r bara gələ.

Kim kor isə bu məclisi qovalum,
Şuna degin ki, kəndü vara gələ.

* * *

Yazmış yüzində gisusı reyhan bixəttihi,
Can yazdı ana özini qurban bixəttihi.

Gözləri qəmzə oxı ilə adəm öldürür,
Şirin budur ki, lə'li qılur qan bixəttihi.

Gözləri sehr qıldı könülə bi'aynihi,
Qullığa yazdı kəndüzini can bixəttihi.

İmani-nurini gisusı küfri uzatdısa,
Gör necə yazdı ayəti-iman bixəttihi.

Bir qətrə rəhmətini qulından əsirgər ol
Ki, virdi Xızra şərbəti-həvyan bixəttihi.

Can ana vardı lə'li-ləbindən zülal uma,
Dilər qıla ziyafəti-mehman bixəttihi.

Müşki qarınca ayağı düzdi xəti anun,
Gisusı der zirə bə kirman bixəttihi.

* * *

Yaraşmışam həvasına bən yılü ay ilə,
Gözindən əsriyən necə ola ki, ayılə.

Şol müştəridür ol ki, çəkər zührə sazını,
Şöylə, günəşdür ol ki, qılur söhbət ay ilə.

Gisusı ilmələrinə iylə diyən kişi,
Bilməzmi anı ki, qurıcax tuzağa ilə.

Zülfi kəmənd ilə könüli saldı bəndinə,
Xətti dilər ki, talaya canı, yaya yelə.

Yoxsulü bəy ilə aparur başa halini,
İlla qaçan ki, səni görür isə bayılə.



* * *

Bunca zəman ki, keçdi ömür bu cəfa ilə,
Şükranələr gərək ki, keçər uş səfa ilə.

Şol dərd qulıyam ki, dəvadur anun qulı,
Bən qulıyam bu dərd iləvü bu dəva ilə.

Yürəgümə toxındı gözinün oxı anun,
Sayman hesabə toxunan oxı xəta ilə.

Bən toprağ eylərəm yüzi ayağı tozuna,
Şayəd ki, bir işarət ola xaki-pay ilə.

Qəmzəsi oxlarına dedi işbu gözüm ox,
Rizvan dəxi qıl ola bu hurə riza ilə.

Dərdi dəvaya irürə bilsə dəli könül,
İksir qıla bilə idi kimya ilə.

Vəslün gecəsi tən canına infi'al olur,
Surət necəsi bağlaya yatmax qəba ilə.

* * *

Saçunla müşk, həm müşkin dəgülmi?
Yüzün ayü küpən pərvin dəgülmi?

Gözün ayinəyi qoymaz əlindən,
Bu caduyi-siyəh xudbin dəgülmi?

Sözüm şirin düşər lə'li-ləbindən,
Yüzündən rövşənü rəngin dəgülmi?

Könülüm serçəsini uşıdursın,
Nigara, könülün səngin dəgülmi?

Şəha, Bəhrami-Gur ki, atar idi,
Anun atduği ox çubin dəgülmi?

* * *

Saçuna uğrayu gələn nəsimə uçdı könül,
Bu dünyada dəxi nə zər, nə simə uçdı könül.

Nə dəmdürür ki, nə dəm gəlməz ola ardunca,
Və leyk dün gecə key şol nədimə uçdı könül.

Müsafir oldı könül hüsni eli içində,
Məlahətin görəli şol müqimə uçdı könül.

Nola idi, qamu quşlar bu gülşənə gəlsə,
Təfərrüc etsə arada ki, kimə uçdı könül.

Özümi bulumazam ki şərh edəm tapuna
Ki, hicrün ilə əzabi-əlimə uçdı könül.

* * *

Tənümi cana irürincə gəlmişəm canə,
Əcəb nə kafir imiş zülfü, gəlməz imanə.

Ləbi ki, qana gəlüpdür yürəgümün qanına,
Rəva durur ki, cigərüm qanına ol qanə.

Nəsimə qul oluram nə zərü nə sim gərək,
Ki, urdı müşk saçına nigarımın şanə.

Yanamı eşqi odına əcəb bu varlığumuz,
Ölümə girsə totağı sora idüm ya nə.

Tən ilə əqlü könüldür, şəha, fəda yoluna,
Arada can xəbəri yox, nə gəldi bu canə.

* * *

Əcəba, dərdümün dəvası qanı?
Əcəba, rəncümün şəfası qanı?

Ayağı tozına yüz ururam
Ki, göz ağrısı tutiyası qanı?



Zülfi pil binübən irişdi canə,
Ənbərin xəttinün yayası qanı?

Kimiya ilə qıldı zər yüzümi,
Yarı bulmağa simiyası qanı?

Sidqümi bildi hüsni eşqində,
Bəs bizə vəslinün səfası qanı?

Əl-ayağ ilə başü can oynamayan,
Eşqi yolında dəstü pası qanı?

Yaxası hicr odına yüz bin yil,
Qoxmayan eşq ilə yaxası qanı?

* * *

Həva nəsimi gül ilə vəli müəttər edər,
Bu riqqət ilə səhabun gözün müqəttər edər.

Səhərdə bülbüli-şeyda tərənnüm eylədügi,
Gülün məhasinini olamı ki, əzbər edər.

Ləbünə bənzədiməz tuti şəkkəri hərgiz,
Necə ki, eşq odına yanıban mükərrər edər.

Dutar çiçək yenə simin sipər fələk oxuna,
Əgərçi həddi dəgüldür vəleyk dərxor edər.

Quşun kimisi mühəddisdürür bu mədrəsədə,
Kimisi vaiz olup, sərv üzrə minbər edər.

Yaşı uzun gözümünü yeli səbanın yeg,
Ki, biri rövzayı tazə, biri müənbər idər.

Nə haldur ki, gözün fitnə qapusın açmış,
Dilün xəlayiqə rəhm evini mühəccər idər.

* * *

Bahar etdi yenə bir yeni ayin,
Ki, hüsnindən xəcil qıldı gök ayın.

Sipər qıldı yenə gül sinəsini,
Çü peyvəstə görür ol qaşı yayın.

Yüzün tək ayinənin var səfası,
Vəli qatı biçüklüdür bu xudbin.

Gözümün yaşı ki, uzun axıdur,
Həmişə altnun üsdində çayın.

Könüldə kim bilə ki, nə qopısar,
Ki, qonışmış yenə ay ilə pərvin.

* * *

Sərvün ki rəvan oldı, rəvanə verələrmi?
Lə'lüni bu dünya tolu canə verələrmi?

Bən canı fəda qılur isəm baxmağa bir göz,
Hüsnünə sənün şər'ilə qanə verələrmi?

Məst ol gözi gibi ki, bənindən alısar xət,
Sofi ki, gələ məclisə, danə verələrmi?

Hammamda zülfüni bənüm əlümə, şaha,
Ta qılam ana canumı şanə verələrmi?

Hüsnündə könül düşdi qəribü canını gər,
Verür isə şol tirü kəmanə verələrmi?

Bən yaxşı canum oynar isə zülfi yolına,
Əqlümi belə rihi-yəmanə verələrmi?

Qıl etdi bənüm tənümi şöylə ki, bilinməz,
Verürsəm anı muyi-miyanə verələrmi?



Gözlərün apardı könüli gər dilər isəm,
Lə'li-ləbüni bənə zəmanə verələrmi?

Şadiyi ki, verdi bizə bu xanədə eşqün,
Hərçənd ki, qəhhar ola, xanə verələrmi?

* * *

Gözün oxı ilə cigərüm qan dilə dəgdi,
Dəxi nə atarsın, çün oxun qəndilə dəgdi.

Hicran ilə vəslün od ilə suyı içində,
Qərq olmaqü yanmax yenə bu sa'ilə dəgdi.

Qəmzən şol oxı ki, canuma qılmış idi rast,
Toxındı yürəgümə canuma ilə dəgdi.

Gözlərünün oxına ki, dil dəgməyə şallah,
Canlar verürəm anun içün ki, dilə dəgdi.

Əql ilə dilü can necəsi ayru olalar,
Birinə dəgən ox qamusına belə dəgdi.

* * *

Nigarına əcəb hüsnün nə millətdür, nə millətdür,
Bu canuma sənün eşqün nə illətdür, nə illətdür.

Bəni eyb eyləmənüz gər olursam, eşq ilə şeyda,
Cünun çünki bu əqlümə cibillətdür, cibillətdür.

Ayağunda verürsəm can banadur rütbəti-ə'la,
Tapundan ayru dirilmək məzəllətdür, məzəllətdür.

Qaşun mehrabına qarşu ibadət kinədür lazım,
İbadət səndən özgəyə nə zillətdür, nə zillətdür.

Bəliyyətdür bu canuma qıya oxları gözündən,
Əlün ur gözümə gör ki, nə billətdür, nə billətdür.

* * *

Nedəlüm, gər könülümə yağısın,
Çünki sən işbu gözümün yağısın.

Qararur gözlərüm bu sevdadan, –
Ki, neçün sən bu gözlərüm ağısın.

Sağü çürük olur hər ənbarda,
Bey'i verdük sana ki, sən sağısın.

Qılmağil özüni pərişan sən,
Gör ki, kimün könüli otağısın.

Can gərək idi uça idi gögə,
Hey de zülfünə ki, ayax bağısın.

Sehrmiydi ləbündə gördüm qan,
Aşkara, şəba, qızıl yağısın.

Can belün ilə əldi qıl zinhar,
Nisbət eylə cana ki, yamağısın.

* * *

Sənün yüzüni görüp ölməyəm, şəba, bu gecə,
Lətafəti ilə anun bulam səfa bu gecə.

Əgərçi nəqşi ilə cövr qıldı hüsni bizə,
Xəyalı qıldı şəbxun ilə vəfa bu gecə.

Xəyalı gəldüginün gərçi qədri yox özünə,
Gəlün görün ki, nə eyd eylədi bizə bu gecə.

Bu mürdə ki, dilə irdi turu gəl uyxudan,
Gərək ki, sinlədəki ölülər tura bu gecə.

Bu canumuzı nəsimə denüz ki, iltə xəbər,
Deyə anun yazusı bu idi yaza bu gecə.



* * *

Cəmalün ilə bu könlüm bənüm nazir olamı,
Bu aləm içrə sənün kibi binəzir olamı?!

Bu can ilə bu könül hicrün ilə qarırlar,
Əcəb vüsalün ilə gözlərüm qırır olamı?!

Gözi oxuna yürəgümü təni döyməz ana,
Əcəb, bu bağrı taşun gövdəsi bərir olamı?!

Necə ki, eşqi odı tiz olur, dil olur süst,
Dedüm bu əqlümə ki, anlağıl, ərir, olamı?!

Vüsal gecəsinün sübhi urdı bir dəmi-sərd,
Dedüm ki, işbu nəfəs badi-zəmhərir olamı?!

* * *

Lə'lindən anun sözləri nazik diləyüm biz,
Hüsnində anun yüzləri nazik diləyüm biz.

Belindən anun qıl yararuz söyləyicək söz,
Şəmsindəki yulduzları nazik diyəlüm biz.

Şəkkər ki, diləməz tuzı məşhurdurur, ol
Lə'li-ləbinün tuzları nazik diyəlüm biz.

Şol gözləri atduğı oxı mərdümə qarşu,
Çün cana irər gözləri nazik diyəlüm biz.

Sözləri çü şirindürü sözin qulağumda,
Nola gəl ana sözləri nazik diyəlüm biz.

Çün sən olasın, pərtövi yoxdur dəxi şəm'ün,
Qaranuda şol gözləri nazük diyəlüm biz.

Çün gözlərümə sürmədürür dəxi yegirək,
Cana ayağı tozları nazik diyəlüm biz.

* * *

Düşmən əgərçi hiyləvü tədbir içindədür,
Tədbirü hiylə həm yenə təqdir içindədür.

Şol fitnələr ki, gözləri hamildürür anun,
Şükranələr gərək ki, bu tədvir içindədür.

Zinhar, dünya xoşlığına inanman ki, hər nəfəs
Anı ki, gösdərür yenə təğyir içindədür.

Düşdür ki, görürüz bu cəban xoşlığı bizə,
Əksincə hər düşün yenə tə'bir içindədür.

Bu hüsn surəsində bir ayətdürür yüzün,
Axir cəmal qissəsi təfsir içindədür.

Elmi-hürufi xətti anun qıldı bana kəşf,
Z'an ruşikəstə gisusi təksir içindədür.

Altun qılur misümi bənüm eşqinün odi,
Bu kimyayi gör ki, bu iksir içindədür.

* * *

Bu könülüm dənizi taşa gərək,
Düşmən ura başını taşa gərək.

Düşmənə den ki, aşını verə,
Bu dənizlər başından aşa gərək.

Quru qılmayısar yaşü quru,
İrə lütfi quruya yaşa gərək.

Başuma irmədin olursam baş,
İrürəm işbu işi başa gərək.

Kim dilər isə qavlaya şahin,
Gövdəsi ortalıxda laşa gərək.



* * *

Bəni bəq irürür isə şəcərə,
Bitürəm hübbi yemiqin şəcərə.

Bən kəmər bağlaram belümə ki, ta
Bağlamayam dəxi kəmər kəm ərə.

Lə'li-ləbləri şir xarəsiyəm,
Nə cəfadur bu əmcəgin əmərə.

Şol güneş quluyam ki, tə'nə urur,
Gök yüzindəki bədr olan qəmərə.

Dil Hüseynə çü canı verdi Həsən,
Borcı qalmaz Əli ilə Ömərə.

Saçları tolaşığı vacib edər, –
Ki, mükərrər ola sözi şəkərə.

Baxəbərdən xəbər dutaruz ümid,
Xəbər oldur ki, ola bixəbərə.

* * *

Məgər novruz gəlmişdir müsəvvər
Ki, olmuşdur cahan yenə münəvvər.

Yüzün dəvrində sərgərdan olalı,
Urur bu nüh fələk çərxi-müdəvvər.

Gecə dersəm saçun, ola söz uzun,
Şəkər dersəm, ləbün ola mükərrər.

Əlüm irərsə bəndinə gisunun,
Nə bəndüm var isə olsun mühərrər.

Qaşunı əgri səvəni dilərəm,
Firaqun çarmıxı ilə müsəmmər.

Könülüm ləblərünə müxtəsərdür,
Canum incə bilünədür mühəqqər.

Müərrəfdür könül lə'lün qatında,
Vəli belündə canumdur münəkkər.

Bilməzəm mücəssəm canmısın sən,
Və ya bu təndə bir ruhi-müsəvvər.

* * *

Gözi oxladı bizi qarə qıla,
Miskin itdi gisusi qarə qıla.

Ğaliyə gisusuna dürtər isəm,
Ğaliyənün yüzini qarə qıla.

Qaşları əgrisi ilə toğruya,
Nə cəfa qılsa, qata qarə qıla.

Qara gisusi ağı vəchilədür,
Çün bənüm könülümə qarə qıla.

Nola mərdümlik eyləsə gözi,
Bizi qaraqlamasa, qarə qıla.

* * *

Cahanda xubları gördük, vəfası yox, nedəlüm?!
Könüli xəstə qılur ol, şəfası yox, nedəlüm?!

Bu süffədə ki, günəş-ay müzəhhəb etmiş ani,
Qaçan ki, olmayasın sən, səfası yox, nedəlüm?!

Gözün könüli qılur xəstə cadulığı ilə,
Bir dərdə dərddən özgə dəvası yox nedəlüm?!

Canum oda düşəli toprağ edərəm yüzümi,
Qara saçuna sənin çün həvası yox, nedəlüm?!



Əgərçi hüsnün apardı saçuna könülümi
Necəsi qurtula çün dəstü pası yox, nedəlüm?!

Fənadurur bu cahanü ləbün fənada fəna,
Bu könülümün ki, fənadur, bəqası yox, nedəlüm?!

Səgirtdi saçlarının bizə yenə tatari,
Yayaları ki, irişdi, xətası yox, nedəlüm?!

* * *

Əgərçi və'deyi-vəslün bəni qılur dilşad,
Fərat eyləyəyüm yaşı hər çi badabad.

Saçun qılın ölümə ver ki, bilünə irişəm
Sənün ilə gəl edəlüm yenil bir bünyad.

Nigara, hurimisin pərinün bu fərri yox,
Əcəb budur ki, fərişteyə bənzər adəmzad.

Fəridi-əsr tapundur ki, xanəgir oldun,
Təvil etməyəlüm sözi eşqün oldı ziyad.

Tapundan ayru canun dünyada nədür eyşi
Zira ki, olmaya, olmaz isən biladü ibad.

* * *

Qaplan olmuş könül, şikarı qanı,
Eşq eşigində ahü zarı qanı?

Gözlərindən çü ayağ içdi könül,
Gözinə qarşı bir xumarı qanı?

Baş dizində qomuş bənəfşə bənün
Görmiş ol zülfi-biqərarı qanı?

Bülbülə zari gösdərəydüm, əgər
Görsə idüm bən ol nigarı qanı?

Gözi ahusı seyd qıldı bəni
Totağındağı dür şikarı qanı?

İncə beli tənümi qıl qıldı
Təni qıl qılmağun kənarı qanı?

İxtiyar ilə vardı dil tapuna,
Şimdi bu könül ixtiyarı qanı?

* * *

Çün tolu mey ayağını qolu ağdan çəkərəm,
Qucaram incə belini qılı yağdan çəkərəm.

Ağız ağız oluban andan aluram dilini,
Tolaşıram saçunavü dili bağdan çəkərəm.

Qara ağını saçar ki, dirə dil balığını,
Balığ olmaya məgər bən əli ağdan çəkərəm?

Ta səfa bula hüzurun ilə bu məclisümüz
Xardan gül götürsə, bülbüli bağdan çəkərəm.

Eşqümün bənzi qaçan sola, çü bu ortada bən
Can kənarına həmişə bili sağdan çəkərəm.

* * *

Bir dəm təbəssüm et, sənəma, ta ki, gül gülə,
Növbət dəgürməyəm yenə zar ilə bülbülə.

Bir dəm irərsə qulluğa canım, görə idün
Ki, necə lütf qıla səfa ilə qul qula.

Lə'lün ayağiylə bizə ver mül ayağın
Aləm keçər dəxi, bizi uzatma mülmülə.

Gər xəlvət arzu qıla könülüm əcəb dəgül,
Bu fəsl içində ki, ola aləmdə qülqülə.

Nola ağız ağız sənün ilə hədis edəm,
Şimdi biri birinə söylədi gül gülə.



* * *

Bənüm bu dərdümə, billah, şəfa gərəkməzmi?
Bənüm bu sidqümə, billah, şəfa gərəkməzmi?

Vəfası qədrini bilüb haqqa şükür qılmaz,
Bənüm könülümə, billah, cəfa gərəkməzmi?

Cəfayı yitəsi qıldun, ey taş bağırlu, bizə
Bənüm bu meylümə, billah, vəfa gərəkməzmi?

Dutam ki, cadu gözün xəstə qıldı canımuzı
Bənüm bu xəstəmə, billah, şəfa gərəkməzmi?

Əgərçi kafidurur eşqi bu canuma bənüm,
Bənüm bu hicrümə, billah, qəfa gərəkməzmi?

Könül nigara qonuğ oldu mərhəbası qanı?
Gözüm dənizlər axıdur aşinası qanı?

Yürəgümün qanına girdi lə'li qanlıdurur,
Nola sorar isəm andan ki, xunbəhası qanı?

Gözümi cadu gözün xəstə qıldı xəylidürür,
Ayağun izi-tozı oldı tutiyası qanı?

Bənüm qanım bu cəhan boynına düşər zira,
Gərək ki, gösdərə bana cəhan səfası qanı?

Ətəgin əlini dutduğum övliyalarun,
Gərək ki, irişə idi bana duası qanı?

* * *

Həbbəza, bülbüli-lətif nəva,
Ki, yaxar könlümi bebadi-həva.

Dərdümə çarə qanda bulınısar,
Çün yenə dərd oldı ana dəva.

Mücrim oldı cəfasını çəksün,
Kim ki, mə'şuqi-bivəfayı sevə.

Sə'y edər ki, təvaf edə eşigin,
Könülüm ta ola ki, bula səfa.

Bən belinə düşəli ol dilbər,
Bənzədə başladı tənümi qıla.

Qıl xod oldı beliylə lakin,
Biliməzəm ki, gisusı nə qıla.

Bəndə oldı saçına can miskin,
Bəndə olmağa yarar ol asıla.

Fələgün qəvsi ki, hilalı durur,
Görür isə qaşun yayın yasıla.

Şəkərü lə'ldən keçər söz çox,
Ağızun aç ki, qamu söz kəsilə.

Tur sallan ta qiyamət ola bu gün,
Yat-uyı, ta ki, fitnələr basıla.

Bindən öndin şikar qılmadı hiç,
Qəmzələri qaçan ki, çıxdı ava.

Hasil etdi könül səfayi çün,
Əvvəlin həmlə özin urdı safa.

* * *

Gözünlə xəstə olana şəfa gərəkməzmi?
Cəfan odına yanana vəfa gərəkməzmi?

Ağız-ağız sorısaram ləbünə irər isəm
Ki, xəstə eylədügünə şəfa gərəkməzmi?

Necə ki, zülfi könül qəlbinə yasaraın sən,
Anun kibi yasayış hər safa gərəkməzmi?



Bu hüsn məmləkətinə çü sən Süleymansın,
İnayətün, a bəgüm, Asəfə gərəkməzmi?

Könülə verdi nəsihət canum ki, ey aşiq,
Vəfası xoşmıdı şimdi cəfa gərəkməzmi?

Bənəfşə zülfüni alur imiş ağızına,
Anun dilinə bununçün cəza gərəkməzmi?

Könüli gəh saçunü ləbünü gəh dişün,
Çokişigə bıraxurlar səza gərəkməzmi?

* * *

Cəfasını çəkərəm bən, vəfa içün ölürəm,
Bu dərd odına yanıp kimiya içün ölürəm.

Saçında zülmətə bağlamışam özüm özümi,
Vəli yüzi günəşində səfa içün ölürəm.

Təbibi-eşq ləbündür şifahı oldı şəfa,
Ayax tozı yolına tutiya içün ölürəm.

Ləbüni qanlu görəli can oldı ana fəda,
Bu necə qanlu tutax xun-bəha içün ölürəm.

Əgərçi pərdəsəra bülbül idi, pərdəsəra,
Səraypərdəvü pərdəsəra içün ölürəm.

* * *

Arif qaçan bilə bu cəhan içrə vasili,
Şundan ki, yar yolına yelə verə hasili.

Gözi çü babilidürü zülfi əbabili,
Qondardı güzginin yerinə bu həvasili.

Lə'li-ləbün ki, eyni-həyat oldı ver bana,
Hərgiz qayurmağil dəxi zəhri-həlahili.

Sail gözüm yaşına nəzər qıl ki, xun axar,
Azürdə qılmağil dəxi, şaha, bu sa'ili.

Ruhumı ruhuna çələp eylədi müttəsil,
Hail bu tən olursa, götürgil bu haili.

Bu hikməti eşit, ye, üzüm bağı sormağil,
Lazım nədür ki, sən sorasın işbu qaili.

Necə gərək sal oda bəni, qayurmağil
Saidlərünlə gər bulur isəm həmaili.

* * *

Zəhr ləbüni anıcax qənd olur,
Gisularun könlümə pabənd olur.

İşbu tənüm uğradı bir halə ki,
Saçun ilə belünə manənd olur.

Ney qədümi yaxaram oduna ki,
Ney-şəkər oda yanıcax qənd olur.

Hüsn əri sənsinü eşq əri bən,
Cins çü cinsə irə peyvənd olur.

Könülümə dəxi inam etməgil,
Qül zira ki, nəqsi-xudavənd olur.

* * *

Bizə ol dilbərün vəfası gərək,
Yenə bu suffənün səfası gərək.

Kimə gərək isə bizə sögsün,
Bana ol yar mərhəbası gərək.

Yaşa qərq etdi, odına yaxdı,
Toprağuma anu həvası gərək.



Gözi qəmzəsi axıdur qanumı,
Lə'li-ləbləri xun-bəhası gərək.

Dərdün artur çü dərd oldı dəva,
Zira bu dərdümün dəvası gərək.

* * *

Sevmişəm səni könüldən, afərin, can afərin,
Afərinsin xublığ içində, həzaran afərin.

Gözlərün yaraladı könli ləbün qıldı timar,
Görmədim lə'li-ləbün tək dərdə dərman, afərin.

Gərçi təqsirü günah oldı qulundan xidmətə,
Sizdən oldı canumuza lütfü ehsan, afərin.

Afəriniş çoxdurur, likin sənün tək yox durur,
Kafəriniş cümlə olsun sənə qurban, afərin.

Gözlərün sehr ilə düzdi könülümi özinə,
Qıldı hər gözüm yaşını bəhri-ümman afərin.

* * *

Ləbi-lə'lüni sənün can dedilər gərçəkmi,
Xəti-nəsxüni ki, reyhan dedilər, gərçəkmi?

Ləbün andum idi, toldı ağızum şəkkərlə,
Kimə dedim isə yalan dedilər, gərçəkmi?

Totağun şəkkərinün rəngini qızıl gördüm,
Çünki sordum anı qandan dedilər, gərçəkmi?

Könüli çahı zənəxdanına düşmiş gördüm,
Bunı Yusif, anı zindan dedilər, gərçəkmi?

Belini gisusınun qılına nisbət qıldım,
İşbu təşbihi nə çəndan dedilər, gərçəkmi?

Hoqqəyi-lə'ldə incü düzümini gördüm,
Sorıcağaz ləbü dəndan dedilər, gerçəkmi?

Eşigünə ki, səba yol bulımaz dün bucuğın,
Eşq əri könlinə meydan dedilər, gerçəkmi?

Tatlu dirilür ikən ləblərüni könlüm içün,
Düşdi aralarına qan dedilər, gerçəkmi?

Sərvünə qul dedilər rastmı tubiyi əcəb,
Bədri hüsnündə bəmizan dedilər, gerçəkmi?

Can apardux ləbünə əqlü dili biləsinə,
Qamusın zirə bəgirman dedilər, gerçəkmi?

Sehr ilə könülümi gözləri qıldı xəstə,
Belini dərdümə dərman dedilər, gerçəkmi?

Küfr idügin saçunı yüzüni ötər bildüm,
Rövşən ay yüzüni iman dedilər, gerçəkmi?

Gərçi asan bilürəm ki, saçı müşkildür anun,
Anda can müşkili asan dedilər, gerçəkmi?

Əbri-giryan idügin gözümi uş görürsin,
Yanağunı güli-xəndan dedilər, gerçəkmi?

Tazə güldən dəxi nazük görürəm tər tənüni,
Bağrunı qatı çü sindan dedilər, gerçəkmi?

* * *

Bizə hər ləhzə dövlətdən işarətdür, işarətdür,
Səadət qapularından bəşarətdür, bəşarətdür.

Həmail andını içdüm nigara saidün içün
Öpəyim saqi saqını, kəfarətdür, kəfarətdür.



Ləbünə kimsənə irməz gözün toğar yürəgümi,
Qaşun bir işvəcüx qılur ki, yə'ni istimalətdür.

Yürəgümi pürək qılup cigər qaniylə apardum,
Yabana dökdi sücisin ki, bu nə mühməl, alətdür.

* * *

Könülə irdi bir nazük bəşarət
Ki, canü əqlə irişdi işarət.

Taladı gözləri könülüm evin,
Qılur kirpükləri canumı qarət.

Nə qıldı candan özgə alsun anı,
Ki, qıldı hüsni könüldə imarət.

Xərab etdi isə nola könüli,
Çü qılısar anı sonra imarət.

Səba nəql eylədi canuma bir söz,
Ki, bən qılımazam anı rəvayət.

* * *

Əgər gözün ilə bizə işarət ola idi,
Bizüm bu canumuza yüz bəşarət ola idi.

Dün içrə gəlsə idi könlümə xəyali anun,
Amasiya kibi canumda qarət ola idi.

Həmail andını içdüm ki, belini qucam,
Salarsa boynuma qolın kəfarət ola idi.

Xərab qıldı gözün könlümün Amasiyasın,
Xəyalı qülləyə gəlsə, imarət ola idi.

Əgərçi olmadı işba' olsa bir işmam,
Vüsalə könülümə bir imalət ola idi.

* * *

Könülümə bən dedüm ki, qandasın,
Qəmzəsinün oxlarıyla qandasın.

Gisusiylə bəndə düşdüm der könül,
Dedüm ana nola çünki bəndəsin.

Nola öpdüm, gözümə sürdüm səni,
Sən dəxi aləmdə bir türvəndəsin.

Bəndəsin sən, bəndəyim bən tapuna,
Bəndəyim bən, necə ki, sən bəndəsin.

Gözlərüm giryanü biryandur könül,
Ləblərün şəkkər, özün pir xəndəsin.

* * *

Qandasın can, qandasın can, qandasın,
Bən səni əsirgərəm ki, zindəsin.

Gisuna könlüm bənüm aşüftədür,
Əm der isə ləblərün, sən dindəsin.

Şol günəş yüzünə qul olam sənün, –
Ki, bu dövr içində xoş ayəndəsin.

Bu arada çünki oldı ittihad,
Gah bən səndəvü gəh sən bəndəsin.

Ayağına düş bu saqinün, könül,
K'ol nə qılursa sana, əlindəsin.

* * *

Müğəyyəbati-ilahun bəşarəti irisər,
Yenə bu fəthü fütuhun işarəti irisər.

Xərab oldı isə nola könülümün evi,
İnayət edicəgəz çün imarəti irisər.

Bizi saçı ilə qıl eylədün belində anun,
Zira ki, bizdən olarun rəvayəti irisər.



* * *

Şəha, saçun girehindən bəşarət oldı bizə,
İrişməgə tapunuza işarət oldı bizə.

Səadət oldı bizə, leyk can ilə könülüm,
Sənün oduna düşibən həsarət oldı bizə.

Tapundan özgəyə and içmişüz, görəməzüz,
Ayağunun tozı ilə kəfarət oldı bizə.

Tapuna can irişəm deyü düzdi idi yarax,
Bu ortalıxda, nedəlüm, həqarət oldı bizə.

Nəhayətə irişür ləblərün ilə eşqüm,
Yüzüni görməz olursam, qiyamət oldı bizə.

* * *

Aşiq qapunda dərd ilə canum səfa bula,
Qan-yaşü ruyi-zərd ilə canum səfa bula.

Dil dilədiydi əql ilə can verdilər bilə,
Bu qamusını gər dilə, canum səfa bula.

Badi-nəsimdür gözümün tutiyası ki,
Sizdən əsərsə gərd ilə, canum səfa bula.

Mövcuddan qulağuma sənün sözün gəlür,
Adun çü gələ hər dilə, canum səfa bula.

Eyni-cəmalini görəli dünyada fərid,
Şol kə'bəteyni-nərd ilə canum səfa bula.

* * *

Qonışdı yılduzum bu gecə yenə ay ilə,
Zührə ayax dutan kişiyə necə ayılə.

Bu quşca can odına səməndər kibi girür,
Zira ki, xoşdurur başı anun hüma ilə.

Yüzi qara bənəfşə pərişan durur neyə,
Oynaduğın eşidti saçunı səba ilə.

Gülşən müəttər oldı, çəmən pürşükufədür,
Satmazmısın canunı dəxi bu bəha ilə.

Boynuma saldı qolını, aydur ki, sev bəni,
Ayrılmamağa and içərəm şol həmayilə.

Yüzüm nola gər aduna sikkə urur zərə,
Odun içində çünki yatur kimya ilə.

Toqat qəl'əsində səbuhyi ver tolu,
Başəd ki, sübhə irürə Tanrı səfa ilə.

Ol nalədən ki, dün gecə qıldum sənin içün,
Bülbül xəcil düşər bu qamu huyü hay ilə.

Miskin edüb saçı dili bıraxdı bəndinə
İp oynın öğrədür ana badi-həva ilə.

* * *

Müzəyyən oldı yenə bu zəmanə,
Yenilə qafilə gəldi cəhanə.

Çəməndə bülbülün bax qülqülünə
Ki, nə odlar saçar bir dərdlü canə.

Belündən gördügüm sığmaz xəyalə,
Ləbündən çəkdügüm gəlməz gümanə.

Gözün oxınavü qaşun yayına
Könüldən nazük olmaya nişanə.

Bənə eşq urdı bir qamçı ki, qılam
Həmail qollarunı taziyanə.

Könülüm sırçadurur, yürəgün taş,
Nə diyəm bən bu sırçayı sıyanə.



Sənün eşqin kənarına kim irər,
Kənara irmədüm, düşdüm miyanə.

Təni candan ayırmaxlıx rəvamı,
Canumdan irdüm irincə bu canə.

Könüldən ver bərəm ana sözümi
Dəxi yalvarmazam hər tərcümanə.

Yəmani qoxuları yaxşı gəlür
Haris edər bizi tibi-yəmanə.

Kimi kafir, kimi sahir, kim oğrı
Nola həmlə qılursam qaziyanə.

* * *

Hüsni gösdərmə ki, dil al ilə ələ düşməsin,
Dam ilə danə boladur, zülfü xalə düşməsün.

Bən kəmani qaşuna peyvəstə toğru ox kibi
Əgri deməzəm hilalə, ta xəyalə düşməsün.

Gözünə ax-qara deməzəm ki, şəhla duymasun,
Nagəhin qəmzəylə dil atup vəbalə düşməsün.

Gücə-gündüz yüzi zülfi qoymadı canə məcal
Kimsə evinə iki dürlü hovalə düşməsün.

Bilün ilə ağzuna düşdi bu dəlü könülüm
Hiç kişinün canı hali qilü qalə düşməsün.

Günəşündür istiva xəttində övc olsun yeri,
Enməsün hərgiz həzizə hiç zəvalə düşməsün.

Ağzunı göstərmə ki, könlüm gümanə gəlməsün.
Belüni anlatma ki, canum məcalə düşməsün.

* * *

Əgərçi dərdini çəkdük şəfaya irdük axı,
Cəfa ucına irişdük, vəfaya irdük axı.

Bizi nişə tal ilə taşlaya bu yaranlar,
Hicazə varmaduğ isə, səfaya irdük axı?!

Hilal olmışıdux və'dəsiylə yillər,
Haqa şükür, yenə bu bədr aya irdük axı.

Adınun atlusı gər sığındı bir tağa,
Arasını kəsübən biz yayaya irdük axı.

Gözüm yaşı dəniz olursa, dəxi qayğusı yox
Ki, əlü ayağ urup aşinaya irdük axı.

Diləgiylə gələn diləgin rəva qıldux,
Cəhan içində rizayi-xüzaya irdük axı.

Gözi oxına dedim: "Ox, canum sana qurban!"
Bir ox ilə hələ şol qoşa yaya irdük axı.

* * *

Əsirgən aşiqi yoxmı canunuz,
Öləsinüz güni axır sanunuz.

İrürünüz bəni yaruma, yoxsa
Yenə öz boynunuzadur qanunuz.

Gisusı küfri dutdı könülümi,
Sizün qancaru vardı imanunuz.

Saçı bana tolaşdı, dedüm ana
Tolaşur ayağunuza sanunuz.

Nəva düz mütribü saqi ayax sun,
Çü yanaram bənümlə siz yanunuz.



* * *

Lə'lünün rəngini qandan dedilər, gerçəkmi?
Yalanı söyləmə qandan dedilər, gerçəkmi?

Qaşunı əgri dedilərü sənün qəddüni rast,
Arizün lütfini candan dedilər gerçəkmı?

Bu xətayi gözüni sehrə qılurlar nisbət,
Çəhi-babilüni zindan dedilər gerçəkmi?

Oğrı dəgülsə gözün, əgrüyə yoldaş nəyədür,
İlədür din ilə iman dedilər, gerçəkmi?

Zülfi ucın gər edər ki, dili kəndüyə çəkə,
Yürəgüm yarasın andan dedilər gerçəkmi?

Qəmzən oxını xəta deyü dutup vermədilər,
Ox idi, çıxdı kəmandan dedilər, gerçəkmi?

Düşməgil bunca xətaya belinə tolaşı gör,
Ləzzət al əmnü amandan dedilər gerçəkmi?

* * *

Ah, baxun eşqəvü halatına,
Dəlü könülün bu mühalatına.

Bən ki, fəraqında anun yanmışam,
Doya biləmmi bu visalatına.

Nöqtəsiyəm xət verür qullığına,
Mö'tərifəm hüsninün ayatına.

Yüzinə baxıp könülün saxlayan
Münkir isə nola kəramatına.

Zülfini çün qıldı hekayət nəsim,
İnanur oldux bu rəvayatına.

Hüsni anun eşqümün atıdur,
Atına qarşu könülüm atına.

Misri-məlahətdə sənünçün Əziz
Yusifi-Kən'an nola gər satına.

Rux-ruxuna gər uraydum şah ilə,
At bulavü gəh dutaydum matına.

Yarun əgər meylini anlar isən
Çıx fələgün dəxi yedi qatına.

Xəstə könüllər çü şəfayi nedər,
İrər isə gözi işaratına.

Çünki qiyamətdurur ol qaməti,
Fitnəyə düşdüm bu əlamatına.

Bən ləbinə susadum, ol qanuma
Ya rəb irür cümləyi hacatına.

* * *

Nə ki var isə xubrux, gətürün,
Satunuz, şol nigaravü yedürün.

Bir səfa ilə söhbət etmək içün
Nə ki, əksükümüz isə yetürün.

Aparun nə ki, ana gərək isə,
Nə ki, bizə gərək isə, gətürün.

Gətürün eşqinün cənayibini
Ərmişi, qalmışumuzı yetürün.

Sərvi kibi turun, yaranlar, rast
Yoxsa fitnə gözi kibi oturun.



* * *

Seyl oldı gözyaşı ilə, qərq oldı işbu hay
Hüsnində göriməyəli bir günəşü üç ay.

Ol can ki, çün xəyal ola belün qılı ilə
Görürsə nöqtə ağzunı, sən anı hiçə say.

Qəmzən oxı yarasını canımda gizlərəm,
Sən necə ki, gərək isə, anı cəhana yay.

Barı ki, hüsni verdi bu barik belinə,
Canum giran dəgül isə olaydı ana tay.

Saidlərün cana yədi-beyzayi gösdərür,
Qılısaram həmail anı gər düşə qolay.

* * *

Gözün nə ox ki, ata kəmandan bəni gözət,
Ox atmağ ilə bari kim andan bəni gözət.

Vəsl ilə hicr sudü ziyanın bulımazam,
Qurtar canı bu sudü ziyandan bəni gözət.

İmən olalı yenə gözündən müşəvvəşəm,
Qurtar, bəgüm, bu əmnü amandan bəni gözət.

Salınma salma bəni xəyalə belün ilə,
Söyləmə, sorma hali, gümandan bəni gözət.

Belün ilə tənüm sanasın saç qılı durur,
Ayağun öpərəm ki, miyandan bəni gözət.

Hər taqda cəmali qomış bir atıcıyı
Ki, gözlə oxunıvü fəlandan bəni gözət.

Cümlə vücudumı gözidərəm sənün içün,
Sən dəxi bir səfa ilə candan bəni gözət.

* * *

Yanağuna ayax dutalı lalə,
Ləbünçün toludur dildən piyalə.

Məcal olursa ki, zülfüni ölçəm,
Gərək ki, irişə ömrüm kəmalə.

Belün inceldügi andandurur bil
Ki, çox girmişdürür badi-vəbalə.

Ağızun qönçəsindədür icazət
Ki, gəldi yenə bülbüllər məqalə.

Ağızunı dilümdən təng gördüm,
Kəmali bənciləyin qul kim alə.

* * *

Yaşum dənizdürür, gözüm səfinə,
Könüldə eşqün odıdur dəfinə.

Yürəgüm sücisindən gözi məxmur,
Tolu ver ayağı saqi kəfinə.

Süleymandur könül taxtında eşqi,
Vəli qılmaz nəzər əql Asəfinə.

Sənünlə sinə bərsinə olan dil,
Nəsinə baxa cənnət rəfrəfinə.

Qarara yandurur zülfi könüli,
Vay əgər uğraya düşmən səfinə.

* * *

Qopar yenə könüldən bir məanı
Ki, dil bilürü dil söyləməz anı.

Nəmazı qaşı mehrabında qıldum,
Çü anda oxıdum səb'i-məsanı.



Ləbündə dil qanını sabit etdün,
Əgər ədlün sorışdurursa qanı.

Kənarə qıla idüm şol miyandan
Kənarından ələ girsə miyanı.

Cəhani can yolına verürəm bən
Ki, can içün diləræm bən cəhanı.

Könül aldı gözün lə'lün zamandur
Könül gərək isə dutam zamanı.

Gözünə dəgməsün gözlər, nigara, –
Ki, atar oxıvü saxlar kəmanı.

Ləbündən sora gördüm bilimədüm
Ki, nerədə olır bu lə'l kanı.

* * *

Belün eşqi belümüzə kəmərdür,
Kəminə işbu yolda tərki-sərdür.

Ləbün girdi könül qanına, şaha,
Nu suçı var gözünün bixəbərdür.

Şəkər şükr eylədi lə'lün tatından
Anunçun dünyada adı şəkərdür.

Havayi-zülfünə düşəli oldum
Səba yeli kibi ki, dərbədərdür.

Bu can gərçi giran idi belündə
Vəli lə'lün qatında müxtəsərdür.

Xəta ilə gözün gər bir ox urdı,
Könülümə nola esrük tatardur.

Şəha, hüsni gözündə sanma yalquz
Ki, görmüşəm anı yüz ol qədərdür.

* * *

Cəmalünə nə nisbət qıla lalə,
Nə dil bənzədi bilə səni lalə.

Tolaşmağa yarardı gisusına,
Xətayi gözi dəgülmisə alə.

Ləbün idğamı ki, gördüm nigara,
Qılur işmamə canumı imalə.

Susamışam ləbündür abi-heyvan,
Həvalə qıl susamışı zülalə.

Yuların başına tola eşəkdür,
Könül ki, düşmədi sahibcəmalə.

Cəhanı təng edəydüm könülümə,
Ləbündən irsə idi ol mühalə.

Saçından qoxu irürsə qoyaydum,
Qəbul adını bən badi-şimalə.

Belün bəni hilalə bənzədipdür,
Nə qıldur ki, girə işbu hilalə.

Belün meyli, nigara, bana vardur,
Dəlalündə dəxi vardur dəlalə.

Hidayət buldı, şaha, dil yüzünə,
Əgər çəkdisə zülfündə zəlalə.

Vücudum eşq ilədür xalis altun,
Nola dilüm əgər gəlmədi qalə.

Zər üsdində hali-lə'l ilə gözüm,
Yazar eşqünə hər dəm yüz risalə.



Müfərrih sun dilə lə'li-ləbündən,
Ki, düşməyə saçun ilə xəyalə.

Gözün şahnalığa əl uralıdan,
Götürüldi, bəgüm, vəchi-iyalə.

* * *

Gözlərünün oxına bən, şaha, nişanə gəlmişəm,
Müşkilə düşdügüm bu ki, zülfünə şanə gəlmişəm.

Ləbləridür canum bənüm canum irincə ol ləbə,
İrdi canum ləbümə ki, sidq ilə canə gəlmişəm.

Dökdi ləbün yürək qanın qana bulaşdı qarşuma,
Şimdi ləbünə yapışup duş ilə qanə gəlmişəm.

Yüzümi zər gözüm yaşın lə'l ilə lö'lö düzibən,
Ağzunı cövhəri görüb yə'ni dükanə gəlmişəm.

Zülfi qılı bəni əgər saldı kənarə xoş ola,
Bən tənümi qıl edübən yenə miyanə gəlmişəm.

* * *

Ta verməndi can irmədi cananə irənlər,
Başın verüp irdi sərü samanə irənlər.

Məhv eylədi için taşınü zahirü batin,
Ta səhv ola məhbub ilə sübhanə irənlər.

Bən ki, gözə-göz yarə irişdüm güpə gündüz,
Gərək ki, sözin qot' edə bürhanə irənlər.

Mərdümlik edüb suladı meydanı bu gözüm,
Meydana nola gər girə mərdanə irənlər.

Sərbaza budur könülüm zülfün ilə ki,
Guy edələr özlərini çəvkanə irənlər.

Qaşı ilə eyd idi bənün canını qurban
Edərsə nola böyləcə mehmanə irənlər.

Əvvəl qılalar zülfüni bellərinə zünnar,
Yanağun ilə ləm'əi-imanə irənlər.

* * *

Canana verələr, sənəma, laş eşigündə,
Zəhr ayağı canuma ola aş eşigündə.

Can anda tamam ola, şəha, eşqi yolında,
K'anı qıla gözün oxı mənxaş eşigündə.

Cadu gözünə hey de ki, rəhm edə könülə,
Ki, taş oxına döyiməyə taş eşigündə.

Baş ilə ayax başını kim saça bilisər,
Bunca ki, ayağunda yatur baş eşigündə.

Pərvanə gərəkdür, şəha, şol şəm yüzünçün,
Ki, yanmağa qoya bizi fərraş eşigimdə.

Zülfündə rəsən-baziyi ol həddə yetürdüm,
Ki, qopa bana nə'rəyi-şabaş eşigündə.

* * *

Şəha, irməyə şol bədrün mühaqə,
Ki, zülfündən könüldə var əlaqə.

Eşigündür hicazum bən mühəyyər,
Dilüm varmaz Sipahənü İraqə.

Yüzündən qıldı mey paludə gözüm,
Nişəstə olalı nəqşün rəvaqə.

Dəxi qəm görməyə könlüm irərsə,
Ləbündən bir müfərrih bu məzaqə.

İricək sənə bən bəndən gedərəm,
Visalün çarə dəgül bu fəraqə.



* * *

Məhasin cümlə tapunda mücəmma',
Neçün mahun durur şaha muqənna'.

Yüzümə seyl axar işbu gözümdən,
Anı eyb etmə oldıysa müşəmma'.

Sənə sahibqıranlıx oldı dərxor,
Məhü tir oldı mizanda mücəmma'.

Mürid oldı ləbü dəndanuna göz,
Anunçün xirqəsi qılur müləmma'.

Qədünə rast dil hicrün müxalif,
Yüzünə bən mühəyyir, sən mübərqa'.

* * *

Mürği-səhər başladı zümzüməi-zirü bam,
Saqi, tolu sun bizə altun ayax lə'lfam.

Gərçi həram ola qan qıldum ana bən həlal,
Ol bana vəslün neçün qıldı əcəb pəs həram?

Eşqün ilə kimsənə görməmişəm bən səlim,
Gər kişi görmiş isə, bizdən ana yüz səlam.

Od ilə su nola gər cəm ola bəndə bu dəm,
Zülf ilə yüzində gör məcməi-sübhü zülam.

Ur ağızun ağzuma, sor canumı gövdədən
Ki, bulasın dünyada aşiqi-malakəlam.

Hey de, bəgüm, nəfsünə, olma vücuduna qul
Taci-təcərrüd gözət, ey sana canum qulam.

Səndən anı dilərəm ki, biləsin ki, varam,
Bəndəsinə hər şəhün ancağ olur ihtimam.

Boynumadur gisusı hər gecə təxtül-unq
Ağzumadur ləbləri ta bəqiyamət lisam.

Könlümi sən sıyalı qıldı gözüm qan rəvan,
Axıda içindəkin, gər sınur olursa cam.

Ta ləbünə irmədi bulmadı cövhər bəha,
Ta dişüni görmədi bulmadı lö'lö nizam.

Fitnədürür gözlərün könlümə axır zəman,
Qəddün edən canıma saəti-ruzi-qiyam.

Oldı yüzün hər səhər canumuza iftitah,
Oldı saçun hər gecə ömrümüzə ixtitam.

Xərq edər isə nola kirpügi bu yüregi
Çünki yaş ilə bulur xərqi anun iltiyam.

* * *

Həva ki, şol sənəmün zülfini müşəvvəş edər,
Qoxusını irürür bu dimağuma, xoş edər.

Həvası varlığumun toprağın gögə savurur,
Ağızunun suyı yürəkdə yüz bin atəş edər.

Anı ki, zülfi keşişləri əylədi bu könülə
Cəhanda ancılayın işi qanqı şərkəş edər.

Beli qılına vücudı ki, saldı gisusına
Zəhi ki, qıl yarar onı özinə oxşaş idər.

Yüzinlə gülşən içində yanar gülün cigəri,
Anunçün ana səba şəbnəmün suyın rəş edər.

Səba hikayət edər bülbül cəmalündən
Qaçan ki, yırta yaxasını qonça, ol qəş edər.

Nə ki, edərsə gözün dilfirib edər, sənəma,
Nə qılur isə saçun cümləsini dilkəş edər.



* * *

Ol dilbəri-ziba yenə bir naza düşərsə,
Tə'n etmə, saçunda könülüm aza düşərsə.

Bir av idi ki, düşdü bizə hüsni-xəyali,
Hala nedəlüm dünyada avaza düşərsə.

Dəm qıldı anun lə'li-ləbinün dəmi bağrı,
Bir dəm nola andan dili-dəmsaza düşərsə.

Gözi könülin nöqtəsinə çün duta gözün,
Məgər ki, xəta oxı ola yaza düşərsə.

Pərgar ilə həq sün'i yaratmış səni, şaha,
İşvən nə əcəb ola, beəndaza düşərsə.

* * *

Hey de gözünə necə atar tiri-xədəngi,
Bir yola sürər bizüm ilə sülh ilə cəngi.

Nə taqəti qaldı dəxi könül elinün, çün
Hindü həbəşə qatdı yüzün türkü firəngi.

Xalünə sənün zəngi necə deyə dilüm ki,
Ayınə təhəmmül qılımaz zərrəcə zəngi.

Ayınə könül yüz görür yüzüni mütləq,
Hiç vech ilə gəlməz gözinə nəqşi ilə rəngi.

Sinə sinəyə sənün ilə dilərəm uram,
Leykin üşənürəm ki, uram şişəyə səngi.

* * *

Gözüm yaşı cəhanı, şəha, səbzəzar edər,
Zülfün həvası könülümi biqərar edər.

Lə'li şərabı gərçi bekam olmadı bana,
Məst oluram qaçan ki, gözini xumar edər.

Könül ərəq qılursa həyadan, əcəb dəgül,
Gülgun cəmalı şəmsi dəxi şərmsar edər.

Rəngin axar yaşum yaşı uzun nə çarədür,
Yürək dəmi dimağuma çün ki, buxar edər.

İşi həmişə qaşı ilə düşdi könülün,
Nə bu siyah-karəyi pəyvəstə kar edər.

Gərək ki, tarü mar edə tatarı zülfinün,
Hər guşəyi ki, cadu gözü ixtiyar edər.

Canuna ver canı ki, tənün cansuz olmaya,
Bəndə olan, şəha, özini şəhriyar edər.

Xuni-cigər yerəm-içərəm ləblərün qanın,
Qəsd etmə qanuma bu işi iztirar edər.

Fili piyadə qıldı, atın aldı ruxların,
Fərzinlənüz ol işi ki, bu şəhsuvar edər.

Zülfün irən yerə qoxusını bulam deyi,
Sünbül yüzin sürər özini xaksar edər.

Müşkin rəsəndə özini mənsur edər könül
Kəndüyi payi-darda key paydar edər.

* * *

Könülümdə qılur kirpügi yara,
Nə yara ki, yürəgi külli yara.

Qərara gəlməyə zülfinə düşən,
Nə xud bir ləhzə aləmdə qarara.

Ləbündən çarə olmazsa könülə,
Olur biçarə ana xud nə çara.

Könüldə hicri şöylə urdı odın
Ki, gögdədür sitarə hər şərara.



Xumariyəm ləbünün çarəm oldır
Ki, həm meydən olır çarə xumara.

Bu ortada miyanunçün olur dil
Çələb bilür kim irişə kənara.

Ləbün qanı bizə ruhi-rəvandur,
Çü irdi canumuz bu iztirara.

Yüzün güni tolınalı gözimdən
Şəfəq urdı əlini ehmirara.

Yürək qanıyla şöylə sərxoş olmış
Ki, baxımaz yəminindən yasara.

* * *

Dil sana rəvan hökmüni qıl canamı dersin,
Lə'li-ləbüni sun könülə qanamı dersin?

Şöylə ki, saçun qıldı pərişan dilü oqli,
İmkana yaxın gələ ki, yasanamı dersin?

Könlümdəki tək şol ləbü dəndan ilə sözlər
Mənzum ola, hər bəhr ilə uzanamı dersin?

Şol hoqqəyi-lə'lündə görən otuz iki incü
Pərvası ola ki, vara dükkanamı, dersin?

Bilür cigərü dil ki, gözün qaniçicidür,
Ol iki tanuxlıx verələr qanamı, dersin?

Lə'lündədürür, şaha, yürəgüm qanı rövşən,
Möhtac ola bir hüccətü bürhanəmi, dersin?

Ənək çuxurına aparur könüli zülfün
Bismillah, bəgüm, çah ilə zindanamı, dersin?

* * *

Şaha, ləbündən sənün axdı yenə qan dilə,
Ey necə taşlar rəqib atdı yenə qəndilə.

Bağrumı paralaya qəmzələrün dil-dilə,
Bu qamusı nə içün gərək isə dil dilə.

Könül alalı saçun bulımamışam dəxi,
İsdərəm uzun gecə tana dəkin qıl qıla.

Gözlərünün sehri hər kimə ki, qıldı əsər,
Ol ənəgün çuxurın çün çəhi-babil bilə.

Silsilədür gisusı boynuma olsun nola,
Gözlərümün yaşını gör nə axır silsilə.

* * *

Hər gecə səhər vaqtına dəkin qıluram ah,
Başod ki, nəzər qıla bənüm haluma ol şah.

Tana qaluram hər gecə bən bədr yüzünçün,
Bədr ay dəxi nola tana qalur isə hər mah.

Ağızuna irişəməzəm könlüm olur təng,
Əl necəsi irə belünə incə olur rah.

Aşiq bənü mə'şuq sən olmamağ olmaz,
Eşqi bana, hüsn sana qism eylədi Allah.

* * *

Zəhi zülfi-səmənsayun bıraxmış şol gülə sayə,
Ləbüni sorma ki, olmış ləbi-heyvana həmsayə.

Yüzün bədr aya bənzər çün, vəli gözlərünə baxan,
Xərabü məst olısardur, anı bədr ay necə ayə.

Saçun yoxsul ilə baya əgərçi qoxu yetürür,
Neçün bu əql yoxsulın dilər ki, sehr ilə bayə.



* * *

Bin baş ola gisundavü bəndə ola bir baş,
Bir başını bin başa fəda edənə şabaş.

Qəddünə nə nisbət qılına sərv bir ağac,
Yaquta nə təşbih edəlüm lə'lüni bir taş.

Şəm eyləyübən yüzümi yürəkdə qodum od,
Pərvanə dilər ki, yaxa qarşusına fərraş.

Bən zahid ikən qıldı bəni gözləri əyyar,
Rind oldum isə eyləməyəmi bəni qəllaş.

Ol od ki, könül yaxdı anı eşqün əlindən,
Yaş nola ki, Ceyhun dəxi eyləyiməyə yaş.

Pinhani nə ki, könülə berib idi lə'lün,
Əsridi gözüm olamı ki, qıldı anı faş.

Ta yaş dökə hicrün ilə gözümə dedüm göz,
Tə'xirün ilə taşa dedüm könülümə taş.

* * *

Bənciləyin hüsnünə qarşu, şəha, heyran qanı?
Zülfün içində könülüm kibi sərgərdan qanı?

Didə mərdümlük qıluban dökdi ayağuna dür,
Buncılayın göz irər yerdə bəgüm insan qanı?

Küfrdür zülfün binaguşundurur iman yaqın,
Cəm bir yerdə, nigara, küfr ilə iman qanı?

Ləblərünün qanıdur dərman bu canum dərdinə,
Çağıruram hər saçu ki, dərdümə dərman qanı?

Qandan özgə nəsnə isdəməz xəyalı lə'linün,
Dökərəm göz yaşını ki, qanı ol mehman, qanı?

* * *

Gəzərüz dərbədər eşqün içün biz,
Umana girürüz Ceyhun içün biz.

Bana çunü çərə dəgməz ki, deyəm,
Bir oda yanalum biçun içün biz.

Bu gözdən nola gər dəniz edəvüz,
Ləbi tək bir düri-məknun içün biz.

Saçı ki, leyl idi, bir Leyli qaldı,
Öləlüm Leyliyi-Məcnun içün biz.

Tənümüz çənginə bir ud idəlüm,
Həvada yenilə qanun içün biz.

* * *

Xəyaluna ta ki, dərbərdür, nigara,
Tapunda eşq bərdərdür, nigara.

Qomışuz varlığı əndər-səri-eşq,
Başumuz bunda sərbərdür, nigara.

Müsəlləm qılmışuz könüli sana,
Yenə zülfündə ləşkərdür, nigara.

Həzaran könüli eylədi miskin,
Bu nə zülfi-müənbərdür, nigara.

Sənün eşqünə nə çarə qılalum,
Əzəldən çün müxəmmərdür, nigara.

Saçun hindusı tarac etdi könli,
Məgər aləm müşəmmərdür, nigara.

Süca' edəli avazun fələkdə,
Bu gün çərxi-müdəvvərdür, nigara.



Əgər hər qıl canuma oldı bir bənd,
Ləbün dəxi mükərrərdür, nigara.

Gözünün hər oxına ləblərindən,
Buyur busə müqərrərdür, nigara.

* * *

Bu canuma xəbər qıldı nəsimüm
Ki, yenilə qəram oldı qərimüm.

Bənüm bu yolda bir canü dilüm var,
Nə zər vardur əlümdəvü nə simüm.

Könülüm şəmü mey ləbləri yarun,
Həvası çəng hicranı nədimüm.

Ləbi gizlivü boyı aşikarə,
İkisi eşqinə haqdur əlimüm.

Səni bən bilürəm ancax bu yolda,
Cəhan içində kim bilə ki, kimüm.

* * *

Sun bizə, saqi, ayaq dəgdi bulınmaz bayaq,
Çünki cəhandur keçər, bizi qomağil yayaq.

Gözi uyuxlar kibi bizi salar uyxuya,
Sura əgər varasın, biz uyuruz, ol oyaq.

Kişi budur qaşınun key bizi oxa dikər,
Gər bulur isə səfa qurban içündür qoçaq.

Gözləri car eylədi tolu ayağ içməgə,
Dünyayı toldur gətür ki, bitün olsun yasaq.

Pirü xərəf əqlümüz eşq ilə oldı yigit,
Çün qocala adəmi ana gərəkdür tayaq.

* * *

Ey vay, bəni bu dərdə dəvam olmayısarsa,
Bin vay bini bu dərdə dəvam olmayısarsa.

Gisun ilə yüzüni dilərəm gecə-gündüz,
Dirilimezəm sübh ilə şam olmayısarsa.

Ənbər saçun ilə, sənəma, bağlamışam əhd
Ol dəxi uzadu vara xam olmayısarsa.

Nərgisləri badamına meyl etdi bu könlüm
Anda dəxi zülfi kibi dam olmayısarsa.

Gisuları bəndinə dilərəm ki, gəmişəm,
Gər iki cahan hökmümə ram olmayısarsa.

Zülfüni tağıt badi-həvaya ki, tolaşsun,
Aləmdə əgər dəxi nizam olmayısarsa.

* * *

Fitnə gözün könülümün afətidür, afəti,
Can aparmax işvələrün adətidür, adəti.

Zülfüni xalün yanında tağıdursın, yə'ni nə,
Xud dutulmax könülümün hacətidür, hacəti.

Gər qiyamət günini bilməz isə hiç kimsənə,
Bən bilürəm ol nigarun qamətidür, qaməti.

Kimsənə haqqun cəmali müshəfin oxımadı,
Bən oxıdum hüsnüni ki, ayətidür, ayəti.

Eşqümün hiç kimsənə qayətinə irimədi,
Zira ki, hüsnün cəmalün qayətidür, qayəti.

* * *

Müzəyyən gülşənü divanə bülbül,
Cəhan toldı yenə məstanə gülgül.

Yüzin ansam ügeyik der ki, gu-gu,
Ləbin dersəm, sürahi der ki, qülqül.



İşarət qıldı gülə-gülə gülə,
Ki, bu nə nəsnədür, dedüm ki, gül, gül!

Salar könülümə Hindustanı,
Güli-surı yüzi üsdində fülfül.

Sana hüsnü bana yaş gögdən enmiş,
Əliyə Zülfiqari ilə Düldül.

* * *

Necə əsir edəsin zülf ilə ya xala dili,
Dəlük könüldə isə tur uru, yaxala dili.

Necə bir al ilə lə'lün ala bu könlümüzi,
Həmişə tatlu söz ilə boyaya ala dili.

Dilüm qanı ki, deyəm qanı içdügin dilümün,
Rəvamıdur ki, ləbün saldı işbu hala dili.

Ağızı nöqtəsi saldı gümana bu canumı,
Bıraxdı beli qılı dəxi həm xəyala dili.

Gərək ki, dər dökə dilüm anun ağızından,
Gər irürür isə ömrüm yenə məcala dili.

Əcəb nə yılduz olur bu ki, bədrini görəli
Zəmanə bənzədə dilər bu dəm hilala dili.

Belün ilə ağzundan bana açılalı sir,
Canum çəkinmədi hərgiz bu qılü qala dili.

* * *

Yar ilə gecə məclisi xali elə girsə,
Məst olıcağaz zülf ilə xali elə girsə.

Ol məsti-müdam olsa çü bən məsti-həvayam,
Bu ortada bir söhbəti-hali elə girsə.

Cadu gözi yoğ isə nola bənzəyə idi,
Bədr ana dü əbruyi-hali elə girsə.

Uyxu gözümə gəlmədi görəm deyü yan,
Çün görəmədüm gəlsə xəyali ələ girsə.

Şəhnə olalı gözi gözi elini yıxdı,
Şar yıxmağa nə şöyləcə vali ələ girsə.

* * *

Qəmzən canuma oxdurü qaşun kəman, bəgüm,
Bilün xəyal könülümə, ağzun güman, bəgüm.

Sərvi-qədünlə əlimi alü gögə yetür,
Gözünlə xəstə düşmüşəmü natəvan, bəgüm.

Bir canumı sənün kibi cavana vermişəm,
Verməyə bir canını kişi rayigan, bəgüm.

Gisusi ilə bağladı gözləri çəkdi ox,
Çahi-zənəxdə bəndə salarlar aman, bəgüm.

Ta canumı irürəm ayağı qubarına,
Badi-səba ilə oluram həm inan, bəgüm.

Gözün sinanı xud könüldən ötə keçər,
Sən bir qayaya yax öz-özüni sinan, bəgüm.

Könlümi aldun isə, şəha, bağla zülfünə,
Ləblərünə qoma, olur ortada güman, bəgüm.

* * *

Şundan bərü ki, cadu gözün çavın eşitdüm,
Əsrük yatıban oynamağı hər dəm iş etdüm.

Oda yanası dil yanalı lə'li-ləbünlə,
Eşqünə quşanub bu tənümi qamış etdüm.

Eşqün gözüm incüsin əgər qıldı isə lə'l,
Bən dəxi yüzüm lə'lini uşda gümiş etdüm.



Lə'li-ləbünün hirsi ilə uşda vücudi,
Başumdan ayağuma dəkin cümlə diş etdüm.

Azışdı isə canü könül nola saçunda,
Miskinləri miskin edərəm nə az iş etdüm.

* * *

Qaşun hilali ilə dildə olamı idün,
Ki, irə yemişi bir gəz bu eşqi-cavidün.

Üzilüb özgədən özüm gözünə bağlanalı,
Zirövşən oldı gözümdə səfası tövhidün.

Həvayi-sərvünə qamət götürəli bu könül,
Səpişd isitməsi iqlim qoqdısa bidün.

Könül həvan ilə şöylə səfa bulubdur ki,
Xəcil ola anı görürsə camı Cəmşidün.

Gözündə tapuna təfrid göstərəyüm əgər,
Görür isəm yenə bu arizunda təcridün.

* * *

Vəsfi-cəmalı dilbərün altunla yazasıncadur,
Zülfün girehlərində könül azasıncadur.

Zülfiylə yüzinə gecə-gündüz mühəyyirəm,
Eşqüm neçə ki, gizlü isə sezəsincədür.

Gəh nazü gəh niyaz edərəm şol cəmalünə,
Üsdünə baxaram bilürəm düzəsincədür.

Gözün tolu verür ayağı canuma bənüm,
Çün saqidür nola sücisin sürəsincədür.

Yazmaz könüli gözləri likin, bu könülüm,
Sidq ilə gəldi ortaya pəs yazasıncadur.

* * *

Əya saqi ki, boynuma toxınur şö'leyi-saqı,
Əlündən əlümə sunğil yükinüb altun ayaqi.

Bu dünya fanidür bari sizünlə söhbət edəlüm,
Görəlüm bir-birümüzi bir-iki dəm ki, var taqi.

Nəvasuzam müheyyir uş mübərqə' gizlədi yüzin,
Nühüftə necə saxlaya könüldə eşqi-üşşaqi.

Könül bir nəzrə aparmış cəmalündən toquzladur,
Bu türki gözlərün yə'ni yetürdi yerə yasaqi.

Yüzündən gözlərüm görən beğayət səhl ola, şəha,
Anun qayətin ol bilə nəzər eyləyə dər baqi.

* * *

Çü zahirdə dəgül eşqüm, cəmalün ilə içindür,
Xətası doxi gözünün könülümdə bənüm çindür.

Saçun hindində bu canum zəmandur ki, müsafirdür,
Bəgüm, xoş saxlağil ani, anun içün ki, çü çindür.

Səmənsadur, şəha, xəttün nə nazük qəidəsi var,
Pərişandur, bəgüm, zülfün ki, pişanisi pürçindür.

Sana manənd qaçan Mani nigan eyləyə bir surət, –
Ki, ay yüzün sənün, şəha, xətasuz bir büti-Çindür.

Bənüm sinəmdəki eşqi gerək ki, irürəm sinə,
Xəfamün niyyəti neyçün ruhəm üsdində pərçindür.

Tutağun işvəlerilə könülə çinələr dökər,
Gözün caduyi-dilçinü bənün hinduyi-gülçindür.

Moğalçin olduğı gözün könülə fitnələr saldı,
Bu rövşəndür ki, gözlərün büti-qıfcağü saqçindür.



* * *

Nigar bizüm ilə necə bir qılur nazı,
Necə əsir edə kəklik xəhanda şahbazı.

Gözün xəta isə gözümə oldi eyni-səvab,
Bəyek gərişmə tüvani ki, kari-ma sazı.

Tamam olur bənüm işüm çü bir nəzər qılasın,
Vəli biçarə biçarəqan nəpərdazı.

Çü canü əql ilə dil cümləsi əsiründür,
Bilməzəm ki, kimünçün qılur tapun nazı.

Nə sir var isə könüldə qulağuna demişəm,
Qanı məcal ağızunda ki, çıxara razı.

Saçun qılında dili gör ki, təndə çənbərdür,
Dəxi gözünə gətürmə cəhanda canbazı.

Ləbün görəli yaxın oldı bana türki məsəl, –
Ki, hər nəsnədə nazikdürür özivü azı.

* * *

İçəlüm bir tolu ayax ki, sirrimüz əyan olsun,
Nə sərmayə gərək bizə, qo südümüz ziyan olsun.

Ləbündən vam bir busə dilər işbu canum bənüm,
Könül gisundadur, işdə inanmazsan zaman olsun.

Dəmində sənciləyin xub hərgiz göz görimədi,
Sənün adun bu dünyada büti-axırzaman olsun.

Qaşun yayını qurmuşü gözün oxlarını çəkmiş,
Ləbündən sorayum suçi bana bir dəm aman olsun.

Könüli ləblərün, şəha, çəkişürlər, anı qurtar,
Eşitməzsən bu sözümi, qo aralıxda qan olsun.

Cəhanı qamu aləmlər bilürlər ki, cana dəgməz,
Bizüm bu bir cəhanumuz bu aralıxda can olsun.

Canum canuna ulaşdı nədür halını bilməzəm,
Buyurursan sorayum bən tutağun tərcüman olsun.

* * *

Dəm olmadımı ki, eşqi bizümlə saf edələr,
Bu sərvi boylular axır necə xilaf edələr.

Cəmalü lütfü məlahət bularda mövzundur,
Və leyk hicrü cəfayi qatı güzaf edələr.

Ağızları yarına canları sələf verürüz,
Rəvadurur bizə anı əgər sülaf edələr.

Gözi könülümi atdı toxındı canuma ox,
Arada assı banadur əgər məsaf edələr.

Alara əql ilə canü dili mübah edərüz,
Tə'əşşüqi bizə anlar əgər müaf edələr.

Gözi sinanına ki, saiqədürür cüzvi,
Rəvamıdur ki, yürəgümüzi ğilaf edələr.

Anı ki, işigini eşq ilə məqam edinə,
Rəvadurur ki, qamu əhli-dil təvaf edələr.

* * *

Novruz olalı cəhanı görsən,
Bu kəvn ilə bu məkanı görsən.

Tən-tən tənə düşdi cümlə tən-tən,
Sığmaz qanuma bu canı görsən.

Bən yaxıluram tütün gözikməz,
Bidud bəni yaxanı görsən.



Bir cari axır könül elinə,
Könül elinə axanı görsən.

Sultan dedilər könülə təndə,
Sultanlara ulu xanı görsən.

Qoysan özüni yüzinə baxsan,
Bu əmn ilə bu amanı görsən.

Düzsək oxuna sini nişanə,
Bu tir ilə bu kəmanı görsən.

Rəhmani dəxi unutmayaydun,
Bir gəz nəfəsi-yəmani görsən.

Nə əhlü nə xanuman anaydun,
Gər sən ulu xanədanı görsən.

* * *

Xərif oldum firaqə can içindən,
Üç yol buldum İraqə can içindən.

Çu ol huri bənümlədür həmişə,
Səlam olsun büraqə can içindən.

Dilü can qullığından ayru dəgül,
Quşansun ol yaraqə can içindən.

Gözə görünü gəlür qaşı hilali,
Baxıcağaz ayaqə can içindən.

Əgər salih olursa sana canum,
Qəriv eyləyə naqə can içindən.

Ulaşixdur nə könüldən keçərsə,
Bir ırmağ olub aqa can içindən.

Yüzün məşriqdə dəxi olur isə,
Könülüm anə baqa can içindən.

* * *

Çarə nedür dərdümə çün çarə yox,
Bənciləyin eşq ilə biçarə yox.

Qəmzələri cigərümi qan edər,
İlla yürəkdə ox ilə yarə yox.

Qanqı könüldə ki, odun olmaya,
Ol könüli bən bilürəm qarə yox.

Sən gəlicək bən bəni bulumazam,
Günəş ilə səb'eyi-səyyarə yox.

Bəndə, şəha, cüz ki, cəmalum sənün,
Başdan ayağuma dəgin arə yox.

Dari-şəfadur tutağun, bəs neçün
Şərbəti bu xəstəyi-bimarə yox.

Canü könül alurü inkar edər,
Ancılayın dilbəri-inkarə yox.

* * *

Lə'li-ləbləri cana şükr arturur,
Şükri şəkkər, şəkkəri şükr arturur.

Zikrini anun dilümdən qomazam,
Zikri könülümdə çün zikr arturur.

Xəttün əsrarın tənavül qıluram,
Çün təəmmül anda bin fikr arturur.

Hər gecə gisularından gözlərüm,
Qucağumda bir büti-bikr arturur.

Şəkkəri lə'lünə vardur hacətüm,
Çünki məstanə gözün sükr arturur.



* * *

Dedi könlündə nə vardur, dedüm həm,
Dedi gözündə nə vardur, dedüm dəm.

Dedi nədür bu aləmdə muradın,
Dedüm bir dilbəri-zibayi-həmdəm.

Çü dərdün böylə müzmərdür könüldə,
Neçün olmaz canun canuma müdğəm.

Ləbün dərdi ilə qanum su oldı,
Nola, gər dərdüm içün umsam əmsəm.

* * *

Ləbün ilə cigərüm hiç qanamadı, nedəlüm,
Dəm olmadı ki, ləbünlə qanamadı, nedəlüm.

Nə qaldı ki, yanamadı vücudu budumdan,
Ki, getmədi dilümüzdən yanam adı, nedəlüm.

Dəvama xətti bəratın yazamadıvü gözi,
Yürəgi qəmzələriylə yazamadı, nedəlüm.

Fəraqı yaramadı bu yürəkdəki yarayı,
Visali xud elə girüb yaramadı, nedəlüm.

Dəvam adını cəhanda bulımadı könülüm,
Mühal imiş bu cəhanda dəvam idi, nedəlüm.

* * *

Bana ax saidündən al ayaqi,
Tolu ver ta qılam cana təlaqi.

Mükəddərdür bu dəm hicr ilə vəqtüm,
Saç oduma yenə cami-rəvaqi.

Bizi xuni-cigər içsün demiş yar,
Hələ bən dutayım əvvəl yesaqi.

Əgər zülfi kibi uzun ola ömr,
Müəyyəndür, nə qalmış ola baqi.

Beli incəvü nazikdür bəğayət,
Qərar eyləyiməz nitqüm nitaqi.

Zücaci-xanə durur irmağ axar,
Bu gözlərüm ki, yanındur vəsaqi.

Oduna girəlüm, ani sevənlər,
Ki bilinə vəfamı, ya nifaqi.

Həva arturdı yürəgüm odını,
Var imiş ikisinün ittifaqi.

Hilal olmuş qaşı budur əcayib, –
Ki, yoxdur bədrinün hərgiz mühaqi.

* * *

Neçün qılmaz əcəb dilbər bizə meyl, –
Ki, gözlərüm axıdur qanını seyl.

Gözüm gecə uyımaz gisun içün,
Eşidəli ləbündən ki, qumil-leyl.

Ayax toprağına layiq bulınmaz,
Məgər kirpük ki, oldur tahirüz-zeyl.

Xəyali həm xəyal oldı bana çün, –
Ki, xalinün xəyali oldı sərxeyl.

Saçun gösdərdəli gündüzdə leyli,
Eşigündən qopar avazi-vaveyl.

* * *

Can cana irmədi isə, tən tənə irdi, şükr ana!
İşbu bizüm zəmzəmimüz, tən tənə irdi, şükr ana!

Anca cigər qanını bən ləbləri ilə içmişəm, –
Ki, sunıcax ağızuma, əl qana irdi, şükr ana!



Can ləbünüzə irəli təngdürür məcalı yox,
Eyşi gərək fərax ola, can cana irdi, şükr ana!

Gəldi xəyalı könlümə, özini buldı xanədə,
Muşdılıq oldı könülə, qul xana irdi, şükr ana!

Rövşən idi bu kim, yüzin sevər idüm qədimdən,
Şimdi bizüm bu də'vimüz bürhana irdi, şükr ana!

* * *

Bən qayətdə dərtlü oldum gəl dərdümə dəva isən,
Bən gözlərün xəstəsiyəm, lə'lün qanı şəfa isən.

Bən qaynamışam bütədə sal eşqinün iksirini,
Ola ki, mis altun ola, şərtincə kimya sən.

Yaraluyam, yaraluyam, yaraluyam, yaraluyam,
Şol şəhdi-ləbündən irür canuma mumya isən.

Belünə bağla canumı gər var isə bir ləngərün,
Tolaş bana zülfün kibi gər dərpeyi-həva isən.

Ayrılmağum yoxdur, şəha, ölməkdə dirilməkdə hiç,
Allah bilür, sən bilürsən mə'şuqəyi-hərca isən.

* * *

Şaha, sənün cəmalüni görəyim, andan öləyim,
Susamışam visalünə, irəyüm andan öləyim.

Bunca zaman ləbün içün saçun qaranusundayam,
Abi-həyat qandadur sorayum, andan öləyim.

Dün gecə düşdə bən səni bənüm ilə görir idüm,
Bu düşümün tə'birini yorayım, andan öləyim.

Bəzmi-əzəldə irəli canuma eşqi hüsninün,
İrimədüm, varamadum, irəyim, andan öləyim.

Canumü əqlümü könül zülfün içində yetdilər,
Təşviş əgər olmaz isə tarayım, andan öləyim.

* * *

Sən gəlicək bu söhbətə bu tənümüzə can gəlür,
İrişicək bu dövlətə san ki, yeni cəhan gəlür.

Yöriyicək belün ilə incə xəyal edər canum,
Söyləyicək ağzun ilə könlümə bin güman gəlür.

Cadu gözün çü əsridi, qəmzələrinə ox derəm,
Nə əcəb ox olur isə, qaşları çün kəman gəlür.

Gözi apardi könlümi ləbi zaman gərək ana,
Şimdi gərək ki, sorışam borclu içün zaman gəlür.

Türki gözi bu könlümi yasağa yetürə gərək,
İşvələrünçün öləyim ki, canuma aman gəlür.

* * *

Səhərdə canuma irən nəsimi,
Ana zər bənzədiməzəm, nə simi.

Nə'im edən cahimi sənün ilə,
Cahim edər bana sənsüz nə'imi.

Nə mimi aç, nə simi gösdər andan,
Nə sini gösdərürsin, bu nə mimi.

Nə hadis oldı ki, qıldun dili rəd,
Çü məvtindür, ana zülfün qədimi.

Günəşdə yüzə büxl etdün nə içün,
Diriğ etdün şəmamundan şəmimi.

Necə bir qəhri-xası işlədürsin,
Əlünə al axır lutfi-əmimi.

Yükindüm, dedi hazır qıl ğərimün,
Çağırdum ya ğəramı, ya ğərimi.



Gözündəndür könül məcruhü xəstə,
Nə çarə, çünki lə'lündür həkimi.

Bənə bu yara yara tə'nə dəgül,
Qanı gösdər gözəlden bir selimi.

* * *

Könüli eşqün ilə can əzəldən,
Xəmir etmişdürür eşqi əzəldən.

Qılur paludə hər dəm qan yaşı göz,
Bənə hər ləhzə gözlərin süzəldən.

Az əldən getmədi axır yoluna,
Saçunda əqlü canü dil azaldən.

Sorardı könül izin can saçundan,
Pərişan oldı, çün getdi iz əldən.

Göz əldən getdi qan yaş ilə getməz,
Dəxi gözlərümün gözi gözəldən.

* * *

Bəqası yox bu cəhanun fənada dutma məqam,
Tur imdi, saqi, tolu ver əlümə cami müdam.

Vücudi külli fəda gər qıla kişi yolına,
Ömür yolına köyiməyə bir nəfəs əyyam.

Ləbini sordum ol aydur ki, bir meyi-püxtə,
Dedüm ki, zülfi nədür dedilər ki, ənbəri-xam.

Saçun büriyəli yüzüni bildüm anı nəfir, –
Ki, yaxın olsa qiyamət qərib olur islam.

Ləbüm ləbünə uzandı ki, sora nərxi-şəkər,
Gözi der ögüni devşür baxa durur lalam.

* * *

Olalı xalına gisusi haris,
Bu meydandan top urmadı faris.

Saçınun xadimi ənbər çü sünbül,
Gözinə qaravaş əbhər çü nərgis.

Nəmək haqqını bilür nola gözüm,
Ləbünçün axıdursa gözdən əris.

Xəyalunsuz dəm urmaz bu gözüm, –
Ki, gərm olmaz məcalis bimücalis.

Zənəxdanunda qıla dil qərarın,
Çü zindan ola təkyəgahi-müflis.

* * *

Nigara, necə ki, irağ isən bini ana dur, –
Ki, sən nərədə olursan yönümüz ol yanadur.

Hicaza gər varur isəm təvafdan sonra
Yəqindür ol ki, könül sə'yi həm yenə sanadur.

Gözün ki, qəmzə oxın rast qıldı qodı gəzə,
Nişanəsi dəxi yoxdur anun yöni banadur.

Dedüm yürəgümə ki, tut ayax anun gözinə, –
Ki, meyli gözlərünün anadur, dəxi banadur.

Ləbünə ki, anadur meyli könülün dedüm, –
Ki, hər nəfəs bizi xeyir söz ilə ana dur.

* * *

Seyfi-qatıdur bu fürsət bada verme, badə ver,
Yox der isən ömrümüzi badə virmə, bada ver.

Aşinayi-bəhri-eşqəm andan əşkə qərqəəm,
Aşinayi verməz isən bizə sən bil yada ver.



Bendeəm azad qılıb bəndə salmağil bəni,
Bu nəsibət aləmədür bəndəvü azada ver.

Dilərəm zülfün ilində seyr qılam bu gecə,
Yol uzaxdur, şol ləbündən canuma zəvvadə ver.

Yıllar oldi bən sana ki, can verürəm hər nəfəs,
Şimdi bir busə ləbündən bir xilafi-adə ver.

* * *

Yüzün görüb ağlar isə bülbül gülə qarşu,
Sən bülbülə bülbül deməgil, gül gülə qarşu.

Gər zülfün içün söz der isə tart qafadan,
Bənəfşə dilini, sənəma, sünbülə qarşu.

Qarşuna sürahi gərək ayda dura qülqül, –
Ki, ayağ içələr tapuda qul qula qarşu.

Gülşəndə gülə irdün isə sən gülə görgil,
Bülbülə rəva gör ki, irə qülğülə qarşu.

Könül fili aldı isə hind elini nola,
Gisuları çəngəlini gör qıl qıla qarşu.

* * *

Gisusı könlümi yenə uş yaya başladı,
Əqlümi cadu gözi yen yaya başladı.

Zülfinə saldı könlümi çün hicr çərisi,
Miskin xəti çü gördi anı yaya başladı.

Yarun xəyalı gözümə gəlmişdi nagəhan,
Əfqanə çəngü dəf yenə qovğaya başladı.

Bir dəm bu vəqtümüzi necə zaye edəlüm,
Ömrün bitikçisi çü nəfəs saya başladı.

Eşq ayağını dəxi böyük dilərəm içəm,
Çün əsridən ayağı yenə aya başladı.

Könlüm zaman idi ki, gözində əsir idi,
Nola əgər müvəkkilin ödəyə başladı.

* * *

Həyva oldı bənizüm dilbərün alması ilə,
Toğradı cigərümi qəmzəsi alması ilə.

Bənizüm sarusı narıncı olur yaşum ilə,
Oldı yürək cigər ikən qara alması ilə.

Könüli almasıdur gözləri şol ləblərinə,
Bəs bu viran necə mə'mur ola alması ilə.

Toprağ ol badi-səbaya ki, açar zülfi üçin,
Bağda gər dilər isən ki, qızıl alması ilə.

Abı yox həyvanun əlhəq zənaxı qatında,
Yanağı cənnəti tərk etdürür alması ilə.

Əli narına apardumü bana alma dedi,
Dür kibi yaşı rəvan eylədüm alması ilə.

* * *

Həyva ənəgünə, yanaxlaruna alma derəm,
Anları görəli kim, ayda ki, bən alma derəm.

Şəftalusına əl uzatdum idi, alma dedi,
Canuma gər nəzər eylər isə, uş alma, dərəm.

Varayım ağızı püstə, ləbi şəkkər qatına,
Al dilərsə iki gözümdən axar alma derəm.

Necə al alma deyü aldaya alması ilə,
Hüsni xanında anun necə bir al alma derəm.

Görəli zülfi kəməndi ilə xunxar gözin,
Hər gözi qəmzəsinə bin başı bir alma derəm.



* * *

Bizə billah bu gülşən dəxi xandan, –
Ki, olur gülləri yüzümə xəndan.

Ləbi şəkkər, sözi şəkkər əcəbdür, –
Ki, şəkkər toğa qandan yəni qandan.

Necə dəndan çəkəlüm ləblərindən, –
Ki, gördük lə'linün içində dəndan.

Gəlün, qəllaş olalum çünki yarın,
Zənəxdanundadur zindani-rindan.

Soraram ləblərindən qanda buldun,
Bu şirin lə'ldən nazük nəməkdan.

Əya meydən bilənlər yar lə'lin,
Gəlünüz uşda bizü işdə meydan.

* * *

Gözüni xüftə görəli əsiri-xab gözüm,
Xumar anlayalı axıdur şərab gözüm.

Gözüm görürü düşər eşqi odına könlüm,
Bu aləm içrə qılur könülə əzab gözüm.

Xəyalı qapusını bağla dedi gözümə xab,
Oyandı şimdi dilər qıla fəthi-bab gözüm.

Anun həvası ilə tən türabü dil ateş,
Dəgül ol ortada illa məgər pürab gözüm.

Tənüm tağ idivü yaşum Fərat idi şimdi,
Xəyalə döndi tənüm oldı çün sərab gözüm.

* * *

Sərraf əgər görsə dişün kibi dürdanə,
Tərk eyləyə hirfətin oturmaya dükkanə.

Hacət nə ki, gözlərün yürəgümi yaralar,
Gözümdən axan qandur dilərsə ləbün qanə.

Qazı gözünə hey de oxa-yaya nə hacət,
Görmədin anı könlüm gəlmiş idi imanə.

Könül, şaha, gözündə çün guşənişin oldı,
Əhli-kərəmə ikram vacib ola mehmanə.

İsa ilə Məryəmdən örnək alü dəq dutma,
Şol sərvi-rəvanında bitdi isə rümmanə.

Lö'lö necə lə'l ilə düzildügin ögrəngil,
Qandasını ey cevhəri bax bu ləbü dəndanə.

Bən cani-giran verdüm ana bənə ol eşqin,
Tə'lim edün ol bütdən yaxşılığı yamanə.

Səndən çü diriği yox vəslüni diriğ etmə,
Canın samana saymaz nəv bisərü samanə.

Yağılavü yaxana miqdarı dəgül artux,
Varlığını eşqünün odlarına yaxana.

* * *

Nola əgər fəth oldı isə bizə Simalu,
Ki, görməmiş ola göz xubi işbu simalu.

Bu vadi ilə bu tağda mühəyyər oldı könül,
Dərəsidür tolu kəkligü tağı iməlü.

Könül nedə, nə qıla furqətində ol yarun,
Ki, mərkəbi ola düşmiş ədügi yamalu.

Nə qıydı canuma bu qaşları ulaşuxlu,
Ki, fürqətə sala dilər bu gözi qıymalu.

Ətəgi belünə sox, al ayax ələ, saqi,
Ki, dərdünə bu gözüm ayağına sim-alu.



Saçun şəma' ili gər esər isə könülümə
Şimal yeli düşə kim ola nəsim-alu.

Həvayla çü beqayəti ikimüz üləşdük
Bu qismət içrə rəvamı ola Qasim-alu.

* * *

Yar bizümlə yenə qıldı özin,
Özgələr ilə qılur oldı sözin.

Şol xətayi gözi qan etmiş məgər,
Yayın oxın qodı, gizlədi özin.

Yüzi bədri hər gecə qarşumadur,
Ol dilər gizləyə bindən gündüzin.

Şol günəş yüzündəki bənmi durur,
Yoxsa saldı ihtiraqə yılduzin.

Söz uzun etməvü sözə çarə qıl,
Bən sana çoxdur derəm sözün uzın.

* * *

Biar gördün isə bizi ari sanmağil,
Kasi tolu ver əlümüzə ari sanmağil.

Andan bərü ki, eşqün odına yaxılmışuz,
Bazari boz, şəha, bizi bazari sanmağil.

Yüz həlqə çərx urub saçuna bən tolaşmışam,
Bini tolaşdı bəndünə naçari sanmağil.

Qayət susamışam ləbünə yan dilərəm,
Yaranlarumı qıla bana yari sanmağil.

Ol bari ki, belündə sənün gördi gözlərüm,
Vermədi könlümə anı bari sanmağil.

Eşqün qapusını gecə-gündüz bənəm qaxan,
Uyırü oyanıx daxi dəyyari sanmağil.

Eşqünə canü əqlü dilü tən bənəm verən,
Bu şarı eşqünə, sənəma, şari sanmağil.

* * *

Nagah eşqünün odına yana düşmişəm,
Sevdan ilə uyır ikən oyana düşmişəm.

Girdi könül qanına, şəha, ləblərün vəli,
Baş qoyub anlarun qanına qana düşmişəm.

Xətin xəta deyü hələ qövlini çin tutub,
Bir uca irəm deyü o cana düşmişəm.

Sevdayiyəm saçı ilə nola müfərrihi,
Sorar isəm çü şol ləbü dəndana düşmişəm.

Şirin nüktə incə dəqiqə ləbi ilə,
Belindən anlayalı bu bürhana düşmişəm.

Divanə dəftərində ki, xublar yazıldılar,
Bənəm hesab anda ki, divana düşmişəm.

Bəndən vücudini canumun görməzəm irax,
Çünki ədəm yolın qoyub imkana düşmişəm.

Cananı cana tərk qılan müşkilə düşər,
Canana canumı qoyub asan düşmişəm.

Şirinü Xosrov iləvü Məcnunü Leyli tək
Bən dəxi sənün ilə bir əfsanə düşmişəm.

* * *

Üşdi şəkər ləblərinə miskü xütən qarıncası,
Oldı ana cümlə fəda əqlü könül varıncası.



Sordum ləbindən dərdümi totağın aldı ağzına,
Bənzər müfərrih isdədi bu aşiqün sor necəsi.

Mə'şuqə çox ziba, veli tuzluvü şuxü şəngi az,
Üşşaq arasında dəxi ayrıxsıdur bir neçəsi.

Vəsli qısa, hicri yoğun olur imiş bu dünyada,
Mə'şuqənün bulınıcax saçı uzun, beli incəsi.

Sima bini zülfün kibi eşqündə çünki toğruyam,
Simasına bax aşiqün bari anı suçıncası.

* * *

Nazlucasın nazəninsin bilməzəm cananəsin,
Canımuzsın, canımuzsın bilürəm cananəsin.

Sərvü boyundur qiyamət qorxaram bundan qopa,
Fitnədür xüftə gözün, üşənürəm oyanasın.

Can ləbünün qanına dilər ki, qana qana qan,
Necə sən qanlu yürəgümün qanına qanasın.

Qulluğa canum yasanur necə zülfün yasanur,
Zülfünün bəndində bəni sən usana sanasın

Can ilə könül apardı əql acıdı eşq der,
Assısından bixəbərdür yana yanasın.

* * *

Zi-novruzi durur, şəha, visalün bizə novruzı
Qanı siz, ey nigarinlər, görün türki-nov-amuzı.

Kamanın xəta qurma yenə kirpigüni çin düz,
Bu könlümüzə məcmu et nigara tiri-dilduzı.

Məgər zülfüni tağıtdun qaranulıx durur dünya,
Gidər zülfünivü gösdər bizə mahi-şəbəfruzı.

Könülümə dedüm bən ki, girişməsinə girişmə,
Yürü, badi-həva sanma bu nari-eşqi-dilsuzı.

Gecələr tana çıxardım, şəha, zülfün fərağıyla,
Olunca yüzüni (gösdər) nigarına bana ruzi.

* * *

Ey saçun türrələri və'l-mürsəlat,
Canumun şövqi sana və'l-adiyat.

Səndən özgəyə canum et-taibun,
Dil yüzünə rakiatun sacidat.

Şəh ruhuna tərh edübən atını,
Könülüm olmuş piyadə, şah mat.

Eyd edəli qaşları ayı ilə
Xətti verür bana qedrümcə bərat.

Necə səndən bən iraq ola biləm,
Ey saçun türrələri və'n-naziat.

* * *

Nola səni sevmişəm kafir dəgüləm axır,
Cümlə səni sevərlər bən bir dəgüləm axır.

Hər kim ki, səni sevər səndən aparır bir xət,
Bana dəxi gərəkdür nazir dəgüləm axır.

Bən sana irincəgəz qayib oluram bəndən,
Qayib əgər olmazsam hazır dəgüləm axır.

Bən qul özümi sana verdüm əbədi, şəha,
Bir ləhzə közigürsin zayir dəgüləm axır.

Gözün ilə öldürüb lə'lünlə dirildürsin,
Bən mö'cizənə, şəha, münkir dəgüləm axır.



* * *

Nəsimi-sübhdəm tez gəl yara bizdən salam apar,
Yürəgi tolu qan etdüm əlündən gəlsə cam apar.

Yüzünə zülfüni tağıt gətür şamı gidər sübhi,
Gidər zülfüni yüzündən gətür sübhivü şam apar.

Zülalin yarunun, şəha, bu təşnədən diriğ etmə,
Həlal olsun sana qanum, həlali ver, həram apar.

Qanumı qara gisusı çü xüşk eylədi müşk aldı,
Arada bir bədən qaldı ki, bir ud oldı xam apar.

Vücuduma dedüm bən dün ki, ver varlığı sən yara,
Nə canı qovü nə cismi bu ortalıxda nam apar.

* * *

Şaha, lütfin müdam olsun həmişə,
Fəraqın səngine döyməz bu şişə.

Bənəm xəstə ləbündür əm olamı,
Ki, bu xəstə içün vara əm işə.

Sənün eşqin bəni yaxdı sanasın,
Ki bir od salı verdün bir qamışa.

Güm iş dəgülmisə eşqin yazaydum,
Halumi altun ilə bu gümişə.

Bu eşq odı səpişkendür, nigara,
Ümidüm var sana dəxi səpişə.

* * *

Nigara, öldürür bizi fəraqun,
Bizə taqət qomadı iştiyaqun.

Dilü əql ilə can vardı çəriyə
Qaçan ki, yetdi bizə bir yasaqun.

İrağunı yaxın eylədi eşqin
Yaxınunı iraq etdi fəraqun.

Həzəran əlünə busə qılaydum.
Əgər girsəydi əlümə ayağun.

Yasaqun fərzdür boynuma bənüm,
Vəlikin saquna yetməz yasaqun.

* * *

Tolu verür ayağı bizə saqini görünüz,
Əlinə alü qoma der yasaqını görünüz.

Ömür axar suya bənzər, keçənə yetilməz,
Bir-iki dəm var isə şimdi baqını görünüz.

Könülüm uçmağa tursa irər yara bu dəm,
Həva ilə gəlün anun Buraqunı görünüz.

Necə ki, yaxına gördük yaxına yetmədük,
Gözüm yaşına dedüm ki, iraqını görünüz.

Visali ilə nə özümi bilürəm, nə anı,
Necə könüldə yer etdi, fəraqını görünüz.

* * *

Əqlimə bənüm eşqümi tənnaz edisərəm,
Dərdümə bu gözlərümi qəmmaz edisərəm

Şol zülfi-rəsənbaza ki, çənbərdən asılur,
Qol eyləyübən əqlümi canbaz edisərəm.

Dedüm ki, çoğ etmə bana nazı dedi çün sən,
Azı çoğ edərsin bana pəs naz edisərəm.

Ənbər kibi miskin könülüm gisularunla,
Düşib oda faş etdi nə kim raz edisərəm.



Cüz ney çü bənüm sözümə bir saz edimədi
Bu Rum elini yaşım ilə saz edisərəm.

Uzadur isəm sərvi boyun sözini nola,
Şəkkər ləbünün vəsfini icaz edisərəm.

* * *

Bizümlə hilə qılur nedəlüm cəhani-fəna,
Dilər ki, quşca canum eşqinin oduna yana.

Gözi çü qıl qələmilə yazar yürəgümdə,
Qızıl mürəkkəb ilə yüzdə yazduğı oxuna.

Necə xətayi deyəlüm bu türkinün gözünə,
Ki atar isə yabana nişanəyə toxuna.

Nəsim verdi yelə dutxun eylədi könüli,
Apardı gisularınun qarasına axına.

Visali və'dəsi irdivü geçdi irəmədüm,
İrağa saldı fələk könülümü yaxına.

Qanadı yox könülümün ki, uça sevdiginə,
Qanadı qanı nigarun gözi ki, qana-qana.

Yüzündə gördügümi bən görürsə hər bidil,
Fəya kəramətə mən zallə yabudu'l-vəsəna.

Cəfaya səbr edəlüm ol visali gözədibən,
Fəraqdan ola ki, çərx dəxi həm usana.

Saçında azdı könülümü azduğı uzanır,
Könül dilər anı ki, azmağ azana uzana.

* * *

Qanısın, sən qanısın, sən qanısın, sən qanısın,
Yürəgümün qanısın, sən qanısın, sən canısın.

Nə həvasın, nə nəvasın könülün çəngində sən,
Bilməzəm qandan gəlürsin hatifi-rəbbanısın.

Sən ki, canistani-iraqısın sana dil zirədür,
Dil nə qədri ola tapunda çü sən kirmanısın.

Sehrü lütf ilə gözün lə'lün dirildür dəpələr,
İsayi-Mərqəmisin, ya Musayi-İmranısın.

Rövşən oldur ki, yanaram atəşi-lə'lün içün,
Gər bəha oldu giran nola, bəgüm, ərzanısın.

Müştəri oldu Zühəl sevdasına zülfeyninün
Dedüm otur aşağa eşqində bir keyvanısın.

Canısın könülümə, sən canısın könülümə,
Yari-canısın, nigara, leyk yarı canısın.

* * *

Yenə işbu susamış can bir dənizə təşnədür,
Şol dənizə təşnədür ki, sizə-bizə təşnədür.

Can ki, sirab oldı ana bən necəsi can deyəm,
Can dedügüm oldurur ki, bir əzizə təşnədür.

Bən sənün lə'li-ləbünə yə'ni heyvan suyına,
Təşnə oldum kim qulama, kim kənizə təşnədür.

Təşnədür qəddün sənün bənüm yürəgim qanına,
Şöylə ki, düşmən yürəginə bu nizə təşnədür.

Lə'li-ləblərünə qanlu yürəgüm gər susadı,
Nola hər nəsnə cəhanda yenə çizə təşnədür.

Tolu ver, saqi, çün fəsli-xəzandur,
Adəm qanı dəgül xuni-rəzandur.

Yaşum qızardıvü bənzüm sarardı,
Könülümdə həva çünki vəzandur.

Saru bəniz, qızıl süci bu mövsüm,
Xəzan əndər xəza, əndər xəzandur.



Xəzan fəslidürür zahirdə likin,
İçümdə mövsümi-mivə-pəzandur.

Pərişan oldu zülfün bən dəxi həm,
Bu könlüm şurişi axır əzandur.

* * *

Xəyal olmış belün, ağzın gümandur,
Ləbündən qan qoxuları dəmandur.

Dəgül qamət, qiyamətdür bu qəddün,
Gözün xod fitneyi-axır zəmandur.

Gözün can aldı zamindür totağun,
Dutarsam lə'lüni, nola, zamandur.

Gözüm gök oldı yüzün görmək içün,
Zəmin oldı yüzüm xeyli zəmandur.

Nigarına qapunda cəm'i üşşaq,
Aralarında bangi-əlamandur.

* * *

Nə al edər, sənəma, yanağun bu yaşum ilə,
Ümid qəddünə uzundurur bu yaşum ilə.

Ümid çünki tapundur eyüdə-yavuzda,
Bərabər olsa gərəkdür səfa səvaşum ilə.

Qaşun yayiylə göz oxın nəyə ki, gözlədün,
Bitürəyim ol işi bən, nigara, qaşum ilə.

Sənün yolunda xələl bən gətürməyəm hərgiz,
Və gər həlal olur isə tutam bu başum ilə.

Vücuduma çü məded yoxdurur məgər ki, tapun,
Təvəccühi sana qıldum içümlə taşum ilə.

* * *

Ta və'deyi-vəsli aramuzda keçər oldı,
Hicranı dəmindən dəxi halum betər oldı.

Zikrümdə məgər qılur idüm bən ləbini dün,
Yar ağzum içində sanasın ki, şəkər oldı.

Sevdayi-siyahı saçınun boynuma düşdi,
Saidlərinün dərdi bilümə kəmər oldı.

Eşqün nə ki, gizlədi isə işbu könüldə,
Yüzümlə gözümdən bu cəhana xəbər oldı.

Yaşum suvü bənzüm gümiş idi, sənəma, uş
Eşqində biri lə'ldürü biri zər oldı.

Bağrum qurıdı bunca zəman eşqin odıyla,
Lütf eylə, iriş, başladı şimdi yanər oldı.

İçümdəki od gizlənə demə dəxi, bəgüm,
Bir şardurur tən, sanasın ki, fənər oldı.

Kafir dəgüləm hey de ki, oxladı yürəgüm,
Ol oxa əl urunca yürəgüm qanar oldı.

Qanuma susayalı, nigara, ləbi-lə'lün,
Hər bir tamarumdan sanasın qantamar oldı.

Bürhan ilə sabit qılıram görəli səni,
Ki, şəmsi-fələk dəxi qulami-qəmər oldı.

Biz şəm kibi yanıban ağlayalı, şəha,
Bənzər ki, zəmiründə sənün qəsdi-sər oldı.

Əqlü dilü can taladı bəndinə buraxdı,
İşbu necə şəhr idi bizə ki, tatar oldı.



* * *

Görsəm nə xəta ola əcəb şol qınımını,
Çindən key isə ki, biləm anun, qarımını.

Lə'lünə dedüm halümi ısırdı totağın,
Fərq eyləyimədüm dəxi əmindən əmini.

Dəmdür yürəgüm ilə yaşum hər biri hər dəm,
Adəm deməzüz ana ki, bilməyə dəmini.

Yayın da anun tiri görür hər qara gözlü,
Hər kişi görimoyə kəmanında kəmini.

Mütrübliği gər gögə irürəm nə əcəbdür,
Çün zülfi girehləri urur çərxü zəmini.

* * *

İlahi, şükr sana ki, mübəddəl oldı bu hal,
Əlümüzə tolu verdi fələk zülali-visal.

Xəyali-vəsldürür şimdi bu dimağumda,
Əlümə girməz ikən heç dəxi xəyal, xəyal.

Həram qıldı gözün uyxuyı bənüm gözümə
Həqiqətə baxıcax, billah, zəhi, sehri-həlal.

Fəraqi-vəsli visali-fəraqdan nedəm,
Fəraqi qıldı fəraq, visali qıldı visal.

Belün qılıvü ləbün qalı ilə bir zərrə
Tənümdə qalmadı qılü dilümdə qalmadı qal.

Fəraquna necə döysün, nigara, dəlü könül,
Çü döyiməyə gözünün oxına Rüstəmi-Zal.

Ləbün təsəvvüri yaxud xəyali belünün,
Zəhi təsəvvüri-batil, zəhi xəyali-mühal.

* * *

Gəl, gəl ki, könülümdə qalmadı qərar,
Tez gəl ki, yürəgümə od düşdi yanar.

Sə'r oldı bənüm tənümü yanar yürəgüm,
Gər gecə gəlür isən düzildi fənar.

Yürək qanamaz leykin sən qəmzələrüni
Dəprədür olur isən filhal qanar.

Bu ortada nigahın sundum belinə,
İrincə kənarına eylədi kənar.

Dar idə diyarı dil həm sənün içün
Dilər dəmümi sinə dar ilə diyar.

* * *

Zəhi zülfü zəhi şamə bu gecə,
Ki, tə'n edər yenə şamə bu gecə.

Yasamış gisusu kafir çərisin,
Şəbixun qılur islama bu gecə.

Nə leylidür, nigara, gisularun
Qara gündür bu əyyama bu gecə.

Fələk zöhrəsi bu gün qaravaşdur,
Qulam lə'li-meyaşama bu gecə.

Nə simadur, şəha, bu surətündə,
Ki, lə'lün eşqidür kamə bu gecə.

* * *

Yüzüni sevdügi içün məlamət olamı dil?
Bu gözlərüni göricək səlamət olamı dil?

Həzar yirdə dəlükdürü qanları axar,
Əcəb bu xəstəliğ içün həcamət olamı dil?



Görəli gözlərini fitnə oldı bu könülüm,
Görürsə qamətini pəs qiyamət olamı dil?

Cigər kəbabü yürəkdə şərab düzdi könül,
Gözi xumar idi, didüm kəramət olamı dil?

Totağı totağuma ver ağız-ağız hər dəm
Ki, oldı bana müsəxxər təmamət olamı dil?

* * *

Günəş, sənəma, yüzünü alnun çü qəmərdür,
Belün ilə qonşısı çü kuhü çü kəmərdür.

Gül yüzün adına oxıya xütbeyi bülbül,
Yüzümdə sənün eşqin içün sikkeyi-zərdür.

Xalün yanağunda, sənəma, qıla nida ki,
Kim bana verürsə könülin qanı hədərdür.

Yarum bana gər bağladı isə qapu nola,
Çün eşqi həvası könülə həlqəyi-zərdür.

Bu türfə dəgülmi ki, könüldən sana varan,
Elçi sözi məcmui-xolayıqda xəbərdür.

Əfsanədürür bizə görə Vamiqü Əzra,
Məcnun ilə Leyli bizə nisbət çü səmərdür.

Hərçənd şəriət ki, qılur hurini təhsin,
İnandum ana leyk tapun çizi-digərdür.

Zülfiylə bənaguşidürür ənbərü kafur,
Lə'liylə zənəxdanı anun şirü şəkərdür,

Çün yüzün ilə bağladılar hura qüsurı,
Olmaya əcəb adəm əgər anda bəşərdür.

* * *

Tənüm can oldı çün cana irişdi,
Yenə bu qətrə ümmana irişdi.

Dilüm sərraf olur isə rəvadur,
Çü könlüm bir yeni kana irişdi.

Özini mur gördi eşq içində,
Anunçün bir Süleymana irişdi.

Zəmanlar ağladı bulud ki, bir gün,
Zi-nagəh virdi-xəndana irişdi.

İçümüzdə sanasın eşqə döndi,
Nə ki, ləbdən bu dəndana irişdi.

Bu dövrə səd həzəran afərindür,
Bizümlə çünki peymana irişdi.

Bu həsrətdən çəməndə laleyi gör,
Ki, ağzında əli qana irişdi.

Könülə dəxi yoxdur qüssədən qəm
Mübəşşir çünki zindana irişdi.

* * *

Sübhdəm gözün ilə aləmi nəxcir edəlüm,
Bu gecə gördügümüz düşləri tə'bir edəlüm.

Arizi ümmidürür zülfüni bir xət deyübən,
Hacibi tuymaz isə nə ola təzvir edəlüm.

Müşk ilə müşkilə salduxları ayətlərini
Şane ilə qılalum həll, anı təfsir edəlüm.

Eşq mədrəsəsi müdərrisi yüz qam soran,
Ol dəlili bizə ki, eşq ilə təqrir edəlüm.

Gər dəlü qıldı isə gözləri razıyuz ana,
Lə'lini dari-şəfa zülfini zəncir edəlüm.



* * *

Dedüm ki, əcəb ləblərüni kim sorar, ey dost
Aydur bu xəyali qovanı kim sorar, ey dost.

Dal etdi saçın, qəddin əlif, ağızını mim,
Bir damdürür şimdi ki, yeni qurar, ey dost.

Zülfünə tolaşdumü qərar edəməzəm hiç
Gəzdüm bu cəhanda qamu kuhü kəmər, ey dost.

Gördüm yüzüni görmədüm anın kibi bir gün,
Pərvin ilə qonuşduğunı bir qəmər, ey dost.

Tifl oldı bu əqlüm necə pir isə ləbünlə,
Nə ki, əlinə girür isə, tifl əmər, ey dost.

* * *

Məhbub xidmətinə əgər yarumuz derəm,
Küllidürür nə var dəxi ki, yarumuz derəm.

Odü həvavü su ilə xak oldı adəmi
Bir nəsnə qopa gər qarıla yarumuz derəm.

Bən mum eşqinəyəmü ol şəhdi canuma,
Bu dud ilə gedə olamı arumuz derəm.

Nam oldurur ki, tərk qıla kişi namını
Məqsəddən edə arı bizi arumuz derəm.

Qaşı dilər ki, kişinə sala bu canumı
Zülfün yetər axı bizə zünnarumuz derəm.

* * *

Aşiq ki, hicrə uğradı dərviş olmasa,
Mə'şuqa qəmzəsiylə könül riş olmasa.

Xoşdur çəməndə yar ilə zövqü səmavü eyş,
Leykin kəmində üzri-bədəndiş olmasa.

Məstanə gözləri ilə gözüm bulaydı xab,
Şuridə gisusiylə təşviş olmasa.

Bən yara irişicək özümi unuduram,
Əzçünü əzçəra dəxi təftiş olmasa.

Ox kibi rast, yay kibi bağlansa bəndinə
Qurbanı olsa talibi-hər kiş olmasa.

* * *

Təşbih gözüm yaşını ırmağa yaramaz,
İrmağa necə bənzəyə, ırmağa yaramaz.

Yalquz dəgüləm bəlki cəhan hüsninə aşiq,
Cövr ilə cəhanı qamu qırmağa yaramaz.

Vaiz ögüdün tut sana ayrılmazam andan,
Təndən canını kişi ayırmağa yaramaz.

Könlümdəki sirrimi təpuna ağız-ağız,
Diməк dilərəm çünki çağırmağa yaramaz.

Xuni-cigərüm oldı dəniz, göz yaşı ırmax,
Sığursa kişi dənizi ırmağa yaramaz.

* * *

Bana lazım dəgülmi bir tərəhhüm,
Nola çün adəməm yidümsə gəndüm.

Şaha qandum, ləbündür çün susadum,
Yürəgümün qanına dəxi qandum.

Nə sanursın ki, usanammı səndən,
Bu sanu sanma ki, səndən usandum.

Oda yanar odum leyk adəmilər,
Yanarlar böylə ki, oduna yandum.



Sofavü eyş bana əksük olmaz
Çü eşqində bu ad ilə adandum.

Gərək Mənsur olam bən eşqin ilə
Qədündür darü boynumda kəməndüm.

Odum yaş ırmağiylə sakin olmaz,
Nə qılayım əcayib oda yandum.

Əgərçi eşq rəngi yox nigara,
Bən ol birəng rənginə boyandum.

Nigara, zayi etmə sə'yümüzi,
Zəmanlardur ki, sənünçün uzandum.

* * *

Gərək ki, könül haləti yazıla bu gecə,
Başdağı xumarum dəxi yazıla bu gecə.

Yaz oldıvü bülbül inilərü gül açılur,
Dil iniləyə, açıla, yazıla bu gecə.

Yazmaz gözi könülümüzi qəmzə oxıylə,
Vəsli necəsi ola ki, yazıla bu gecə.

Sübhin yüzini şəm ilə kimsə bulımaya,
Gər gisuları gözilə yazıla bu gecə.

Zülfüni əgər düşürür isən yanağundan,
Quşlıx günəşi qulluğa yazıla bu gecə.

* * *

Bəzənmişdür yenə gülşən bu gecə,
Əya bülbül gözün rövşən bu gecə.

Neçün türki gözün gizlədi oxın
Neçün geymiş yüzün cövşən bu gecə.

Ey göz, göz ol nigarın söhbətində,
Ey yüz, ayağına döşən bu gecə.

Gecə-gecə deməgil dün qısadur,
Sabah etmiş kəmin üşən bu gecə.

Miyanından kənarın dilər isən,
Saçı eşqin bilə quşan bu gecə.

Dəlük ayinə səndən oldı xudbin,
Anun yolına gəl uşan bu gecə.

Bu gün minbərdə bülbüllər qılur şur,
Ki, bəzənmişdürür gülşən bu gecə.

Gecə qaranuvü zülfün qaranu,
Ayıblanmaz ana düşən bu gecə.

Üşənməyib şəkər totaxlaruna,
Həzarlardur məgər üşən bu gecə.

* * *

Yüzün üsdində saçun həm çün şəb əndər ruzdur,
Qəmzən oxları nigara navəki-dilduzdur.

Dildə zülfü xəddün içün ertə gecə sazdur,
Könülümdə hicrün odı ilə dayim suzdur.

Gərçi tirəndazdur cadu gözün şəha sənün,
Ki, anun işvələri qayətdə eşqənduzdur.

Nöqtədür xalun sənün ayətidür hüsnünün,
Nüqtədür mə'nisi anun sureyi-mərmuzdur.

Gözlərün tatarı içün canı pişkəş çəkərəm,
Ta ləbündən əyağ içəm, yə'ni ki, novruzdur.



* * *

Dərdünə dəva ah ilə qılalum, əfəndi,
İqdam işə Allah ilə qılalum, əfəndi.

Kuh isə könül kah durur beli qatında,
Biz işümüzi kah ilə qılalum, əfəndi.

Tacir çevügi şah ilə qılur satu bazar,
Can bəy'ini biz şah ilə qılalum, əfəndi.

Əfvahda derlər ki, ləbini soraram bən,
Biz bu işi əfvah ilə qılalum, əfəndi.

Dil lə'linə can belinə bənzər sənəmün pəs,
Biz bəy'ümüz işbah ilə qılalum, əfəndi.

Biz çün göriməzüz günəşi ayda bir, ey dost,
Bünyadumuzı mah ilə qılalum, əfəndi.

Sən Yusifi-Misrivü banadur zənaxun çah,
Yusifliği pəs çah ilə qılalum, əfəndi.

* * *

Sabahdur qanı, ey saqi, bu səbuh əyağı,
Şəbəhlərə yeridür şimdi tolu ruh əyağı.

Bu gecə bir yeni ömr idi bizə ol həqdən,
Bu fəth içün nola sunsan tolu fütuh əyağı.

Çü tövbədən qılıruz tövbə nola əgər
Yükinübən sunasın əlümə nasuh əyağı.

Necə ki, ömür qısa isə uzun qılıruz biz
Həmişə toludur əllərümüzdə Nuh əyağı.

Ləbün sürahi qanın içdi içməyəmmi qanın
Qısas içün hələ içisərəm cüruh əyağı.

* * *

Can oynamağ imiş yenə həm canı bu dərdün,
Dərd isdəmək imiş yenə dərmanı bu dərdün.

İqrar edərüz sidq ilə islam arasında,
Ki, eşq ilə ixlas imiş imanı bu dərdün.

Gər dür dökilür isə dilümdən nə əcəbdür,
Çün tolu cəvahir ola ümmanı bu dərdün.

Sən sanma ki, dərdüm odı tək hasil edəsin
Yaxanı bu dərdün qanı yaxanı bu dərdün.

Dərya ola bir qətrə bu eşqin ayağında
Qanda dükənür çün ol ola kanı bu dərdün.

* * *

Saçun girehləri nə buldı bilməzəm bəndə,
Ki, boynuma tolaşıban dilər sala bəndə.

Xətası cümləsi çindür bu müşki-gisusnun,
Çü sehri türki gözinün bəni qılur bəndə.

Əcəb dəgülmi bu Leyli sifətlü leyli saçı
Ki, şəmsi voch verür arasında tabəndə.

Uzun ömürləri sərf etmişəm qiyamət içün
Ki, urdılar adı cuyəndəyə ki, yabəndə.

Qübar olursa könül qonımaya xəttinə hiç,
Və gərçi kuh ola döyməyə ol kəmər bəndə.

* * *

Nigara lə'li-ləbün bənzədür isəm qanda
Xəta ola ki, şəkər qanda ola, ol qanda.

Əcəb təravəti vardır totağunun şirin,
Ki, lə'l ola şəkər çünki başlana qanda.



Yürəgüm odı kibi göz yanında qanda ola
Və ya gözüm kibi gözlər nerədə aqanda.

Yaqanda göz kibi göz bəni qərqi-xun etməz,
Vəli könül yaxar oda vücudu yaqanda.

Gözüm əgər su içində yüzüni görməz isə
Nə eyb k'olmaya taqət günəşə baqanda.

* * *

Xəyalün ilə gözümi bizarəm,
Zira özgə xəyalindən bizarəm.

Şəha, xəttün yazar gül səfhəsində
Əgər bir nöqtə şərhindən yazaram.

Nə qıl ki, girdi zülfündən əlümə
Gər əldən qor isəm dindən azaram.

Yüzüni görəli zaram çü bülbül,
Belüni görəli qıl tək nizaram.

Əgər bülbül gül içün zar edərsə,
Sənün gül yüzün içün bən həzaram.

* * *

Bizümlə möhkəm edərsən qərarı,
Tağıt lütf eylə zülfi-biqərarı.

Yürək tolu süci bağır kəbabın
Apardım gözinə yazmaz xumarı.

Yüzün dövri kibi dövri-qəmərdə,
Günəş görmədi görəli mədarı.

Saçalı ənbəri kafura zülfün,
Qatı miskin edər müşki-tatarı.

Şəha, İsadurur şəl lə'li-ləblər
Yanağü gözü hacibdür həvarı.

Şəha, şahin gözün könlümi alur,
Necə ki, bəhrilər alur oxarı.

Miyanı yolu incədür yorınmaz
Və leykin bana xoş gəlür kənarı.

* * *

Dedüm, şaha, seven səni bənəm, bən!
Gecə-gündüz qovən səni bənəm, bən!

Dedüm: "Cana nəsən, bir bana şərh et",
Dedi: "Oda yaxən səni bənəm, bən!"

Qılən rüsva gözün yaşı ilən bən
Yüzün ilə çaxən səni bənəm, bən!

Gözündəki görən bəni tapundur,
Gözümdəki görən səni bənəm, bən!

Uzanmış zülfi qəddinün boyunca
Uzanğil ki, üzən səni bənəm bən!

* * *

Gül bülbülə müsəlləm ola xar əgər çıxa,
Dünya münəvvər ola bizə yar əgər çıxa.

Zarü nizardur belünün qılına könül,
Səhl ola yar yoluna könül zar əgər çıxa.

Abi-həyatdur totağun gözlərün ilə
Türfə dəgülmi könülə bimar əgər çıxa.

Bən soraram ki, xasiyyəti nə totağunun
Ki, diri qılur öliyi, bir ay əgər çıxa.

Qanda qərar qıla bilə təndə bu könül
Gisularında caduyi-məkkar əgər çıxa.



* * *

Bilürsin ki, günahum çox, ilahi,
Ümidim səndən ayrux yox, ilahi.

Bəni fe'lüm ilə həm sən yaratdun,
Əgər əksük və gər artux, ilahi.

Qədər oxın qəza yayında çəkdün,
Nə ox kim atar isən ox, ilahi.

Nəfəs kimsə urmaz diləgünsüz
Nəfəs-nəfəs anı saydux, ilahi.

Canumuz əsrüg idi eşqin ilə
Vəli nəfs ilə ayıldux, ilahi.

Səni bizdə yitürdux bulımazuz
Bizi gər qorısax bulduх, ilahi.

Şaha, lütfün cəhana toptoludur
Biz andan necə oyıldux, ilahi.

* * *

Ya ilahi, ya ilahi, ya ilah,
Səndən artux yox bu canuma pənah.

Ahi-möhkəm diləräm vahi dəgül
Girməz isə ol əlümə ah-ah.

Könülümə səndən özgə gəlmədi
Gəldi isə qəm sənsin bazişah.

Vah səndən dilərem, ey mirdad
Dad həm sənün əlündən dadxah.

Kahidux, kuh eylədün lütfün ilə,
Kuh ikən qılma bizi cövr ilə kah.

Binəvavü xəstəvü üftadəəm,
Rəhm qıl çün düşmişəm dərşahrah.

Sərvi-bustanəm nədür bibar bənəm
Qılmağıl bəni əbəs həm çün giyah.

Gər günah içün yaratdınsa bəni,
Dedügüni etdüm etmədüm günah.

Eşqxahunam vəgər nə tuxmədür
Nəfs eşəgi arpadan hər salü mah.

* * *

Əgər küstax isəm şahum halimdür,
Bənüm əhvalümə ol həq alimdür.

Bəni andan irax qılmax diləyən
Sığındum ana şeytani-rəcimdür.

Nola məcruh isəm məhrum dəgüləm,
Çü can sultanı rəhmani-rəbimdür.

Zəhi dövlət ki, sultana hərifəm,
Yenə ol saqi yenə ol nədimdür.

Nəsimdür canumı salan bu zövqə,
Nə zərdür canumun qəsdi, nə simdür.

Bu qəddüm dalı dal oldu bu eşqə,
Zəhi dəm ağızun mimi nə mimdür.

Dedi canun giran oldı bilümdə,
Dedüm ya rəbbi böhtani-əzimdür.

Neçün qıl yarmaya eşqim bənim çün
Ki, bir nöqtə ağızunda dünimdür.

Visalündür bana cənnəti-firdövs,
Fəraqunun əzabı gey əlimdür.



* * *

Gül irdi qılalum biz yaza təbsin,
Ki, bu təhsinə göklər yaza təhsin.

Həvaya oyandı zülfi başımı,
Dedi, sünbül ki, bu sərbaza təhsin.

Yürəgi su qılub, yaşı dəm edər,
Gərəkdür dilbəri-dəmsaza təhsin.

Gözin baz etməg ilə aldı könli
Yürəkdən könlin alan baza təhsin.

Könül pərvaz edər hər dəm işikdə
Ki, ta bir gün bula pərvaza təhsin.

* * *

Bədi olmaz mə'ani çün bəyandur,
Bu sirrimüz gözünüzə əyandur.

Belünə canü əqlü dil apardum,
Ki, aşiq varlığı əndər miyandur.

Nigara qıyma gözün qıydı bizə,
Mübariz ortalıxda həm qıyandur.

Gözün baz olalı vərhəmdürür dil,
Gözün qatında dillər makiyandur.

Nə hinduyi-xətayidür bu gözün,
Ki, əlində gah tirü gəh kəmandur.

* * *

Olur eşqində əzmüm cəzm hərdəm,
Qılur gözün dil ilə rəzm hər dəm.

Cigər qanını dökə gözlərüm ki,
Qıla lə'li-ləbünlə bəzm hər dəm.

Bana Xorezm oldı nəğmən ilə
Düşəli yaduma Xorəzm hər dəm.

Mübərqedən nəva bulalı könlüm
İraqa qıla dilər əzm hər dəm.

Gətür, saqi, cigər qanın içəlüm
Ki, əzm oldur ki, ola rəzm hər dəm.

* * *

Qanısın, qanısın, qanısın,
Canısın, bu tənün canısın.

Bu yürəg qanısın canıcux
Canıcux bu yürək qanısın.

Nə şəkər kanısın totağı,
Totağı nə şəkər kanısın.

Xanısın bu könül şarınun
Bu könül şarınun xanısın.

Yusifi-sanisin, ey bəgüm,
Ey bəgüm, Yusifi-sanisin.

* * *

Cövhəridür ləbün yüzüm zəhəbi,
Yaşlarum sücidür, gözüm inəbi.

Fəxr oldur ki, qulun ola kişi
Nə verələr ana ki, kan əbi.

Nə riayət qıla biləvüz ədəb
Çünki tərki-ədəbdürür ədəbi.

Düşdi sevdaya yenə dəli könül
Gisularundurur anun səbəbi.



Abi-heyvan ilə tər et ləbümi,
Çənd əz in təşnəgivü xoşk ləbi.

Sələbil-eşqi bi'l-həva kəbidi
Qomadı canda saz ilə sələbi.

Can canun ilə ittisal etdi.
Qanısın paşa, qanısın çələbi.

* * *

Yar kənara gəlicək bən çü miyana gəlmişəm,
Şimdi ki, irdi firqəti dərd ilə cana gəlmişəm.

Necə ki, qaşları bəni ox kibi atdı yabana,
Ağzum açup əlin öpüp yenə kəmana gəlmişəm.

Can ilə əqlü dil verüp dərd ilə eşq almışam
Yə'ni ki, ulu xocayam sudü ziyana gəlmişəm.

Ayruğa canı həq verür ta ki, cəhana gətürə,
Bən canum oynamağ içün işbu cəhana gəlmişəm.

Dari-bəqa sanur kişi işbu cəhani-faniyi,
Bən bu fənaya girmişəm, əmnü amana gəlmişəm.

Lütf ilə qəhri həq bana birbiyəsin biribidi,
Bəs bu bəsirət əhlinə dam ilə danə gəlmişəm.

Elmi-əzəldə çünki həq seçdi qamu olacağı
Bənü neçə bənüm kibi bunda bəhanə gəlmişəm.

Hiç idügini könülüm bildi belini görəli,
Görəli lə'li işvəsin şimdi gümana gəlmişəm.

* * *

Məxmur gözlərün kibi xəmmar olamı,
Gözün kibi təbib ki, bimar olamı.

Can bu mübərqə'ə kişi verməzsə mayədür,
Bunun kibi nühüftədür ədvar olamı.

Günəş yüzün həvasına sabit durur könül,
Səni sevən hesabına səyyar olamı.

Bir saçunun qılına nə tatar zülfünə
Qarşı turası dünyada tatar olamı.

Dilər səba ki, apara bir çoxucux məgər
Miskin nə fikr qıldı səbüksar olamı.

* * *

Yəmən yelini biri birsə ol ilahi-qədim
Ədu dərisi süheylümüz ilə ola ədim.

Bu müşt həqqə nəzər qılur isə şah olur
Ki, bir girişməsi diri qılur izami-rəmim.

Nola əgər tolu verəsin oyağı, saqi,
Səadət oldı müsahib siyadət oldı nədim.

Könül müsafir idi hüsnünün biladında
Çü yazdı gözləri guşələrinə, oldı muqim.

Həvası...
Nə... gəh suvü gəh qan idi bəəmri-kəlim

* * *

Nigara, zülfün içün çin deyəlüm
Bu müşki kafura pərçin deyəlüm.

Bənünə xal ya şamə deməzüz,
Ana biz hinduyi-gülçin deyəlüm.

Bəni ləbün qoxusi əsrük itdi
Şəraba şimdi xuşəçin deyəlüm.



Görəli ənbərin xalüni, şaha,
Bu qara zülfünə miskin deyəlüm.

Yüzünlə küpələrünə, nigara,
Qonışmış ay ilə pərvin deyəlüm.

Qaşun mehrabına şol can tapmaz
Anun imanı yox bidin deyəlüm.

Belün təhrik edüb qopardı canı
Qərar edər isə təskin deyəlüm.

* * *

Qılıc yalın verəli əlümə əli, vəli
Kimə ələst dedüm isə bana dedi, bəli.

Dili bu ənbəri-zülfün ki, müşkilə saldı,
Nəsimə qul ələyım müşkilümi qıldı cəli.

Dedim ki, səni sevərəm bana dedi ki, əcəl
Dedim ki, səni sevən necə görməyə əcəli.

Buyur ki, eşqin oduna girə bu aşiqlər
Ki, seçilə tapuna xalisi ilə dəğəli.

Könül evini gözün çün otax dutar dutsun
Nə vechi var ki, qılur ana fe'li.

Əmələ kimsə irməz vəlik lə'lün içün
... həm çü tifl bir əməli.

Görəli şəhdi-ləbünüzi bunca can verdüm
Yanaram uşda çü şəmü yüzümdürür əsəli.

* * *

Nigara, canda eşqindir siriştə,
Könülümdür odun ilə biriştə.

Bəni qıyma çəkər şol qəmzələrün
Ki, yə'ni xoşdurur məxmura riştə.

Qüsurun hurinün bən anda gördüm,
Ki, yüz urdı ayağına firiştə.

Yatuban yüz ururam şol həqə kim
Sənün tək yox oturuşda, turuşda.

Yürəgüm qanını içər totağun
Bən isbat eyləyəyüm bir sorışda.

Yüzünlə ağızun nə demək olur,
Vəli qəmzən bəladur ol yarışda.

* * *

Eşq ilə könül seyl olubən taşa gərəkdür,
Nəqş eyləyə can dərdini hər taşa gərəkdür.

Yar niliyiçün nola fərat olur isə yaş,
Alında yazılan irişə başa gərəkdür.

Yaş oldı yüzüm gözlərümün yaşları ilə
Qan-yaş axıdan həm yenə ol yaşa gərəkdür.

Badi-səhər ayağı tozın saçdı gözümə
Əlbəttə bir ücrət dəxi rəşşaşa gərəkdür.

Pərvanə verür isə ki, şəm olam önində
Can varlığını oynaya fərraşa gərəkdür.

* * *

Dəm dəm nişə bu yürəgümi dəm qılasın sən,
Çün bir dəm ilə ölüyi adəm qılasın sən.

Əmsəm deyü varam ləbünə qəmzələrüni,
Necə-necə yürəgümə əm səm qılasın sən.



Biz biş ilə kəmdən sənəma yoluna keçdük,
Cövrüni bizə bişü vəfa kəm qılasın sən.

Zülfün girehində sənəma yetdi könülüm,
Ol nəsnəyə lazım nə ki, matəm qılasın sən.

Belündə könülüm hələ bir qıla asıldı,
Bari diləröm anı ki, möhkəm qılasın sən.

Müzmər qılıram könülümi lə'li-ləbündə
Canum canuna nola ki, müdğəm qılasın sən.

Yanmışamü yanısaram oduna bilürsin,
Bən xamə nola belüni gər xəm qılasın sən.

* * *

Yolunda yalın əyağü sərbaz olısaram,
Can oynayıban eşqinə sərbaz olısaram.

Şəhbaz gözünə gəhi seyd edisərəm can
Kəklik yüriyişinə gəhi baz olısaram.

Mahmud olısar bən bilürəm aqibət işüm
Anı gözədüb lacərəm Ayaz olısaram.

Çün sözümə həmdəmdür əgər çəngümə girə
Ney ilə dəxi bu gecə dəmsaz olısaram.

Lütfini bana qılmaz isə dilədügümcə
Pəs bildügümi aləmə ğəmmaz olısaram.

* * *

Gülsitanü dilsitanü dustan,
Andururlar könlümə Hindustan.

Gül yüzün tək görmədi gülşən gözi
Qanda gördi nərgisün tək busitan.

Gəl dikənlüdür, bənəfşə qayğulu
Qəddünə sərv olalı əz rastan.

Çün irişməz əlümüz ətəgünə
Astıniylə sipürür asitan.

Bu nə dastandur k'anun saidləri
Aləm içində qomışdur dasitan.

* * *

Ta ki, oldı şol cəmalün saxtə,
Oldı könülüm evi pərdaxtə.

Dutalum ki, atmayasın dəxi ox
Qəmzənün bin oxı var əndaxtə.

Dildə eşqin odıdur əfruxtə,
Canda eşqin tuğıdur əfraxtə.

Vəsfini dərdüm çəməndə hüsnünün
Anun içün dedi, gu-gu faxtə.

Nə ki, cəm itmiş isə canü könül,
Qamusın gördüm yolunda baxtə.

Can fəraqun odı ilə suxtə,
Eşqin əhənginə könül saxtə.

Gisularun çərisi dil şəhrinə
Bilməzəm neyçün firavan taxtə.

Dildə lə'lün eşqini ənduxtə,
Taşra sənün qeyrüni əndaxtə.

Gisusi çərisinə könülümi
Biribidüm ki, tura nəşnaxtə.



* * *

Baxalı qara gözüm şol saqına,
Baxmağa saidlərinə saqına.

Rast budur namüxalif söz dedi,
Xırlu ahəng etmədi üşşaqına.

Nə nəql etdi yanağından nəsim,
Gül anı dərc eylədi övraqına.

Nə ki, ağzından gəlür düşnamü mədh
Zəhr isə qatar canum tiryaqına.

Gərək odundan içə təşnə zülal,
Nə verələr aşiqin zərraqına.

* * *

Eşqini ləbün çünki dilü cana gəmişmiş
Bu dilə vücudın qamusın yana gəmişmiş.

Könlümi mühit eyləmişü gözlərümi Nil
Dişlərün əgər könlümə dürdanə gəmişmiş.

Bənəfşə dilin çəkdi qafadan qara zülfi,
Yüz silsilə həm sünbülü reyhana gəmişmiş.

Başın başuna qoşdı məgər lalə anunçün
Sərsər alı ilə başı meydana gəmişmiş.

Bir sözünə mövquf durur k'açıla qönçə
Bax ki, əlini necə giribana gəmişmiş.

Gözünə nə əsrük deyəyüm əqlimi bənüm,
Əqlindən ilədib yerə divanə gəmişmiş.

Badi-səhəri vəqti xoş olsun ki, qılur lütf,
Zülfeynini bir fe'l ilə imana gəmişmiş.

Könlümi dəxi öğməyəyümmi ki, canını
Bunun kibinün eşqinə mərdanə gəmişmiş.

Kafir kibi yardı yürəgümi gözi külli,
Bıtsün deyü eşqindən anun danə gəmişmiş.

Talatdı canı firqəti qurdına çü Yusif,
Şimdi zənəxi çahına zindana gəmişmiş.

Göz yaşı alından alıban oduna salmış
Dərdindən alıb yə'ni ki, dərmana gəmişmiş.

* * *

Dedim gözümə, ey gözüm xəyalı, yarumun qanı
Xəyalını yetirdünsə, qanı gözlərünün qanı?

Gözüm səni görəlidən gözünə özgə gözikməz,
Rəiyyət səhl ola gözdə çü göz görmiş ola xanı.

Zəmanə qılsa bir ərlik bizüm ilə bu aləmdə
Aparsam oda yaxanı bəni bu oda yaxanı.

Neçün ey dilbəri-canı, bu canı səhl görürsin,
Neçün Tanrınun əmrinə olursın eşq ilə canı.

Nigara, müşk ilə zülfün müşəkkəldür bədi' ola
Ki, bula bu könül anda diləgincə tən asanı.

* * *

Səni sevərəm, ey bəgüm, işbu cəhanda bən fəqət
Yaş dənizinə bu gözüm ol səbəb ilə oldı bət.

Hüsnün içində yox xəta, ey büti-Çin, əgər kişi
Əgri deyə qaşun içün, söyləmiş ola ol qələt.

Zülfüni gösdərür isən güldə bitən bənəfşəyə
Buyruğ əgər olur isə qulluğına yazıla xət.



Nilün içün, nigara, bən gözlərümi fərat edəm
Ola ki, eşq mərkəbi ilə də bəni suyi-şət.

Eşqim uzunü incədür mənhəci şaha eşqinin,
Necə ki, ömür vardurur halumuz ola bu nəmət.

* * *

Ta ki, gülşəndə gül işi xəndədür,
Dəlü könül lalə kibi qandadur.

Qövs qaşlaruna bin can müştəri,
Sərvi-azaduna bin dil bəndədür.

Guşəsində gözümün hüsnü xəyal
Kimi ayəndə, kimi rəvəndədür.

Məryəmi-İsanəfəsdür sanasın,
Təb' kim övsafuni zayəndədür.

Zad ümidü səbr ölümdə əsa
Hüsnünün eşqi yoluma zindədür.

Yox durur bəllü məqamı könülün
Qanda ki, isdərlər isə andadur.

Qandadur könülümi bən bilürəm
İlla bilməzəm ki, könül qandadur.

* * *

Yüz cadulıx qılur, sənəma, aya gözlərün,
Bən umaram ki, yə'ni bəni aya gözlərün.

Peyvəstə umaram ki, bana rəhm edə idün,
Xud urdı əlini ox ilə yaya gözlərün.

Lə'lün gərək verəydi bana xunbəhayi-nəqd,
Yüzüni gösdərüb bıraxur aya gözlərün.

Fitnəsi sehrdən qatıdur gözə, könülə
Harutı dəxi qəmzə ilə baya gözlərün.

Yapışdı eşqi yaxamuza budurur əcəb
Ki, hər nəfəs canı yaxaya, yaya gözlərün.

* * *

Yarun belinə key baxıcağaz xəyal imiş,
Sehri şol iki cadu gözinün həlal imiş.

Abi-həyat sanur idüm ağzı yarını,
Sordum ləbindən anı su abi-zülal imiş.

Cövrü cəfası qatı gəlür idi könlümə,
Kəşf oldı ki, qamusı anun bər kəmal imiş.

Dünya dedüklərini qamu bir-bir anladum,
Bir hüsnü qamət imişü bir zülfü xal imiş.

Gözini xüftə gördi könül sundı lə'linə,
Dedüm ki, or kibi hələ bu dəm mocal imiş.

* * *

Əcəb, canum kibi bir canı yoxmı?
Bu eşqinə yananın canı yoxmı?

Gözi toğrar könüli, qanı çıxmaz,
Əcəb, aşiq könüli qanı yoxmı?

Saçı oğrı deyü bağladı könlü,
Zənəxdanında hiç zindanı yoxmı?

Göz urur qaş atar bağlar gisular
Bu könül şəhrinün bir xanı yoxmı?

Zəmandan sonra gördüm iki qaşın,
Birinün dəxi bir qurbanı yoxmı?

Saçı bin mö'mini bəndə gəmişmiş
Əcəb, bu kafirün imanı yoxmı?



İki aləmdə lə'li kibi yoxdur,
Bu yaquti-tərün bir kanı yoxmı?

Könül dərdi həmişə dərdin ünlər
Bu dərdə düşənün dərmanı yoxmı?

Anun ki, yazdı arada fəraqı,
Visal olmaxlığa fərmanı yoxmı?

Həvası oynadur canı saçında
Bənüm tək eşq sərgərdanı yoxmı?

Canımda qaməti qıldı qiyamət,
Dedim bu tübinün rümmanı yoxmı?

Acı yaş dökərəm səbr ilə hər dəm
Əcəb, bu səbrümün uranı yoxmı?

* * *

Bən aşiqi-biçarə sevdüm səni nə çarə,
Yerlücə ikən eşqin qıldı bəni avarə.

Olalı mübərqə' sən mühəyyər olur əqlim,
Nühüftə bənüm eşqim şöhrə olur ədvara.

Yara yaradur gözün qəmzələri yarasın,
Billah, zəbi yaradur ki, yaradur əğyara.

Vəslin bizə bağlamış çənbər kibi qapusın,
Al Cə'fəri-təyyarı şol beydəri-kərrara.

Eşqin qomadı, şaha, hərgiz yürəgümdə su,
Bir xuni-cigər qaldı sərf edərüz idrara.

İkimüz arasında qalmadı ikilik hiç,
Şəm al əlünəvü gəl başdan ayağa ara.

Gər zülfüni İbrahim bir ləhzə görə azar,
Gözinə gözükməyə hərgiz dəxi ol Sara.

* * *

Könül ilə can içində karzar olmış durur,
Bülbüli-divanə noldun növbahar olmışdurur.

Sən güli-səd bərg ilə qılalı gülşəndə qərar
Gül pərişan oldı sünbül biqərar olmışdurur.

Bülbülü tuti bənəfşə, yasəmən sənün içün
Kimisi zar oldı, kimisi nizar olmışdurur.

Büləcəb budur ki, xaki zülfün içün hər sabah
Yüz yerə qoyub bənəfşə xaksar olmışdurur.

Bülbül ilə gül həvasınaqil andan anlaya
Qanda gülzar olmış isə mürğzar olmışdurur.

Nola lə'lündən canuma bir məzə yaqut ola,
Bilməgil anı mübərrəm iztirar olmışdurur.

Məst gözündən əgər bən məst olursam, tanlama,
Nərgisə andan çəməndə e'tibar olmışdurur.

Gərçi pinhandur bu tar könlümdə sirri lə'lünün,
Buyi-zülfün şərqə-qərbə intişar olmışdurur.

Eşqi hər bir aşiqin mə'şuquna qürbətdədür
Dərdi-yarumdur bənüm ki, dərdiyar olmışdurur.

Bən miyanında anun yenə miyanın isdərəm
Çün kənarını diləyən dərkənar olmışdurur.

Bən bəhər bari miyanundan umaram bir kənar
Qılca hasil olmazü könüldə bar olmışdurur.

Arizunda xətt ilə zülfün günahın yazmağil,
Ləblərün bilür ki, qanlar bişümar olmışdurur.

Gözləründür həm qədəh canumavü türfə budur
Ki, bən əsrük olmışam, anlar xumar olmışdurur.



Tarü mar oldı isə nola saçundan könülüm,
Çünki hər tarı bənüm könlümə mar olmışdurur.

Gülşəni-hüsnində güldür al yanağın nedəlüm
Çün bənüm yürəgümə kirpügi xar olmışdurur.

Sərvi-qəddi eşqi boyuma uzun gəldi, vəli
Bu cəhan eşqi quşağı bana tar olmışdurur.

* * *

Tolu ver əyağı saqi ki, eşq qalibdür,
Qə sübh sözini bu dəmdə çünki kazibdür.

Fərizədür bizə ki, ömri xoş keçirəvüz,
Vəli nigar ilə zira ki, şöylə vacibdür.

Könüldürür yeri yarun zira ki, can oldur
Nigara ki, can ol ola qəlb qalibdür.

Həva ki, qopdı yürəkdən oda çəkər canumı
Ki, nə ki, golə qopa mərkəzinə talibdür.

Yüzinə oldı müsəlləm bu gün imarəti-hüsn
Bu məmləkətdə iki qaşı, iki hacibdür.

* * *

Eşq əhli cəhana qala ya canə der isən
Bilməmiş olasın bəni ya canə der isən.

Ceyhun edübən yaşumı ümmana irürəm,
Mərdümlik edüb gəl yola, mərdanə der isən.

Bu əhli-cəhan canını lə'lünə irürəm
Gər zirə rəvadur gələ Kirmanə der isən.

Canü dil ilə əql fədadur qaşına leyk
Xəstə dəxi məqbul ola qurbanə der isən.

Tən şəmü yaşum süci kəbab oldı yürəgüm,
Nədür yarağun bu gecə mehmanə der isən.

Aşiq seri samana satılmaya bu yolda
Gər bizciləyin bisərü samanə der isən.

Bən cövhəriyəm lə'l ilə lö'löyi qovaram
Uydun neyiçün bu ləbü dəndanə der isən.

Zülfün əlümə verü zənəxdanına salğil
Gər gəmişürəm bənd ilə zindanə der isən.

Zülfeynüni çövkan edü bənlərüni guy ed
Girsün dilü can eşq ilə meydanə der isən.

* * *

Səbuhi ver ki, sabah etdi faliqus-sabah
Ki, getdi ayü toğar günü dinlənür misbah.

Cəhan fənadurü gənci-bəqayi kim ki, dilər
Könül ələ götürür isə bulur ol miftah.

Bu canü əqlü dilə gözün olalı qabiz
Həyat mənbəinə ləblərüpdürür fəttah.

Könül dəvasını, şaha, gözün bilür yaxşı
Ki, dərməni çıxara bilməyə məgər cərrah.

Sənündürür nə sənə kim deyilür isə bizə
Ki, run ilə diridür dünyada qamu əşbah.

Zərurət oldı bana uşda olmışam küstah,
Buyurmış axı mən idtarra ma əleyhi cünah.

* * *

Ey necə düşdi könülüm şol yanağınun alına,
Ey necə dəxi düşisər lə'li-ləbinün alına.

Şəhdi-ləbinə qəsd edün qəmzəsi irdi canuma
Dikəni irdi canuma irmədüm isə balına.



Qali şəkərü qıl beli qəddi çü ney-şəkərdürür
Ney kibi yandum odına irəli qilü qalına.

İşbu xəyalə qalmışam ki, beli tək xəyal olam
Sevda başumda zülfi tək bu ki, irəm visalinə.

Şol gözünün kəmalinə iruben oynadum könül
Ah irər isə gözlərüm şöylə ki, var cəmalinə.

Ay gözünün günəşinə iricəgəz hilal olur
Bən iricək noluşaram bədr ayının hilalinə.

Oduna yanaram anun dəxi yanısaram dəxi
Ola ki, irə dövlətüm ta irişə zülalinə.

* * *

Yüzün görəlimeyl edimezəm İrəmə bən,
İrmişi qoyub güvənimezəm İrəmə bən.

Hüsnündə könül seyd isə nola dəpələmə
Öləm deyü salmamışam özüm hərəmə bən.

Dinara urur sikkə şəhüm eşqi yüzümdə
Göz incülərini saçımazam dirəmə bən.

Lütf ilə kərəm biri-birindən ayırılmaz
Səndən, ey lətif, irişəmədüm kərəmə bən.

Yarı yaradı yarama yarını umaram
Bulmadı kişi ol ki, dilərəm yarama bən.

* * *

Əksin ləbi-lə'lün yenə bu camə geyürmiş,
Mətbu geyüribən anı bir camə geyürmiş.

Aşiq nola gizlənür isə pərdə içində
Gör ki, necə məst pərdeyi badamə geyürmiş.

Gəh cami-şəbabi içürür işbu zəmanə
Gəh badi-xəzanını bu əyyama geyürmiş.

Qısavü uzun demək ədəbdən ola xaric
Ol tonı kim ol xasa və ya a'ma geyürmiş.

* * *

Sənəma, çü gisuların tağıdub boya buraxdun,
Sanasın ki, ləblərünün şəkərin suya buraxdun.

Ləbünün qanı var idi yürəgimdə çünki sənün
Bir-iki kəlamı qıldun qamusın yuya buraxdun.

Könül ilə əqlü cana saçun ucını toladun
Dəxi bəndə nəsnə yoxdur qamusun oya buraxdun.

Şəkərün tuzını aldun tuza verdi tat totağun
Günəşin yüzini aldun birəzin aya buraxdun.

Könülüm bu sirçəsini könülünə töhfə iltür
Anı hiç əsirgəmədün ki, ana qaya buraxdun.

Neçə əbcəd oğlanıysam əlifi bidən bilürəm
Neçə surə oxımışkən bəni hecəyə buraxdun.

Sənəma, yürəgə dəgdi dəxi çəkmə atma hərgiz
Nə ki, kiprügün oxından bu gecə yaya buraxdın.

Sənəma, gözüm qan ilə dilərəm ki, dəf tər ola,
Bu yürəgümün bitsin ya nitə nəyə buraxdun.

* * *

Düşən səndən ayru nə görür qiyamət
Sevən özgə xubi nə bulur nədamət.

Ləbün mö'cüzəsi dirildür ölüyi,
Sağaldur gözün sayruyı zi kəramət.



Nigara, qanumı rəvamı içərsin
Totağun qızılı dəgülmi əlamət.

Dedüm aşiqünəm, dedi canun oyna
Rəvadur, bu də'viyə gərək şəhadət.

Budur hacətüm ki, nigarumdan özgə
Bana verməyə həq dəxi özgə hacət.

* * *

Ləbün həvası ilə bu könül çü narındur,
Belün kibi tənümə bax necəsi narındur.

Gözümə şöylə toludur xəyalı hüsnünüzün
Ki, bilməz görür ikən ki, bu nigarındur.

Dilər isən tura könül yüzün ana gösdər
Dilər isən yöriyə yörgədür qərarındur.

Yarına susamışam yarına salar bəni ol
Nə bilə oda düşən ki, həyatı yarındur.

Ümidi-vəsli kəsərsən, ümidi bizdən kəs,
Hiç olmaz isə dəxi ve'də ilə barındur.

* * *

Şaha, gisuların ilə beğayət bən pərişanam,
Xəyali ilə zülfünün həmişə ənbərəfşanam.

Gəhi xəndanü gəh giryan vəli eşqinin odundan
Nigarına nə deyəyüm ki, yüz dərd ilə biryanam.

Gözün guşəsini görüp mücavir oldı dil anda
Oxuna dəxi ox derəm necə ki, anda mehmanam.

Necə candur şaha zülfün ki, hər birində bir canlar
Əsir olmış əcəb nola bənüm canum ki, bir canam.

Bana peyvəstə qaşunı çü gösdərür şəha hüsnün,
Gəl imdi bayram idəlüm hilalünlə çü qurbanam.

* * *

Nigara, eşqin odu bu canumı azaldan,
Apardı göz yaşı bu toprağumı əzəldən.

Gözüm necəsi gözəldən dəxi yerə savışa
Vəli fəraqi ilə uşda getdi göz əldən.

Qaşı ilə gözi tək görmədüm dəxi yayü ox
Fələkdə qövs ilə tirün boyını düzəldən.

Nigara, müşki-halilə səmən gülindəki tək
Qələm görimədi bir nəqş lövhə yazaldan.

Saçun qaranusına düşdi könli izləyü can
Uzun gecələr içində yolunı azaldan.

* * *

Yanağun alı ilə sən başladun alə, eyləmi?
Gözlərümün yaşını sən boyadun alə, eyləmi?

Lə'li-ləbüni görəli susamışam totağuna,
Qarşuna uşda oluram təşnə zülalə eyləmi?

Dam ilə danəyə düşər uçan həvada quş dəxi
Düşdüm isə dəpələgil zülf ilə xalə eyləmi?

Könül kimi sevər isə Leyliyi-Məcnun oldurur,
Düşdüm isə günahluyam sahibcəmalə, eyləmi?

Səba yeli gətürəli bana gisusı qoxusın
Yüklədürəm qoxuları badi-şimalə, eyləmi?

Belün içün qıl olmışam bənzədürəm öz-özümi
Bədr yüzüni görəli mahi-hilalə, eyləmi?

Bəhram əgər av olmaya, gözlərünə çubin ola,
Qəmzələrün urur oxın Rüstəmi-Zala eyləmi?



Bir qıl ilə asılıban zülfünə, şöylə qalmışam,
Eşq əri bir bənüm kibi qıl ilə qala eyləmi?

Bidilü aşiqü qərib xəstədürür ləbün, təbib
Dərdinə qılmaya dəva, düşə vəbalə eyləmi?

* * *

Gər sənün içün dünyada rüsva ola könlüm,
Bicanü dilü bisərü bipa ola könlüm.

Bana ağız-ağız ləbünün sirrini dersən
Ağzum tolu ab olavü bima ola könlüm.

Aldun canı könül dəxi, pəs nəmə gərəkdür,
Yox əqlimə bənüm yenə qovğa ola könlüm.

Miskin saçunı tağıdalı, gösdərəli yüz
Miskin ola canum sana, şeyda ola könlüm.

Adəmdür axır yaş dökə mərdümlik edə ol
Gözindən əgər eşq ilə həvva ola könlüm.

* * *

Tə'nələr urur qanlu gözüm əbri-bahara,
Gəlmədi könül zülfüni görəli qərara.

Gözləri qarasına səbəb zülfini bildüm
Sevda gətürən başına pəs gözi qərara.

Xüftə gözi tək görmədi aləm gözi oxcı
Ki, xüftə dili cadu gözi ilə o yara.

Zülfündə qərar etdiyidi könlüm əzəldə
Meyl etdi isə yenə nola darü diyara.

Kəşf etdi məgər badi-səba bürqə'ini ki,
Gizləndi günəş yüzinə dutındı sitara.

Eşqin belinün incəvü uzun çəkisərəm
Səbr ilə gərək ki, irürəm anı kənara.

Əqlü dilü can özləri ayaxlarıyilə
Bari gözünə yüz göz ilə vara şikara.

Ditrər yürəgüm ləblərünün meyzədəsiyəm
Çarə yenə xəmmar edisərdür, bu xumarə.

Bəniz saru yürək salınur vəsl ələ girməz,
Divanə könül olamı qəlb urdı əyara.

* * *

Bir ləhzə əgər sənün ilə xəlvət olaydı
Divanə könlümə zəhi dövlət olaydı.

Eşq əhli əgər əqlini devşürə biləydi,
Onlar dəxi öz başına bir millət olaydı.

Gəh xəstəvü gəh xüftə dəgülmisə gözi bəs
Eşq əhli könülində qaçan illət olaydı?

Gözlərümə sürmə qılam ayağı tozını
Günəş yüzini görməgə gər alət olaydı.

Bu eşqi çü İsa gögə gərək irürəydüm,
Bilsəm ki, əcəldən canuma möhlət olaydı.

* * *

Qanı əqlüm, qanı canum, qanı dil?
Sanasın, adət əyləndi qanı dil.

Əgər özgələri anar olursa,
İcazətdür sana kirpüg ilə dil.

Bəni xətm eylədün müshəf həqiyçün
Qılalı qolunı bana həmail.



Zənəxdanun bana yetməzmidi ki,
Qılursın zülfi boynuma səlasil.

Həzəran dil ola hər qıl dibində
Bu könül kibi isdənürsə qıl-qıl.

Bəlabil növha qılurlar səhərdə
Am dəxi canuma bir bəla bil.

Anadil hər gecə der, sübhə dəkin
Ki, olmaya cəhanda biana dil.

* * *

Mürdə zində oldı, şaha şeyxi aləm oldı şəb,
Bərq gülər aqiləvü aşiqə ağlar səhab.

Gül geyürməyincə təbüm hüsnüni ərz edəməz
Tənünə axdan qəbavü yüzünə aldan niqab.

Hırfətün əyyamı oldı gəldi işrət fürsəti,
Qılma fayit ki, binayi-aləm olmışdur bir ab.

Sən bana sun lə'l əyağın yüz-gözü könül ilə
Qılalum hazır şərabi-safivü şəmü kəbab.

Bən xəyalündən görimezəm, nigara, cüz xəyal
Çünki canı gözlərüm görimədi illa be xab.

Bu lətafət ki, sənündür səhl olaydı fürsətün
Olmasaydı bu vücudum bana tapundan hicab.

Sənün eşqün ilət aləm iləm lütf eyləgil,
Şol zamanı an ki, dirilər qanı əyyami-şəbab.

* * *

Bir dilbəri biqərara düşdüm,
Gisuyi-siyahkara düşdüm.

Gülşən yüzinün gülin dərərkən
Gül dərmədümü xara düşdüm.

Əsridüm anun ləbi meyindən,
Şol nərgisi-pürxumara düşdüm.

Zülfünə tolaşuban çü Mənsur
Şol sərvi-qədində dara düşdüm.

Cənnət göribən cəmalın anun
Yolında həzar nara düşdüm.

Zülfi ili qoxusın eşitdüm,
Aldum başum, ol diyara düşdüm.

Namus ilə ardan çü uram,
Bu varlığum ilə ara düşdüm.

Qan yaşum ilə nigar oldum
Çün sənciləyin nigara düşdüm.

Dayim bu miyanda oyandum can
Pəs şimdi neçün kənara düşdüm.

* * *

Gördüm bu gecə zülfini qıl qıla, nigara,
Ki, qanqısıdur ki, bəni qıl qıla, nigara.

Cana olasın canıvü dilümi diləsin
Can almaz isən, səhl ola dildilə, nigara.

Məcnun idüğüm Leyli saçuna qamu bilür,
Çün rövşən imiş, sən dəxi bil belə, nigara.

Gün-gün yüzün ilə nə ki, çokdüm isə rövşən
Yazdum bu gecə zülfünə yil yilə, nigara.

Lə'lün əlümə girsə soraydum ki, anıcax
Şuri ağızumda nişə dil dilə nigara.



* * *

Ey xətti müzəvvər sənəmü zülfi müşəmmər
Dildə ləbi-lə'lün şəkəri şükri mükərrər.

Can qaçan ayıla tutalum içməyə süci
Çünki ləbünün xəmri ilə oldı müxəmmər.

Can ayrılımaz, şaha, tapundan nə qəzadur,
Kim olmış əzəldə bu könülümə müqəddər.

Miskin könülüm micmər əgər oldısa nola,
Kafur yüzi üsdinə gərdi xəti-ənbər.

Can buldı səfa, şaha, sənün işvələrünlə
Olmaya dəxi cövrü cəfan ilə mükəddər.

* * *

Könüli aparan den ki, neçün gəlməz özi
Kəndüzi gəlməzü atar yürəgə oxı gözi.

Xubü zibavü gözəldür anı ki, bən sevərəm
Dilə gətürüməzəm andağı tatıvü tuzi.

Qoçuz uş görməmişüz buncılayın bir dəxi hiç
Könül aparıcı, can qapıcı bir şivğə quzi.

Çünki tor olavü görməmiş ola qulın əyər,
Nicəsi çarə qıla bilə ana aşiq özi.

Ney kibidür uş vücudum yanaram bu neyiçün
Düşərəm odına udam yana derəm qopuzi.

* * *

Aləmdə bir ot bitməyə bənüm kibi hərgiz
Düşməyə sənün oduna canum kibi hərgiz.

Ləblərünə ki, lə'li-bədəxşan ana quldur,
Olmaya canı dünyada qanum kibi hərgiz.

Çox can ola dünyada vəli könlüm elinə
Oturmaya sultan dəxi xanum kibi hərgiz.

Bən aduna adandumü bu sanuyı sandum,
Kimdə ola bu ad ilə sanum kibi hərgiz.

Lə'lündə güman eyləmişəm şərbəti-heyvan,
Olmaya həqiqət bu gümanum kibi hərgiz.

* * *

Şaha, bəni sən vüslətünə ruzə sanasın,
Cövri canuma ruziyi-hər ruzə sanasın.

Nəm var xu varum qamusı qamusına möhtac,
Cümləsi qılur hüsninə dəryüzə sanasın.

Ömrüm yarışur göz yaşı ilə gecə-gündüz
Yaş qurıyıban ömrüm anı üzə sanasın.

Məşşatə yasamış, sənəma, zülfüni leykin
Badi-səhəri yasam ilən bozə sanasın.

Hər sözi içün söz edərəm hüsninə qarşu,
Bən suzi-nəyəm, aşiq ol sözə, sanasın.

* * *

Şey lillahumuz var nola varından, əfəndi,
Bil aşiqinin zarü nizarından, əfəndi.

Can belünə bar ola deyü biri bimədüm
Qəflətdə imiş can dəxi barından, əfəndi.

Yarın dilədüm cana dəva, dedi ki, yarın,
Yarın nə biləm, nə gələ yarından, əfəndi.

Bən gül yüzünün vəsfini gülşəndə çü dedüm
Gül dərlədi şəbnəm kibi arından, əfəndi.



Vəslün sənəma həşt behiştün yigi olmış
Hicrün dəxi yavuz tamu narından, əfəndi.

Bən şöylə gülün aşiqi oldum ki, göricək
Toymaya vücudum dəxi xarından, əfəndi.

Zülfün neçə tatarı var isə könül alur,
Miskin könülüm nidə tatarından, əfəndi.

Gözlərün içürdi ləbünün sücilərindən
Kim qurtıla dünyada xumarından, əfəndi.

Qaşunü gözün ləbün ilə saldı şeşi xoş
Bən nə aparam işbu qumarından, əfəndi.

* * *

Gəl halumü gör dəxi yetər səni əsirgə,
Gör kimi sevərəm dəxi gəl bəni əsirgə.

Heyf olmayamı qaşlaruna çin salasın sən
Bən xud ölürəm, sən hələ şol çini əsirgə.

Canü dil ilə əql sənündür, nə deyəyüm.
Lütf eyləvü bax Tanrıya, bir dini əsirgə.

Məşşatə neçün qaliyə sürtər bu yüzünə,
Heyf olmayamı gisuyi-miskini əsirgə.

Ləblərün içün lə'l demək qatı günəhdür,
Sən deməvü şol cövhəri-rəngini əsirgə.

Moddah nə təhsin edə bilə səni, şaha
Sən qaxıma ol mədh ilə təhsini əsirgə.

Yüzinə günəş alnına ay nisbət olımaz,
Dişlərinə gəl bax, dəxi pərvini əsirgə.

* * *

Nə dilüm varur ki, vəslin diləyəm
Nə əlüm irər ki, sunam belinə.

Bən xu sənünəm na hacətdür gireh
Bunca zülfündə ki, canum ilinə.

Can verürəm ta məgər cananumuz
Bizüm ilə bir qılıncı qılına.

Saçı qılınca ki, can verdüm ana
Qamusın saymadı bir saç qılına.

Tutalum ki, vəslə ol razı ola
Kim ola ki, ol nigara ilinə.

Sözə gəldi, dilinə baxdum anun
Dil rəvadur ol dilə ki, dilinə.

Çün həyadan düşdi şəbnəm yüzinə
Bərgi-gül gərək ana ki, silinə.

Canumı verdüm ana bilmədi
Kani-candur qanqı bir can bilinə.

Könlümi yaraladı, dedüm neçün
Bəni sərdi der, baxun nə'lininə.

* * *

Könül bu gecə qıldı yenə yarına me'rac
Bülbül bilə gül halinivü nə bilə dürrac.

Badi-səhəri müşk ilə kafur arasında
Bir nəsnə toxıdı ki, adın bilmədi nəssac.

Gösdərdi yüzin, qıldı necə şahi piyadə
Gər qılmasa oynayımaya oynını ləclac.



Bağrumı birištə qılurü yürəgi riştə,
Qılalı gözi oxlarına canumı umac.

Kuyində səfayi ki, bulam zəmzəməyilə.
Zəmzəmdə dəxi bulmamış ola anı hüccac.

Bər varlıq ilə toylamışam hüsnini anun,
Cana ləbi sundıvü gerü qalanı tarac.

Bən ətəgünə yapışıban həsir olısaram,
Məhşərdə qaçan ki, yığılu gəlisər əfvac.

* * *

Əqlüm dəlü, can əsrük, könülquşı avarə,
Gərək ki, inüldümdən su olub axa xarə.

Ta ax yüzü qara saç gösdərdi şaha büsnün
Kimdür büti-çini ki, ax deyə və ya qarə.

Yar der bu cəhan xalqı yarı axar ağzından,
Bən yar ana derəm ki, aşiq yürəgün yarə.

Günilərəm ayağın həm ətəgi tozından,
Baş qoşdı səbaya, bax şol zülfi-siyəhkara.

Baxma ana ki, gözi tutar könülə əyax,
Lə'li-ləbini gör ki, püstəyə şəkər qara.

Came' olalı, şaha, yüzün bu qamu hüsnə
Gözlərümi görürəm hər birini fəvvarə.

* * *

Gülşənə gəl, nigara, bülbüli gör,
Hüsn içün aləm içrə ğülğüli gör.

Ayinə al əlünə, bax yüzünə
Güneş içində danə fülfüli gör.

Saqiyi-simsaq sun əyağı,
Az-çox ömür içində mülmüli gör.

Bülbül avazı dəgdi qulağına
Bax sürahilərə bu qülqüli gör.

Bülbülün zarisiyçün ağlar ikən
Könül aydur bana ki, gülgüli gör.

* * *

Zimecmei-mətbuvü zəhi söhbəti-mövzun,
Leyli bunı bu gecə görürsə ola Məcnun.

Bəxşayişi-həqdür bu ki, sərdə ola lihəmd,
Mühəmməd ola mütrübi, saqisi Firidun.

Sevdayi əgər qılur isə gisusi nola
Çün ağzı qılur lö'lö ilə lə'lini mə'cun.

İsdərəm anun vəslinivü girməz əlümə,
Şöylə ki, su isdəyəvü məhrum ola kəmmun.

Zülfindən anun kəm qılı bu cəngümə gəlməz
Bən neyləyəyüm çün bu imiş dünyada qanun.

Sərvin görəli qopdı qiyamət yürəgümdə
Nilin görəli axıduram gözləri Ceyhun.

Bu fitnə ki, gözündə görürəm, sənəma, bən
Harun dəxi sanma ki, anunla ol mə'mun.

* * *

Yar ilə şətrənc oynadı, könül uş oldı mat,
Gözləri qıldı piyadə könülümi saldı at.

Görəli özgədən oldux ta'ıbun əl-a'ibun
Siz nola olur isənüz rakiatun sacidat.



Can fəqirü dil həqirü tən kəsirü sən həbir
Gər irürürsən nola bana ləbündən bir zəkat.

Zülfünə tolaşdı könüllər ləbün ümidinə
Virdi xəttün qədrümüzcə hər birimüzə bərat.

Qıldan incədür belün leykin anun bari giran
Gündən aydındur cəmalün bənləründür nadirat.

* * *

Zülfün ilə bu könül biçarədür,
Gecələr ol arada avarədür.

Can alur, əql aparur, könül qapar
Hökm çün anundurur, nə çarədür.

Yara bən gösdərməzəm könülümi
K'anda necə qəmzəsindən yarədür.

Ah qılmadı anun könlində yer
Olamı könli ki, səngi-xarədür.

Kirpüginün hər biri bir oxdurur
Bax yürəgümə ki, parə-parədür.

Gəldi gözləri xəyali gözümə
Varlığumı aldı gözi qarədür.

Gözi can alurü can busə dilər,
Hüsni bu də'vimüze nəzzarədür.

* * *

İlahi, nola gözümə bu xabi xab edəsin
Cigər qanını bana dəmbədəm şərab edəsin.

Şərabü xab salar aşiqi yarından irax,
Yeridür anlarun içün nə ki, əzab edəsin.

Zücaci cama yürək meyini gözümdə qodum
İradətün var isə, uş cigər kəbab edəsin.

Bizümlə lütf qapusını bağlu tutarsın,
Dilərsin olamı hicrana fəthi-bab edəsin.

Könül yüzi suyını dökəsin yerə çün sən
Həya ilə ərəq eyləyübən gülab edəsin.

Nə cövhəri ola şol ki, ləbüni lə'l sana,
Görür ikən ki, anı qan ilə xizab edəsin.

Təbibi-eşq ləbün dərdü həm dəva yenə ol,
Şərabi gizləyübən necə bir cəvab edəsin.

* * *

Dilbər ki, dilrüba olavü şuxü şəng ola,
Yüz döndərürsə kişi ana namı nəng ola.

Geyik gözünə necəsi seyd olmaya könül,
Tutam ki, ol könül kişisi xun pələng ola.

Zülfün nəhayətinə qaçan irişə könül
Xassə ki, qəmzəsi ilə anda xədəng ola.

Sənünlə bir olan könülüm könülün ilə
Bəllüdürür bir arada ki, şişə səng ola.

Bənzüm sarusı iləvü gözüm yaşı ilə
Bən bülbüləm çü gül yanağun həm dü rəng ola.

Borcum nədür bu lə'li-ləbünə ki, qan içər,
Tutam ki, qəmzələrün ilə sülhü cəng ola.

Sərbazlıx gərək ki, qılam zülfün ilə bən,
Sevdazədə olub ana gisusı dəng ola.



Eşqin odu yaşum dənizü dilbərüm balıx
Himmət bu odü sunun içində nəhəng ola.

Gözi xətavü qaşı xütən, gisusi həbəş
Hindu bigi yanağı neçün pəs firəng ola?

* * *

Xusrova Şirin təng şirin ləbün,
Cənnətisin bəllüdür narin ləbün.

Tən xu yoxdur canü dil şimdi fəda
Nə rəvadur qoyımaz sarin ləbün.

Lə'lü lö'lö şunca dökdi gözlərüm,
Nola qaytarsa bana birin ləbün.

Ləbləründən dərdümə sordum dəva,
Dedi, yarın tutdı tə'xirin ləbün.

Baxdı yaşuma təbəssüm eylədi,
Bildi bənzər canda tə'sirin ləbün.

Totağın şirin dedim, şirin dedi,
Gözümə girsün görə şurin ləbün.

Mar isə gisun tolaşsun boynuma,
Çün xət ilə qıldı qul murin ləbün.

Bən bugün necə sana könül verəm,
Çün bəni öldürisər yarin ləbün.

* * *

Qaçan ki, yar ilə bir gececük sabaha irə,
Ümidi eşq ərinün lacərəm nə caha irə.

Şəhadət isdəyə eşq ərinün canı hər dəm,
Nigarı yolına ta ki, məgər fəlaha irə.

Nə zəhməti ki, çəkə rəhmət ola mütləq ol
Yüzinə baxıp əgər rahət ilə raha irə.

Nicəsi səbr edə gözləri ilə bir könül
Ki, kirpügi ilə hər ləhzə bin cəraha irə.

Könül quşına cünahı olmasun əgər diləyə
Ki, müşk ilə saçuna tolaşub cünaha irə.

* * *

Bu tabxaneyi-dildə ki, eşq tab qılur,
Qanın şərab içərü bağrını kəbab qılur.

Gözüm yaşını su ikən ləbi qılur xunab,
Vəli xəyali yürəgümdə xuni ab qılur.

Həzar can ola hər bir qılında gisusinun
Könüli, əqli ol arada kim hesab qılur.

Yüzinə baxmağa gözlər doyamaz içün
Tərəhhüm eyləyibən zülf ilə hicab qılur.

Bu piri-puxtəyi sunğil bizə sən, ey saqi,
Ki, zövqi irsə dimağına, şeyxi şab qılur.

* * *

Səndə qalur, bəgüm, gözüm afəti didəganmısın?
Sənsüz kişi dirilüməz cani-mənü cəhanmısın?

Beli qılına sundum əl, əlümə nəsnə gəlmədi,
Canumı gördümü dedim sən dəxi dərmiyanmısın?

Cadu gisuları tağux düşmiş əyağuna yarun
Oğrayu gəldümü dedim rəxti-horamıyanmısın?

İns sənün ilə üns edər can canı səndən aparur
Adəmimisin, ey sənəm, həsrəti-insü canmısın?

Hüsni bu canda toludur, adı cəhanda uludur,
Dün gecə gəldi, bilmədüm, dedim, ey can, filanmısın?



* * *

Necə ki, çərx bindi əsbi-əbləq,
Fələklər necə ki, yasadı cəvsəq.

Xəcil qıldı yüzi şəmsi mü'əyyən,
Xəti nəsx etdi incili müheqqəq.

Ayağı tozına sürdi yüzin yer
Anun tək görimədi çərx əzrəq.

Salınışı ilə sözləri qıldı
Müqəssəm xətti nöqtəyi müşəqqəq.

Xəyalüni özində gördi məgər
Ki, Həllacun dili dedi, ənəlhəq.

Saçun sevdasına düşdüm dəlüyəm,
Bana şimdən gerü sən tutmağıl dəq.

Bəgüm, eşqə düşən olmaya aqil
Şahum, xubi sevən olmaya əhməq.

Ağızuna düşən zəhi müheqqəq
Belünə can verən zəhi müvəffəq.

Gözüm yüzündə mö'ciz nəsnə gördi
Ki, qılmış kiçi barmax bədr ayı şəq.

Gül anlar gözümü bülbül qulağum
Bağırsun necə ki, gərəksə ləqləq.

Müqəyyəd çoxdurur zülfündə, şaha,
Vəli yoxdur könülüm kibi mütləq.

* * *

Könlüm necə bir yüzünə heyran ola çün şəm
Gözüm necə bir qarşuna giryan ola çün şəm.

Yar zülfü ilə küfrə əgər düşə könülüm,
İçində anun şö'leyi-iman ola çün şəm.

Ağlamağü sararmağü yanmağü tükənmək
Aşiq canınun dərdinə dərman ola çün şəm.

Pərvanə olursa ki, qıla eşqini zahir
Ol yola gərək eşq əri qurban ola çün şəm.

Əksük yanar isəm sənəma oduna bir dəm,
Həqdür ki, başum almağa fərman ola çün şəm.

Gərək ayağın turıban ağlayavü köynə
Eşq əri çü mə'şuq ana mehman ola çün şəm.

Yürək odını kəndü canımçün sevərəm bən
Aşiq ki, odı olmaya bican ola çün şəm.

Kamil olıcax eşq əri yanduğına canı
Giryan dəxi olur isə, xəndan ola çün şəm.

Şəhdi-ləbüni yad edicək küllü vücudum
Başdan-ayağa cümləsi dəndan ola çün şəm.

Eşqin yeli əsdükcə içümün odı artar,
Sanma bu həvadan ki, pərişan ola çün şəm.

Miskin könülüm gisuların ənbəri içün
Dəm-dəm ki, yana nuri-firavan ola çün şəm.

Hicran odına taş dəxi gər oğrar olursa,
Hər nəqşi qəbul etmədi, asan ola çün şəm.

Aşiq könüli nur ilə qaçan tolu olsa
Ayax basacax yer ana meydan ola çün şəm.

* * *

Dilərəm ayağun tozını gözümə sürmə,
Məqsuda eşikdən irişincə bəni sürmə.

Gözünə xəla eyləyibən düşdüm isə bən
Aldun axı əqlü dilü canımı bu cürmə.



Peyvəstə qaşunı şəhə mizan ilə gördüm,
Də'vi qıluram qəmzən ilə güci buyurma.

Dedim ki, ləbün bildimi çəkdügini canum,
Xişm ilə bana baxdı gözi, yə'ni ki, sorma.

Xalün bana yetər ki, qıla xali vücudi
Gisuni pərişan edübən damunı qurma.

* * *

Ey necə eşq ilə biz yüz dürlü sər pa urmışuz
Ləbləri yadına meydən məşqi-səqqa urmışuz.

Əhmədi olup, gəhi oldux molla dər cihan
Ki, səma'ü əvhadını bisərü pa urmışuz.

Eşq odını gizləmişüz bir ovuc topraxda biz
Bir nəfəsdə gör ki, necə həft dərya urmışuz.

Eşq dedikləri bizüz həm yenə bizdən varur
Biz gətürmişüz anı k'adını baba urmışuz.

Biz fəna içün gərək təbli-bəşarət çalavuz,
Dəxi suri çalmadın zira ki, surna urmışuz.

* * *

Eşq bir cövhərdürür ki, şəhri dildə şöhrədür,
Kəmtərin xuddamı mahü müştərivü zöhrədür.

Aşiqi-aqil ana derəm ki, əhliyyət sevə
Bülbüli-divanədür kim ki, əsiri-çöhrədür.

Mehri möhrinə könülüm mumdur Tanrı bilür,
Çünki şol şəhdi-ləbünün mehri şimdi möhrədür.

Aşiqin həzzi gərək tabe ola mə'şuquna,
Nəfsi içün bəhrə diləyən kişi bibəhrədür.

Eşqdir tərki-iradət kim ki, bu yola girə
Gər iradət də'visin qılur isə bizəhrədür.

* * *

Şəkkər ki, derəm lə'li-dilaram dəgülmi?
Ənbər ki, derəm zülfi-şəbəhfam dəgülmi?

Dildar yüzindən nədür artuğı günəşün,
Gülşən dəxi şol yari-güləndam dəgülmi?

Cadu gözi, kafir saçı, fitnə gözi anun
Qürbətdə yüzi arada islam dəgülmi?

Əvvəl qədəmi eşq ilə can üsdinə basdum,
Bir dəxi qılam vəslinə iqdam dəgülmi?

Simaya bənüm altun ilə eşqi yazıldı,
Siz dəxi bilün çün bilə ollam dəgülmi?

* * *

Nigara, eşqin ilə əl tutub divanə varuram,
Nola aqil dəgül isəm çü bən divanə varuram.

Həvayi biribidüm bən ki, vərbad eyləyə zülfin
Gərək ki, dinməyə hüsni ki, bən imana varuram.

Züleyxa qul olur isə nola bən Yusifə çünki
Sənün eşqində zindana hələ, zindana varuram.

Nigara, ərrə düzmişsin saçun şə'rin rəvamıdır
Ki, bəndə hər qıltnun misli çün arana varuram.

Təbibi-lə'lünə sordum dəva bu dərdümə nədür,
Dedi, nəvmid olmanuz çü bən dərmana varuram.

* * *

Ləbüni görəli dəmdən bu gözlərüm axıdur xun
Oduna ud olmağı bana həq eylədi qanun.

Əgər hər gecə zülfündən pərişan söylərəm nola
Əsirünəm vəli eşqin dilümi eylədi madun.



Dərunam gərçi surətdə bəni birun görürlərsə,
Həzaran var dəruni ki, bilürəm bən anı birun.

Bu ədvar içrə bizüm tək bu eşqin gözi görmədi,
Nə idi Xusrovü Şirin və ya Leyli ilə Məcnun?

Çü ayinəsidür hər yar yarının nigarına
Gözün məst edəli bəni gözikür ləblərün meygun.

Gözündən borc aluban bən ləbündən badələr içdüm
Zənəxdanuna sal bini bənəm ol müflisi-mədyun.

Bənəm sevdayivü sən həm dəgülsin xali sevdadan,
Vəfavü eşq ilə gəl ki, müfərrih düzəlüm mə'cun.

* * *

Məşşatə bana müşk ilə bir şanə gətürməz,
Bənüm kibi bu dünyaya divanə gətürməz.

İrürdi canumı ləbüməvü tətağını
Ta cana irürməz ləbümi cana gətürməz.

Ögrəndi ki, gizlü sata gövhərini lə'lün,
Yə'ni nə qılınur k'anı dükkana gətürməz.

Sir gördi, şaha, lə'lün içində bu könülüm,
İzn olmaz isə, bu ləbü dəndana gətürməz.

Dutdum könüli zülfün ilə, şaha, bu gecə
Bir piri kişivü hələ divana gətürməz.

* * *

Neçə ki, binəva isən gəl ki, Hicaza gedəlüm,
Qan ilə dəstəmaz alub yüri namaza gedəlüm.

Çeşmi çü bazdur anun tö'məsidür cigərümüz
Tö'məsini eylədəlüm naz ilə baza, gedəlüm.

Gözləri məst edər bəni ağızı təngdil qılur
Gəl ki, saçına uyıban rahi-diraza gedəlüm.

Çəng buraxdı çənginə, ud buraxdı odına
Badi-həva ilə gəlün, bir yeni saza gedəlüm.

Hüsnini rövşən eylədi dünyaya ol günəş yüzi,
Ağızı eşq sirridür dur uru raza gedəlüm.

* * *

Sevüb səni can oynaya mərhum ol kişi,
Dünyada görməyən səni məhrum ol kişi.

Şirin ləbüni görənə sorma nə oğradı,
Yandı həvan odı ilə çün mum ol kişi.

Tamu əzabı hövlini neyçün sorar əcəb,
Eşitmədimi bir gecə ahım ol kişi?

Saldı həbəş çərilərini Çin elinə,
Altunda sikkəsin ura dər Rum ol kişi.

Lə'li zülalinə necəsi səbr edə bilə,
Biçarə gözi görəvü məhmum ol kişi.

Mərhəmdürür visalünü gözün yaraladı,
Tiryakdur totağunü məsmum ol kişi.

Əqlüm sən aldunü bana derlər ki, dəlüdür,
Məmduh hüsn ilə sənü məzmum ol kişi.

* * *

Gəlün, içəlüm bir-iki camı tolu badə,
Cəhd eyləyəlüm verməyəlüm ömüri badə.

Bidada könül bağladı canum gözün ilə,
Bir parə qılursan dəxi ol varmaya dadə.



Bən sənə canum verəmü sən yada könülün
Andan dəxi götürməyisər hiç bizi yadə.

Bən sərf sevərəm səni, sən sadə gözəlsin,
Gərək ki, barışa idi bu sərf ilə sadə.

Zülfündə yol uzundurü belində iş incə
Lə'lün nola gər verür isə bizə zəvadə.

Belündə özin oynadı canum zimühəqqiq
Zira ki, gözin açdı bəqa gördi fənadə.

Bən eşqinə varlıx verürəm kim verür artux
Olmaya rəva kim verəsiz hüsni məzadə.

Hüsnün kibi bən eşq ilə gərək ki, ad alam
Azadə qaçan qane olısardur az ada.

Bən sözi tə'vil edimezəm şöylə fəridəm
Ki, qalmaya cüz eşq vücudumda ziyadə.

* * *

Qulağuma gülşəndə bir avazə irişdi,
Bülbüldənü bildüm ki, canum yaza irişdi.

Nə səbr qodı bəndəvü, nə can qodı təndə
Mahmuddan avazə çü Ayaza irişdi.

Ta çeşmini baz eylədi can tö'məsi oldı,
Miqdarı nədür sa'və çü şahbaza irişdi.

Könül görəli lə'lini oynadı canını
Can səhl ola şunun kibi bir raza irişdi.

Ətnab edər idi, qadı mədhində könülüm
Gördi ağızı nöqtəsin, icaza irişdi.

Hər çənd ki, icaz ola xublar ağızında,
Bunun kibi olamı ki, e'caza irişdi.

Yar gisusi ucları ilə oynaya aşiq
Başın neçün oynamaya sərbaza irişdi.

Hərçənd ki, əşkiyə bu eşq odı sanurduq
Ki, şimdi hənuz ol ağaza irişdi.

Eşqim quşı yavrı idi yetürdi qanadın
Şimdi gərək avlaya ki, pərvaza irişdi.

* * *

Göz cəmalün göricək olur qərir,
Göz ki, görməyə cəmalüni qərir.

Şə'r ələkdən keçmə olur bu tənüm
Görəli sənün tənüni çün herir.

Qandı lə'lin ləblərünə dər əzəl
Eyləmiş idi bəşir ol həq bəşir.

Anun içün binəzir oldı yüzün
Ki, təravətdən olur hər dəm nəzir.

Xəddi odı ilə dil uxduddur,
Gərək isə aləm olsun zəm horir.

Qaşı hacib, gözi şahnə hüsninün
Yüzi sultan, gisularıdur vəzir.

Ənbərü kafur içində qərq olur
Baxdlu dil ki, saçundadur əsir.

* * *

Fitnədürür gözi, şükür, Allah, xüftədür,
Oldum müheyyir ağzına ki, nühüftədür.

Şol didəyə ki, hüsni kibi gör nə didədür
Bir mədh dilər ayda könül ki, nəgüftədür.



Taq oldı əqldən könülü ruhdan tənüm
Görəli qaşı taqın əgərçi ki, cüftədür.

Gün gözi görmədivü yil ayağı irmədi,
Nə vəch ilə nigar ləbi lə'li-süftədür.

Bir can verür könül ki, ala canını ləbün
Hərçənd xəlq meyli bu dünyada müftədür.

* * *

Eşqində olan nəqsi divana gəliməz ol,
Dəftərdə olan xətbi divana gəliməz əl.

Kimün k'ola cismində can dirivü əql ölü,
Oynayan ilə canın meydana gəliməz ol.

Eşq ayağını tolu saqidən alımayan
Pəjmürdə yatur dayim, məstanə gəliməz ol.

Hər kim ki, yaxılmaya bir günəşin odında,
Bir quzda yata qar tək səyvana gəliməz ol.

Bin səbr ilə bir aşiq necə var isə ömri
Ta gəlməyə canına bir cana gəliməz ol.

Aşiq gözi gərək ki, axıda qızıl irmax
İrmaxları olmayan ümmana gəliməz ol.

Tax zülfüni boynuma çahi-zənaxuna sal
Kim ki, ola gənincə zindana gəliməz ol.

Kimdə ki, ola biliş qapunda yazılur qul,
Bilişi bulımayan biganə gəliməz ol.

Lə'lün sevənə, şaha, sərmayadurur yoxlux
Sərmayəsi olmayan dükkana gəliməz ol.

Mərdümlük edər gözüm, dökər ləbün içün su
Zira ləbünün suyı heyvana gəliməz ol.

Ləblərüni sordum çox kim neçəsi cövhərdür
Təkrar edübən bildüm dəndana gəliməz ol.

* * *

Bizə gəlgil bu gecə ki, mahtabun tabı yox,
Lə'li-ləblərün qatında xud şərabun abı yox.

Müşki-zülfündür, sanasın, yildə bir yelda qılan
Zira nəsnə yox cəhanda kim anun əsbabı yox.

Qaşlarun yayduru ol qorır yüzündən gözləri
Qanqı sultandur cəhanda kim, anun hüccabı yox.

Badi-qibli əsdi könlümə neçün dögməyə yaş,
Nerdə gördüm öylə yelini k'anun seylabı yox.

Dilərəm ki, gözlərüm gözlərüni düşdə görə,
Gözlərindür xüftəvü bənüm gözmün xabı yox.

Gözlərün xunivü məstü cadudur əlhəq, vəli
Hic müsülmanun onun mehrabı tək mehrabı yox.

* * *

Görəli şaha yüzündən bir camal
Qalmadı yüzüni görməgə macal.

Qıl belünə nöqtə ağzına, bəgüm
Bu təsəvvür batil ol sevda mühal.

Bən ləbündən içərəm yürək qanın
Dutalum k'andan axar yüz bin zülal

Yaşumı gözdən buraxdum ki, nədən
Bu səvədə nəqş edəmədi xəyal.

Beldə qıl, ağzunda qali görmədin
Varlığum yoğ idi hiç qilü-qal.



* * *

Bu zöhrə yenilə saz edər, oxşar,
Mühəyyirlərə şəhnaz edər, oxşar.

Bu quşca canuma əsirgəmədin,
Laçin gözlərini baz edər, oxşar.

Canumla gisusını verdi yelə,
Havada bizi sərbaz edər, oxşar.

Bizə bir buseyi bin cana satdı,
Bəha oldı isə naz edər, oxşar.

Ağızı nöqtədən edər yüz ayət,
Məgər də'viyü i'caz edər, oxşar.

Bəni qıldı səməndər odı ilə,
Qışı dəxi məgər yaz edər, oxşar.

Könül qandan çıxınca gözi qapar,
Qara bahrıyi pərvaz edər, oxşar.

Məgər əğyar ilə yar oldı ol yar,
Bizümlə razını az edər, oxşar.

Müdam etdi yüzümdə seyli-xuni,
Məgər Rum elini saz edər, oxşar.

* * *

Nə deyələr cəfa müdam edənə,
Bu cəhan içrə nəqdi vam edənə.

Qanı məmnu ikən mübah içənə
Lütfi məndub ikən haram edənə.

Nə əcəb olur isə hərcayı
Saçları piçini məqam edənə.

Bu canumun elini xas edərəm,
Hüsni nurın cəhana 'am edənə.

Qılmaz aram dünyada könülüm
Cüz ki, can tusənini ram edənə.

Gözlərüm yaşı eşqini çaxdı,
Barəkallah, nik nam edənə.

Bən ki, sultanları qulam etdüm,
Uş qulamam bəni qulam edənə.

* * *

Dilbəra, al əlünə, al əyağı,
Toptolu eylə ələ sal əyağı.

Ömr çün bizüm əlümüzdə degül
İçəlüm ruzü mahü sal əyağı.

Hicr əlindən ağuyi çox içdük,
Həsrətümüzdürür vüsal əyağı.

Əlinə canı gər haram edəvüz
Qaçan ola bizə həlal əyağı.

Əllerin qanumuza boyamış
Nə əcəb sunar isə əl əyağı.

İçəli gözləri əlindən ayax
Gözümüzdədürür xəyal əyağı.

Ol əyax gözi əlindən içən
Qılısar ana guşmal əyağı.

* * *

Dilbərün qəmzəsinə ox deyəlüm,
Hər cana dəgər isə "ox" deyəlüm.



Tola şəkkər ləbin anıcağ ağız
Bu sözi vacib oldı çox deyəlüm.

Müşk saçın qaçan ki, tağıda yar
Salalum udı oda "qox!" deyəlüm.

Çün nə dersəm müxalifət qılısar
Busə gərəkmi dersə, "yox" deyəlüm.

Adəm oldur ki, andan əsrük ola,
Ayığ olanlara uyux deyəlüm.

Bən səni sevərəm, sevisərəm,
Bu sözi türkcə qoyux deyəlüm.

Vəsfüni gəh qəsidə, gah qəzəl,
Gəh rübaivü gəh tuyux deyəlüm.

* * *

Şol şəhün ki, saçı çü ənbərdür
Eşqi odına can səməndərdür.

Şol ləbi-lə'l içün ki, himməti yox,
Yaşum incüvü yanağum zərdür.

Gərçi baravər olmaya tubi
Sərv qəddini gör ki, dərbərdür.

Ləbi çün şəkkər olduğı nə əcəb,
Çün ikidür yəqin mükərrərdür.

Nay oda yana suzum əlindən,
Gözlərüm yaşi ilə dəf tərdür.

Sərvünə qarşu ud oldı tənüm
Yürəgüm zülfün ilə micmərdür.

Sazkar ol bu saza, ey aşiq,
Bu qəza cana çün müqəddərdür.

* * *

Könül yarı qılur, həvəs girməz əlümə dəsirəs,
Zülfi gecə, gözi ə'səs, ləbi şəkkər, könül məgəs.

Hər ləhzə gözi canuraə ox urdı girdi qanuma
Taldı bənüm ümmanuma gözümdən axıtdı Ərəs.

Gözi nə düzdi ray içün, qurdı qaşını yay içün
İniləröm dəray içün tana dəgin həm çün cərəs.

Bən ruxruxına urayım şəhmat əgər der isə ol
Fildən piyadə olıban önində tərh edəm fərəs.

Gər qonar isə əlümə şəhbaz bir gün filməsəl
Zülfi kəməndin taxayım bən boynuma həmçün ərəs.

* * *

Neçə bir qarşumuza göz ilə qaş oynadısar
Qaçan isə bu yola can ilə baş oynadısar.

Yürəgi taş, qaməti nay, kirpügi tiri-xədəng
Necə bir yürəgümə od ilə taş oynadısar.

Tərü xüşki qoyalum, məhv ilə bizdən keçəlüm,
Zira dilbər yolına quruvü yaş oynadısar.

Necə pinhanı tuta eşqini canında kişi
Sözi sazında çü eşq əhlini faş oynadısar.

Şol məhəldə ki, baş oynaya qulun yola gedə,
Qaydadur, görəlüm, ol kişi ki, şaş oynadısar.

* * *

Gərək ki, tərk edə varını yarı diləyən,
Əğyar ulaşığını kəsə yarı diləyən.

Namusı nam içün qoyavü sidq ilə ola,
Ari nigarının yoluna arı diləyən.



Bən sevərəm könüldə yarasını gözinün
Gül eşqinə ola yenə həm xarı diləyən.

Mərsum olalı könlümə eşqin odu bu gün
Oldı bu gözlərüm dəxi idrarı diləyən.

Qal ilə qilü qoyavü tolu içə qədəh
Eşqinin əyağı ilə əsrarı diləyən.

Könlüm uyalı gözinə ditrər ləbün içün
Zira ki, xəmrə meyl edə xəmmarı diləyən.

Gəzdük cəhanı bisərü pa zülfi yolına,
Bipavü bisər ola səbüksarı diləyən.

Gözin görəli ağzı yarı içün ölürəm,
Zira ki, şərbət isdəyə bimarı diləyən.

* * *

Gözünlə bənciləyin kişinün dilini kəm al
Gözüm qanı kibi lə'lün yolında ola kəm al.

Xətada dəxi gözün tək xətayı görmədi göz
Ki, ol savaba müqabil düşər be hüsnü cəmal.

Kəmal gözin irax eylədi gözündən ki,
Ola ki, gözlərünə iriməyə eyni-kəmal.

Deyiməzəm, sənəma, mədhüni ələ'l-amya
Ki, lal ola dilüm təb'ümə irişə kəlal.

Bizə haram görən şəkkərini lə'lünün
Həlalı oldı həramü həramı oldı həlal.

Xətayi eyni-səvab eyləmək nə sehr olur
Ki, Musa dəf'inə bulımaya təriqi-məcal.

Gümana nisbət edərlər ağızını zi güman
Xəyalə bənzədələr incə belini zi xəyal.

Yüzündə eyd hilalini görəli bu gözüm
Müherrəm olsun əgər gökdə gördüm isə hilal.

İmalət etdi qaşun, qılmadı ləbün işmam,
Gözün ya nişə qılur işbu könlümü i'lal.

* * *

Xandəm, xandəm, xandəm, xandəm,
Sənün eşqin ilə uyırdum oyandum.

Gəhi lə'lün ilə qızıl qana batdum,
Gəhi zülfün ilə qaraya boyandum.

Bəni dəpələmə rəva olmaya hiç
Ki, sənün sözünə, nigara, inandum.

Yoluna nə əcəb əgər can fədadur,
Hələ bən bu işə yolunda qıvandum.

Bəni sana sayma əgər səndən özgə
Dəxi bir yasağa dəxi hiç yasandum.

* * *

Xəlvət etmişəm sənünçün, ey nigar, könlüm için
Söhbət edəlüm sənünlə bir nəfəs canum için.

Camı təmam ola dersən uş könül sana yürək
Anun içində qan olmışdur bu dəm canum için.

Zülfünə düşəli bildim ki, xəta düşdi könül
Tolaşuğa saldı ol dəmdən bərü canumı Çin.

Qaşları peyvəstə əgri bulınur öz əhdinə
Necə ki, bağlamışam bən anlara canumı çin.

Dilərəm xəlvət irəm tapunavü qılam fəda
Bir nəfəs canum için, canum için, canum için.



* * *

Eşqi südini lə'li xəyalından əməldən
Tifli könülün barmağ əmər oldı əməldən.

Dərdümə dəva dərdivü dərman canuma dərd
Bu halət ilə taşdı hələ şimdi kəm əldən.

Çəkməmiş ola dünya bu gög əqrəbi ilə
Hər ləhzədə bən çəkdügüm ağuyı həməldən.

Məxmuri şərab olmışamü eşqə əsirəm,
Sun tolu qədəh çarəmüz et qövlü əməldən.

* * *

Can oynamayınca necə canan ələ gəlür,
Can yerinə gör ki, necə bin can ələ gəlür.

Düşdi könülüm müşkilə gisuları ilə
Ol türrəyi sən sanma ki, asan ola gəlür.

Kanı kişi gər cövhər içün isdər olursa,
Ləblərünə irən kişiyə kan ələ gəlür.

Nə nisbət ola təxti-Süleymana qarınca
Qarınca olan cana Süleyman ələ gəlür.

Dərdün dilərəm bana dəxi nəsnə gərəkməz,
Zira ki, yenə dərd ilə dərman ələ gəlür.

* * *

Bu söz ilə faş etdi ləbün razi-cəhanı,
Kim suzum ilə yaxdum oda sazi-cəhanı.

Sən zülfüni gör ki, necə bir qılına asdı
Bir şurişimüz iləvü sərbazi-cəhanı.

Əqlami-əzəl yazdı yüzünə xəti-hüsni,
Şol dəm ki, qılurlar idi ağazi-cəhanı.

Apardı gözi canıvü oldı ləbi zamin,
Dutarlar isə borclu içün nola zamanı.

Paludə qılub kirpüg ilə yaşum axıtdum,
Ta anda nişəstə qılam ol sərvi-rəvanı.

* * *

Düzənlig ilə yarənlər gəlün ki, cam içəlüm,
Bu günü tanla demədin meyi müdam içəlüm.

Gözi ilə məst olıban, zülfi ilə aşüftə
Anı-bunı deməyəlümü sübhü şam içəlüm.

Yürəgümüzi ki, qandur ana həlal edəlüm,
Totağı eşqinə yarın meyi-həram içəlüm.

Çü eşqi odı ilə dilbərün sana gəldük
Canı əsirgəməyəlüm şərabi-xam içəlüm.

Zərurət ilə çü yaran gözi ilə əsrügüz,
Meyi-muğanəyi gəlün ki, bərdəvam içəlüm.

* * *

Şol can ki, eşqinə sənəma ol nədim ola
Gərək ki, dürdi-badəyə sindən muqim ola.

Bin can bu can kibivü dəxi yaxşırax dəxi
Cananəyə fədavü bu can anda kim ola.

Yar ilə bin əzabı nə'im müqim olur,
Hicrilə bin nəm əzabi-cahim ola.

Eşq əhli tərki-dünyada canü cəhan olur,
Bu dünya əbli tərki həmin zərü sim ola.

Dünya çü fanidür nola gər tərk qılalar
Kim tərk edərsə canü cəhanı kərim ola.



* * *

Ləbüni şəkkərə eşq əhli, şaha, qanda verə,
Nəbata nab nə aqil ola ki, qanda verə.

Saçunı küfrə necə nisbət edə bilə kişi,
Nişani-dini nəbi çünki ol Yəməndə verə.

Əsir verə varın ta ki, qurtıla bağdan,
Məgər bu bəndə ki, gəndüyi daxi bəndə verə.

Görürsə zülfüni cündi məvacibin cümlə
Vücudına qatiban küllisin kəməndə verə.

Bənəfşə ola pərişanü sünbül ola xəcil
Səba əgər saçunun qoxusın çəməndə verə.

* * *

Gəl axı xətaya düşmə çözicək saçını görgil,
Xütənün ki, müşki vardur, biləsinə çini görgil.

Yüzi güldürür, dəridür çü gülabi-xoş mükərrər
Öləyim deməz olursan sən anı saçını görgil.

Tağıldı zülfüni sən bu cəhan qaranu oldı,
Yenə gündüzi dilərsən boyunun axını görgil.

Qılağındağı güpi gör dəxi ana nədür demə,
Demə tuba boyına gəl bel ilə biçini görgil.

Taşı lə'ldür ləbinün, içi şərbəti-həyatı
Gər ana irişür isən dürişüb içini görgil.

İçini biləm der isən sənəmün taşını görgil,
Dilü canü əql rəxtin ol evə taşını görgil.

Yaşı gəncəcük nigara de ki, göricək yaşınma
Sənəma, səni sevənə nəzər et yaşını görgil.

Qaşı qəmzəsi əlindən başumı qaşınımazam,
Gəlür isə gəl əlündən baxıcax qaşını görgil.

* * *

Gözümdən axan yaşları xunabə sanasın
Döndi bu yürəgümdəki xun aba sanasın.

Busə dilədüm totağını tutdı dişiylə
Düşdü tolucux danəsi ünnaba sanasın.

Könül adalı oyağı eşqi qapusından,
Yol ol qapudan eylədi hər baba sanasın.

Gözüm açalı qapu xəyalı qonuğına
Bağladı Səmərqəndi qapu xaba sanasın.

Qurmış gözi qaşmü savaş yarağı etmiş
Zülfəyninə bu şib qəsd edər ə'raba sanasın.

Kirpüklərim ucından axar irmağı yaşum,
Bir cərrədürür hər biri dolaba sanasın.

* * *

Mücərrəd namü nəngü canü dildən bir qələndərvən,
Havan içində qərqü eşqin odına səməndərvən.

Mübərqə yüzüni görəli üşşaqundan oldum bən,
Görəli qəddüni toğru budurur ki, müxəyyərvən.

Xızır kibi qara zülfün qaranuluğına girdüm,
Ləbündən leyk məhrumam sanasın ki, Skəndərvən.

Əbu-Bəkrəm səfan içrə, Öməryən iqtidan içrə
Çü Osmanam sana qarşu, vəli yolunda Heydərvən.

Gözünün qəmzələrinəvü ya zülfün kəməndinə
Şaha, kim deyə bilisər tutalum bini Xeybərvən.

* * *

Gülşənə bax, yarumun girişməsini gör,
Eşqi ilə canumun girişməsini gör.



Yağmacı gözlərinün bilişməsinə bax,
Zülfi girehlərinün ilişməsini gör.

Bax bulıda gözlərüm içün necə ağlar,
Ləblərün içün gülün gülişməsini gör.

Zülfün ilə arizün gösdərəlidən
Gündüz ilə gecənün qavışmasını gör.

Sanma ki, mə'şuqə eşqim odını bilməz,
Bir araya gəlüb baxışmasını gör.

* * *

Yenə səba qoxusı ilə müəttər əldı məşam,
Megər ki, gülşən arasında yar qaldı xüram.

Bana ləbindənü gözlərinə yürəgümdən
Haram oldı həlalü həlal oldı haram.

Qiyamı məhşəri-ərvaha bir qiyamətdür,
Anun içün dilü can ilə bən canuma qıyam.

Saçına baxdum idi çin həzaran bin can var,
Sanam ki, bən dəxi canum ilə sağışa sanam.

Nə eyş isdəyə kişi cəhanda bundan yeg
Ki, şəmü şahidü saqi müdam olavü müdam.

* * *

Sənəma, saçunı çözgil ki, zəmanə məşhəridür,
Könülümə sal odından, zira eşq məcməridür.

Neçə alını ayı ilə könülüm qələndər isə
Saçı həlqələri ilə yenə əql heydəridür.

Əlifi boyını sevən kişi mimini göricək
Bilə ki, ölü diriltmək yenə həm peyəmbəridür.

Yüzi ədən uçmağıdur, iki qaşıdur tərazu,
Gözidür cəhənnəm odı, ləbi həvz kövsəridür.

Ayağını başuma bən götürür isəm nə ola,
Çün anun yolına başum bu nəfəsdə sərsəridür.

* * *

Bən incə diyəm ki, bana şol yar nə qıldı,
Könülüm elinə şol büti-əyyar nə qıldı.

Qoymadı bana əql ilə canü dili hərgiz
Çün yar bunı qıldı, pəs əğyar nə qıldı.

Xüftə gözi yazmadı canı qəmzəsi ilə
Xüftə bunı qıldı isə bidar nə qıldı.

Sən gördün isə qılduğımı türki gözinün,
Pəs bana gərək heydəri-kərrar nə qıldı.

Nə qıldı isə qıldı yüzün dövri-cəhana,
Billah, bana de, günbədi-dəvvar nə qıldı.

* * *

Bən dünyada Bağdad ilə dilşad olısaram,
Bəndəsi olub qüssədən azad olısaram.

Bən canü dilü əqlü tən ilə könülümi
Mə'şuqə fəda qılmağa bünyad olısaram.

Bən xaki gözümdən yaşum ırmağını döküb
Ol atəşi lə'li ilə vərbad olısaram.

Mehrab edübən canuma mə'şuqə qaşına,
Dərdüm elə eşq əhlinə övrad olısaram.

Dad eyləməz isə bana, bidadumı dilbər,
Bən dəxi cəhan xalqına bidad olısaram.



Şirin ləbinün ləzzətini almaz olursam
Fərhad kibi dünyada bir ad olısaram.

Gözi ilə zülfeyni kəməndini bulursam,
Könli quşın avlamağa səyyad olısaram.

* * *

Biliməzəm ki, odunla yanam, yanam, olamı?
Bu suyun ilə odunla yanam, yanam, olamı?

Ləbünlə əsrükəmü zülfün ilə aşüftə,
Bilməzəm, qədünlə yanam, yanam, olamı?

Cəfanuz oda yaxar, lütfünüz dökər şəkəri
Bu acıvü bu tatunla yanam, yanam, olamı?

Quşanmışam ayağı başdan ayağuma dəkin
Ki, nə biləsin odunla yanam, yanam, olamı?

Bilişünə tolaşuram yadun oda yaxaram,
Bilişün ilə yadunla yanam, yanam, olamı?

* * *

Yüzüm xəzanü gözüm həmçü əbri-nisandur,
Vücud idə ədəmüm eşigində yeksandur.

Əgərçi müşkili zülfünlə müşkilə düşdi,
Gülabi-lütfünə irmək könülə asandur.

Müşəvvəş eylədigiyçün səba yeli saçunı
Çəməndə sünbüli-tər dəxi key pərişandur.

Bu kişi-eşq bizə gösdərəli qaşı yayın
Könüldə eydü canumuz yolına qurbandur.

İlahi, dərdini könülümüzdən irmə irax,
Ki, dərdi könülümüzə dəvavü dərmandur.

* * *

Xəncərü, ey cani-canan, xəncərü?
Can gözün xəncərlərindən xəncərü?

Könülümün quşını yetürmişəm
Zülfünün tuzaxlarından xəncərü?

Canumı isdəyibən bulımazam,
Soraram totaxlarından xəncərü?

Bana derlər ki, qərar etsən nola,
Ayduram şol incə beldən xəncərü?

Can sən isən bu tənümə gəlsənə
Yoxsa bu tənümüzə can xəncərü?

* * *

Can dərdinə gözün kibi mə'lul görmədüm,
Zülfündə hiç könüli məhlul görmədüm.

Qədrümə görə gərçi ki, verdi xətün bərat,
Zülfün nə minnət edə çü məqbul görmədüm.

Hüsnü məlahətün gözümə var dəlaləti,
Nə fayidə dəlil, çü mədlul görmədüm.

Özgə qiyas bunda nəticə neçün verə
Mövzun bu qəziyyədə məhmul görmədüm.

Bən vüslətünə irməgə, ey şah, razıyam
Zənciri-vəhdətünlə çü məğlul görmədüm.

* * *

Ah ləbün pistəsinün şəkkəri şükrin deyiməz
Gər dili ola bu badam gözləri səkrin deyiməz.

Anlayımaz bu əqlümüz incə beli xəyalını
Dil dəxi lə'l ağızınun nöqtəsi sirrin deyiməz.



Nəsb edəli bu könüli cövrini rəf qılmağa
Hər qılınun ki, qıldılar canuma cərrin deyiməz.

Dilgir edər gözüm yaşın könül elini qurıdur
Dilümi qasir eylədi bəhr ilə bərrin deyiməz.

Kövkəbi-dürri sanasın yüzi günəşini anun
Ki, dilümi dilər isən dişləri dürrin deyiməz.

* * *

Nigara, vəslünə oldı bəha din
Qaçan bula bunun kibi bəha din.

Züleyxa gər pərəstar ola, nola
Çü bu Yusif qulıdur İbni-Yəmin.

Necə əl irişə asan yüzünə
Ki, qılmış anda yuva iki şahin.

Xəta qılmış saçı çin edəlüm biz
Ki, qılur əql ilə könüli pürçin.

Saçun əqdi ilə bən hal oluram
Ki, qılımaz anun zəbdin dəvavin.

Ləbündən sordı könül öz dəvasın
Verimədi bu sayruya cəvabin.

* * *

Neçə-neçə zülfi-ənbər tolaşa, şəhüm, tənümə
Tonunı yabana salğil, urayım canun canuma.

Ləbünün qanına dişüm bu gecə dilər ki, girə
Ki, qaraxcı gözləründən nişə gər dilər qanuma.

Gözün ilə əsrügəm leyk qaşun ilə piç piçəm
Ki, saçunla bir olıban bəni əgri der canuma.

Qulıyam bən ol həbibün ki, günahumı əsirməz,
Zəhi yaxşılıx ki, baxmaz işigində yamanuma.

Saçı küfri gül yüzinün imanını gərçi yaydı,
Hələ raziyüz nedəlüm saçı küfri imanuma.

* * *

Can nə canıdır ki, ol əzmi-ləbi-canan edər
Bunca küstax olur ki, ziro ba Kirman edər.

Canı zülfindən quşadub lə'linə bağladı dil,
Zi təbibi-mehriban kim dərdə bu dərman edər.

Qaşını gösdərdi zülfün şöylə ki, kişi idi
Nə əcəblərsin anı gər canumı qurban edər.

Gösdərəli lə'li-ləbün ilə simin tənüni
Qan-yaş ilə saru bənzi eşq əri dükan edər.

Bisərüpa zülfüni dirşür ki, neçə aşiqi
Bənciləyin bu cəhanda bisərü saman edər.

Gözlərünün guşəsini bən necə deyəm axı
Bənciləyin səd həzəran rindi ol mehman edər.

Ləblərünə hay de ki, bu könlümi xak etməsün,
Nagəhan çəkişik ilə arada bir qan edər.

Bən könül elini ana diləg ilə vermişəm
Şah lütfiylə alıban ellərə ehsan edər.

* * *

Xalüni görəli canum əzmi-Hindustan edər,
Könlümi əcəbləmə gər qəsdi-Ərzincan edər.

Rum elin yüzün görəli könülüm yurd eylədi,
Görəli gözüni leykin rayi-Türküstan edər.



Zülfi özini yüzində gərçi ki, Rüstəm deyə
Sən anı başından anla hilədür dəstan edər.

Könlümi çəkişməsünlər billah ləblərünə de
Bu çəkişmək qorxaram ki, aralıxda qan edər.

Hüsnünün eşqi necə Leyliyi Məcnun eylədi
Bəs nə əcəb k'ola gər bir Əhmədi Səlman edər.

* * *

Gözün oxı ilə yüregi yaz axı noldı,
Xəttünlə qəmüm şərhini bir yaz axı noldı.

Anca ki, gözün qanum içər oldı xumar uş
Al əlünə tolu qədəhi yaz axı noldı.

Sən saçunı çözüb tarağıl ha ki, çəməndə
Bizə səhəri yel ola qammaz axı noldı.

Son şəhruxı neco əraisindən irax tut,
Tərh edər olur kişiyə bihbaz axı noldı.

Bir dünyada sənün ilə razıyüz olalum,
Bir evdə dəxi olavuz az-az axı noldı.

Apardı, şəha, zülfi yüzündən səhəri yel,
Hər yilə gərək uçmayısar baz axı noldı.

* * *

Nə xəta qıldı ki, könül verdi ol növ xəttə xət
Qomadı bəndə be cüz xəyalını fəqət.

Bən ana halüm ilə həddümi bir-bir dedüm
Kim dedi ana ki, gösdərə idi bana nuqət.

Bən çü Təbrizi-vücudumı fəda qıldum ana,
Gözlərüm yaşını yüz vəch ilə ol eylədi şət.

Qutə qılursa nola yaş dənizinə bu gözüm
Aşınalığ ilə çün irmağa düşə bilə bət.

Bu zəmin səthdürür dairəsi, nöqtəsi sən
Cismünün qulluğına yazdı canum özinə xət.

* * *

Yüzünə bir nəzər etdüm idi ay axı, bəgüm,
Çü sərxoş etdi gözün ləb ilə ay axı, bəgüm.

Cəbanı sərxoş edüb aləmə verür məzəyi,
Gözün ilə iki lə'li-ləbün ay, axı; bəgüm.

Başuma irər əlüm, ol dəxi yoluna fəda,
Ləbündən alur isəm əlümə ayaxı, bəgüm.

Yüzünlə zülfüni görəli gözümə girməz,
Gecə qaranusı bu dünyada ay axı, bəgüm.

Tapuna müştəri olur isə nola zührə
Atun ayağına nə'l olmış uş ay axı, bəgüm.

* * *

Dərdümi necə deyəyim ah-ah,
Necəsi şərh qılayım, Allah.

Bən xu mat olmışam ruxıyçün anun
Ana məvqufdur ki, görəm şah.

Zülfüni görməyəli yüzündə
Anlamadum dəxi səpidü siyah.

Yürəgə çərxə tiri gözlərünün
Dəgməyincə olmadux agah.

* * *

Nə ruhsın, ya nə hurisin, ey xülasəyi-ruh,
Ki, vəsfüni deyiməz dünyada kişi məşruh.



Cigər kəbabü yaşumdur şərab, işbu əcəb
Ki, könülüm geyigi qəmzəsi ilə məcruh.

Ağızun açar isən canumuza nəfxəyi-sur,
İnilər olur isəm dərdün ilə növhəyi-Nuh.

Yürəgi yaraladı qəmzənü dişüm ləbüni
Sorılur isə gey isə qisas ola cüruh.

Bənəm ki, şəh ruxi içün piyadə olmışam uş
Ana ki, fil sifətlər yolınadur mətruh.

* * *

Sana bizdən, əya dilbər, yenə bu dəm səlam olsun,
Nədimün zöhrə, məh saqi əlündən mimü lam olsun.

Oda yaxma bizi, saqi, yenə bu xam zöhdünlə,
Çü biz yanaruz oduna tolu sun cam xam olsun.

Yüzündə can quşu içün cəmalün qodı bir danə,
Tağıt sən dəxi zülfüni ana qarşu ki, dam olsun.

Çü qaş yayından ata türki gözün qəmzən oxını
Kişi qarşusına turmaz gərəksə puri-Sam olsun.

Xəyal etdi totağını gözüm bir gecə şol ləhzə
Axıtdı qanlu yaşları ki, yə'ni bu haram olsun.

Suya girdi dedüm neyçün dedi abi-həyat olsun
Tağıtdı saçını aydur ki, bu gün Rumü Şam olsun.

Qaşı mehrabını düzmiş bu dəm eşqinin əhliyçün
Hələ biz razıyuz ana qanı gözi imam olsun.

* * *

Can çəkdügi gər deyilə hicran arasından,
Anılmaya Məcnun dəxi dövran arasından.

Külli bu bənüm dərdümə dərmansın, əfəndi,
İlla soraram dərdi bu dərman arasından.

Qanlu gözüm irmağı əgər irə dənizə
Bəlgülü gərək ki, ola ümman arasından.

Yüzündə qara bənüni gördüm sanasın ki,
Bir nöqtecə şübhədürür iman arasından.

Yüzündə görəli sənəma zülfüni bildüm
Ki, bir qıl imiş gəbrü müsülman arasından.

* * *

Tur uru, saqi, ver əyağı bizə,
El olursa tapun nə yağı bizə.

Canumı buldı, asdı bir qıldan,
Ögrədür zülfünüz yasağı bizə.

Bən saçundan yetürdüm odağumı
Kimdürür gösdərən odağı bizə.

Qara saçun ağına çəkdi bəni,
Gösdərimməz nedəlüm ağı bizə.

Sünü boy yay qaşunü kirpügün ox
Bəsdürür yürəgümdə dağı bizə.

* * *

Nəsima, nola zülfinə nigarınümün əsməsən,
Səhər vəqtində iribən bu yürəgümi kəsməsən.

Həmişə qəmzən oxı ilə yürəgi parə qılursın,
Nola oxunı gözləyib qaşun yayını basmasan.

Belinə irəyüm dedüm bana qıl kibi incəldir,
İrürsən iricək isəm bəni bir qıla asmasan.



Şəha, zülfün girehlərinə canum bağludur nola,
Fəraqun barmağı ilə ulaşuğını şeşməsən.

Canumı yazmasan, yazsan bəni qullar sırasından,
Cəfa yolından azıban, vəfa yolından azmasan.

* * *

Gər gözi qəmzəsinə hədəf sinəmi deyə
Fikrün nədür qatumda sözi sınamı deyə.

Öldüm ləbün içünü ləbün çeşmeyi-həyat,
Abi-həyat isə içü bir sınamı deyə.

Çoxlar dəm ura eşqin ilə leyk özgələr
İrürəyim sənün səvinü sinəmi deyə.

Şe'rayə şe'ri şair əgər irürür isə,
Canum turağı şol boy ilə sinəmi deyə.

Qurlu qaşıvü qəmzəsi gizlü, cigər qolay
Oxı tükənə, yayası yasınamı deyə.

* * *

Canum gərək qəbul ola cani dəgül isə
Gözün ala könülümi xuni dəgül isə.

Lə'lün görəli nişə gözüm lə'l axıdur,
Totaxlarun bu gün, şaha, kani dəgül isə.

Bir şərbət ağızundan umaram yutınam,
Tartınduğun nə dünyası fani dəgül isə.

Carı xəyalinün yeticək caridür gözüm
Əqlə təhəkküm edəmi xani dəgül isə.

Canum edə biləmi ki, eşqinə yaxıla
Yanmax fəraqun odına şani dəgül isə.

* * *

Dəva dərdümə qılma ki, dərdün dəvadur,
Oduna bu yürəgüm yanar isə rəvadur.

Rəva tutma ki, canum tapundan ola ayru,
Tənümdən canum ayru olur isə rəvadur.

Qaş ilə gözi aydur könülümün elinə
Nə edər isə leykin saçı ana qaradur.

Çü ol birdür, biz birsəvüz ortada neyçün
Saçınun sağışınca yürəgümdə yaradur.

* * *

Eşigindən özgəyə bən yüzümi sürməyəyüm,
Ay yüzündən özgə xubi görəyüm, görməyəyüm.

Bən düşümi yorayım səndən yana xeyr olamı
Könlümi bən səndən ayru kişiyə yormayayum.

Lə'li-ləbindən sorayım ki, nədür halüm vəli
Axıdayım göz yaşını olamı sormayayum.

Bən bu dünya xoşlığından turayın eşqin içün
İlla vəslin ləzzətindən öləyim, turmayayum.

Şol qaşun yayını qurub cana atdun qəmzeyi,
Bən dəxi bazarı ana razıyam qurmayayum.

* * *

Yenə zülfün çəri qıldı biliməzəm siyahisin,
Nedəyim çün seçiməzəm çü gecədən sipahisin.

Cəhanun mahı çün sənsin bu aləmdən əcəb tutma
Xəyalünlə yaşum irmağı içrə gərçi mahisin.

Piyadə oldı bu gün fil eşqin nəthi içində
Ruhuna qarşu çün gördi ki, sən bu dünya şahisin.



Qaşun əgri, gözün əsrük görəli aləm içində
Qomadux, qılmadux nəsnə bu dünyanın mənahisin.

Həzəran ahu vah olur eşigündə vəli gərək
Ki, biləsin həzəran ahun arasında vahisin.

* * *

Pürqəm könülüm oldıvü pürnəm gözüm nədən
Oyaxdı ayunı görəli yılduzum nədən?

Uzandı zülfüni görəli dərdi könlümün,
Qalmadı ağzunı görəli hiç sözüm nədən?

Bir gəz dilərəm odağına ündəyə bəni
Bin gəz qılam fəda yolına pəs yüzüm nədən?

Qarartdı gözi yürəgi, qan etdi ləbləri
Gərək qarara üzümə görə üzüm nədən?

Gözüm dişündən iki düzüm incü anladı,
Hər ləhzə lə'l axıda düzüm-düzüm nədən?

* * *

Soraramü sorısaram çü razıyam sorınca bən,
İrərsəm dəxi yanaram ki, ivərəm irincə bən.

Saçı tək qüssəm uzandıvü ömrüm olsa nolaydı,
Ağız ilə beli kibi olınca hiçü incə bən.

Yürəgüm qanını içər qara gözləri nolaydı
Ki, içəydüm üzüm qanını anun ilə içincə bən.

Ləbi şəkkər saçaru bən saçaram əqli anunçün
Neçəsi dirə biləm çün dükənürəm dirincə bən.

Gözi guşəsinə vardum saçı bəndinə
Umardum, yə'ni içəydüm anun ilə doyunca bən.

* * *

Gözün yenə qaş yayını qurmış atar oxşar,
Bir yaya dəgül qanı olamı çatar oxşar.

Könül elini yağmaladı canı apardı
Dəldi yürəgi, içdi qanını tatar oxşar.

Zindana buraxdı zənaxında könülümi,
Şimdi saçını boynuna taxdı satar oxşar.

Gözümə gözükmədi xəyalı tolalı yaş
Taşxundurur irmağı gəlürsə batar oxşar.

Hər ləhzə həzəran dilü can bəndən aparur
Neçə ki, nəzər qıla dilü can bitər oxşar.

* * *

Neçə xumar gözün, dilbəra, bixab olısar,
Neçə şərab yaşum yürəgüm kəbab olısar.

Xəta neçəsi deyəm çini zülfün içün bən
Nə fikri-nazük edərsəm qamu savab olısar.

Binayi-eşqi könüldən çü qıldı məst gözün,
Həman dəm oldı yəqin ki, bana xərab olısar.

Çü əqli-tifl biki bəndünə əsir oldı,
Tapunda neçə bənüm kibi şeyxü şab olısar.

Acı kələcilərün çünki tatlu gəldi bana,
Canuma əzbi-ləbün ləzzəti əzab olısar.

Xəyalı necə xəyal olmaya gözümə bənüm,
Çü xabı gözlərümə bilürəm ki, xab olısar.

Sorar idüm totağundan könülə müfərrih
Ağızun açar isən mütləqa cəvab olısar.

Gələ deyü gözümə hər nəfəs ərusi-xəyal
Bu kirpügüm neçə bir qan ilə xizab olısar.



* * *

Ağzun kibi cəhana şəha raz gəlmədi,
Zülfün kibi həva ilə sərbaz gəlmədi.

Ud ərçə yandı oda vəli pərdəsüzdürür,
Micmər bigi bu pərdədə dəmsaz gəlmədi.

Tutar dilini qonçavü xara girür çiçək,
Bu ortada səba kibi qəmmaz gəlmədi.

Qomadı canü əqlü apardı gözü könül,
Eşqi çü yetdi ansuzın az-az gəlmədi.

Könül quşını gözləri bir dəmdə aldılar,
Ol kəkligə bunun kibi şəhbaz gəlmədi.

* * *

Neçəsi kişi səni görməgə qənaət edə,
Səni görən kişi yaxud neçəsi taət edə.

Bipay olmaq içün sərv gülşənə giricək
Ayağuna düşibən nardan şəfaət edə.

Bəyazü həmrasına hər ki, ol nəqi xəddün
Təriq bulur isə sərvəri-cəmaət edə.

Yürəgi parə qılub qan axıtdı olamı ki,
Dilər ki, gözləri könüldə bir ziarət edə.

Saçun kəməndi bitabü qaşun kəmanı bizə
Zəhi səadət ana ki, sana itaət edə.

* * *

Eşqin əyağını içən ayıla görmədüm,
Yüzün görəli ürkəri ay ilə görmədüm.

Bay ilə, yoxsul ilə irişdüm bəsi veli,
Hüsnünlə eylə ki, kişi bayıla görmədüm.

Hüsnə qəni cəmalüni gördümü arada
Bır ne'məti ki, sayilə sayıla görmədüm.

Yüzün şüasi ilə, saçun qoxusı kibi
Gündüz-gecə ki, aləmə yayıla görmədüm.

* * *

Qılırdum ləbləri zikrini təkrar,
Görəli gisusında ceyşi-cərrar.

Qılur lə'li könülə qam mərsum
Qılur gözi gözümə yaşı idrar.

Gözə-göz könüli əldən aparur
Gözi tək olmaya dünyada əyyar.

Ləbi süci ilə əsritdi bəni,
Xəti gösdərdi canumuza əsrar.

Könüli qarət etdi cadu zülfi
Sanasın qüdsə axın etdi küffar.

Əgər qolun salıb rəqsə girəsin,
Qala heyran sana bu çərxi-dəvvar.

Ləbüni ağzuma ver ki, görələr
Qılanlar ölü dirliginə inkar.

* * *

Gözün könülümi, sənəma, ala dəgülmi?
Döndərə ləbün göz yaşını ala dəgülmi?

Gözüm qarası ilə, bəgüm, gözünə baxdum,
Gəy anlayımazam əcəba, ala dəgülmi?

Fikrüm ilə zikrüm gecə-gündüz, şəha, sənsin
Bir dəm ola ki, rast gələ fala dəgülmi?



Altun düzərəm yüzümi gözüm yaşı incü
Canını sevən qalmayısar mala dəgülmi?

Bu gəncümizi gör ki, budur gəncümüz, ey dost,
Nə afət olısar əgər ulala dəgülmi?

* * *

Gisuslarun içün bəni gər qıl qılur isən,
Uzatma, fəda ayağuna, qıl, qılur isən.

Bir xoş dil ilə dil dilər isən nola, dilə
Bir dil ilə nola bizi xoş dil qılur isən.

Miskin edisərsin bəni şol gisularundan
Hinduyi mü'əlləl gözə sail qılır isən.

Aləm qamusı qəbzəm içində ola, şaha,
Saidlərüni bana həmayil qılur isən.

Cənnət pəsi-pərdə qalavü hur ola məhcur,
Bu şəklə əgər böylə şəmayil qılur isən.

Dövri yüzünün nöqtə çü qodı könülümüz,
Vay cana gər ol nöqtəyi zail qılur isən.

* * *

Hər ləhzə bənüm könlümi avarə qılursan
Hər dəm yürəgümi dəxi səd parə qılursın.

Can alur ikən gözün aparur könülümi,
Nə nəqşdürür ki, bizə avarə qılursın.

Bir işvə ilən taşı dəxi mum edər ikən
Nazük tən içində yürəgin xarə qılursın.

Bir fitnəvü sevdavü həzəran şərü şuri,
Miskin edübən zülfi siyəhkarə qılursın.

Namus tonın çak edər isən nə əcəbdür,
Gül pirəhənin gör ki, neçə parə qılursın.

* * *

Ləbün şəkkərdürür, leykin mükərrər,
Xətün ənbərdürür, leykin müһərrər.

Belün qıldur gözümüzdə müxəyyəl,
Yüzün bütdür canumuzda müsəvvər.

Uzandı eşqimiz sərvünə sənün,
Görəli bədr yüzüni müdəvvər.

Şəhid eylər bizi gözün, nigara,
Nə qazi türk olur Allahu-əkbər.

Ləbün eşqi könüldə şuna bənzər
Ki, bir miskin yabanda buldı gövhər.

Nə ki, göz saldı könlümə ləbündən,
Yenə gözdən olur şimdi müqəttər.

Səba gülşəndə zülfündən dəm urdı,
Cəhan oldı həvasından müəttər.

* * *

Xurşidi şol dildarumun əksi-cəmalindən bilün,
Qanı şəfəqdən anlanuz bir şəmmə xalindən bilün.

Qıl eylədügi cismümi könüli qalə salduğın
Bülbülə güli gösdərün qil ilə qalindən bilün.

Vəsl ilə hicri netdügin ol günəşimün cisminə
Bir ay gecə uyımanuz bədrü hilalindən bilün.

Şəhdü şəkər nə nəsnədür lə'li-ləbindən soralu
Dam ilə danə nədürür, zülf ilə xalindən bilün.

Lə'li-ləbündən, ey sənəm, qan qoxusı gəlür bizə
Gözləri alı çoxdurur, buni kəmalindən bilün.



* * *

Zəhi şirin ləbü nazük şəmail
Ki, könül işvəsinə oldu mail.

Saçı eşqi quşaxdur belümüzə
Olalı saidi bana həmail.

Vüsalündür bana tiryaki-əkbər,
Əgər hicrün isə zəhri-həlahil.

Bunı göz anlayımaz, əql irişməz
Bu nə boydur, bu nə şəklü şəmail.

Həzaran üqdədür gisularında
Qaçan hal olısar bunca məsail.

İrişmək səhl ola idi tapuna,
Vücudum ortada olmasa hail.

Nigara, gisularundur müəqqəd,
Ləbündən görürüz vazeh dəlail.

Nizarı belünün, miskin saçunun
Olupdur eşigində şimdi sail.

* * *

Can dəxi sənündür, sənəma, nola dilərsən
Dil dəxi sənündür, a bəgüm, nola dilərsən.

Bin gəz iləyim gisularun ilməsinə bən,
Bir gəz nola gər damumıza bizüm ilərsən.

Seyl oldı axar gözlərümün yaşı cəhanda,
Tükənməyə bu gözlərümün yaşı silərsən.

Sən bilər isən nə çəkerəm hər gecə sənsüz
Razıyuz əgər qəsdümüzə dişi bilərsən.

Dilümə diləgümi bənüm gətürimezəm,
Bax könlüməvü anlağıl əhvali dilərsən.

* * *

Diriğa, xəsteyi-yaram, şəfa yox,
Giriftaram, cəfasına vəfa yox.

Həzəran can apardum qulluğına,
Ləbündən bana bir gəz mərhəba yox.

Necə sə'y etmişəm gisularıyçün
Nedəyim eşigində çün səfa yox.

Çələb hər dərdə bir dərman yaratmış,
Bənüm bu dərdümə hərgiz dəva yox.

Yarum qıldı vücudum oldı fani,
Cəhanda buncılayın kimya yox.

Gözüm görməgə sənün şah yüzüni
Ayax tozından özgə tutiya yox.

Ayağa düşmişəm məcruh bana
Ləbün şəhdindən özgə mumiya yox.

* * *

Nigara, gözündən bu oxlar xətadur,
Bizüm xud işimüz qəzaya qəzadur.

Gözün fitnə ilə qopardı qiyamət,
Çü türk əsrük oldı, nə qılsa rəvadur.

Çəməndə, nigara, xuraman yürigil,
İzün tozı çünki gözə tutiyadur.

Bənüm dövlətümsin, şəha, qarşuma gəl
Ki, fürsət əzizü əcəl dər qafadur.

Bəni öldürən ol, bən andan həyada
Əcayib şəhadət, əcayib qəzadur.

Çü dərdün dəvadur, dəva dərdünə yox,
Dəva dərdünə yox, çü dərdün dəvadur.



* * *

Olalı hüsni nəqşi dünyada faş
Dəxi də'vi qılımaz oldı nəqqaş.

Nə ziba boy olur, bu qəddə əhsənt,
Nə nazük hüsn olur, bu hüsnə şabaş.

Xətayi gözlərinün yox xətası,
Qədi toğru, vəli işvəsi qəlmaş.

Bizə hüsni bu gecə şəm yetər
Gəl imdi şəm'unı apar, ey fərraş.

Qüsurı ola hurinün, nigara,
Ki, var isə yüzində şol gözü qaş.

Gözüm Ceyhun əgər gördisə gözəm
Xoyalün kibi dəxi sana oxşaş.

Tağıdalı saçun oğrılarını
Gözün rind oldıvü qaşlarun ovbaş.

* * *

Bir zəmzəmə qıl göz yaşını zəmzəm edəlüm,
Sənünlə səfa eyləyəlüm, bir dəm edəlüm.

Göz yaşı ilə toprağa eşqini sinürdün
Gösdər səni, hər zərreyi bir adəm edəlüm.

Tolaşımazuz zülfi bizə vərhəm edərsə
Yürəgümüzə lə'li ilə mərhəm edəlüm.

Aləm bizə didarı əgər olmaya tardur
Hər guşeyi didarı ilə aləm edəlüm.

* * *

Mə'şuqə əlindən bizə bir cam ələ girsə,
Kamumuza ləbləri ilə kam ələ girsə.

Atdıysa İraqıyla Hicazını Sipahan,
Sübhə ulaşıx yar ilə bir Şam ələ girsə.

Çox süxtə var hicrinün odıyla məhrum,
Ol püxtədən əlümüzə bir xam ələ girsə.

Qulax dəlibən halqa qulağa köçürəydük,
Bir bənciloyin dünyada bədnam ələ girsə.

Kəm dam ola ki, düşibənün çıxmadum andan,
Şimdi yenicə düşmədügüm dam ələ girsə.

Əyyam keçər hasilümüz yox nedəlüm biz,
Ol hasil içün bir neçə eyyam ələ girsə.

Bən nə qılayım, çünki dilaram ola tusən
Çün qəsd qılur, canü dilaram ələ girsə.

* * *

Tolu qıl ayağunıvü, əlümə saqi, gətür,
Sürahidə qomağil hiç nəsnə baqi gətür.

Küdurəti bu cəhanun çü həddən aşupdur,
Səfa gərək bizə şimdi meyi-rəvaqi gətür.

Zəmandurur ki, fəraq ilə yanmışuz yara,
Vüsalə döndərəlüm şimdi bu fəraqi gətür.

Neçə ki, acı isə sırfü tolu sun bizə
Ki, ləbüni ananun tatludur məzaqi gətür.

Könül bu cüftə qaşuna ütüzdi varlığını,
Yenidən oynaya dilər bu cüftü taqi gətür.

* * *

Sevərəm anı, fəraqı əzab ola key isə,
Visali dərdi ilə can kəbab ola key isə.

Anun içün soyılalum cövri tonından,
Ol ikimüz arasında hicab ola key isə.



Ləbi təbibinə canun dəvasını sorayım
Dəva bu dərdümüzə bir cəvab ola key isə.

Savab edər ki, xəta oxlarını gözi atar,
Xəta oxı bu canuma səvab ola key isə.

Gözüm həmişə yürəgüm qanını axıdur,
Xumar gözləri içün şərab ola key isə.

Sögər isən dəxi bir ləfz gəlsün ağzundan,
Həyatumuza bizüm fəthi-bab ola key isə.

Könül tolar ki, bir ah eyləyəm ki, od saçıla
Cəhan dəxi odı ilə xərab ola key isə.

Yaşumı qan axıduram ləbi içün anun
Ağızı yarı içün yürək ab ola key isə.

* * *

İşvələrinə gözlərünün, şaha, dəm dedüm
Yaqut ləblərünə qiyas et, nə dəm dedüm.

Şol dəm ki, nəm dəgül cigərüm qanı ilə gör,
Yüz canü bin dil ilə bən ol dəmə nəm dedüm.

Qəmzən oxına könülüm əm sordı canuma,
Bən lə'li-ləblərüni bu yaraya əm dedüm.

Baş qomamağ içünmi ayağuna sübhü şam,
Şol zülfü xalü xəttü xədünə sənəm dedüm.

Novruzı saz edüb çü nəğam diyəsin bizə,
Çəngini zöhrə çalmaz olursa nə qəm dedüm.

Dedi ki, eşq səmmi nərəni ağuladı,
Yürəgümi anışdurmadum nəsəm dedüm.

Şahanə pəncələrün apardı bu könlümi
Canum qayırmadı bu əlümdən al əm dedüm.

* * *

Boyun sərvü tənün çün yasəmindür,
Ağızun toptolu dürri-səmindür.

Sana inneyəyüm səndən irərsəm,
Başunçün bana bu ulu yəmindür.

Saçınun arasında əqlü cana
Kəmini aydayum yüz bin kəmindür.

Qamu bütlər cəmali gögi, şaha
Sənün hüsnün ayağına zəmindür.

Nə nazük afərinişdür, nigara,
Ki, hər nəsk yerində afərindür.

* * *

Həddən aşurdun cövrüni həcrə nihayət yoxmıdur?
Dərmanuna xud irməzüz, dərdünə qayət yoxmıdur?

Gisularun könülləri zülmətdə gümrah eyləmiş,
Abi-həyat ləblərünə hərgiz bidayət yoxmıdur?

Hər dəm irürür gözlərün cana əzab ayətlərin,
Lə'li-ləbündən rəhmətə hərgiz rəvayət yoxmıdur?

Gözləri oxladı canı, bəndinə saldı gisusı,
Can oldı alan alana ana himayət yoxmıdur?

Can qoyub öz vilayətin, oldı rəiyyət hüsnünə,
Aşiqdə pəs zənnün nədür, yə'ni vilayət yoxmıdur?

* * *

Eşqi tutdı yenə yaxamı əcəb,
Ləbi çeşməsinə yaxamı, əcəb?

Şərbəti-vəsli girməyəmi ələ,
Dayima hicrinə yaxamı, əcəb?



Dilərəm eşqini qılam pinhan
Bənizüm sarusı çaxamı, əcəb?

Səgi-kuyinə xaki-pay oldum,
Başumuza bunı qaxam əcəb?

Gər niqabın salursa yüzindən,
Xirə gözüm ana baxamı əcəb?

Tamu döyəmi gözlərüm yaşına,
Eşqim odıyla Nil axamı əcəb?

Eşqin evində gördügüm dər isəm
Kimsə bu qapuyı qaxamı əcəb?

* * *

Gözümə görinü gəldi yarumun xəyalini gör,
Dilü canı şol dəm aldı, sən anun kim alını gör.

Gözi könlümi apardı, saçı canı dama çəkdi,
Neçə seyd edər pələngi, bu keyik maralını gör.

Yüzünün niqabını sal ki, çağıra yapracuxlar,
Biri-birnə ditrəşibən ki, fəlan cəmalını gör.

Bilünə dilərdi saçun ki, qıla idi təşəbbüh,
Var imiş başında sevda, sən anun xəyalını gör.

Nola eşq odı yaxarsa kişiyi yüzinə qarşu,
Ləbi-lə'li çeşməsinə nəzər ed, zülalını gör.

* * *

Eyb olamı, cani könli dilaramı dilərsə,
Ya can ilə, nola, bu dil aramı dilərsə.

Zülfün kibi baş ayağuna hər gecə qoyub
Əl götüribən vəsli-dilaramı dilərsə.

Can zülfinə eşq ilə şu molla ulaşubdur,
Ki kəsi bilimeyə dil aramı dilərsə.

Ayru düşəli zülfi kibi oldı pərişan,
Mə'zur ola can şimdi dilaramı dilərsə.

Bir ləhzə xəyalından anun düşməgi ayru
Savurmış ola yelə dil, aramı dilərsə.

* * *

Vəqti-səhər neçə-neçə zülfünə tolaşam deyü,
Sevdayi oluban gəzəm, bir qıla ulaşam deyü.

Beli qılına irməgə bir əqəbə var ortada,
Yüz ayağına sürərəm ol yoxuşı aşam deyü.

Bağlamışam bu boynumı bər qılına gisusınun,
Ola ki, fürsət əl verə bağlayanı şəşəm deyü.

Xalını danə eyləmiş zülfini dam ta məgər,
Danəsinə təmə'qılub damına bən düşəm deyü.

Hüsni sərapərdə urup qeyri irağ ayardılar,
Əql ilə canı qoydılar, yə'ni xədəm, həşəm deyü.

Qanuma girdi ləbləri, işdə nişanı gözə-göz
Qanı gərək ki, dişləyəm ol qanı ödəşəm deyü.

Beli tənümə bənzəmiş, bən tənümi qıl etmişəm
Ta ki, cəvabın edübən zülfinə oxşaşam deyü.

* * *

Eşqin qonuğ oldı bana uş bəni bəndən ilədür,
Bənüm işüm xo səhl ola çoxları dindən ilədür.

Müftiləri mədrəsədən, zahidləri sovməədən
Keşişi həm keşiş ilə kilisəsindən ilədür.



Könli yerindən gidərür, canı tənindən aparur,
Əqli neçə ki, pir isə, gözi yolından ilədür.

Cigər qanı ilə keyik Xütəndə nafə düzdügi
Badi-səba qoxusını zülfi piçindən ilədür.

Bən səni gər görəm, dəxi neyləyəyüm görimezəm,
Sənligüni görsədicək bənligi bəndən ilədür.

* * *

Əcəb eşqi odı bəni yaxamı,
Qoyamı hicri əlindən yaxamı?

Anı oğurlayıncax bən sevəram
Gözüm ilə yüzüm bəni çaxamı?

Yar adın qazanam deyü andum
Yarum əğyara bu adı taxamı?

Gözüm görməyəli səni göz oldı,
Nə sanursın ki, özgəyə baxamı?

Muqim olalı çoxdur eşigündə
Könül şimdi dəxi qapu qaxamı?

* * *

Xəti miskinü ya xamə dəgülmi?
Yapışdı eşqi yaxama dəgülmi?

Yazar bir naməvü nəngi aparur,
Zəhi nəngü zəhi namə dəgülmi?

Yanağı cama al camə geyürür,
Zəhi camü zəhi camə dəgülmi?

Saçı şamü bəni şamə, yüzi sübh
İrişdüm sübh ilə şamə dəgülmi?

Nola gər zülfi damı seyd oldum,
Şəkər ləb, gözi badama dəgülmi?

* * *

Bən neçə anun yüzin bənzədi biləm şəmsə,
Eyvanına çün şəmsə yol yox ki, ola şəmsə.

Gözləri atar qəmzə bağruma, vəli türkin
Ləbləri dəxi şəkkər atar nedəyüm əmsə.

Gösdər yüzüni bana, ey dilbəri-gəndümgun
Uçmağı dəxi anmaz görən səni adəmsə.

Çün xosrovi-eşqəm bən, toldur qədəhi sunğıl,
Hərçənd ki, şirinlik tapuna müsəlləmsə.

* * *

Fəsli-bahardur neçün olur könül mə'lul,
Çünki xəyyat qıldı qamu tənlərə hulul.

Şol qönçəyi görüp neçə küncə qərar edəm
Çünki nəşati-tiflinə qöncədürür həmul.

Badi-səba şəmailinə düşdi könülüm,
Qərbidən özgə canuma yellər qamu qəbul.

Hicran içində surətüm ətlalə bənzəmiş,
Yaşı uzun ki, gözlərüm ana saçar tolul.

Razı dəgül yürək ki, ola gözlərinə cam
Xuni-cigər çəkər bunun içində ol füzul.

* * *

Eyş edəlüm ki, ola ol eyşdən dilşad şad
Bir iş idəlüm bu şarda kim, qıla Bağdad dad.

Xabı qoyalumü sürx ab axıdalum anca ki,
Qalmaya bizdən vücud, ola cəhan abad bad.

Zülfi ilə bən pərişanü ləbiylə xürrəməm,
Bəndəəm sərvinə ki, ol dünyada azad zad.



Gər olam qurban, şaha qaşun yayına gəlməyə
Gözümə novruz ruzı könlümə ə'yad yad.

Könülüm sadı gözündən ayni-lütf anlayalı
Tuydı ki, tuyar imiş əz sən'əti-irsad sad.

* * *

Xumar xəstə gözün çün xumar xəstəyəm uş,
Saçun girehləri ilə şikəstə bəstəyəm uş.

Görəli gül yanağunda qızıl güli dəstə
Bc rəsmi-bülbüli-divanə xalqa dəstəyəm uş.

Səbayi gördüm dün gecə zülfünə tolaşır,
Nizarü zarü pərişanü dilşikəstəyəm uş.

Saçuna tolaşıban belünə ulaşalı bən
Görəndə can yükini fala bil xucəstəyəm uş.

Kimisi nəfsəvü, kimi həvaya qul olmuş,
Həqə şükür ki, bən ol lə'li-meypərəstəyəm uş.

* * *

Kərəm qıl imdi bizə, saqi, ver əyaqi tolu
Mükəddər etmə bizi ver meyi-rəvaqi tolu.

Qaşun hilaldurur, leyk hüsn ilə toludur,
Bunun kibi gök ayı olmaya məhaqi tolu.

Gözümdə vəsli xəyali suda urur nəqşi,
Vəli nerəmə baxarsan, anun firaqi tolu.

Göz ağızunı görimez əcəb budur ki, qaçan
Anarsa şəkkər olur dilinün məzaqi tolu.

Əgərçi gözləri məşhuri-sehrdür leykin
Gözümə gir nəzər eylə ki, qaşı taqi tolu.

Cigər kəbab edübən qılmışam çəkidə yaşı
Ki, yükinüb içürəm yaruma əyaqi tolu.

Həzar can ki, yüzündən apardı bir həzzi
Ziyan nə oldı tapuna yerində baqi tolu.

* * *

Divanəəm tutılmışam şol dilbərün zəncirinə,
Müştaqam, oda yanmışam lə'li-ləbi iksirinə.

Seyd eyləmək dilər könül şəbbaz gözləri anun
Kimdür ki, şadan varmaya şol gözlərün nəxcirinə.

Lə'li-ləbindən əm uman gərək ki, dərdə qatlana,
Zülfinə bu aparamı qatlanmayan şəbgirinə?

Təbüm əgər tətvil edər boyı içün vardır məcal,
Çünki məcalı təng ola, ağız içün təqsiri nə?

Təqdir edəlüm, vardurur tədbir hər bir dərd içün,
Şol gözlərün sevdasınun gəl bulalum tədbiri nə.

Ayətdürür hüsnün, şəha, e'caz içün bu dünyada
Bən ictihad eyləmişəm, ta ki, irəm təfsirinə.

Bən bibəha qul olmışam lə'li-ləbinə dilbərün,
Pəs xət yazıban hüsninün anun içün təzviri nə.

* * *

Gözində zəhi nərgisü ağzında ziqöncə
Yol belinə irməgə leykin qatı incə.

Könlüm yürəgü mey qanumü gözlərüm əyax
Gözlərinə içürsəm əyağumi içincə.

İrdüm nedəyüm dirşürimezəm özümi bən
Qalmadı dilü əql ilə can ana irincə.



Kafura qarar ənbəri zülfi yanağında
Qorxum budurur qopa ol ortada qarınca.

Qaçan qaçar isən neçəsi qoyısaram bən
Ərməyisərəm, qovısaram ta ki, irincə.

* * *

Bən gözümi sevərəm hüsnüni sevdügiyçün,
Bən canumı sevərəm yolında öldügiyçün.

Bən məcməri sevərəm salar özinə özün
Bən uda qul oluram oduna yanduğıyçün.

Şol xüftə gözün içün neçəsi üful ayum
Qıldı səbayı sayru ircək oyanduğıyçün.

Odlar yağar gözümdən, köz saçılur sözümdən
Eşqin odı, nigara, cana boyanduğıyçün.

Abi-həyatı görün kim, axar ağızumdan
Eşq ilə bu cəhanı qəndünə qanduğıyçün.

* * *

Gözüm qılalı lə'lündən hekayət
Yaşumdandur nigarına şikayət.

Saçun qoxusı tolmışdur cəhana
Məgər badi-səba qıldı rəvayət.

Nigara, rast aydalummı sərvün
Qiyamətdür, qiyamətdür, qiyamət!

Qəmər şəq oldı, pərvin oldı guya
Biridür mö'cizü biri kəramət.

Nizarü zarü əfgaram, nigara,
Əcəb yoxmı tapunda bir fərasət.

Səqim olalıdan gözün diləməz
Ki, eşigündə ola bir səlamət.

* * *

Saqiya, novruz gəldi mehricanı dəprədür
Belünün işvəsinə ki, nə canı dəprədür.

Zülfinün sevdası ilə qalmışam həmçün xəyal
Lə'li-ləbindən ümidüm var ki, qanı dəprədür.

Qəmzəsi tiri nə hacət yürəgüm umacına
Ol yaralanur qaçan ki, yar kəmanı dəprədür.

Zülfinün şurişlərin gör ki, xəyalum arturur,
Şol şəkər sözlərin eşit ki, gümanı dəprədür.

Bən yaxınmadın həzaran canı qıluram fəda,
İncə belinə ki, canımı ya canı dəprədür.

Gözlərüvü qaşları ağzı ilə yanaxları
Xətti gər yazar isə səb'i-məsani dəprədür.

Töhfə şol hüsnünə layiq təb' bulmaz buncadur
Ki, aşağa-yuxaru hər dəm dükanı dəprədür.

* * *

Hər qılında zülfinün yüz bin dilü can dəprənür
Küfrdür gisusı, leykin anda iman dəprənür.

Eşq ilə gər bulanursam, bana tə'nə tutmağıl,
Çün həva ilə görürsin bəhri-ümman dəprənür.

Gər xətayi gözlərün qəhr edər isə səhl ola,
Çün bənaguşundan, ey can, lütfü ehsan dəprənür.

Ağzunü qaşun gözün möhri-Süleymandur bana
Şol möhür dəlüsiyəm k'andan Süleyman dəprənür.

Sən qaşunı dəprədicək dəprənürsəm nə əcəb,
Çün dərü divar ilə bu səqfi-eyvan dəprənür.



Şəms yüzünə, şəha, bən müştəriyəm, müştəri,
Zöhrənin zəhrəsi gidər bəlki keyvan dəprənür.

Həmdülillah, gərçi çoxdur qarası zülfeyninün
Şol nəfəs ki, əl ura ana müsülman dəprənür.

* * *

Gəl imdi bidüvü çar, ey həbibi-məhçöhrə,
Ki, şəşdər oynamaq içün salaram uş möhrə.

Çü bəndə müşt əriyəm müştəri məhəlli yox,
Görürsə zöhrə bu haləti, çak edər zöhrə.

Xəti yüzində yazar isəm ə'zəmi leykin
Gözi girişmələri irürür anı sehrə.

Dişün münəzzəm edər iqdi-lö'löyivü saçun
Tağıtdı müşki ulayım bu nəzm ilə nəsrə.

Əgərçi sirr idi könlümdə eşqü hicrün cəhr
Fəda bu sirr ilə cəhrüm bu sirr ilə cəhrə.

Əgərçi kuyunı şaha kuy etmişəm leykin
Sənün yolunda hələ şəhrə olmışam şəhrə.

Güpəsi ürkərü qaşı tərazudur leykin
Bənati-nə'ş qılur gird rusını nəsrə.

* * *

Canumda eşqinün irmağı taşa başladı,
Məhəbbətini qılur nəqş taşa başladı.

Qomadı qurıda bir yer ki, yaxmadı eşqin
Qanın axıtdı, bu gözləri yaşa başladı.

Neçəsi münkəsir olmaya zülfinün çərisi
Ki, bir yel ilə boşaldı, təraşa başladı.

Könül başa aparısar bu eşqi zira gər
Çü əvvəl urdı ol ayax, bu başa başladı.

Əlümi zülfinə sundum əgərçi bin qıldur,
Çü eşqinin dənizi mövci aşa başladı.

* * *

Yarun cəmalı dünyada bədr aya bənzəməz,
Sərxoş gözi cəfası bizi aya bənzəməz.

Qaşları yaya benzərü zülfi tağuxlığı
Könlüm məhəbbətin ya'bana yaya bənzəməz.

Bir sayəyəm ki, göz görürü yoxdurur tənüm,
Bu halı yar bana ömürə saya bənzəməz.

Haciblərünə haydı atar çərxə tir ilə
Yoxsula baya girmə der, o baya bənzəməz.

* * *

Nəqqaş bənləri kibi hiç şamə yazmadı,
Xəttat hüsni-xətti kibi şamə yazmadı.

Pərvanə dilədi ləbi canı biribidüm,
Şərbət bəratını xəti peyğama yazmadı.

Xalını danə eylədi, gisularını dam
Can ilə əqli çəkdi, hələ dama yazmadı.

Bir baxmağa yüzinə apardı vücudumı
Bir nəzreyi dəxi bana ən'ama yazmadı.

Bir namə yazmadı xəti kibi dəxi cəhan,
Yanduğum ol ki, ol xəti bir namə yazmadı.

Bir nüqtə yazdı xətti könül səfhəsində ki,
Lövh üsdinə qələm anı əyyama yazmadı.



* * *

Şol aşiqə yar nişə tolu sunmaya badə,
Kim tərh edüb atı ruxına oldı piyadə.

Bana fəridəm nəyə təvil etdi cəfasın
Qıldı bana cövrini həzəranü ziyadə.

Bana ayağı sərf ver, ey saqiyi-məhru,
Başəd ki, qıla bu könülüm lövbini sadə.

Ver badə ki, dadın verürüz işrətü eyşün
Vermə bu bizüm ömrümüzi hiç yerə badə.

* * *

Gül dəxi şol ağzun kibi pürxəndə dəgüldür,
Bülbül xu tapun kibi sərayəndə dəgüldür.

Dünya bana lutfündürü fanidür anunçün
Zülfün ömürümdür vəli payəndə dəgüldür.

Dərdümə ləbün yararü sən qanda salarsın
Həm anda durur meyli canun qanda dəgüldür.

Lə'lün kibi mey neçəsi şirin olısardur,
Şəkkər ağızun kibi xoş ayəndə dəgüldür.

Kim gisuların bəndinə olur isə bəndə,
Bu bəndə sənün lütfünə dər bəndə dəgüldür.

Vəhminə xəyalün, sənəma, sığmaya belün
Ağzun ki, təsəvvür qılına zəndə dəgüldür.

Bin yil gecə-gündüz səni gər görür olursam,
Kim deyə ki, hər görməgi türvəndə dəgüldür.

* * *

Hər nəfəs lə'lün içün gözlərümi dəm görəsin
Zülfün içün könülümdə safi matəm görəsin.

Nəm görürsən nola bu gözlərümi eşqin ilə,
Görmez isən anı bəndən dəxi sən əm görəsin.

Bən çü Mənsur anun içün saçuna asıluram,
Çün Birahim ola ki, yoluna ədhəm görəsin.

Bən ləbün əmsəm ola dedüm isə tutma əcəb,
Gər səadət qıla yarı ləbün əmsəm görəsin.

Müzmər oldı zənəxün çabi içində bin dil,
Sor der isən ləbünə bin dəxi müdğəm görəsin.

İncələn saçun içün dünyada gərçi çoxdur,
Qan dökən lə'lün içün bənciləyin kəm görəsin.

Yaşum irmağ edəyüm kuyun içində dünlə
Ki, sabahın oyanıb yüzüni şəbnəm görəsin.

* * *

Sərv olamı boyunuza oxşaşa,
Qaşun olamı yürəgə ox şaşa.

Cəm edərəm eşqini könüldə bən
Fürqəti ilə bu cəhan qaxşaşa.

Uyır ikən kirpügi qırdı bizi
Vay əgər oxları oyax şaşa.

Oxşayışum incə belinə dedüm
Kim ola kanun belinə oxşaşa.

Bir oxına kim ola qeyd əyləyən
İlla gözi oxını soyax şaşa.

* * *

Yürəgümə urur isə, sənəma, gözün oxı yüz
Bu canum sana fədadur nə yüz ilə qaytaram yüz.

Dişüni görəli gözüm dəniz eylədi cəhanı
Əgər aşına bilürsən suyınü dənizə düş yüz.



Könülüm çü sənün oldı ana bir riayət eylə
Tənüm ayru düşər isə, tut anun dərisini yüz.

Bana Tanrı eşqi birdür yenə yarı bir severəm,
Bu cəhanı görünüz ki, kimi bin sevər, kimi yüz.

Səni sevərəm nideyüm ki, bana inayətün yox,
Vəli ana sevinürəm ki, səpişkən olu o yüz.

Şükr ana ki, yapışdı yarun eşqi yaxaya,
Şimdi ki, yapışdı yenə yayamı yaxaya.

Bən uravü bir saya anun qəmzələri çün
Zülfeyni çərilərini məşşatə yasaya.

Bu dərdə dəva dərd olısardur çü əzəldə
Ol dərdi verən dərdi biribidi dəvaya.

Zülfeyni həvasına tolaşdı bu könülüm,
Yoxsa necə uçaydı könül badi-həvaya.

Gül qıldı ərəq yüzi suyını yerə dökdi,
Qılalı nəzər gül yüzün üsdində hayaya.

* * *

Gözlərüm neçə-neçə yar belünə qıla nəzər,
Nə rəva ola ki, göz gər qıla bir qıla nəzər.

Bən dutayım ki, nəzər qıla, nə qıla nəzəri,
Bir qıla bunca yaş ilə neçə ki, silə nəzər.

Dutayım ki, yüzüni gösdərəsin faş bana,
Tolu yaş neçə qıla bilə sana pilə nəzər.

Nə nəzərdür bu ki, toxınıcağaz bu dilümə,
Dilümi diləvü gəlməyə dəxi dilə nəzər.

Çeşmini baz edərü gisularun damgahinə
Göz yüzinə baxıcax yazmaya vay ilə nəzər.

* * *

Qaşun görəli tapun oldı könlümə mehrab
Gözün ki, təşneyi-xundur könüldədür sirab.

Gözün bixab olıcax baxtum ola oyanux,
Zira ki, bəxt oyanuğ olsa, fitnə ola bexab.

Təbibi-lə'li-ləbündən şərab dilədi dil,
Diş ilə dutdı totağın zəhi lətif cəvab.

Xəta gözünlə ki, canü dili sən apardun
Çü qılduğ anda təəmmül olaydı eyni-səvab.

Bu gözlərüm axıdur irmağın zər üsdində,
Çü dəniz oldı yürəgümü gözlərüm dolab.

Gözüm yaşına baxü baxmağıl həvan odına,
Gəl imdi gəl ki, yüzüm sənün ayağuna türab.

Nigara, sərvi-qədündə saçuna irmək içün
Təəmmül et ki, nə qıldı müsəbbibül-əsbab.

Oda yanar yürəgüm ləblərünə qıldı ümid
Ki, saça işbu oduma ola ki, bir nəmək ab.

* * *

Nəsim irürdi yenə sübhdəm bizə xəbərün
Ki, ruhi tazə ola başladı bu dəm cigərün.

Yüzün ilə totağunı görürlər olur isə
Gülab ola gülü yürəgi əriyə şəkərün.

Saçun əsirini sayğılü bəllü bil təhqiq
Ki, xalqa nə qara günlər gətürdi bir nəzərün.

Ayağunun tozını yelə verməgil, zinhar,
Ki, kimya başı olduru nuridür bəsərün.

İraxlıx uzaduğınca ümidi-qurb artar,
Anun içün ki, səfər bargiridür həzərün.



* * *

Hər gecə sübhədəkin eşq ərinün naləsidür,
Qara günlər gətürən başa gözün alasıdur.

Şeyxü müftivü müdərris neçə saxlarsa özin
Gözünün işvələri cümləsini alasıdur.

Nə bəladur könülüm quşına gözün, sənəma,
Əcəb olmaya çü ol şəh balaban balasıdur.

Aşina olduğiçün eşqi dənizinə könül
Varlığından soyulub bir gün ana talasıdur.

Bağü bustanı nedər şol ki, yüzün görə bilə,
Sərvi boyunü yüzün gülşən ilə laləsidür.

* * *

Canuma irəm ta ki, irəm cana dəgülmi?
Əğyar sözinə yar dəxi inana dəgülmi?

Hind ilə həbəş, rumü xəta hüsnün əlində
Bir canum içün cümləsi yasana dəgülmi?

Tərk eyləyəlüm cism ilə can dünyavü üqba
Andan gözədəlüm yarı pakanə dəgülmi?

Candan nə əziz ola nigarına iricək
Ol dəxi rəva olmaya şükranə dəgülmi?

Gözümə xəyalı gələli jürri-xoşabı
Hər ləhzə nisar eylədi mehmana dəgülmi?

Qanadı qanamadı yürək ləblərünə hiç
Qanadı var isə irişə qana dəgülmi?

* * *

Gözləri oxladı dili nagəh xəta ilə
Bir gəz "bəli" dedük, yanaruz ol bəla ilə.

Lahəvl oxır könül gözün üsdinə hər gecə
Çünki zəmirdür, şəha, hakim vəlayilə.

İnam olmaya nə zəhi maidədürür
Gər vəqtini imarət edərsə nisa ilə.

Yüzüni görməyincə bu rövşəndürür, bəgüm
Kim qılmadux cəhanda bu eyşi səfa ilə.

Biz zülfinə varınca ömür tolaşısaruz,
Şol yüzdə, qaşda can nedə bir-iki ay ilə.

Hinduyi-məstdür, sənəma, fitnəsi dilün
Sən sanma anı k'ay ilədür ta ki, ayıla.

Çahi-zənəxdə könlümi gördüm ki, şe'r oxır
Babil qanı pərri-əbabilə bayıla.

* * *

Sübhdəmdür al ələ çəngi, bəgüm,
Gedərəlüm arada cəngi, bəgüm.

Bən sənünəm nola bənüm olasın,
Qoymayalum bu tuğü rəngi, bəgüm.

Gözünə hey de gər müsülman isə
Neçə bir ata şol xədəngi, bəgüm.

Namü namus sana zəhmət edür,
Atalum bu şişəyə səngi, bəgüm.

Tatlumı, tuzlumı deyəm ləbünə,
Nedəlüm biz bu şuxü şəngi, bəgüm?

* * *

Cihanda yenə novraz oldı bu gün,
Nə kim məqsud isə ruz oldı bu gün.

Düzün sazunuzı kim yenilədin
Bənüm canuma bir söz oldı bu gün.



Gözi qəmzəsinə qalxan cigərdür
Çü anun oxı dilduz oldı bu gün.

Bilürdi işvələrün eşqi-bari
Nə deyəm çün novamuz oldı bu gün.

Vücudum dil ilə qulax olurdı,
Şükür Allaha ki, göz oldı bu gün.

* * *

Yenə gördüm bu gün şəmsi həməldə,
İrişdüm dövlətə yenə əl əldə.

Buluşdum yenə ol canlar ilə ki,
Bilişmişdüm olarunla əzəldə.

Anı ki, sən gözəldə gördi gözüm,
Göz əldən getdi görmədi gözəldə.

Bəni hal qıldı eşqi gisusınun,
Pərişan oldı dil bu eqdü haldə.

Yedinci gökdə yer tutdı anunçün
Ki, vardur ayağı tozı zühəldə.

* * *

Qərq ola tənüm hər gecə bu yaşa neçə bir,
Gözümdən axan yaş başuma aşa neçə bir.

İçdügüm ayax, şaha, tətaxlarun əlindən
Yığıla içümdəvü taşa-taşa neçə bir.

Baş oldı yürəgüm, sənəma, hicrün əlindən
İşdür ki, gəlür bər gecə bu başa necə bir.

Əsritdi gözi vərhəm edər bizi gisusı
Pamal olalum rind ilə övbaşa neçə bir.

Can dilədi bəndən ki, ləbin ağzuma verə
Ol fitnəcə turmaya bu bolcaşa neçə bir.

İncəldi tənümü yürəgüm toludurur qan,
Tən belinə, dil lə'linə oxşaşa neçə bir.

Xəndan görəli lə'lüni gözümdən axar qan,
Giryan olayım ol ləbi-bəşşaşa neçə bir.

* * *

Gördüm saçunı nola uzanur isə yaşum,
Görimeyəli nola uzanur isə yaşum.

Baş oldı yürəgüm, sənəma, qəmzən oxından
Əyax ver əlümə ki, fəda can ilə başum.

Taşdur yürəgün leyk tənündür güli-nəsrin
Bənüm könülüm sirçədürü taş ola taşum.

Qaçan ki, nigar əli ilə əyağ içürə,
Məcruh gərək ki, ola yürəkdəki başum.

Səccadəsini əql salar yüzinə qarşu
Bir cürə mey içün gerü alur gözi şaşum.

* * *

Qılur könülüm yar ilə bir gecə münacat
Gərək ki, qəbulə irişə cümləyi-hacət.

Fitnə gözinə canı könül oynaya dilər,
Tez tuta gərək zira ki, tə'xir ola afət.

Anca gözümün yaşlarını bən dökəyim ki,
Nil ilə Fərat axa çü Bağdad ola Toqat.

Bən dilərəm anı ki, səni diləyəm ancax
Ana sevinürəm ki, əl-ə'malu biniyyat.



* * *

Dilriş əgər olmaz isə, dərvişə nə derlər
Zülfinə əgər tolaşa təşvişə nə derlər.

Yadı bilişi əcnəbivü xişi bilicək
Məst olmayıcax aşiqi-bixişə nə derlər.

Taşdur yürəgün, şişədürür, şaha, könülüm
Taşa toxışıcax, sənəma, şişə nə derlər.

İsar edərəm canı, şaha, qaşlarun içün
Qurban olıcax hər kişi bir kişə nə derlər.

Belünə irimədümü əndişə həm irməz
İrməyicək irməyənə əndişə nə derlər.

Dünyada yenə bən qoca bir gəncə irişdüm,
Viranə içində, sanasın, gəncə irişdüm.

Zülfeyni pərişan idi, gözləri hərami,
Şükr ana ki, bən lə'linə iminco irişdüm.

Belinə irişəm deyü bən bu yola girdüm,
Şol bilə ki, ol qıldur uzun incə irişdüm.

İçincə nigarum bir-iki əyağ içərkən
Tolu əyağı sundumü içincə irişdüm.

Narincə beliyçün nola nar olsa könüldə
Sərvində çü bən şol iki narincə irişdüm.

* * *

Bir müddət əgər bulmaz isən yar eşigində
Cəhd eylə qərar etməgə naçar eşigində.

İqrar gərək ki, qılasın cürmü xətana
Zira ki, ulu cürm ola inkar eşigində.

Gər yar isən ana kişiyi görməgil əğyar
Zira ki, şahun olmaya əğyar eşigində.

Sultan qulı ol ki, ola aləm sana Bağdad
Yürəgə yörəniməyə əğyar eşigində.

Gülşəndə əgər bir güli sən qoxular isən
Əlünə nola batar isə xar eşigində.

Zor ilə zərə sevdügümün çün tanı yoxdur,
Yüz naləvü bin ah edərəm zar eşigində.

Can xəstəvü lə'lündən umar dərdə dəvasın,
Öldürmə, şəha, sayruyı əttar eşigində.

* * *

Neçə ox urdı gözün ki, yürəgüm qanmadı,
Bunca əyax ki, ləbün verdi cana qanmadı.

Sanmadın saçunı hər qılına bin can verdüm
Can ana yetməyəcəgini könül sanmadı.

Gözləri cadulayıb qıldı bu oqlümi əsir
Zülfi silsiləsinə bağladı inanmadı.

Can ilə saxlamışuz əql ilə könüli zəman
Yara qul oldı qamu biri bizə tanmadı.

Şəhdi şirinliginə gərçi ki, dirildi məgəs
Hüsni şəm'inə biri bənciləyin yanmadı.

* * *

Xəyalünə könül xanə degülmi?
Gərək el saxlamax xana dəgülmi?

Yaşum dənizü bən oda yanaram,
Kişi suda oda yana degülmi?



Gözün xəstə olalı xəstəyəm bən,
Əgər uyırsa, oyana degülmi?

Əgər ehsan ilə qul olur insan,
Bəni qul etdi hicrana degülmi?

Saçından azduğum çün bəndə saldı,
Ədəb vacibdür azana degülmi?

Diriyəm uş, bəgüm, eşqin odında
Var isə din, gəl imana degülmi?

Şaha, sevdayi oldum zülfün ilə,
Yazıldum şimdi divana degülmi?

* * *

Yürəgüm abü yaşumdur şərabü cam gözüm,
Bu nev ilə gözün içün dökər müdam gözüm.

Quluna ağzun açıban bir-iki söz diyəli
Zəhi ki, lö'lövü lə'lə verür nizam gözüm.

Cəmalı gülşəninə gözi olalı nərgis
Çəməndə nərgisə özin edər qulam gözüm.

Saçı məşama təhiyyət həvayilə biribir
Su ilə salar anünçün ana səlam gözüm.

Qərar qılmadı anda məgər xəyalı xas,
Qılalı qapusın açub salayi-am gözüm.

* * *

Bana yenə totağundan şərabi-nab gərək,
Diriğ olmayısar, gər cigər kəbab gərək.

Könülümə qodı eşqinü oda yaxdı onı,
Günahı yoxdur anun, gənc dərxarab gərək.

Gözümə gər basar isə yüzün xəyalı əyax
Nisar içün yaşum incü yüzüm zərab gərək.

Bənini gördümü dedüm, bu hindu bunda nədür,
Dedi ki, cənnət isə nola bir əzab gərək.

Yoluna varlığı qoyub gərək ki, söhbət edəm
Mühib ki, irə həbibinə nə bicab gərək?

* * *

Cigər fəraqun odından kəbab oldı, kəbab
Yaşuma bax ki, gözümdən şərab oldı, şərab.

İmarət edəli eşqin şarın dimağumda
Könül vilayətinə bax, xərab oldı, xərab.

İçəli eşqin əlindən canum tolu əyağı,
Yetürdi əqlivü könül sərab oldı, sərab.

Gözüm içinə xəyalün basa deyü əyağın,
Yaşum çü lə'l yanağum zərab oldı, zərab.

Həvan ilə yüzümün suyını yerə dökdüm,
Tənüm oduna yanıban türab oldı, türab.

* * *

Ey cigər eşqin odı ilə kəbab,
Vey gözüm yaşı ləbün içün şərab!

Bir təbəssüm qıl ki, candur qayğulu,
Başəd andan bizə ol fəthi-bab.

Gözləründən qanda mə'mur ola dil,
Şah iki olsa olur ellər xərab.

Gözlərüm bağlar saçundan hər gecə
Sübhədəkin neçə bir nəqşi bərab.



Lə'li-ləblərinə xəstə vardı can
Şəkkərü şəftalu dedilər cəvab.

Ol həyadan gözlərüm odın dökər,
Bu iki dökər şərabü ol gülab.

Lə'lü incü dökdi gözüm yüzinə
Bən dəxi yanağuma urdum zərab.

Şöylə ki, tuzludurur şaha ləbün
Ağızun yadı neçün oldı cülab.

Uyır ikən caduladun könlümi,
Sehrdür vallah gözündə sehrü xab.

* * *

Ana ki, eşqin irişə bir ada irsə gərək
Kişi ki, tərk edə özin murada irsə gərək.

Bu eşq kişi başına tanışıban gəlməz,
Yaxasına yapışub birədə irsə gərək.

Əgərçi qəmzəsi oxı dələr bu yürəgümi,
Yürəgümə yenə dəm-dəm yarada irsə gərək.

Əgərçi lütfü səfadurü gərçi cövrü cəfa,
Bənüm yürəgümə dəxi sırada irsə gərək.

* * *

Görmədi gözüm xalı kibi dünyada şamə
Gördüm Misiri buncavü vardum necə Şamə.

Bir saat irişəm dedüm idi tapusına,
Gülşəndə salındı nedəlüm qopdı qiyamə.

Aldı əlinə camıvü düşdü ləbi əksi,
Ol cama sanasın ki, ləbi eylədi camə.

Ol namə gərək can irürəm ki, xəti ilə
Canuma yaza gül yüzinün üsdinə namə.

Bir səhl bəhanə ilə zülfinə tolaşam
Pəs bana nə hacət bu qamu danəvü dama.

Şol lə'li-ləbün ləzzəti kim gəldi xəyalə,
Bən kamuma irməzəm əgər irməyə kama.

Şol dərdi çəkərəm, sənəma, hicrün əlindən
Ki, cənnət ola tamu əgər qətrəsi tama.

Bu dünyanun uzunn-enin bir nəfəsə say,
Çün qalmadı ol Rüstəmi-dəstan ilə Sama.

Çün suxtəyəm, nola əgər puxtə içərsəm,
Bən xama umaram ki, yazıla bana xamə.

* * *

Bən oda yanaram yaş ilə nəm-nəm olısar,
Şahum neçə kim var isə pəs kəm-kəm olısar.

Əl iltür isəm qana yetər xuni-cigərdən,
Olmaya əcəb eşq ilə gər dəm-dəm olısar.

Eşq əhli səfası olıcax zəmzəmə ilə,
Olmaya əcəb göz yaşı gər zəmzəm olısar.

Könlüm dəlüdür totağun-əmsəm, nola, ey can,
Naçar bənüm dərdümə ol əm-səm olısar.

Canumı aparursınü könül qoparursın,
Şadı dəxi pəs yürəgümə həm-həm olısar.

* * *

Zülfüni tolaşdırısar boynuma silsilə nola,
Bən bir qılam gər qarışa dünyada qıl-qıla, nola.

Ruxındağı fülfülə bən tərh eyləmişəm atumı,
Gər şəh piyadə olıban tərh edə fil-filə, nola.



Ömürdə bən bir canumı qayırınlamadum özgədən,
Sən yeni gəldün bu yola səhl ola dil-dilə nola.

Dünya anı bildi ki, bən lə'li-ləbiyçün yanaram,
Sən dəxi gəl yanağı ol bu nəqşi bil belə nola.

Gözüm yaşını sil dedüm, silmədi, saldı silsilə,
Zülfeyni tolaşığını saldıysa silsilə, nola.

* * *

Mədh eyləyələr özgəyi nəsinə deyələr
Nə şəklə, nə şəmailə, nə sinə deyələr.

Bədguylar dilər isə ki, eyb edə ana
Bin fikr edərlər isə de, nəsinə deyələr.

Bəndən canı diləyicəgəz sına qaxaram
Zira mürüvvət əhli cana sına deyələr.

Cinnü mələk dəxi, sənəma, şiftəndürür,
Tək dünyada olan işi nəsinə deyələr.

Yar oldurur ki, yar yolına verə canını
Bu sözə rast deməyənə sinə deyələr.

* * *

Gözün durur, nigara, eşq imamı,
Ki, rəvişlərdür ana rəkbi-şamı.

Şərabi-lə'lün ilə tər dimağum
Qılur zülfün müttər bu məşamı.

Pərişan eylə zülfüni, nigara,
Dilər ki, oda sala udi-xamı.

Bu həsrətdə keçər ömür bilinməz
Ki, dutub yaxamı, oda yaxamı?

Könülümi səfa, gözümi zəmzəm
Çü qılmışam müşərrəf qıl məqamı.

İçin yarum ilə var yüz məqalum,
Nədamı eşidiməzlər, nidamı.

Ləbindəndür sözüm şirin əgərçi
Qaşı der bana neməl-xal idamı.

Çü əl irməz ki, qılam ana səcdə,
Əya badi-səba, apar səlamı.

Gözi məs olur isə nə əcəbdür,
Çü gözlərüm dökər əşki-müdamı.

Gözün tiğidürür bir qətrə su ki,
Həmişə parə-pərədür niyamı.

Könülüm şəhrinə fitnə gözündür
Qiyamətdür, şəha, qəddün qiyamı.

* * *

Gülşən yenə bu suffə içində səfa düzər,
Nərgis bu xəstəliğini cana şəfa düzər.

Bənəfşə xəttini ağızına alur isə,
Susən qılıcı ilə zəban bərqəfa düzər.

Gözləri çözdi nagəh vəfa düzgün eylədi,
İslah eylədi, ləbi nagəh cəfa düzər.

Hərçənd aşikarə qaşı bozdı könüli,
Gözlər işvələri canı bər xəfa düzər.

* * *

Alınma zülfinün ilmələrinə ilməsi çox,
Dökilmə bağları dügmələrinə dügməsi çox.



Düşə yüzün ayağına ki, əl verə dost,
Gözüni ayağı tozına sür ki, sürməsi çox.

Nə gülşənə yüzünün cənnətini bənzədəyim
Ki, sünbül ilə bənəfşə, gül ilə alması çox.

Könül uçındı çü gördi gisuları çərisin,
Dedüm ki, dəprənü turur, üşənmə qarası çox.

Göz assısına qənaət qaçan qıla könülüm,
Visal mərhəmi gərəkdür ana yarası çox.

* * *

Al çəngüni çəngi əlünə, başla nəvaya,
Söhbətdə ki, sən çalmayasın çəngi nə vayə.

Gisularunun bin başı var naz ilə oynar,
Bən bir başumı oynadam uş badi-həvaya.

Yar dərdi dəvadur canuma olmasun əksük,
Dəgşürməzəm olınca bən ol dərdi dəvaya.

Bibərgü nəva eşqin uzun yolına girdüm,
Gülbərg yüzün ilə irəm olamı nəvaya.

Bən sərvün içün rast budur bisərü payam,
Bənzəmişəm ol bədri cəmalünlə nov aya.

* * *

Tolu əyax ver, ey saqi, zira novruz çağıdur,
Şərəfdədür həməldə şəms, əyağ onun əyağıdur.

Bana lə'li el olursa, çü gözi məstdür nola,
Əgər zülfeyni şurişdə və ya qaşları yağıdur.

Gözi könüldə əsirib neçə qanlar dökər görsən,
Qılursa ərbədə, nola, çü həm özi odağıdur.

Yüzində danə gösdərür, tağıdur zülfini çevrə,
Hələ bir könüli yazmaz nə qara zülfi ağıdur.

Bana derlər ki, eşqinin qaçandur axırı barı
Nə bilem axırın, çünki odun əvvəl umağıdur.

Yüzümi yerə sürər isəm ki, öpəm ayağın anun
Bunı bən bəndən etməzəm anun zülfi yasağıdur.

Neçə kuhü kəmər gəzdi qərar edəmədi zülfi
Könül qıldı qərar anda əcəb dəgül ki, yağıdur.

* * *

Gər canuna can isdər isən, gəl bərü can uş,
Nə can ki, həyati-dili-canani-cəban uş.

Lö'lö dilər isən, gözüm uş, varma mühitə,
Altunmu gərək, yüzümə bax, altuna kan uş.

Lə'lün boyadı göz yaşı qanına tənümi,
Ol şimdi xəyalüni boyar qanına, qan uş.

Gər xub xəyal isdər isən belinə baxgil,
Bax pistə ağızına ki, sərbəstə güman uş.

Biz sayımuz özgədənü görəli qaşını
Qurban edərüz canı ki, eydi-rəməzan uş.

* * *

Gözlərümdə, nigara, yaşını gör,
Qana yatmış yürəgi başını gör.

Ləbinün çeşməsindən içini gör
Belinün sayəsinə taşını gör.

Hüsni dövrində gər cigər yandı
Kirpügi qəmzəsiylə qaşını gör.



Gözi qonuxlığında ox yedi dil,
Ey cigər, ana görə aşını gör.

Göz edər gözlərümi qan-yaş ilə,
Uzadur yüz yaş ana yaşını gör.

* * *

Bülbül yenə giryandurü gülşən yenə xürrəm,
Qönçə yenə xəndandurü nərgis yenə pürqəm.

Bülbül gərək ağlaya sabahadəkin anca
Ki, düşə həyadan gelinün üsdinə şəbnəm.

Sübh ol günəş içün dəmi-sərd ura rəvamı,
Ya lə'li içün lalə ağızın aça dəm-dəm.

Sevdama müfərrih dilədüm lə'li-ləbindən,
Qan olmaya gər aydur isə, ol bana əm-səm.

Tək sən bənüm ol uçmağı kimə gərək isə
Tərk eylədi bir buğda içün uçmağı Adəm.

Xalündə səfa anladum, ey kəbeyi-dilha,
Ol zəmzəmə eylədi bənüm gözümi zəmzəm.

Mərhəm dilədüm sirr ilə yarama ləbindən,
İrürdi səba gisusına eylədi vərhəm.

* * *

Könülümdə, şaha, eşqin mükərrər,
Olacaxdur nə kim olmış müqəddər.

Həyatı canumun lə'li-ləbündür
Zəhi qazi gözün Allahü əkbər.

Ləbi-lə'lündürür, lə'li-ləbündür
Cana dərman deyiməzüz mükərrər.

Nə ki, hüsnündə yazdı isə xəttün
Könül lövhində biz oxıruz əzbər.

Biliməzüz ki, sənsin, ya xəyalün,
Olan gözümüzə qarşu müsəvvər.

Vücudumuzdurır eşqin xəmiri
Hələ eşqin ilə olmış müxəmmər.

Nola oldı isə zülfün müşəvvəş,
Cəhan çün oldı eşqinlə müşəmmər.

Könül andan qaçan ayrılısardur,
Bu bir xətt ilə ki, yazmış müzəvvər.

Xətün içün öləyim ki, gül üzrə
Yazar azadlığumı mühərrər.

* * *

Bənzüm saruvü yaşumı al etdün, eyləmi?
Sevdan ilə tənümi xəyal etdün, eyləmi?

Cadu gözünü danə bənün, dam saçlarun
Seyd etməgə canumı kim al etdün, eyləmi?

Od ilə su içində bəni müstəmənd edüb
Eşqini od yarunı zülal etdün, eyləmi?

Bir busəyi bana, ey müsülman, haram edüb
Qan içməgi ləbünə həlal etdün, eyləmi?

Gözün biçynihi yürəgümi qılur hədəf,
Eşqinə qəddümi dəxi dal etdün, eyləmi?

Bədri dəxi günilədi olamı ay yüzün
Nal olmağa atuna hilal etdün, eyləmi?

Eşqin canuma verdünü bir səbr vermədün
Bizümlə türfə hali-mühal etdün, eyləmi?



* * *

Sənəma, qara gözün bizüm ilə aladurur,
Könüli gizlər isəm dəxi qəmaz aladurur.

Hindu bənlərüni şol lə'li-ləbün yanında
Görürəm cərgələmiş olamı büt xalədurur.

Gisularun gecəvü bədr yüzün arizunı
Behəqiqət dənəyicək sanasın halədurur.

Cüftə qaşuna könül vardı gözün ox çəkər,
Can dedi noldı sana aşiqi-səd salədurur.

Hicri meydanına aşiq varı qodı könlin,
Kimisi üzə gəlürü kimisi qaladurur.

Xəttini gördi könül dedüm ana eyb dəgül,
Adət oldur ki, arı qanda isə baladurur.

Gözi kirpükləri oxı ilə gözlər gözümi
Urmaz zira yaşum dənizinə taladurur.

Cövr oxları ki, qəmzən könül evinə atar,
Mancınıq taşlarıdur ki, yöni turxaladurur.

* * *

Olmasun eyb sorarsavuz ki, nədir totağun
Meymi ya lə'lmidür ya xu şəkərdür totağun.

Əsridür gözünü zülfün tutarü qaşun atar,
İlla bir nəfəs ilə yenə dirildür totağun.

Görəli gözlərümün yaşını kim qanın axar,
Qıpqızıl oldı olamı ki, xəcildür totağun.

Zülm edər cadu gözün canuma qıldurma xəta,
Çünki lütf ilə qıla nola baxıldur totağun.

Kirpügünün oxıvü gisularun bəndi bana
Səhl geçə umaram zira ki, eldür totağun.

* * *

Sahiri isdər isən, gəl gözə-göz bu gözə bax,
Günəşi gördüm der isən, yüzə yüz bu yüzə bax.

Sanmağıl gər olur isən ki, xərab ola tənün
Bu həvada can verürsin, ləblərində tuza bax.

Gecələr nola könül zülfində sərgərdan ola
Çün səhər yeli əsər bu sübhdəm gündüzə bax.

Bən günəşdə qərqə oldum bu münəxxəmləri gör
Ki, bana derlər ki, dünlə turu gəl, yılduza bax.

Canü əqlü könülü tən oynamışam bu yola,
Özini bizdən əsirgər şeyxi-novamuza bax.

Bən bu yox varlığumı töhfə aparmışam ana,
Dilərəm andan özin bu lütf ilə dəryuza bax.

Görəli qaşı hilalin ruzə tutdum özgədən,
Canumı oynamışam bu eydi gör ol ruza bax.

* * *

Bən bilürəm anı, ey can, bil bilə
Silmə yaşumı ki, ola silsilə.

Can xu bizdə yox sınarsan sən bizi,
Bizə ver yardan xəbər bir dil dilə.

Can çü yox, ağzında olalım müqim,
Tən qarışsun gisusına, qıl qıla.

Bu gecə yandurdı könül şəm'ini,
Ay yüzində gəzdi zülfin til-tilə.

Nola bən gər tozunı izlər isəm,
Çün görürəm qulluğuna yil-yilə.



* * *

Ah əgər baxıp tapunı görməyəm,
Düş göribən yenə sana yormayam.

Hiç zamanda, hiç məkanda, hiç nəsə
Görməyəm ki, anda səni görməyəm.

Quralı sən gisularun tuzağın
Nəzrüm oldur quşa tuzax qurmayam.

Eşqbazı məclisində neçə ki,
Tapun oturur ola bən turmayam.

Neçə ki, baz oldı gözlərün, şaha,
Ayruğa könül quşın uydurmayam.

* * *

Ey seyyidi-xuban, ləbün gösdər, hüseyni olalum,
Şunı ki, isdərlər qamu söylə ki, səndə bulalum.

Ya odunı gəl yax bizə, ya xoş nəzərlə bax bizə,
Neçə-neçə şol gül kibi tazəvü gəh solalum.

Səndən bizə çün çarə yox, dərdi-dili biçarə çox,
Şöylə ki, varsın ol hələ şöylə ki, varuz olalum.

Şaha, könül səndən tolu dərdüm nedəm bəndən ulu,
Neçə ki, dərd ulu isə hələ anunla tolalum.

Gül kibi açıl yüzümə, xurdələr etmə sözümə,
Qoyma bəni kəndüzümə, gəl gül yüzünə güləlüm.

* * *

Bidar olalum bu gecə xabi nedərüz biz,
Sərfü tolu sun əyağı anı nedərüz biz.

Cövrün odına yaxdı yetər canumı gözün
Sün əzb totağunı əzabı nedərüz biz.

Gözün bizə xəmmar ləbün nöql yetər gəl,
Çün suxtəyüz dəxi kəbabi nedərüz biz.

Ləlündən, ey can, həsrətümüzdür meyi-mə'qud
Ver kimə gərək isə müzabı nedərüz biz.

Can qıldı müsəlləm könüli gözləri içün
Rədd eylədilər ki, bu xərabı nedərüz biz.

* * *

Səhər yeli yenə dəprəndi, iç nedim əyağı,
Nəsim içün içəlümü nə zər, nə sim əyağı.

Cəhənnəm içrə əgər filməsəl ola ruzi
Nigar əlindən ola cənnəti-nəim əyağı.

Səyahəti qəmayəm zülfi mülki içində
Neçə ki, əldə olursa yarın muqim əyağı.

Təmam ala könül ilə canum əlin əlinə,
Ölümə çünki suna işvə ilə nim əyağı.

Totağı qılmış idi və'də canuma bir əyax,
Toluvü nəqd gərəkdür ola kərim əyağı.

* * *

Saqi, tolu ver əyağı Mənsuruz eylə bil,
Mütrib nəva düzüb dəxi məxmuruz eylə bil.

Bərdar qıla bu könlümi zülfündə, ey nigar,
Lütfün olursa ortada Mənsuruz eylə bil.

Könül gözünlə səhl ola oldı isə xərab,
Lə'lün xəyali ilə çü mə'muruz eylə bil.

Qəhrun gözinə olalı mənzur könülüm
Rəhmət gözindən uşdaya məsturuz eylə bil.

Bir-iki gün visalünə irgür dünyada
Birinə yüz gün oldı ki, məhcuruz eylə bil.



* * *

Şundan ki, gözi, qəmzəsi qaş yasına düşdüm,
Belün ey yaranlar ki, könül yasına düşdüm.

Quruldum idi vəslini seyd eyləməgə leyk
Gözləri bəni caduladı yasına düşdüm.

Ayağa bəni saldı idi zülfi ilə leyk
İşvəsi yenə dutdı əlüm pasına düşdüm.

Hammamda cadu gözi ilə mim ağızını
Gördüm su olub, əriyibən tasına düşdüm.

Hər dəm, gözümün yaşıvü könül odı taşar,
Əsirgə bəni odü su miqyasına düşdüm.

Hindu həbəşün cündinə Mənsur olur ikən
Nagəh saçınun bir qılına asına düşdüm.

Mur oldum isə mar saçı ilə, nə əcəb,
Çün cəhd edübən son ucı həlvasına düşdüm.

* * *

Şaha, ənəgün alması abi dəgülmidür,
Xaba gözüm gözün içün abi dəgülmidür?

Əm dilədüm bu dərdümə lə'lini dişlədi,
İnsafa gələlüm ya cəvabi dəgülmidür?

Gözüm mey axıdur yaşını gözləri içün
Könül yürəgi bağrı kəbabi dəgülmidür?

Nola imarət etsə gözün könlüm elini
Rəhmət yeridür özi xərabi dəgülmidür?

Bən varlığumı can yolına tərk qılmışam,
Varlıx kişiyə canı hicabi dəgülmidür?

* * *

Bən bülbüliyəm gül özini qönçədə gizlər,
Eşqim dənizini beli bir incədə gizlər.

Bən aləmə faş eyləmişəm hüsnini anun,
Səhl ola əgər sevgüyi bir neçədə gizlər.

Qaşları tərazusına mizana qodux can,
Tanrısı ilə kəndü bilür səncədə gizlər.

Hərçənd ki, şir isə şəhün hüsni cəhanda
Lütfi dəxi var ki, könüli pəncədə gizlər.

Əyyardurur yar, nedəyim bən anun ilə,
Basmağa yüzümə qədəmin rəncədə gizlər.

* * *

Buraqi-eşqə binübən qılur könül me'rac,
Geyübən ol tonı kim toxımaz anı nəssac.

Atunı salıban olğıl piyadə rux-ruxa ur
Bu rüq'ədə bunı oynayımaz məgər leclac.

Könül nə edə həvasıylə şir ki, ahu
Cigər nə qıla gözi ilə baz ki, dürrac.

Totaxlarun bir-biriylə ləbaləb olub
Yürək qanı içün eyləyiməz məgər kəngac.

Xumar görəli gözüni gözlərüm, şaha,
Könüli qıyma çəkibən irürdi bir umac.

Bu canü əqlü dilə gözlərün nə qılduğını
Bu deyəyim ki, seyidlərə qılmadı həccac.

Xəyali guşəsinə qonar isə gözümün
Nisar edəm ana lö'lö özümi verəm bac.



Dəgül ki, kəndü gələli könülə eşqi anun
Buyırmışam qamu budü vücudumı tarac.

Nə mal acısıvü, nə xud yol arnuğı qala hiç,
Səfa ilə əgər ol Kə'bəyi – təvafidə hac.

Visali xanı bəni neçəsi qoya məhrum
Çü süfrə artuğı ilə toyınur ola bin ac.

Kişi sıruma döyiməz və gər nə ata idüm
Bu tağ ilə taşı netə ki, panbuğı həllac.

Bənüm boyum dəgül ol boy ki, ol boya cüz həq
Dəxi kişi toxıya bilən ton içün dibac.

* * *

Biribidi hüsnünə dil gözi ki, vara şikara,
Bilimədi ol şikarı ki, şikar ola şikara.

Bədən ayruğ olur isə, çü visal ola hasil,
Çü həyati-mə'nəvidür bu vücud pəs çi karə.

Günəşün əgərçi vardur cəvəlanı biədəb leyk
Tana dəkin ol həyadan duta yüzinə sitarə.

Bəni eyb edənə qarşu yüzünün niqabını sal
Ki, cəhan gözilə görə necə mum olur hicarə.

Çü salına incə beli qılı yara lütfi ilə
Çü sözə gəlür ağızı şəkəri qılur dü parə.

Gərək ixtiyar edəm bən ki, gedə bu ixtiyarum
Bana bəxt yar olursa ki, irəm bu ixtiyara.

Bu yəmən yəmini ilə nəmini gözüm dökibən
Dəxi yürəgüm odını irürimədi yəsara.

Çü həva yeli qatıdur bəni gönləgünə alğıl
Ki, çü şəm bu ki, uğrar ola həcəti fənara.

* * *

Sana oynamağa canı tapuna layiq at olsa
Qədünə qaşlarun kibi bu qəddüm iki qat olsa.

Şəha, yelda gecəsindən sənün zülfeynün uzundur
Nola qədrincə canuma visalündən bərat olsa.

Nə zəhrəm var ki, hüsnünçün deyə biləm ki, zöhrədür,
Vəli vəslün qəvaidi nolaydı sabitat olsa.

Çəməndə sərv qəddünçün başınun üsdinə turdı,
Rəvayidi qaşun içün ana gər iki qat olsa.

Sənün bir işvən içün ki, qılursın aşiqə hər dəm
Olur məğfur əgər səndən həzaran seyyi'at olsa.

Ruhum xod qərqi-əşk oldı könül eşqünə verdi at,
Nola uş böylə oynunla könülüm şahmat olsa.

* * *

Yeni ruha irdi canum yenə bu cəhan içində,
Nə əcəb bahar gördüm, sənəma, xəzan içində.

Cigərün, şəha, ləbündən soraram şikayətini,
Nə rəvadurur ki, tətağun bu qan içində.

Belüni xəyal edərsəm bəni zülfün ilə asğıl,
Bana söyləməz olursan, qaluram güman içində.

Yüzün ilə qara zülfün bu cəhanda fitnə oldı,
Qəddüni qiyamət etmiş bu axır zəman içində.

Özini atıcı sanan oxuna əsir olmış,
Gözüm oxına döyiməz göricək kəman içində.

* * *

Nigara, səndən iraxlıx bana məlal idi bu,
İrişməmək tapuna qatı infial idi bu.



Ləbüni dürci-gühər anlamax güman idi ol,
Belüni ruhi-rəvan bildügüm xəyal idi bu.

Yanağun alı ki, altun edər yüzüm gümişin
Gözümə göricək bəllü bildüm al idi bu.

Görən qaşunı yüzündən qina'ı açıcağaz
Deyə ki, bədr qaçan oldı çün hilal idi bu.

Əgərçi mümkin idi bana ki, yoluna öləm,
Tapundan ayru dirilmək bana mühal idi bu.

Sənünlə bənivü sənsüz bulımazam səni bən,
Neçəsi ulaşux ola bana nə hal idi bu.

Ağız-ağız ləbünə ləblərüm sirini dedi,
Bən əsrüg idümü tapun o bərk mühal idi bu.

Belün gözümdə nə qıl idi ki, bəni qıl edər,
Sözün bəni oda yaxdı əcəb nə qal idi bu.

* * *

Sunğıl ayağı saqi ki, dünya güzərandur,
Çoxlar bu dəmə irmədi, çoxlar nigərandur.

Qəmzən oxını atü niqabunı yüzündən
Gedər ki, görələr ki, kemin içrə kəmandur.

Şol sərvünə bin canı rəvan eyləyəyim gəl,
Gözlərümə ki, qanlu yaşı abi-rəvandur.

Gözüm quşı aləmdə həmin sana ilişdi,
Əglənməgi dünyada eşigündə həmandur.

Yaran diləməz kişi ki, ayru ola yoxsa
Ölüm dəxi eşq əhlinə bir dəm seyrandur.

* * *

Bənciləyin aşiqi-biçarə yox,
Çarəmüz nə dərdinə çün çarə yox.

Sən qərib olalı könlümdə müqim
Bənciləyin şəhrdə avarə yox.

Gicə ruşəndür ki, nisbət zülfünə
Qara yoxdur, qara yoxdur, qara yox.

Ləblərün dari-şəfavü şərbəti
Bənciləyin xəstəvü bimara yox.

Nisbət olmaz sinənə nəsrin, bəgüm,
Yürəgün kibi nəçün bir xarə yox.

* * *

Ta gözlərüm yaşı ləbün içün mûdam olur,
Könlümdə dişlərün ilə labüd nizam olur.

Bən bər dəvam işvən içün canı oynaram,
Zira ki, dərdünə yanaram, ol dəvam olur.

Bən dilərəm nühüftə nəva vam canuma
Çün əqlü dil əvəz verürəm ol nə vam olur.

Gisusi çin sənün kibi olmaya Misrdə
Ki, yüzi sübhü gözi xəta, zülfi şam olur.

Sən hüsn içində adlusınu kim ki, yoluna
Canını oynaya, sənəma, niknam olur.

* * *

Ləbündən çün sözün qənd ilə düşdi,
Həman dəm dərd ilə can dilə düşdi.

Könül qaçan imarət olısardur
Çü cövrün taşları qəndilə düşdi.



Ləbün qanuma girdi gizlər özin
Neçəsi gizlənə qan dilə düşdi.

Nə dəm gördüm ləbindən bilməzəm
Ki, andan yürəgi qan dilə düşdi.

Dəva sordum ləbindən yürəgümə,
Cəvabı həm bana qan dilə düşdi.

* * *

Çün beli xəyal olavü ağızı gümandur,
Eyb olmaya gər gözi, qaşı tirü kəmandur.

Apardı gözi könülümi lə'li söziylə
Bən tutısaram ləblərini çünki zəmandur.

Bən nəqd verürəm sana əqlü dilü canı,
Sən vəsli qoma nisyəyə, bir gör nə zəmandur.

Bən aşiqi-sadiq vəli məhrum yüzindən
Mə'şuqə dəxi nazükü əxlaqı yamandur.

Gözüm səni gördivü könül oduna yandı,
Ondan bərü göz ilə könül arası qandur.

* * *

Nigara, dil odundan oldı naşı,
Taparuz şimdi eşqi-diltiraşı.

Yazımazuz sənün eşqinə biz şərh
Mədəd qıla məgər ana havaşı.

Həmişə qəmzəsi canı qanadur
Yenimezüz bu məsti-dilxiraşı.

Anun şəmi odına yandı fərraş
Dilər fərraş ki, qıla fəraşı.

Axar sular xəyaliyçün axıdup
Gözüm düzmişdürür bir hücrə kaşı.

Şunun ki, ətəgün irdi əlinə,
Nişə ayağuna qoymaya başı.

Mə'adin kim bilür hər kişinün leyk
Zəhi xoşdur bu üşşaqun mə'aşı.

* * *

İrincə bənüm canum şol yari-dilarama
Görmədi tənüm xoşlığ, irmədi dil arama.

Ol yara irişicək könlün ki, dərunidür
Ol taqəti qalmaz ki, girə bilə arama.

Yaxama anun eşqi yapışalı nə zəhrə
Ki, meyl edə gözlərüm bir puxtəyə ya xama.

Könül tutisi əvvəl lə'lində şəkər tatdı,
Andan özini saldı şol nərgisi-badama.

Dedüm yüzünə bax gör şamə ki, nə miskindür,
Aydur ki, nə fitnədür ol Rumavü ya Şama.

* * *

Lütfün yenə bizümlə şahanə olısardur,
Öldügi içün aşiq şaha nə olısardur.

Mərdümlik edüb gözüm dökər iri incülər
Mərdümlərün işi həm mərdanə olısardur.

Canlu kişi sana can oynar, sənəma, leykin
Cananəyə can vermək ya cana olısardur.

Bir qətrə dərün şaha gəldi gözümə bu dəm
Ummana düşən qətrə dürdanə olısardur.



Bağçana çü can girdi əlbəttə anun meyli
Şəftalu ələ girməz rümmana olısardur.

Gözün ilə zülfündən əsrükü pərişanam,
Eyb etmə əgər sözüm məstanə olısardur.

Məcnun ilə Leylinün meyli var idi axır,
Aləm sana anunçün divanə olısardur.

* * *

Neçə çəkəyim dərd ilə bidad eşigində
Bir gün varayım çağırayım dad eşigində.

Bən ney kibi gər yanar isəm səhl ola ana,
Çün ud qılur naləvü fəryad eşigində.

Can verməgü dərd almağü eşq odına yanmağ
Gərək ki, qılam eşq ilə bünyad eşigində.

Bən bəndəsi olamu gərək olmayam azad,
Səhl ola qazanur isəm azad eşigində.

Dilşad oluram şol gözi əyyar ilə dayim,
K'anun kibi göz görməyə Bağdad eşigində.

* * *

Gər girür isən nola sən bu gecə qoynuma,
Ya nola qoşınursan tana dəkin oynuma.

Könülümə gözlərün şol rəsm ilə axarlar,
Ki, qaplan ənükləri axın edə qoynuma.

Gözlərün edər cana hər nə ki, edər isə
Əlün-ayağun yazux irər isə boynuma.

Bən türkəmü sən tatar yolı ilə sorışalum
O çayı gərək bana baxar isə oynuma.

* * *

Yenə yarı dilrübamız bizə naz edər, rəvamı?
Yenə çəngin aldı ələ, yeni saz edər, rəvamı?

Dil ana sərih quldur, bu kinayətə nə hacət,
Çü həqiqət anun oldum bu məcaz edər, rəvamı?

Ləbüni dilə gəlürsəm neçə müxtəsər deyəyüm
Qəddüni bəyan edərsəm ki, diraz edər, rəvamı?

Nə rəva ki, pərdənüzdə bu nəsimə yol verələr
Ki, saçunı sünbül ilə vara, raz edər, rəvamı?

Canı eşqi kimyası neçə odlara salıbdur,
Misümi çün altun etdi, nə güdaz edər, rəvamı?

Gözi baz ikən bu koklik çü şikar edər həmişə
Gözini çü bağladı, uş gözi baz edər, rəvamı?

* * *

Neçə-neçə bizə sevda yədi-beyzayı gösdərsən,
Yüzüm simin çü zər qıldun bizə simayı gösdərsən.

Gözümdən Nil axar hər dəm, dedüm ki, ey qara gözlü,
Nola bana bu irmaxlar axan dəryayı gösdərsən.

Gözüm məşki-saqa dökər, nola, ey pəhləvani-hüsn,
Bu meydanı məlahətdə bizə sərpayı gösdərsən.

Zəmanlardur ki, şişə dil sınur taş bağrun ilə,
Dili-səngini gösdərdün, təni-dibayı gösdərsən.

Şəraba nisbət eyləyən ləbüni ola sevdayı
Həzaran dil ola Məcnun sən ol bəmrayı gösdərsən.

Neçə şəhladurur, şaha, sənün şəh ruxlarun içün
Dəxi neçələr olaydı əgər şəhlayı gösdərsən.

Hilali görəli qaşun qırar üşşaqı ox ilə,
Günəş yüzün nə qılaydı, əgər bədr ayı gösdərsən.



* * *

Qıldı könülüm hüsnün ilə xəlvəti-nazük,
İrişdi bizə vəslün ilə dövləti-nazük.

Gösdərdi bu gün mö'cizəsini şəha hüsnün
Ki, yazdı bu dəm xətti ilə ayəti-nazük.

Gər verdi isə Yusifə həq qayəti-hüsni,
Hüsnüni sənün qıldı bu gün qayəti-nazük.

Bən şəm'ü gözün saqivü yürək qanı süci,
Gəl ki, qılalum sənün ilə söhbəti nazük.

İncə dedilər saçı qılın beli qatında,
Gözün nə xəyal eylədi bu qeyrəti-nazük.

* * *

Sonəma, xəzan irişmiş, gəl axı, bu halini gör,
Nəzər et kəmalinə, bax yenə dün zəvalini gör.

Kimisi bəyənik aşiq saruya boyamış özin,
Kiminün be rəsmi-xuban yanağının alını gör.

Hər ağaç bu çağ içində, sanasın ki, bir büt olmış
Yöri, dünya halinə bax, bu cəhan mühalini gör.

Sallanışun ilən apar canumı ki, deyə görən
Necə seyd edər pələngi bu geyik maralini gör.

Bu cahanda hüsnə mala neçə qərrə olısarsın
Bu bahari-hüsninə bax, ya xəzani-malini gör.

Bağ içinə salınu gir ki, çağıra yapracuxlar,
Bir-birnə ditrəşübən ki, filan cəmalini gör.

Qıla bənzəmiş tənüm ki, belünə qıla təşəbbüh,
Var anun gümanına bax, gəl anun xəyalini gör.

* * *

Ruyi-nigarü fəsli-baharü şükufədür,
Bu fəsl elçilərinə canlar ülufədür.

Kim tərk qılur isə cəhanı, anı qovar,
Pəs bu cəhan sidq ilə bir rast yufadur.

Gər ismi-ə'zəmi eşidə çöpə saymaya,
Şol qəlbi-xam kim, nəzəri kəm hürufadur.

Dünya çü qəlpdür ana uymasa yigirək
Kim nəfsinə uyar isə nəqdi züyufadur.

Bu dünya xalqınun anı yarıma dəgməyə
Əhdi eşq ərənlərinün bin ülufadur.

* * *

Xəmr içmədin nigar gözinün xumarı var,
Peyvəstə eşq ilə qaşınun karü barı var.

Qıldum rəqibdən gilə aydur ki, ey fülan,
Nerdə ki, gül olur isə, əlbəttə, xarı var.

Qanda ki, bir qərib qılur növhə gecələr
Ya dər diyar olmaya, ya dərdi-yarı var.

Yüz göz ilə xəyalüni dilər bu gözlərüm,
Çoxdur şərabı zər tabaqında nisarı var.

Gül qöncədə həya ilə gizlədi yüzini
Labüd əyarını bilə hər kim ki, arı var.

Urur yəmini müshəfə hər ki, əmin isə
Ki, gizləməyə sana bədən yəsarı var.

Bir dağ ur dedi zəmandur gözün bana,
Onulmadı dəxi yarasıvü qoxarı var.



* * *

Yar bana hicranı odını sanasın yaradur
Kim, bəni gəh yox qılur eşq iləvü gəh yaradur.

Çün bilürəm ki, nigarun meyli vardur danəyə,
Gözlərüm hər ləhzə gözdən axıdurlar yaradur.

Beli ilə hiç olursa, ağzı ilə təng dil
Səhl tutmax gərək anı, çün qamusı yaradur.

Dil dilədi qəmzələri, dilədilər ki, anı
İgnəcə yer sağ bulınmaz, dil qamusı yaradur.

Qəmzəsi tazə könül dilədi ki, butə qıla,
Dedüm uş könül hələ varınca bu key yaradur.

* * *

Nigara, firqətündən can üzilə,
Vüsalün saətində dil əzilə.

Neçəsi iltifat edə bana şol
Ki, baxar bu cəhana bir göz ilə.

Yazuğa yazılamı gər xumarum
Anun lə'li-ləbi ilə yazıla.

Dil azdı zülfi Hindistan elidür,
Nola bir məmləkətdə gər azıla.

Ləbündən çəkdügümi bax yüzümə
Ki, lə'l ilə zər üsdində yazıla.

Dilərəm könülündə bu məhəbbət
Ki, nəqş olub taş üsdində qazıla.

Həvandan özgə çarə yoxdur ana,
Anun zülfiylə bənzər ki, söz ilə.

* * *

Nə dəm ki, sənsüz olursa könülə ola nədəm
Nəğəmlər ilə nə çəkər könül tapuna nə qəm.

Nəsəm ki, fürqətüni çəkə dəxi dirilməz
Var isə, çarə ana qıl, yoğ isə, ana nə səm?!

Əgər irəm tapusına bana nə'im cahim
Və gər irax düşər isəm, cəhənnəm ola irəm.

Vüsalunuz azıdurü fəraqunuz əridür,
Diləgüm ol ki, qılasın inayətüni həkəm.

Belün çəkimədi ömrincə qonşısı yükini
Yuxaru bax, neçə bən fürqəti yükini çəkəm.

* * *

Hiç belün kibi qılı vəhm xəyal qılamı,
Əql bunı görür isə xətti mühal qılamı?

Şafi'i gər görür isə ləblərinün həlavətin,
Meylüm içün bənüm ana xuni həlal qılamı?

Tanrı cəmilü ol cəmil cins sevər mücanisin
Mö'min anı bilüb dəxi tərki-cəmal qılamı?

Gözləri ox ilə cana bir dəm içində yazduğın
Hiç müğal çərisinə Rüstəmi-Zal qılamı?

Aşiqi-təşnə məst ola, irə ləbün zülalinə,
Neçə təsəvvür edəsin yadi-vəbal qılamı?

* * *

Şəha, şol ləblərindən əmən
Xəyyata irişür bir ləhzə əmən.

Sana müstəğrəq oldum bilimezəm
Ki, sən mənsin gözikən gözə ya mən.



Ləbüm xüşk oldı, ana çarə səndən
Gözüm tər qılalı yolunda damən.

Həvadan bir şərarə gördi canum
Nəsin dedüm, dedi ki, oda yaxan.

Çü zülfünün həvasıylə bilişdür,
Gərək ənbər ola bu oda yanan.

Gözün tatarınun yasağı budur
Ki, qurtılmaya bu eşqə yasanan.

Gərək ki, aşıq ola şəm kibi
Ki, pərvanə ola odına baxan.

* * *

Yürəkdən qopdı yenə bir zəbanə
Ki, gəlməz şərhi anun bu zəbana.

Vücudından könül təcrid olur ki,
Sımarlar ana bir yük sufiyanə.

Bu dəhri dəhri derlər, neyləyəlüm,
Müvafiq olımaz bizə zəmanə.

Xəyalə düşdi biliylə könülüm
Ağızıyla düşər can yüz gümana.

Könül halini yüzüm ayda durur,
Nə hacət ortada bir tərcümana.

Könül hali səbükdür gözün ilə
Qatı möhtacdur rətli-girana.

Kənarından kənar edən gərəkdür
Ki, gələ şol miyanından miyana.

* * *

Yüzünə ay heyran olalıdan
Günəş bir nəhc dövran olalıdan.

Tənüm görmədi canun kibi bir can,
Təni-insana bu can olalıdan.

Züleyxa görmədi ğozüm sənün tək,
Bu Yusif eşqə zindan olalıdan.

Gözüm bir əbrdür giryan sanasın,
Yanağun verdi xəndan olalıdan.

Ləbü dəndanda şirin nöqtələrdür,
Ləbün vəsfi be dəndan olalıdan.

Könül kuyinə çövkan zülfi oldı
Cəhan üşşaqa meydan olalıdan.

Çıxardum ol düri bu bəhr içindən
Cəhanda bəhrü övzan olalıdan.

Bənümlə eşqəvü sənünlə hüsnə
Məsəl kimdür bu mizan olalıdan.

Gülab axar yanağuna həyadan,
Könüldə eşqi suzan olalıdan.

Dürəfşan olmadı hərgiz bu gözüm
Bunun tək bir güləfşan olalıdan.

Bulud giryandururü bərq xəndan,
Saçunla dil pərişan olalıdan.

* * *

Nə sevda düşdü yenə bu xəzana
Ki, altun ilə toldurdı xizanə.



Nə eşqi ki, nihan idi könüldə
Çü gedər oldı gətürdi əyana.

Ola bənzi saru, topřağa düşə
Həvaya hər nəsənə ki, tayana.

Zəmanı vasilə nə səbz geydi
Müza'fər geydi şimdi aşiqanə.

İşarət bu qədər yetməzmi bizə
Kı, vardurur fəna əndər miyanə.

Xəzan kibi sarar, ayağına düş
Dilərsə yar eşqinə nişanə.

Firavan dəstgahı yox bəqası,
Cəhanun sudı yetməz çün ziyana.

* * *

Ləbüni dilədi dil yə'ni kəşfi-raz gərək.
Könül saçunı sevər ömrümüz diraz gərək.

Dilərsə hüsni ki, Mahmud ola aqibəti
Bənüm kibi eşigində neçə Ayaz gərək.

Bu çeşm baz ki, gəh xəstədürü, gəh xüftə
Könül ki, avlaşa, qayətdə çeşm baz gərək.

Cigər qani ilə gözüm vüzu qılur olamı,
Ki, yüzi qibləsinə qarşu bir nəmaz gərək.

Nühüftə ləbləri derlər bizə ki, ey üşşaq,
İrişməgə bu hicaza nəvavü saz gərək.

Həqiqətə iricək eşq sənü bən qalmaz
Bu nəsnəyə döyiməzüz bizə məcaz gərək.

Niyaz vəslünə varduru nazuna dəxi bin
Çün eşq nazük ola nazü həm niyaz gərək.

* * *

Könülüm bişürür sevda bu gecə
K'ola sənün ilə yelda bu gecə.

Bu gecə şol gecədür ki, dilərəm
Ki, hərgiz olmaya fərda bu gecə.

Geçər yel kibi elə girməyisər
Diriğa işbu gün dərda bu gecə.

Əcəb dünyada bir dəxi olamı,
Bənüm tək hüsnünə şeyda bu gecə.

Günün yüzi yüzün nurında laşey
Gecə zülfünlə napeyda bu gecə.

* * *

Sənciləyin əcəb əgər uçmaq içində hur ola,
Hur əgər olur isə neçəsi biqusur ola.

Günəş əgər ziya ilə aləmi xürrəm eylədi,
Zülməti zülfünün, şəha, könül içində nur ola.

Səni əgər sevər isə eşqinə dəxi aşiqəm
Eşqimi dəxi sevərəm ta ki, bana hüzur ola.

Qəddi qiyamət eylədün canuma yetmədimi ol,
Gisunı yelə verəsin ta mədədi-nüşur ola.

Bənləri qıldı müşk tək xüşk qanını yürəgün
Ta ki, zəbanə urıcax eşq odı ol baxur ola.

Badi-səba gər irürə zülfi qoxusunı yetər,
Öli dirilməgə neçün hacəti-nəfxi-sur ola.

* * *

Lə'li-ləbün kibi, bəgüm, qanı şəkər, qanı şəkər?
Dişlərünün dürri kibi qanda bulına bir gühər?



Müşk sənün saçun kibi çini nədür, xətada yox,
Ola ki, çində ahuda gər olur isə xun cigər.

Gözdə xəyali hüsnünün nəqşi-bər abdur, bəgüm,
Könülümüzdə xəttünüz yazdı cəfayi dər həcər.

Gözlərümi yaş edibən xüşk qılan dimağumı
Eşqin ola dəxi nədür bana cəhanda xüşkü tər.

Lə'lü dürər dökər gözüm yar ayağı tozına
Böylə gərək ki, qılına kimdə ki, var isə nəzər.

* * *

Türki-xəta gözi anun əzmi-şikar eyləmiş,
Zülfi çərilərinə uş yenilə car eyləmiş.

Gərçi yəminidür yəmin gözüm anun əmin bilür,
Eşqi anun yasarınun yüsr-yəsar eyləmiş.

Zülfi həvasına görə qalmadı dildə hiç qərar
Pəs neçə dəlü könülüm anda qərar eyləmiş.

Gisusı tarı dilbərün mardurur könülümə
Könüli tarü mar edən zülfini mar eyləmiş.

Gərçi kənara irmədi dərdi miyanı dilbərün
Dil zimiyan turu gəlüb əzmi-kənar eyləmiş.

* * *

İncəlik içində beli qayət
Bir tağı götürdi zi kəramət.

Sərvini qılur isə xıraman
Qopar bu tənümdə yüz qiyamət.

Miadi-visali hiç bilürməz,
Zira ki, muğis ola saət.

Bir güldürür isə, ağladur bin
Bərq ola yağışa həm əlamət.

Baxsun yüzinə özin sınasun
Anlar ki, qılur bəni məlamət.

Çox xəstələrün qanını içdi
Gövləşdi gözinə şol səqamət.

Qan ilə gərək yüzu ala dil
Ta ayrıla adətü ibadət.

* * *

Nigarı bağda gördüm gök içində,
Nola günəşi gördüm gök içində.

Nigarı zahir əgər görməz isəm,
Gözüm qarşusınadur ög içində.

Bini bir gəz anarsan bana yetər
Əgər dilər isən yüz sög içində.

Xəyalün içməyə könül içindən
Gərəksə sögü gərək ög içində.

Gök altında, yer üstində sənün tək
Gözüm görimədi gül kök içində.

* * *

Dilər isən ki, görəsin hüsnini, aç gözüni
Bax yüzi ayinəsinə gör yenə anda yüzüni.

Çeşmə dəniz neçə ola çünki dənizə girmədi,
Yar ilə birlik isdədün qıl ana qərq özüni.

Ləblərinün lətafətin dil dilər idi şərh edə,
Qeyrəti dedi ana hey söylə hədüncə sözüni.



De ki, salına qəddünə, ta ki, yaxın ola güman
Ta ki, kəman yaxın ola, sözə gətür ağızunı.

Zülfünə nəsnə deməzəm badi-səbaya uğrasun,
Qanda bulam səni, şəha, çün neçün örtər izüni.

* * *

Şəha, könül olalı gözlərünlə dürd aşam,
Tolaşdı şamənüzün lanəsinə danəvü dam.

Yüzünə baxmağ ilə göz münəvvər oldı nəzər
Saçun şəmimiyilə müəttər oldı məşam.

Bu eşqdir bəni mə'şuqü səni aşiq edər,
Bu eşq ilə dilərəm ki, sənün ilə sıvaşam.

Cəhənnəm əhli dəgüləm, nigara, cənnətiyəm
Neçəsi sənciləyin huridən gözüm yaşam.

Bu dünlə könüli isdəyü vardum eşiginə,
Dedi ki, zülfümə tolaşmış idi ir axşam.

Ayağunun tozıyam eşq yolına gəlicək
Əgərçi cümleyi-sərvlərün başına başam.

İnayətində ilahun üşə çox irmaxlar,
Qamusı qərq olalar irmağumda çünki taşam.

* * *

Tapundan özgədən xatir müərra,
Könül özgə xəyalindən mübərra.

Visalü hicrün ilə dəlü könül
Rəfiqün oldı dər sərra və zərra.

Bana səhra fəraqun ilə zindan
Bana zindan visalün ilə səhra.

Yüzi bana əyanü ağzı sirdür,
Derəm bən bu sözi sirən və cəhra(n).

Zəhi günəş yüzindən şəms rövşən
Zəhi zəhri ləbindən zührə zəhra.

Həvan odı ilə gərək su ola,
Gərək xakü gərəksə səngi-xara.

Biz anunvüzü ol bizüm, rəvadur
Əgər can qıla anunla müdara.

* * *

Can oynamax yoluna oldı könülümə deyn
Gözün ki, dəgməsün gör gözümə qarşudur eyn.

Beyn ilə tən əridi təndə canum xu sənsin
Pəs bəllüdür nə qıldı bu ortalıxda tabeyn.

Zülfeynünə tolaşıb me'rac qıldı könlüm
Çün qaşuna irişdi nə gördi qabü qovseyn.

Məşşatayi nedərsin zinət nə vechə sığar,
Zinət edinmədügün yetməzmi yüzünə zeyn.

Bən rast olduın idi qəddi ilə zəmandur,
Tolaşdurü həmişə könülüm ilə zülfeyn.

Ta kim olalı vəslün keyfümi sorma bənüm
Və'dən məta, nigara, dərdün könüldə ta eyn.

Gözlərün osrük ikən cana imamət edər
Mehrab qıla dilər cüftə qaşunı ta qeyn.

Dünyavü üqbavü eşq bu üçi cəm olımaz,
Açdunsa qapu eşqə qıl imdi sətri-bəbeyn.

İdin əgər edərsə bir dəmdə, nola, könül
Qaşlarun ilə çünki gördi gözüm hilaleyn.



* * *

Bax yürəgümdə lalə vəqti-xəzan baharı gör,
Şirləri şikar edər ahuyi-canşikarı gör.

Nərgisi məst edər gözi, badəpərəst edən bizi
Bu neçə fitnələr olur caduyi-pürxumarı gör.

Gəldi qərarı gözümə zülfivü qılmadı qərar,
Bir yil ilə uçar hələ hinduyi-biqərarı gör.

Qomadı su yürəkdə hiç qana tatandı gözlərün,
Qəmzələrünə hey de ki, qəlb edər uş əyarı gör.

Dərdi-diyarü dərdi-yar neçə çəkəsin, ey könül,
Bir qədəmüni cana bas yarunıvü diyarı gör.

* * *

İçümdəki eşqim odı nəqb etdi yenə taşuma
Ceyhun dəxi oldı xəcil, baxdı bu qanlu yaşuma.

Dünya qarardı gözümə görəli qara zülfini,
Xəstə görəli gözini sevda ulaşdı başuma.

Hər söz ilə şəhdü şəkər gözləri dökər nideyim
Çün qəmzəsinün naveki ağuyı qatar aşuma.

Bir xəlvət ələ giricək ol şəmü bən pərvanə pəs
Şəmi götür qapuyı tut, bin gəz dedüm fərraşuma.

Gecələrün ömri uzun, həmdəm olurlar eşqimə
Soyux nəfəslü sübhə bax, key baxmadı yoldaşuma.

Canü tənü əqlü könül eşiginə aparmışam
Urdı canuma gözi ox-ox zi əvəz şabaşuma.

Baxdı gözüm gördi səni, toldı cigərüm qan ilə,
Ol qanı gözdən axıdur şimdi könül padaşuma.

* * *

Könlüm dənizi şimdi yenə taşa gərəkdür,
Nəqş eyləyə eşqi bütimək taşa gərəkdür.

Tənüm qurıdı dərd iləvü oldı dəniz yaş,
Lütfün sənün, ey şəb, quruvü yaşa gərəkdür.

Eşqin sirrini bişürüben gizləyiməzəm,
Od çünki əsər qıla aşa-aşa gərəkdür.

Gözün gözümə çəkər oxın könlümə urur,
Əsrük dəxi həm atduğını şaşa gərəkdür.

Hər zahidi-xama, şaha, gösdərmə yüzüni,
Büt bənciləyin rind ilə övbaşa gərəkdür.

Kim bir göz ilə nəqşi-cəmalünə baxarsa,
Yüz göz ilə canın verə nəqqaşa gərəkdür.

Bır nöqtədə qoyan otuz iki düri-xoşab
Bin gənci nihan eyləyə xaşxaşa gərəkdür.

Aşüftədürür gisusı pürşuram anunçün,
Aşiq dəxi mə'şuqına oxşaşa gərəkdür.

Ta basa xəyalün yüzümi sulaya gözüm
Pəs bir nəzərün dəxi bu rəşşaşa gərəkdür.

* * *

Şaha, totağun könülümi ala neçə bir,
Döndərə gözüm yaşlarını ala neçə bir.

Dəstan ilə saidlərün apara könüli
Bin tə'nə ura Rüstəmi-bin Zala neçə bir.

Şuridə sözün iləvü aşüftə saçunla
Tolaşa könül qılavü ya qıla neçə bir.



İdğam edə başladı səba müşki saçunda
Şol xəstə gözün qəsd edə ə'lala neçə bir.

Xalin görəli oldı könül qüssəsi xali
Ol quzğunı bən xoş görürəm fala neçə bir.

Hər ləhzə xəyalinə dökər gözlərüm incü,
Meyl edə mücərrəd dəxi bu mala neçə bir.

Eşq aldı ələ hüsnüni gösdərdi cəhana,
Bən saçu verəm varlığı dəllala neçə bir.

* * *

Ol türki gözəl aldı canumı,
Cadu göz ilə dökdi qanumı.

Səni sevərəm, əsirgə bəni,
Aldun qomadun bəndən bənümi.

Sanum budur ki, belünə irəm,
Tiz verə çələb nazük sanumı.

Eşqi könüli eylədi viran,
Mə'mur ola çün bildüm xanumı.

Səndən canumı bən seçiməzəm,
Gərçi seçərəm candan tənümi.

* * *

Yüzüni görmək içün gözümə qılğıl bir nəzər,
Gər nəzər qılmaz isən neçə görəm, ey bixəbər.

Ol bizə gisusını uzatdıvü dedi bana
İşbu yola varmı könül dedüm ana bər.

Sən sitareyi götür ta ki, bu dövründə sənün
Şəmsi biləsin nədür, ta kim nə bilisər qəmər.

Müşki gördüm salmışam ənbər ilə udı oda,
Cümləsi razı ki, ola zülfün ilə sərbəsər.

Kuhi-dərdi etmək içün şimdi bənüm üsdümə
İncə belini görün ki, neçə quşanmış kəmər.

* * *

Səndən ayru bən dirilmək olmaya, ah, ey bəgüm!
Toşnə ayru şərbətindən haşəlillah, ey bəgüm!

Yüzün uçmağında gər meyl etdüm isə xalünə,
Adəmiyəm qılmış olam nola günah, ey bəgüm!

Rux ruxuna qarşu qodun bən piyadə saldum at,
Ariyadan varlığı gidərürəm şah, ey bəgüm!

Neçə saxlayı biləm bən yenü ayun sağışın,
Çün görürəm bən yüzündə hər gecə mah, ey bəgüm!

Kə'bə sənsin, qiblə sənsin, məqsudü mətlub sən,
Çünki səndən özgəyə can bulımaz rah, ey bəgüm!

* * *

Vəsfi ləbünün, şaha, dəxi güftə dəgüldür,
Lə'lün dəxi şimdiyə dəgin süftə dəgüldür.

Qəsd ilə qılur cadu gözün xəstə bu məsti,
Bu fitnə oyanux axır xüftə dəgüldür.

Gəh dərhəmü gəh vərhəmü gah ola pərişan,
Adəmmidür ol ki, ana aşüftə dəgüldür.

Hər cüfti ki, var taq durur hüsni içində
Meylanı məgər anun içün cüftə dəgüldür.

Kəşf eyləyəli yüzüni sevdüm səni təhqiq,
Könlüm sirini könülünə nühüftə dəgüldür.



* * *

Bəni xəyali ilə könülüm qərara gəlür,
Vəli saçını anıcax qaçan qərara gəlür.

Xəyali gəlicəgəz gözlərümə lö'lö'vü lə'l
Nigar ayağına eşq ilə nisara gəlür.

Əcəb deyəm, sənəma, işbu yaradılışdan
Tənün hərirü yürəgün çü səngi-xarə gəlür.

Neçə ki, göz yaşı ilə qızarduram yüzümi,
Yürəgümün odı ilə yenə sarara gəlür.

Gərək ki, rux ruxa uram sənün ilə, ey şah,
Piyadə olan eşigündə çün süvara gəlür.

* * *

Baharü eşqü nigarınü tolu cam oldə,
Bu cümlə olmayısardur, bəgüm, müdam oldə.

Şəha, bənüm olur isən yəqin budur ki, olur
Eşikdə bəndə fələklər mələk qulam oldə.

Əlümdə camü həmişə dilümdədür totağun
Həlaldür ağızumda vəli haram oldə.

Bizümlə söhbəti xas et, nigara, bir ləhzə
Qaçan ki, sən dilər isən çü dadın am oldə.

Neçəsi döyə könül cadu gözi qəmzəsinə
Ki, sərxoşü atıcı yay ə'ləd-dəvam oldə.

* * *

Könlümi aldun, ey bəgüm, bilimədüm ki, qandadur,
İlla bilürəm anı ki, könül alalı qandadur.

Qəmzələri ki, gözlərün atar nişanladum,
Bən cigəri boyamışam ol oxları ki, candadur.

Yazdı xətün könül halin, yazmadı hiç gözlərün
Atduğı qəmzə oxları qamucuğı nişandadur.

Bən könülümi qandadur deyü ləbindən isdədüm,
Gəldüm öz-özümə hələ bildüm anı ki, qandadur.

Yüzi içün bən ağlaram gülə bulut gözi kibi
Ağlamağ isə zahira, batin içində xəndədür.

* * *

Qəmzən sənəma urdı yenə yara yürəkdə,
Nə saxlamışam görsə idün yara yürəkdə.

Bən saxlamışam hüsni xəyalini nigarun,
İnanmaz isən tur bərü gəl, ara yürəkdə.

Şaha, könül elündür axı bir yörənü gəl
Gör ki, nə qılur zülfi siyəhkarə yürəkdə.

Şol cadu gözün sehr ilə aldı canumı leyk,
Miskin könüli eylədi biçara yürəkdə.

Bən gül görürəm yüzüni gözümdəvü leykin
Yer düzərəm öndin, sənəma, xara yürəkdə.

Azadəsiyəm nola hələ bəndənüz oldum,
Eşqün odınun yerini gör qara yürəkdə.

* * *

Eşqin bizə, ey dilbər, sərmayeyi-can olmış,
Can işi xu səhl ola can ilə cəhan olmış.

Yar ilə gecə-gündüz yeyəlümü içəlüm,
Hiç qüssə yeməyəlüm bir yeni zəman olmış.

Xali, gözi aparmış əql ilə könülümi,
Zülfinə tolaşdurmış ləbləri zaman olmış.



Könül neçə qurtılsun gisusı zireh geymiş,
Qaşı ilə kirpügi tir ilə kəman olmış.

Xüftə görürəm gözin bu dəxi qənimətdür,
Bir ləhzə hələ cana ecəldən aman olmış.

* * *

Gül yanağına bir baxunuz şamə görünüz,
Bir hindu ilə tə'nə urur şamə görünüz.

Cam əlinə verün ki, düşə gül yüzi əksi
Andan baxunuz camavü al camə görünüz.

Şahin könülüm ki, iki kövni çöpə saymaz,
Bir danə görüb düşdi neçə damə görünüz.

Bən xas anunam nedəyim ən'amı olur a'm
Kim canını oynar bu dəm ən'amə görünüz.

Sən çünki dilaram olasın olmaya dil ram,
Bu dil ki, ola ram dilaramə görünüz.

* * *

Dilər bu könülüm cana bu gecə,
Ki bir eşq odına yana bu gecə.

Sənünlə söhbət edə sübhədəkin
Nə ara, nə xu usana bu gecə.

Bizə əmdür ləbün qomaz ki, qanam
Dilər ki, girə bir qana bu gecə.

Könül miskin əsiridür saçunun
Anun içün nə yasana bu gecə.

Xəyal edər mühali dəxi könlüm,
İrəm gərək bu imkana bu gecə.

Gözümdür saxlamışduru yüzüm zər
Könül bir can bu mehmanə bu gecə.

* * *

Şaha, saçunı göricək könül qərara gəlür,
Könül ki, bin gəz apardun qaçan qərara gəlür.

Ləbün xəyali qızarıı gəlicəgəz gözümə
Bənüm bənizümi gör ki, neçə sarara gəlür.

Bu təndə ki, gözümün baxmağına döyiməz,
Əcəblərəm könülüni ki, səngi-xarə gəlür.

Səba yeli yetübən tarı-mar edər saçını,
Məgər ki, qarı içün nafeyi-tatara gəlür.

Şümara gəlməmək içün saçuna tolaşdum,
Şümara gəlməyə ol ki, bəgüm, şümara gəlür.

* * *

Pərişan oldı zülfeyni səbadan,
Müşəvvəş qıldı könlümi həvadan.

Ətəgi qoparan tozı izindən
Gözümə yeg görürəm tutiyadan.

Bəni mənsub edər eşqin tapuna
Yeg imiş eşqi yarun kimyadan.

Həzar əfsun edər cadu gözün ki,
Birisin bulmamışuz simiyadan.

Kim ayıra bəni şol qəmzələrdən
Ki, yegdür yarası yüz mumiyadan.

Dəva qanda bulınur dərdinə çün
Ki, dərdi yegdürür yüz bin dəvadan.

Xəyalin yoxlar isəm bir nəfəs çox
Gətürür bir xəbər şol dəm səbadan.



* * *

Vəslünə irənlərə təşrif nə hacətdür,
Eşq əhli müəyyəndür, tə'rif nə hacətdür.

Zülfün ilə qaşlarun məfruq ilə məqrundur
Əcvəf şəkər ağızun təsrif nə hacətdür.

Dedüm ki, müfərrihdür busən, dedi ki, billah
Dedüm ki, ləbündən sor, təhlif nə hacətdür.

Bən aşiqi-pabərca sərvün içün olmışam,
Qılca belünə barı təhrif nə hacətdür.

Belün kibi qıl qıldun pəs bunca cəfa yükin,
Əsirgəmədin ana təklif nə hacətdür.

* * *

Ay kibi qaluram tana bən barı bu gecə
Başəd ki, bulam olamı ol yarı bu gecə.

Namusı qomışam ki, məgər hasil ola nam,
Ari olayım ta ki, bulam ari bu gecə.

Gözi yasağıdur ki, ola cari bu gözüm,
Cəhd eyləyəlüm ki, yöriyə cari bu gecə.

Hüsnini münadı qılur ol eşqi cəhanda
Ol şarı nedərsin ki, dəgül şarı bu gecə.

Ağzı ilə belindən anun hasilümüz yox,
Canun yoğına oldı fəda varı bu gecə.

* * *

Yarun yenə bizüm ilə şıltağı nə imiş
Xuni gözinün sancışa yasağı nə imiş.

Qaşları yasın qurdı, gireh saldı kəməndə
Aşiq dəpələməkligə umağı nə imiş.

Canuma ki, bir zülfi qılından asılupdur,
Bunca girehü bənd ilə tuzağı nə imiş.

Oğrı gözi, yəğmaçı qaşı, ləbləri xunxar,
Hüsni çərisi içində ya yasağı nə imiş.

Sultanun olan nəsnəyə bir gəz uralar dağ
Bir dəmdə bənüm bağruma bin dağı nə imiş.

Dövrində anun bulınmaya bir dili-bidərd
Allah ki, bu dövri-qəməri çağı nə imiş.

* * *

Sevən səni gözün kibi bimar gərəkdür,
Həm dərdün ilə canına timar gərəkdür.

Kim ki, dilər isə ki, ola eşq ilə Mənsur
Miskin saçun ilə hələ bərdar gərəkdür.

Üşşaqun arasında bənüm kibi mühəyyər
Bulmaxlığa bu dünyada ədvar gərəkdür.

Əqlü könüli zülfünəvü yüzünə canı,
İsar edərəm yolçı səbükbar gərəkdür.

Gözlərümün ırmağını yoluna uçurdum,
Labüd bizə bir cə'fəri-təyyar gərəkdür.

Bənüm kibi məstə ki, keçər əql ilə candan
Məstanə gözün rəsminə xəmmar gərəkdür.

Əfkarumı çün cəm edərəm bunı buluram
Ki, canü könül eşqünə əfkar gərəkdür.

* * *

Leylim içün, Leylim içün bən bəni Məcnun edəyim,
Gözlərümün qan yaşını yolına Ceyhun edəyim.



Gəh sadı gözləri içün bən gözümi eyn edəyim,
Gahi əlif boyı içün qəddümi çün nun edəyim.

Xəmmarı gözləri içün könüli yürək qılubən,
Göz şişəsin əyağ edüb yaşumı meygun edəyim.

Çün saldı çənginə canı eşqi odı micmərinə
Bən dəxi ud tək yanmağı aləmdə qanun edəyim.

Əvvəl qədəm yürəgümi toldurdı gözüm qan ilə
Ol qan içün şimdi gözi qan-yaş ilə xun edəyim.

* * *

Gəl, ey səyyahi-pürdidə, bu yürəkdə yar işin gör,
Gözinün qəmzəsi ilə cigərümdə yarışın gör.

Neçə ki, cövrin arturur, canum dərdi dəxi artar,
Anun cövriylə dərdümün bu meydanda yarışın gör.

İtabı ilə dəpələr, diríldür işvələriylə
Gecə-gündüz bəni hər gün uyıdub o yarışın gör.

Könüli müşkilə saldı pərişan zülfüni dirşür,
Güli-nəsrini hər ləhzə qaraya boyarışın gör.

Yar işin, gör yarışın, gör uyıdub oyarışın,
Bu qamusı ilə eşqi kəmakəm uyar işin gör.

* * *

Ziba nigara canü könül tərki səhl ola
Cananədən kişi cam ya cana cəhl ola.

Zülfi kibi kəməndi ilə başum oynamax
Gösdərəyüm əcəldən əgər bana məhl ola.

İki cəhan səadəti dəxi necə olur,
Məhbub xubü nazükü zibavü əhl ola.

Gər bir cəvan dərdi ilə pir ola nə qəm,
Tifli-dü ruzə gördügi saətdə kəhl ola.

Kirmana zirə yükin aparmağ olur, vəli
Ziba nigara canü könül tərki səhl ola.

* * *

Urur eşqündə yüzüm sikkə bər zər,
Nola kim büttəraş oldıysa Azər.

Ayağun toprağı bərsər qılursam
Ümidüm var olam dünyada sərvər.

Ağızı mimi ilə qaşı nunı
Qılurlar əql ilə könülümi cər.

Vüsalünlə fəraqunçün qalubdur
Bu abü ataş içrə bəhr ilə bər.

Nə zəncirə salar zülfün könüli,
Əgər qaxdı həvadan həlqeyi-dər.

Yanağun ateşidür gisularun
Dilərlər ki, salalar oda ənbər.

Məgər gül xurda dutdı yüzünə ki,
Çəməndə susən aldı ələ xəncər.

Gözümün yaşı uzun, gözüm aydın
Ki, yaş dənizinə bıraxdı ləngər.

* * *

Neçə urdı yürəgə ox qanamadı gözləründən,
Ey neçə əyaxlar içdi qanamadı gözləründən.

Belünə əl irmədügin nə deyəm ki, xoş bilürsin,
Gözüm uyxuya gecələr irəmədi gözləründən.



Tutayım ki, qəmzə ilə bəni xəstə qıldı gözün
Ləbünə nə gəldi bir dəm soramadı gözləründən.

Nə dəvaya ki, dilərsən könül irdi ləbləründən
Vəli xəstə canuma əm deyəmədi gözləründən.

Neçə xişm gördi cismüm, sənəma, gözün oxıyla
Nedəlüm irişdi lütfin görəmədi gözləründən.

* * *

Qonmasun şəh yüzünə toz, çələbi,
Görməsün səndən özgə göz, çələbi.

Ol yüzi ki, cəhana gösdərdün
Kimdə ola ki, baxa yüz, çələbi.

Tuzmıdur ləblərün ki, şəkkər axar,
Nə şəkər ki, dökilə tuz, çələbi.

Eşq toldı ləbündə qo əmsün
Quzı içməyəmi ağuz, çələbi.

Eşq dedükləri bir uyuzdur
Səpişə şa'llah bu uyuz, çələbi.

* * *

Könlüm yenə bir eşqə sər ağaz edisərdür,
Yar niyyətinə bir dəxi pərvaz edisərdür.

İrərsə əl ətəginə möhkəm tutısaram,
Bən ana niyaz, ol bana bin naz edisərdür.

Könüldə anun eşqini bən gizləyə idim
Leykin nedeyim qəmzeyi qəmmaz edisərdür.

Şol gisusı ki, badi-səba ilə yarışur
Eşq ilə neçə sərvəri sərbaz edisərdür.

Ol şəh ki, gözin baz edəli gördi özin baz
Anun işini neçəsi şəhbaz edisərdür.

Bəni çü qılur Sə'di əcəb olmay gər ol
Sivası dəxi xitteyi-Şiraz edisərdür.

Dəmsaz əgər olmaz isə ləbləri bana,
Əlbəttə nəvasını könül saz edisərdür.

* * *

Nigara, bir uzun gicə sənün ilə məcal olsa
Ki, sevdayi-səri-zülfün tapunda vəsfi-hal olsa.

Ağızunı bəyan etsəm ana vəhmüm sığarmısa
Belüni şərh eyləsəm ana bənzər xəyal olasa.

Günəhkar olmaya idi cəhanda adəmi hərgiz
Əgər huridə bunun tək dəxi bir zülfü xal olsa.

Nolaydı xub olanlar sənün tək tuzlu olaydı
Və ya sahib məlahət dəxi sən tək bacəmal olsa.

Çü zülfün saldı ayağa, şəha, miski rəvadurur,
Əgər gülşəndəki sünbül yoluna paymal olsa.

* * *

Qış gecələri yandurayım anca buxarı,
Başəd irürə gülşənə yandura bu xarı.

Arturdı məgər yürəgümə eşqi odın ki,
Gözümi bulud eylədi başdağı buxarı.

Qapdı könüli gözləri, qurtılmadı andan
Sunqur nitə ki, seyd edə gökdəki uxarı.

Eşqi yaxarü hicri yıxar, qəmzəsi yuxar,
Sihhət canuma yaxarü yıxarü yuxarı.



* * *

Yox cəhanun bəqası, pəs nedəlüm,
Dərdinün yox dəvası, pəs nedəlüm.

Yaralandı könülü girməz elə,
Ləbinün mumiyası, pəs nedəlüm.

Dutaram ləblərin könülüm içün
Budurur xun bəhası, pəs nedəlüm.

Cövrü hicranü naz və'dəsidür,
Bu könül kimyası, pəs nedəlüm.

Eşqə girdük gərək fəna olavuz,
Bu imiş eşq əsası, pəs nedəlüm.

Ay yüzündə dedüm nə danədür ol
Dedi ki, yüz qarası, pəs nedəlüm.

Bizdən andan arada nazü niyaz
Ulaşıxdur arası, pəs nedəlüm.

* * *

Sun-sun əyağı saqivü sən çəngünə al ud,
Geyisə qopa işbu nəfəs səəti məv'ud.

Gəlməmiş ikən nəqşi-cəmalün bu cəhana,
Olmamış idi büt dəxi dünyada məscud.

Ol oda bıraxdı könüli hüsni nigarun
Ki, səhl ola qatında anun atəşi-Nəmrud.

Ahumdan, ey şəh, yüzüni neyçün qaçurursın,
Ud odda qaçan yansa qılur dudı gözə sud.

Bir işvə ilə tur der isən ölülərə sən
Ol ləhzə qiyamət qopa mə'dum ola mövcud.

* * *

Yoluna canü dil vermək nigarına ibadətdür,
Can alub eşq verməklik bu yolda xərqi-adətdür.

Ölür isəm yolunda bən həyata sayaram anı
Şəqavət şah eşigində bana xoştər səadətdür.

Nə zəhmət ki, çəkərəm bən şəha, rəhmətdürür yolda
Gözündən xəstə olursam totağundan iyadətdür.

Pərişan olalı zülfün bana oldı yaqın, şaha
Ki, can almax ləbün çağında gey şirin lətafətdür.

Gözünün qəmzələri gər qılur könülümə nöqsan
Ana nöqsan deyiməzəm, zira eyni-ziyadətdür.

* * *

Gər gösdərə şol gisularun sərsəri-muyi,
Əqlü dilü can cümlə ola bər səri-muyi.

Çün muyi-miyanuna könül olmadı layiq,
Əqlüm dəxi həm olmaya dərxor səri-muyi.

Gər zülfün açub arizüni gösdərür isən,
Dünyada dəxi qalmaya kafir səri-muyi.

Qıl bitdi gözümdə ki, görəm beli qılını,
Şimdi bu gözüm göz ola əndər səri-muyi.

Cəzm etdi ki, kəsr edə gisusı bu könüli,
Vəslindən anun qalmadı dil cüz səri-muyi.

* * *

Bən gül sevərəm, anun içün xarı sevərəm,
Bən şəkkər içün külbeyi-əttarı sevərəm.

Əfsunı iş etdüm görəli cadu gözüni,
Qəmzən görəli dərd ilə əyyarı sevərəm.



Yegdür geçə keçiməyə sevdügini aşiq,
Bu xəslət içün səb'əyi-səyyarı sevərəm.

Bir neçəyə, bir incəyə düşmək qayusı yox,
Ol incə belindən canuma barı sevərəm.

Bazarı dəgüləm nişə bizarı sanursın,
Eşq əhlini mə'şuqına bazarı sevərəm.

* * *

Eşq əhli qamunuz gəlünüz ah edəlüm, ah,
Könül elinə ol büti bir şah edəlüm, şah.

Nə hüsnü cəmal olurü nə lütfü kəmalu
Nə işvəvü nə şivəvü nə naz olur, Allah.

Görməz olur isəm səni, görinməz olam bən,
Günəşi əgər görməyə görinməz olur mah.

Zülfüni tutub vardı zənəxdanuna könlüm,
Uş oğrıvü uş silsiləvü işdədürür çah.

Zülfünə de ki, boynumı bəndinə gəmişə,
Ta bir gecə bəni sənün ilə görə bədxah.

* * *

Çin deyəlüm saçun ilə düşdi xətaya gözlərüm,
Cadu saçun çini ilə düşdi xətaya gözlərüm.

Könülümün yaxasını dutub apardı gözinə,
Sonra yaxamı dutıban saldı yaxaya gözlərüm.

Dərdə dəvadurur bu dəm könülə bir həva yeli
Bir su kibi qəbul edər dərdi dəvaya gözlərüm.

Gərçi ki, aşina dəgül bəhr ilə bu qara gözüm
Diləram aşinasını şimdi sınaya gözlərüm.

Gözləri ilə qaşına düşdi isə könül nola,
Düşdi isə xəta dəgül ox ilə yaya gözlərüm.

Gözlərüm əsridür dili gözlərinə baxalıdan,
Nişə gərək ki, əsriyə baxdısa aya gözlərüm.

Gisusı ömrümüzdürür gözlər anı bu gözlərüm
Şöylə ki, ta ola cəhan yaş uzaya gözlərüm.

* * *

Gəlün bir söhbət edəlüm, ilahi,
Ki, tovhid ola hali hər məhali.

Saçından özgəyə tolaşmayalum,
Əgərçi yoxdurur ana tənahi.

Könüldə nişə sultan ola ol ki,
Sayımaz taətə ulu günahi.

Yüzünə məh deyiməzəm, günəşdür,
Vəli can göz yaşında oldı mahi.

Gözinün fe'li yavuzdur eşitməz,
Əgər ögüt verürsə nik xahi.

Ləbün bir busəyə yüz bin can isdər,
Bəhasın necə yetürə sipahi.

Belündə biır dəqiqə var ki, aşiq
Çərağ alub ələ isdər bu rahi.

* * *

Nə xoş naz olurü nazük kirişmə,
Canunı oynayımazsan girişmə.

Ləbünə can tuza axar tək axmış,
Canum yandı ləbün barı yaxışma.



Könül sana savun, bana axışdı
Kərəm qıl bənüm ilə göz qaxışma.

Əgər yad edisərsən özgələri
Kərəm qıl, ol nigar ilə bilişmə.

* * *

Dildə eşqün saçunun küfrini iman yazmış,
Dərdüni bu tənümə eşqün odı can yazmış.

Gərçi müşkin saçunun yazmağı gey müşkil idi,
Dil xumarını gözün gör ki, nə asan yazmış.

Sən gözün mərdümini gör ki, nə mərdümlik edər,
Əhl yaraluvü bidili yeksan yazmış.

Mürdə könülümə heyvan suyını saçdı ləbün,
Qul olayım xətünə ki, anı insan yazmış.

Ləbü dəndanunı gördüm ki, gözüm lə'lü dürər
Dökər oldı ki, könüldə yeni dükkan yazmış.

Lə'lü dür nəqşini qıl qələm ilə yazdı gözüm,
Zər varaq üzrə yenə ziləbü dəndan yazmış.

Verüb idi könül evinə xəyalini qonux,
Bir yürək süci dəxi ratibi-mehman yazmış.

* * *

Olalı qara zülfeynün şikəstə,
Görürəm gözlərüni dəxi xəstə.

Sabahın toğmadın gün səni gördüm
Sücud etdüm zəhi fali-xücəstə.

Gözün yüz qəmzə oxın urdı cana
Şikayət qılıcax der uyma məstə.

Qara zülfün ki, miskin etdi müşki
Qılur ənbər bəhasını şikəstə.

Nə dəstə güldürür, şaha, yanağun
Ki, gül dəstələrini qıldı dəstə.

Məgər paludə qılısar yaşumı,
Xəyalün oldı gözümdə nişəstə.

Həzaran nəsnə gördük zülfünə ki,
Birini görməmişüz dexi rəstə.

Xuda sevdi cəmali der Mühəmməd
İcazət olmayamı bütpərestə?

Ləbündən bən umaram ki, əmərsəm
İrişəm ləzzəti-cami-ələstə.

* * *

Gözümdə sənün zülfün sevdayi-siyah
Könüldə be cüz hüsnün zi ulu günah.

Eşqünə deyəm ləbbeyk yüz yil ölibən
Üsdümdə əgər bitə bin dürlü giyah.

Görəli görimədi gözüm günəşi,
Ol gecə gözikəli gönimədi mah.

Gər sən bənüm olursan zi rəhməti-həq,
Gər bən sana irərsəm zi lütfi-ilah.

Sevda ilə əqlümdür bir tac ilə sər
Canum ilə eşqündür bir təxtü külah.

* * *

Yanağun bir gül durur ki, sayə pərvərdür, bəgüm,
Ləblərün abi-heyvanı həvzi-kövsərdür, bəgüm.



Gərçi rumidür yüzün, fülfül bənün hindudurur,
Bən ana şükr edərəm ki, xali dərxordur, bəgüm.

Zülfün ayağına yüzüm toprağ edərsəm nola,
Çünki sünbüldür otıvü xaki ənbərdür, bəgüm.

Xətti yazmış ləbləriyçün bir bəratı əqlümə
Can qəbul etməz anı çünki müzəvvərdür, bəgüm.

Bən sənün hüsnün görəli nola eşqə talmışam,
Hüsnünün hər yaprağı eşqi-müsəvvərdür, bəgüm.

Nüh fələk gər bilür isən eşqüm andan biştər,
Nöqtəyi bilürsin axır səbri-kəmtərdür, bəgüm.

Dürri-mənzum oldı şe'rüm dişləründən deyəli,
Zülfünün dəftərləriyçün ki, mübəttərdür, bəgüm.

Bən ağızundan deyicək cövhəri-fərd ayduram,
Lə'lünə şəkkər deməzəm, çün mükərrərdür, bəgüm.

Xütbə nola gül yüzünə oxır isə əndəlib,
Çün bənüm yüzümdə şimdi sikkə bər zərdür, bəgüm.

Bən niçə sərbəsər olam zülfünə, birdür sərüm,
Zülfünə baxar olursam sərbəsər sərdür, bəgüm.

Dərbədər bən geziben çox həlqeyi-dər qaxmışam,
Gər qəzadur, qəmzənün oxı müqəddərdür, bəgüm.

* * *

Ayrux qapusın hiç könülüm qaxmaya şallah,
Gözüm yaşı cüz sənün içün axmaya şallah.

Gözlərümi bən yaş ilə toldurdum anunçün
K'ayrux yüzinə qarşu turub baxmaya şallah.

Eşqi odı eylə ki, bənüm könlümi yaxar,
Dilək budurur hiç könüli yaxmaya şallah.

Bədr ay ki, bizə toğdı bu gecə var ümidüm
Ki, dayim ola dəxivü oyaxmaya şallah.

Gecə ömürümdür anı uzatğıl, ilahi,
Canum canıdur sübh məgər çaxmaya şallah.

Ah eylədüm eşitdi anı badi-şimali,
Gülşəndə könülüm halini çaxmaya şallah.

* * *

Bu nə hüsn olur, bu nə boydur, nə sin,
Afərin, can, afərin, can, afərin!

Adəmimisin və ya huri, nəsin,
Afərin, can, afərin, can, afərin!

Başdan ayağa sevərəm cümləsin,
Afərin, can, afərin, can, afərin!

Sorıcağaz deyiməzəm ki, nəsin
Afərin, can, afərin, can, afərin!

Gərçi çeşmüm cismi-mövzunun görür,
Afərin, can, afərin, can, afərin!

Könülüm bilür ki, sən cananəsin
Afərin, can, afərin, can, afərin!

Bəndə bənlik qomadı cadu gözün,
Afərin, can, afərin, can, afərin!

Bəndəgiyi göricək inanasın
Afərin, can, afərin, can, afərin!

Dedüm ana ki, nəyəm odunda bən,
Afərin, can, afərin, can, afərin!

Dedi bana ki, nə isən yanasın,
Afərin, can, afərin, can, afərin!



* * *

Yayağ oldı könülüm, oynadı at,
Ruxlarun deyəli bana şah mat.

Qancaru baxsam gözüm səni görür,
Sənün ilə zira tolıdur cihat.

Mancınıq oldu həvanü top canum,
Qancaru ki, dilər isən anı at.

Bəndə can bəndündürür lütf eyləgil
Qılmağıl azad anı, lə'lünə sat.

Cana istiftah əgər etdün isə
Qədrümüzcə bizə dəxi yaz bərat.

Ləbləründən bir sədəqə umaram,
Gərçi bilürəm ki, lə'lə yox zəkat.

Çün şifahundur şəfa xəstə cana
Ola kim anun ilə bulam nəcat.

* * *

Bahar oldı gülə başladı lalə,
Qılur gülşəndə bülbül yüz ə'lalə.

Dilü canü könül bənümlə turmaz
Bizi səhraya qılurlar həvalə.

Həva işmam edəli gül qoxusın,
Qılur bülbül nəvasına imalə.

Rəbi oldı mühərrəmdür təğafül,
Susamış neçə səbr edə zülalə.

Bu bir canumı canana verürəm,
Deynüz qaziyə ki, yazsun qəbalə.

Könül hərçənd ki, eşqi ilə gəldi
Sənün ilə gərək irə kəmalə.

Günəşdən ayrılıcax ay olur bədr,
Bən ayrılalı bənzədüm hilalə.

* * *

Bahar irişdi yenə yer geyindi hüllə bu gün.
Süciyə and içənə vacib oldı büllə bu gün.

Bir oba olmaya ki, anda çalğu yox bu nəfəs
Cəhanda süci içilməz qanı məhəllə bu gün.

Əsiri-eşqdurur cəvq-cəvq bülbüllər,
Geyiklər əsriyibən oldı gülə, güllə bu gün.

Gözüni qüdrəti-Allaha taldırursan sən,
Səvaba dönə əlündən gəlürsə zəllə bu gün.

Kəlal bulma, nigara, bənüm inildümdən,
Bəharü eşq ilə qızmışdurur kəllə bu gün.

* * *

Ol lütfi saqiya ki, əlündən müdam edər,
Hər ləhzə lə'li-ləblərün anı müdam edər.

Gözün ki, bər dəvam atar qəmzə oxların,
Minnət urur yürəgümə, yə'ni dəvam edər.

Lə'lün həlaldür bana anı həram edən
Kafir olur dinində, həlalin həram edər.

Nə ruhsın ki, huri-behişti cəmalünə
Hər can ilə ki, dünyaya gəlür səlam edər.

Dedüm gözüm səqamıdurur göz olub axar
Qarşuma süzdi cadu gözin ki, səqam edər.



Hüsnində hiç yer olmaya ki, bin əsiri yox,
Xalini dəxi danəvü zülfini dam edər.

Zülfi həbəş çərisini derdivü yasadı,
Bu mülki-nimruzını alırü şam edər.

Odlara yaxa xali anun udı micmərin
Zülfeyni ənbərə tolaşıbdur ki, xam edər.

Əsritdi bəni şimdi dilər bəndən əsriyə
Anun içün yaşı meyü gözləri cam edər.

* * *

Xüftəvü xəstədür gözün, bən ya neçəsi sağ olam,
Gərçi ki, yaxınam sana, səndən irağ-irağ olam.

Baş ayağuna qoyalı gərçi ki, dünyaya başam,
Şimdi ayağı basmışam ki, tapuna ayağ olam.

Yürəgümi gisun içün fətilə ənbər etmişəm,
Ta ki, uzun gecədə şəm'ün çirağ olam.

Zəngi gözün içün, şəha, çün bəbəşidürür könül,
Eybə sayılamı əgər başdan-ayağa dağ olam.

Fürqətün ilə göynərəm, vüslətün ilə yanaram,
Artuğ olur cana xətər neçə ki, bən inağ olam.

* * *

Yenə vəqtümüzi xoş qıl bizüm, mütrib, neyü dəfdən,
Genə sunğıl bizə, saqi, tolu əyaxları kəfdən.

Nəvaziş qıl bizi, saqi, rəqibün sözinə baxma,
Süleymani-məlahətsin, nə qorxun vardur Asəfdən.

Yeri gər döşək edibən taşı bən yasduğ edərsəm,
Eşigündə bana yegrək cinan içində rəfrəfdən.

Xətün nələr yazar, cana, bənüm alnumda kim bilür,
Deyiməzəm ki, bizaram bu təvriti-mühərrəfdən.

Şəha, canı qodum, caməvü tutdum gözünə ayax
Görəlüm ki, nə toğısar bu təcnisi-mütərrəfdən.

Səni bən sevmişəm şahavü ölüncə sevisərəm,
Qağan aslan bu bişədə neçəsi qorxa əf-əfdən.

Sözüm rəngin deyü, şaha, əgərçi var idi ücbüm,
Görəli yüzüni keçdüm bu də'viyi-müzəxrəfdən.

* * *

Necə bir eşqün ilə yana könül,
Nə ola əqlü canü ya nə könül.

Getdi qoymadı evdə rəxtini hiç,
Dayima sevinür ziyana könül.

Çünki kəndüligini qıldı fəda,
Nə içün can içün yacana könül.

Qana qan isə qandurur yürəgüm,
Gərək idi ləbünə qana könül.

Belün ilə xəyal bağladı ki,
Düşdü ağzun ilə gümana könül.

Əvvəl ol getdivü yenə bulınur
Növbəti-axırı-zəmana könül.

Tutayım, tutmayam könül cəhətin
Döyəmi tir ilə kəmana könül.

* * *

Könlüm yenə meyl eylədi oda yanasına
Lə'lindən ümid eylədi qana qanasına.



Könlüm nola meyl etdi isə xalinə anun
Adəm dəxi meyl eyləyə buğday danasına.

Paludə qılur kirpügümü süci dökər göz,
Zamin olımaz kimsənə barmax banasına.

Bir sanıbanun könüli ana fəda qıldum,
Varmadı könülüm dəxi sanu sanasına.

Yaş qızılü bəniz saru könül qara qəmdən
Fikri kimün irəvü bu yanu yanasına.

* * *

Könülüm lə'li-ləbiyçün dəmbədəm çün qandadur,
Nisbətin təhqiq edicək ləblərinün qandadur.

Ta ki, dəm bəstə olup, gül dəstə ola yüzünə
Neçə ki yaz gələ, gülün dövləti payəndədür.

Vəslü hicranun ilə xoş keçürürüz bu yazı,
Əbr giryan olur isə suri gül pürxəndədür.

Arif isən anmağil dünivü sorma yarını,
Kim halini gözədə eşq ilə pabəndədür.

Zində isən dünyayı mürdəyi tərk etgil yara,
Mürdəyə meyl etməyə bər ki, cəhanda zindədür.

Aşiqəm dinüm budur ki, eşqdür dinüm bənüm,
Bən imamam bana uysun şol ki, işbu dindədür.

Çün bənəm anun günəş yanaxlarına müştəri,
Qəmzə tiri pəs neçün pərvin ilə kəbindədür?

* * *

Bu gün könlüm yenə divanə gəldi,
Vəli aqil dəgül, divanə gəldi.

Gözüm mərdümlik edüb dökdi yaşın
Nigarın yolına mərdanə gəldi.

Qanı gisusı çövkanı nigarun
Könülüm guy olup meydanə gəldi.

Bişürdüm can verüb vəslün yemişin,
Ayırma çün ləbü dəndanə gəldi.

Sana Yusif kibi biçarə könül
Öz ayağı ilə zindanə gəldi.

Nə damı eşq ərinə kim düzərlər,
Bizüm yolumuza ol danə gəldi.

Biz onı eşq ərinə saymazuz ki,
Bu yola can ilə ya cana gəldi.

Nə qətrə ki, olur eşqünüzə qərq,
Görəsin son ucı dürdanə gəldi.

Saçunı görsə müslim ola kafir,
Yüzün müşrik görüb imana gəldi.

Sana, ey can, necə bir gələ canum,
Cana gəlməkligi ilə cana gəldi.

Yüzünə döymədi, sığındı zülfə,
Günəşdən qaçıban seyvana gəldi.

* * *

Yürəkdə gözlərinün yarəsidür,
Könül xud eşqinün biçarəsidür.

Uzun gecələr içində bu könlüm
Müsəlsəl zülfinün avarəsidür.

Dedüm, zülfi gedər xalüni gösdər
Dedi, uzatmağıl yüz qarəsidür.



Gözümdən atılur yaşlar sanasın, –
Ki, şamun camiən fəvvarəsidür.

Gözüm guşəsinə gəlsün xəyalün
Ki, can bu gecə sizə varəsidür.

* * *

Boyun sərvü tənün çün yasəmindür
Cəmalün şəmseyi-ruyi-zəmindür.

Könül girəli mehrabi qaşuna
Nə ki, dilər isə həqdən əmindür.

Əmin sorar könülüm ləbləründən
Onı tutma əcəb, ruhül-əmindür.

Könüli gördi can zülfində qəmgin
Dedi, nəsin, dedi, aləm həmindür.

Cəhan gər müştəri ola rəvadur,
Çü dilbər afitabi-məhcəbindür.

* * *

Nigara, yenə seylab oldı gözüm,
Yürəgüm qanü dolab oldı gözüm.

Görəli çeşmi-pürxabın nigarun
Əcəb dəgülmi bixab oldı gözüm.

Yürəkdə qalmadı qan ləblərünçün
Gözüm qanı dəxi ab oldı gözüm.

Çü dövlət oyanuxlara irişür,
Gözümə xab həm xab oldı gözüm.

Yaşum qanı əgər əksildi nola
Gözüm dəxi çü innab oldı gözüm.

* * *

Gözümi gör bənüm qərqab içində,
Könülün dut əlin seylab içində.

Gözün çün fitnə oldı xüftə behdür
Nələr qılur cana gör xab içində.

Göz ilə, cigər ilə dil nə qıla
Gəhi ataşdə, gahi ab içində.

Bu suffada səfa qəsdi xətadur,
Çü bən yol bulmamışam bab içində.

Qulun üşşaq içində fərd düşmiş
Nitə ki, xizmətün əhbab içində.

Varum oynayayum yar varlığına,
Bunı öğrənmişəm adab içində.

Bu göz yaşında odlar gösdərəyim,
Çü gördüm günəşi məhtab içində.

Yüzümdə bitdi müəsfər rəvadur,
Gözüm dolabıdur xunab içində.

Ləbündə könülüm halini gör ki,
Əcayib təşnədür sirab içində.

* * *

Olmadı, bəgüm, çarə dəva ilə bu dərdə,
Öylə yazılu idi qəza ilə qədərdə.

Çəkdi gözi oxın yürəgi qarşu apardum,
Keçdi canuma durmadı oxı bu sipərdə.

Yazdı könülində sanasın hicr bitigin
Nəqş eylədi ayrulığı yə'ni ki, həcərdə.



Əsritdi bəni lə'li-ləbi məgər anunçün
Ki, eşqi həvası səkir eylədi şəkərdə.

Həmvarə bənüm sirrümi faş eylədi yaşum,
Ol mə'ni içün gəlmədi göz yaşı nəzərdə.

* * *

Canısın canuma, leykin sən canumun canısın
Lə'l kanıdur totağun, sən şəkər dükkanısın.

Eşqdür dinüm bənüm ol sənün ilə rastdur
Pəs həqiqət baxıcax sən dinümün imanısın.

Ağızundan təngü belündən girandur canumuz
Nə ki, canlar çəkər isə yoluna ərzanısın.

Can zənəxdanı çəhində özin azıtdı dedüm
Sana nə gəldi özün aldurmağıl mehmanısın.

Səndən özgə könülüm təxtində şah oturmaya,
Çün bu elün xanısın, sən xanısın, sən xanısın.

Müştəri olmax dilərdi günəş anun eşqinə,
Bax gözi tirinə dedüm bil ki, bir keyvanısın.

Zəhr ilə tiryəki həq cəm eyləmiş bir yerdə gör,
Vəslü fəsl ilə cəfana dərdünə dərmanısın.

Sən qamu insanı eyni olduğun dəgül əcəb
Bül əcəb oldur ki, sən bu eynümün insanısın.

Bən necə can aparam k'ol həzrətə ola qəbul,
Çün qamu zirələrün sən, ey sənəm, Kirmanısın.

* * *

Səbzəvü ruyi-nigarü növbahar,
Könlümə qomadılar hərgiz qərar.

Ölülərdür kim diri olmış qamu
Gər ülul-əlbab isən qıl e'tibar.

İxtiyarum qalmamışdur həq bilür,
Qılalı könlüm tapunı ixtiyar.

Gər rüxünçün şah mat olam nola,
Nət' içində bən piyadə, sən süvar.

Ol miyanun gər konarın bulmayam,
Bu miyanından necə qılam kənar.

Barı belünə verən barı içün
Getmədi bu könülümdən bari bar.

Kim ki, bir tatarına gisusının,
Verür isə könlin olur tarumar.

* * *

Qanı bənüm ilə sənün əhdi vəfalarun, bəgüm,
Neçə-neçə bu canuma cövrü cəfalarun, bəgüm.

Ləblərüni şəfa deyüb dərdünə bağladun bəni,
Dərtlü çü eylədün bəni, qanı dəvalarun, bəgüm.

Zülfünə döndi könülüm hiç qərar bulmadı
Gör ki, bu qılca canuma netdi həvalarun, bəgüm.

Qəddünə rast deyəyüm oldı müheyyər işbü dil
Vəqti durur ki, irişə cana nəvalarun, bəgüm.

Qodun əzəl bəlasını bizüm ilə, ey aşina,
Şimdi nədür bu canuma bunca bəlalarun, bəgüm.

* * *

Ənvar olalı şol sərvündə dalı,
Əlif qəddüm həvadan oldı dali.



Belin qıl etdi barı barın ağır,
Necə götürisər bunca vəbali.

Qan olsun deyiməzəm ləblərinə
İçər susamışa qarşu zülali.

Güləfşanda gözüm oldı dürəfşan,
Əgər bir dəm əsə badi-şimali.

Əgərçi ayda bir görməz yüzini
Gözümdən xali heç olmaz xəyali.

Totağı içün dökərəm dür anunçün
Bəlürdürəm lali ilə ali.

Saçı şəstiylə gözinün küşadı
Gətürür qayda yüz bin puri-zali.

Gərək hindü həbəş çinə qaçalar
Qaçan ki, düzə zülfini yasali.

Dilü əql ilə canı qarət edər
Saçar qatı haramı ilə həlali.

* * *

Könlüm dənizi eşq ilə taşa olamı ki,
Mehrüm dilündə nəqş edə taşa olamı ki.

Baş etdi cövri yürəgi bitdi anun işi
Lütfi mədəd əcəb qara başa olamı ki.

Derlər ki, xubdur vəli əxlaqi xoş dəgül
Xoşdan yavuz necə gələ haşa olamı ki.

Anca döker gözüm yaşı ki, ağladı bulıd
Andan əcəb mədəd dəxi yaşa olamı ki.

Az qaldı ki, başuma irə yaş yoluna
Böylə varursa bir zəman aşa olamı ki.

* * *

Tapuna irişən divana döndi,
Səni kafir görüb imana döndi.

Ləbündən dəm uranlarun neyiçün
Qanı suyavü suyı qana döndi.

Əya şahi-məlahət dad səndən,
Dəpələrsin anı kim xana döndi.

Əgər döndi isə könül tapuna,
Anı xoş saxlağıl mərdanə döndi.

Əgərçi bürcü barü var bu şarda,
Çü oldı xatirün meydana döndi.

* * *

Yanar eşqün ilə dildə qanadil,
Boyanmışdur ləbün ilə qana dil.

Anadildür tanux inanmaz isən
Ki, düşdi eşqün ilə dər ana dil.

Bəla bil canuma şuni dəxi ki,
Səhərgəh nalə qılurlar bəlabil.

Bənüm olmaz isən bəndən nə hasil
Xüsusən açdı pərrini havasil.

Yüzün tədviri içində mümessəl
Görürəm olısarsın bana mail.

Vücudumı ərit hicrün odıyla
Ki, oldur ortalıxda bizə hail.

Sənün irzüni sanmasam yazaydum,
Gözümün qanı ilə yüz rəsail.



Zənəxdanunda könlüm çaha düşdi,
Nə lazımdur bana bunca səlasil.

Şəha, əksükligümdən özgə yoxdur
Sizün tapunuza hərgiz vəsail.

* * *

Kimün ki, ola məhbubı lətifü xubü narınca,
Əcəblərmisin oxşarsa yüzinün rəngi narınca.

Xəlifə xanü sultanü məlik tətğavulü qazi
Fəda qılur sana özin qamusı varlu varınca.

Gözün içgicidür axı gərəkməzmi ana yürək
Könüli yürək edinsən anı uş böylə yarınca.

Anı ki, səndə bən gördüm qaçan qoyısaram anı
Qaçar dəxi olur isən qovısaram sən arınca.

Gidər yüzdən niqabunı ki, hüsnün aləmə düşsün,
Nə lazımdur sənün içün bizi taşlaya bir niçə.

Nə heybətdür ki, qılurlar bənüm canuma gözlərün
Bana çək ayruğa atğıl bu yürəgümi yarınca.

* * *

Yanduğum oda eşqünə axır dəlil olur,
Oduna eşq ilə salan özin xəlil olur.

Gözüni xəstədür xo görürüz hicab yox,
İllət nədür anı görənlər əlil olur.

Lə'lün içün gözüm axıdur incü anca ki,
Seyl oluban axar eşigündə səbil olur.

Necəsi şahid anlayayum bən əcəb səni,
Kimi şəhid yoluna, kimi qatil olur.

Zülfün həvaya uçduğıçün saldun ayağa
Mə'şuqə eşq əhli olanlar zəlil olur.

Gözüm yaşı odundan axar olmaya əcəb,
Ol ot kı, ol bitürə əgər zəncəbil olur.

Cənnətdürür yüzünü özün hurieyn kibi
Ağzun yarı məgər məsəli-səlsəbil olur.

* * *

Lütfi Həsən, xülqi Həsən, hüsni Həsən, ol Həsən
Əlhəmdü-lillahil-ləzi əzhəbə ənnə'l-həzən.

Ta bə əbəd canü könül zülfi yolına fəda,
Böylə olur adəti aşiq ki, ola mümtəhan.

Hər günü hər həftəvü hər mah ilə hər sal olur
Mərdümi bu gözlərümün yüzünüzə müftətən.

Necəsi ola dəxi ləbüni soran, ey bəgüm,
Qanmaya heyvan suyına qanar isə bir qanan.

Bən sənünəm, sən bənüm ol, qılma dəxi qilü-qal
İnanayım bəs sana, sən dəxi bana həm inan.

* * *

Düşibən gisularına salalı qıl qıla bizi
Nə lazım incə bilün kim dutıban qıl qıla bizi.

Nə hər tatarı zülfinün ki, yetər bana bir tarı,
Cəmali devriliyor çökərdür silsilə bizi.

Gözün dilər isə bir dil dilə al nişə dilərsin,
Dutalum ki, gözün dilər, nə içün dil dilə bizi.

Zənax zindanına saldun, nə sehr edər yenə zülfün
Pərişan qılmasun hey di ki, çahi-Babil belə bizi.

Nigara, gərmi-suziylə bəni sevdaya nərm etdün
Ki, bir nöqtəyi gösdərdüb düşürdün fülfülə bizi.



* * *

Nigarına bənüm halüm sənün ilə müəmmadur,
Ləbi-lə'lüni görəli bu gözlərüm müdəmmadur.

Görəli incə belüni gəl imdi cismümi görgil
Vücuduma nəzər qılğil ki, ismi-bimüsəmmadur.

Bizə batin gözi ilə nəzər qıl çünki səndə nur
Məzahirdə bu zahir gözi zira qatı ə'madur.

Əgər özgəyə zəhr isə anun eşqi bana tiryək
Və gər xar isə bin şükür ki, dərdi bana xurmadur.

Cəhan gözümə qararur pərişan olalı zülfün,
Həvaya iabe olmaxlıx bu könlümə nə sevdadur.

* * *

Könül dilor ki, irə bir qərinə
Yüzüm sarısı anadur qərinə.

Nə ahudur bilimezəm nigarın
Ki, olmaz seyd bu şiri-ərinə.

Tənüm micmərdə ud oldı çü gördi,
Yarın yüzində müşkin ənbərinə.

Anun zülfində çənbərdən keçərəm
Açun ağızunuzı afərinə.

Əgər sən lə'l qıldun ləblərüni,
Hələ bən yüzümi qıldum zərinə.

Yüzümdə saruvü qızıl ilə al
Düzə idüm vəli gülşən yerinə.

Dişinə dür dökər gözüm və leykin
Könül eşqi yolındadur nərinə.

* * *

Ta xəyalündən könüldə nəqşi-ziba urmışam,
Ey bəsa noqqaşı çin ilə sərü pa urmışam.

Mey ləbi-lə'lünə özin nisbət eylədügiçün
Qanını içmək içün yüz məşki-səqqa urmışam.

İrmağı irmağa yarar göz yaşını yaramaz
Aşinamuz bilür axır ki, nə dərya urmışam.

Bəkriyəm çünki gözündən mey çəkərəm dünü gün
Sufiyəm çünki ləbündən qəndü həlva urmışam.

Yenə eşqə düşmişəm bən səni dilərəm, səni
Yemək, içməgi nedərəm mənnü səlva urmışam.

* * *

Zülfünün hər xamında bin çindür,
Hər çin içində bin könül çindür.

Gözünə uydı gözlərüm çin içün
Biri gülçinü biri dilçindür.

Bizə iraxlığın nə qıla ziyan
Söhbətümüz sənünlə içindür.

Dil xəta dimeyə əgər der isə
Ki, yüzün nurı dideyi-çindür.

Nə əcəb rəhmi var xəta gözünün
Ki, oxı bu yürəkdə pərçindür.

* * *

Misümüz döndi yenə şükür ilaha gümişə
Eşqün ilə sənəma irişəvüz güm işə.

Könülüm quzısı əmişə gərək lə'lün ilə
Tanrının lütfi olursa, nə gərəkdür əm işə.



Yaxdı eşqün bəni varlıxda qomadı nəsnə
Sanasın bir od idi düşdi nagahın qəmişə.

Ləbi şəftalusına qarşu yürəgüm ditrər,
İçi yansa kişinün meyl edər olur yemişə.

Gözlərümün yaşı uzun ki, qomadı yaşsuz
Bu od işində, bilürsin, gərək olur nəm işə.

* * *

Döndərə ağ yaşlarımı ala, rəvamı,
Dərdini verə, könül ala, rəvamı?

Bənizümi bənzədə xəzana bənüm ol,
Kəndü yüzin gösdərə çü lalə, rəvamı?

Bin gəz oda yaxdı bəni, salmadı iksir
Şimdi dilər tuta yeni qala rəvamı?

Meyli könülün ləbi ilə dişinədür,
Eşq əri gər meyl edərsə mala, rəvamı?

Əql dəlü oldı zülfüni görəlidən
Piri-xərəf girdi bu vəbala, rəvamı?

* * *

Gözümdən axan yaşlara tufan necə bənzər,
Yürəkdən olan qanlara ümman necə bənzər.

Könlümə ki, eşqün, sənəma, kürsi qılubdur,
İnanımazam təxti-Süleyman necə bənzər.

Yaqut ağızunda görəli dürri-xoş abı
Gözə-könülə dəniz ilə kan necə bənzər.

Bir şəm alıban bən də səni isdərəm, ey dost,
Sidqümə bənüm dünyada iman necə bənzər.

Dərman dilərəm dərdüni artırmağ içün bən,
Ləzzətdə sənün dərdünə dərman necə bənzər.

Xəttünə əgərçi yüzünün sülsini tutdı,
Gülşəndə bəgüm dəsteyi-reyhan necə bənzər.

Canuma ki, çahi-zənaxa zülfi gəmişdi,
İnsafa gəlün, Yusifi-Kən'an necə bənzər.

* * *

Hüsni gözin könül elində, bəgüm, qan yazmış,
Ləbləri üsdində könülüm içün qan yazmış.

Tapdı dəlü könülüm qaşları mehrabına çün
Gözinə işbu hilali canı qurban yazmış.

Necə qul olmayayum sana ki, nəqqaşi-əzəl
Güldə şol ənbər ilə bir xəti-reyhan yazmış.

Həm yenə müşk saçundan bilürəm k'anı yazan
Yazar ikən özi yazusına heyran yazmış.

Zər varaqda bu gözüm qıl qələm ilə yazusın,
Gər gözün görür isə bilə ki, səkran yazmış.

* * *

Hərçənd ki, vəslün, sənəma, aza irişdi,
Çox var ki, sənün *vəslünə* ol aza irişdi.

Sərbaz durur zülfünü canbazi-həvadur
Canbazı gözün necəsi sərbaza irişdi.

Könül quşını cadu gözün avladı, şaha,
Nə baxtulu bu kəkligi şəhbaza irişdi.

Lə'lünə irəli könülümi bulımazam,
Gizlədi məgər özini çün raza irişdi.

Bu pərdədə sufi necəsi ola biləm bən,
Çün çəng ilə dəfdən yenə avaza irişdi.



* * *

Gəlün ki, cümlə eşikdə qulami-şah olalum,
Həmişə dər peyi-dəryuzeyi-günah olalum.

Günəşə irməgə qüvvətümüz əgər irməz
Müqabil olıbanun əksi ilə mah olalum.

Saçı həvaya uyıb getdi könül axınına
Qamumuz uyıb gəlünüz sipah olalum.

Yüzində yazdı ki, ən-nuru fis-səvad xəti
Gəlün, odına yanub cümləmüz siyah olalum.

Səfa ilə kişi yarı yolına olmamış,
İcazət olur isə biz dəlili-rah olalum.

Əziz olmadı ta çaha düşmədi Yusif
Zənəxdə biz dəxi şaha əsiri-çah olalum.

Bu şəhlərün şəhi qullarına çü quluz biz
Cəhanda cümleyi-şəhlərə pazişah olalum.

* * *

Təndən səni sevən canı avarə gərəkdür
Peyvəstə qaşun ox ata həmvarə gərəkdür.

Canı gözünə tutu qoyub əsrimişəm bən
Rəhn edə kişi varlığı xəmmara gərəkdür.

Bən xəsteyi-üftadə ləbünçün öləyimmi,
Lütf eyləyə əttar bu bimara, gərəkdür.

Qanlu yaşı idrar idərəm yara gözümdən,
İmza qıla ləbləri bu idrara, gərəkdür.

Zülfünə könül vardı ki, bir qoxu apara,
Zəncir dəxi düzd ilə əyyara gərəkdür.

* * *

Aşiq ki, uyar əqlinə divanı derüz biz,
Yazmazuz anı dəftərə, divana derüz biz.

Biz baş ana derüz ki, ana baş qayusı yox,
Sərvər deyü hər bisərü samana derüz biz.

Könülümə bir od, sənəma, düşdi yüzündən,
Əl ilə deməzüz yüzünə yana derüz biz.

Yüz sirri-nihanı ki, anı kimsənə bilməz,
Ağız-ağız ol dilbəri-pinhana derüz biz.

Necəsi cəvab edə bu dərdümə təbibüm,
Can dərdi deyü çün yenə dərmana derüz biz.

* * *

Ayax toprağıyam, nigara, həvadan
Zəhi bulmışam bən bu dərdi dəvadan.

Dəva dərdümüzdür cəfa lütfünüzdür
Zira key buluruz vəfayı səfadan.

Gözündən, nigara, bizi əsrük etgil
Ki, biliməyəlüm əbayi qəbadan.

Canı yelə verdük, nigara, saçunçün
Bulalı saçunun qoxusın səbadan.

Könül buta qıldum, canı anda yaxdum
İşüm altun ola deyü kimyadan.

* * *

Əql lövhində əzəl katibi ta can yazmış
Könülüm gözi içində səni insan yazmış.

Nəsx edəyim deyü yaqut xətin hüsnini gör
Ki, gül üsdində necə şiveyi-reyhan yazmış.



Hüccət içün ki, ölür sevdügi yolına kişi
Vazeh olmaxlığ içün bir dəxi bürhan yazmış.

Məh qaşunı, sənəma, könülümi mahi qılalı
Bəni qurban sanavü eşqüni ümman yazmış.

Məzhəri-sün' durur küfr ilə iman anda
Saçını küfr bana yüzini iman yazmış.

Bana cövr ilə cəfa verdi anun gözi hələ
Ənbərin xətti əgər lütf ilə ehsan yazmış.

Könlümə yazmış imiş ki, tolaşa gisusına
Lacərəm ol cəhətə canuma seyran yazmış.

Hər kişi canı nolacağın əzəldə yazıcax
Bən zəifün canını ortada heyran yazmış.

Xadimi-hüsnini kafur ilə nəbər düzəli
Göz yolın sulamağa lö'lövü mərcan yazmış.

* * *

Bizi bu eşqə çələb bisərü saman yazmış,
Bu könül dərdinə ləblərüni dərman yazmış.

Ləbləründən soraram bən ki, neçün göz yaşını
Ləbi-yaqutı bənüm üsdümə mərcan yazmış.

Müşkil oldur ki, anun zülfinə dərbəndəm bən
Başuma işbu qəzayı dəxi asan yazmış.

Qəmzəsi türki gözinün bu yürəkdə su qomaz
Gözümə işvələri gərçi ki, ümman yazmış.

Ləbləri qanuma girdügi içün münşii-hüsn
Sonlısar deyü tarixi ilə qan yazmış.

* * *

Bu aşina yoluna dil çü düşdi araya,
Anı bu gözlerinün irmağı qaçan aya.

Su başdan aşdıvü ağzumda qana irdi əlüm,
Sünügə irdi bıçax əz qafayi-həmsayə.

Necəsi qəmzəsinə döyə könül ol yarun
Ki, fitnə yetürür ol gözi ilə dünyaya.

Belindən ayru bizüm eyşimiz xəyal ilədür,
Ləbindən ayru keçən ömri dil beçə saya.

Kimün nə taqəti var rumda çü zülfeyni
Həbəş çərilərini sağa-sola yasaya.

Yayın qodı qələm aldı əlinə tiri-fələk
Çü urdı cadu gözün əlini oxa-yaya.

Qiyamətün günidür eşqi-dil ki, düşdi ana
Nə iltifat edə ayrux oğula-ataya.

* * *

Dilbəra, onulmadı könlümdə qəmzən yarası,
Bulmadunmı xüftə gözdən ayru dil oyarası.

Zülfünə dedüm açıl ki, xalüni görsün gözüm
Dərlədi yüzi həyadan dedi ki, yüz qarası.

Ərzə qıldum könlümi hüsninə dedi: bu nədür,
Aşiqi-miskin dedüm gisularun avarəsi.

Can sanurdum lə'lini, könlümə sordum bu nədür,
Dedi ki, canum dəgüldür illa canum parəsi.

Aşiqü mə'şuq arası səhl ola ixlas ilə
Könülə cayiz dəgüldür aralıxda arası.



* * *

Olalı zülfün sənün ənbərşikən
Canı mişkin anda qılmışdur səkən.

Hüsnünün vəsfinə çün pərvanə yox
Şəm kibi yanmışam əndər ləgən.

Kim pərişan kimi ditrər görəli
Hüsnüni şimşadü sərvü yasəmən.

Hüsnü xülq ilə məlahət görmədi,
Kimsə tapundağı kibi əncümən.

Eşqümə bənümü cövrünə sənün,
Oldı mizan ayu günəş mərdü zən.

Saçunı tağıt ki, bu cana məgər
Bir nəfəs irə zi ətrafi-Yəmən.

Çinü hindün müşgi ilə ənbəri
Zülfünün bir qılına olmaz səmən.

Aşiq öldürmək dəgülmidür qübh,
Ey sözi mövzunü ey vəchi Həsən.

Varlığına varlığum qıldum fəda
Dil dilinə, can canına tənbətən.

* * *

Nigara, gül yüzünə qarşu lalə dəstə gərək
Könül ki, zülfüni sevər, şikəstə bəstə gərək.

Çü ağzun ilə belün bəni hiç qıldı, hiç
Xitab bana neçündür itab həstə gərək.

Gözün dilər ki, bizə tövbə verə eşqindən
Əgərçi ki, bən ayığamü tövbə məstə gərək.

Sabah yüzüni gördümü fal dutdum anı
Səni sevən kişi falı, şəha, xücəstə gərək.

Dilər gözüm ki, qıla qanlu yaşı paludə
Qanı içində xəyalı yarun nişəstə gərək.

* * *

Canını cana verməgə yürək içində can gərək
Yürəgi qanı su olub, gözləri suyı qan gərək.

Qövs qaşında gözləri bədr ilə xoş qiran edər
İlla budur ki, könülüm anda sahib qiran gərək.

Gözi yürəgi qanadur, bən ləbini qanadayım
Çünki şəriət oldurur ki, qana yenə qan gərək.

Yaşlu gözü saru bəniz, qanlu yürəgü od cigər
Yetmədimi yara ki, der ki, sevüyə nişan gərək.

* * *

Təalallah, təalallah bu nə lütfi-ilahidür,
Bu könül mülki elində nə tacü təxti-şahidür.

Deyiməzəm ki, günəşsin qaçan deyəm ki, aysın sən,
Çü varlıx varlığı zatun bu aləmdə kəmahidür.

Könül Yaqubına nola əgər Yusif olasın sən,
Ki, saçundur rəsən cana, zənəxdanun xu çahidür.

Dilərəm vahi olmaya bənüm ahum içün ahum,
Həzəran ah ahumçün gər olursa ki, vahidür.

* * *

Aşiq gərək ki, hiç sərü samana qalmaya
Bu yolda başını saya samana qalmaya.

Yarı ləbinə qana, qanı dökilür isə,
Məqsuda cəhdin eyləyəvü qana qalmaya.



Dünya nədür ki, söyləyələr axirət dəxi,
Cananı isdəyən hələ bir cana qalmaya.

Canun visalidür axı dirlik dedükləri
Bu nüktəyi bilən ləbi-heyvana qalmaya.

* * *

Canan visalinün nəmi bir cana kim uya,
Yaşdan dəniz gərək edə ümmana qalmaya.

Aşiq ki, oynayımaya canını xam ola,
Verməsə ay varın günəşə, natəmam ola.

Gəh zülfi tağıdub, gahi saçını dirməsə,
Əhli-təriqətə necəsi sübhü şam ola.

Gər şah ola nola konül elində ol qulam
Sultan ikən bu can hələ ana qulam ola.

Sən öz-özüni sıvü nigarun odına yax,
Taş çün sınavü gör oda yaxıla, cam ola.

Kimdə ki, varlığı qarışa qəlb ola yəqin
Saf oldurur ki, aşiqi-mala kəlam ola.

Uydurmışam nəmazunı gözünə, ey nigar,
Uymamağ olamı, çü gözün tək imam ola.

Qanum həram ikən çü ana qılmışam həlal,
Vəsli həlal ikən nə rəvadur, həram ola.

* * *

Neçə-neçə yaxılam bən tuzun ilə, çələbi,
Günəşi isdəməyəm bən yüzün ilə, çələbi.

Nə qəhri-Qahirə gərək, nə Misr isrannı
Şəkər yetər bu cəhana sözün ilə, çələbi.

Bana nə şəms gərək gündüzü nə ay gecə,
İkisi dəxi bənümdür özün ilə, çələbi.

Cəfan çoxdurü lütfün canuma qatı az
Çoxuna nola döyəyüm azun ilə, çələbi.

Xətün bərat qılur canumuza kim yoxdur,
Həzar canü dili bir yüzün ilə, çələbi.

* * *

Novruzü növbahar irişdi ki, cam içəm
İşbu cəhan içində müdamı müdam içəm.

Aşüftə sünbüli ilə nərgisləriylə məst
Lə'li-ləbiylə badeyi-mala kəlam içəm.

Bən eşqi püxtəsiyəm əgər suxteyi-diləm,
Ləbləri yadına nola gər badə xam içəm.

Qanum həramdur anavü ol həlal içər,
Bən dəxi həm sürahı qanını həram içəm.

Ey Xızr ləblü nola çü bən də İsgəndərəm,
Gər şərbəti-həyati dəruni-zülam içəm.

Pərvanəsüz bu eşqün odına ki, girmişəm
Tolu ayağı nola əgər, ey qulam, içəm.

Yüzünlə zülfün içrə görəli totağunı,
Boynuma vacib oldı ki, hər sübhü şam içəm.

* * *

Neçə bu yürəgüm qanı axa, axıdanı qanı?
Şimdi gözümdən su axar, yürəgümün qanı qanı?

Can ilə əqlü könüli dilbər apardı çoxdurur,
Şimdi tənümdurur əcəb bu tənümün canı qanı?



Yürəgi yazmadı gözün, yazuğa yazdılar anı,
Səhl ola oxa ox, derüz, bul axı, dəmrəni qanı?

Bən səni görəli özüm səndə yitürmişəm, şəha,
Səni qaçan ki, buluram bulımazam bəni, qanı?

Yar bana itab edər, bən ana üzr edərəm,
Üzrü itab bir imiş deyüb, eşidəni qanı?

* * *

Nigara, nişə döndürdün şunun kibi yüzi bizdən,
Mənüm tək aşiqi-biçareyi-aşüftə acizdən.

İzüni basa yürürəm, ola ki, ələ girəsin,
İzüni dəxi sevərəm ki, ayruxsıdur iz izdən.

Sizə bizdən qamu varlıx çəkürgə ayağınca yox,
Cəhanda bən Süleymanam qarınca gər gələ sizdən.

Xəyalün bəndə şöyledür ki, qan alur olur isəm,
Üşənürəmı qanalıcı seçiməyə sizi bizdən.

* * *

Saçunı bilürəm, şaha ki, bu gülşəndə reyhandur,
Yüzün güldürü gözlərün əcayib namüsəlmandur.

Gözünün guşəsində dil qonuğ oldıydı bir gecə
Qomadı ana əqlü can apardı yə'ni mehmandur.

Gözün canuma dərd idi, ləbün dərdümi arturdı
Ki, yə'ni sormağa vardum ki, ol dərdümə dərmandur.

Güneş yüzünün üsdində hilali qaşı gösdərdün
Ki, bin aşiq bənüm kibi bəgüm ol eydə qurbandur.

Bəgüm və'n-nazi'ati-zülf çün qılur bizi bəstə
Nidəlüm şəms yüzüni, əgər sureyi-rəhmandur.

* * *

Sənün kibi bir şaha dəxi irməyə kimsə,
Sənün kibi bir xuba könül verməyə kimsə.

Dil gisularun silsiləsi bağlusı olmış,
Dəlü dəgül isə, anı qurtarmaya kimsə.

Zi lütfi-ilahi ki, sənün gisuna girmiş,
Bir qılını müşk ilə anun burmaya kimsə.

Can ilə könül aldun isə şöyləmi qıldun
Anları ki, dünyada dəxi yirməyə kimsə.

Qönçə kibi gülşəndə dəxi badi-həvaya
Könlün yaxası dügməsini qırmaya kimsə.

Biz varlığı çoxdur ki, məzada biribidük,
Mə'şuqədən özgə ana hiç irməyə kimsə.

Qaçan ki, kişi gülşəni-vəslünə irişə,
Şəftaluvü gül dərə dəxi dərməyə kimsə.

* * *

Anca bən lə'lün ilə yedüm əmək,
İlla ol bilməz imiş nanü nəmək.

Sanamı qaldı cəhanda qan içiş
Banamı qaldı cəhanda qəm yemək.

Bən səməndər qıluram oda könül,
Sən qılursın yaşuma bəni səmək.

Yürəgümi dəm qılubdur ləblərün,
İlla dökilməgə bulınaz demək.

Sən nə kişisin ki, dənizdə ikən
Xali olmaz tapundan mərdümək.



* * *

Həmvarə gözüm yaş ilə qərqab olur isə
Olmaya əcəb, dil qanı gər ab olur isə.

Dərilə yüzümdən niçə gərəg isə əsfər
Bu gözlərümün yaşına sirab olur isə.

Yürək qanı gər suya dönə, olmaya əcəb,
İşbu gözümün yaşları xunab olur isə.

Bəndən nə əsər bulına bu dünyada, billah,
Bu rəsm ilə gözüm yaşı seylab olur isə.

Yüz həsrətü bin heyrət ilə dərdi könüldə
Vardur, aparayum sizə gər bab olur isə.

Bu gecə umaram ki, görəm düşdə yüzüni,
Düşdə görürəm bu düşi gər xab olur isə.

Böylə ki, gözüm yaşı qılur yüz gümişin zər,
Gey sən'ət ola kimsədə tizab olur isə.

* * *

Can qurtılamı qara gözündən
Könül nə özin qara gözündən.

Qararımaya cəhanda şol dil
Ki, özini qurtara gözündən.

Eşqün ilə zərdə sikkəsini,
Yüzümdə gözüm ura gözündən.

Yürəgi kəbab edüb yeyürüz biz,
Ta içəvüz aş ara gözündən.

Səndən yaramayalar könüli,
Bunca ki, görür yara gözündən.

* * *

Gözüm axıdalı yolunda qanı,
Tapundan bir vəfa bulmadı qanı.

Qinamuz olmayısar söhbətündən
Ki, nazükdür qavanidən əğanı.

Qulağım dür sözündən eşidürsə,
Bu o'yanumda görəsin mə'anı.

Ləbü yüz, gözü qaş, gisu, ayağ-əl
Namazumdadurur səb'i-məsanı.

Bənüm canum canına müttəsildür,
Ya neyçün canısın, ey yarı-canı.

Sözi şirin deməк gərək, ləbiyçün
Çü oldı Xosrovi-xuban zəmanı.

Sığınsun gözlərünün guşəsinə,
Cəhanda diləyən əmnü əmanı.

Gözüm lə'lü dilüm dürlər dökərlər,
Sənün yoluna yəğmadur dükanı.

* * *

Cüz suz dəxi eşq ərinün pişəsi yoxdur,
Mə'şuq ilədür vəsl ilə, əndişəsi yoxdur.

Könülini dilər ki, könüli ilə qıla bir,
Çünki taşa uğradur anı, şişəsi yoxdur.

Mərhəm dilər eyləyə bənüm könlümə lütfi,
Ol rişə nə çarə ki, anun rişəsi yoxdur.

Məstanə gözi zülfinəsidür könülümi,
Aşüftə biliməzmi dərü bişəsi yoxdur.



Qurtılmadı könül quşı şəhbaz gözindən
Biçarə necə gizlənə çün bişəsi yoxdur.

Kirpügi ilə qəmzəsi dəldi yürəgümi,
Ey düzdi anı özinə gər tişəsi yoxdur.

Lə'li-ləbinün nuşı ki, dirlik suyıdır ol,
Dəpolədi bəni nola gər nişəsi yoxdur.

* * *

Toldur əyağı saqivü angah be ma dih
Hələ nola Allahü lətifun bi ibadih.

Bən safiyəmü safi içərəm hələ eşqi,
Tu cani-mən əz saf bedih baz riya dih.

Bən şəhriyəm şəhr dilərəm könülində
Yoxsa bana hər qulxa şar olavü yaxa dih.

Yitürdi gözi könülümi zülfi içində
Dedüm sana gərək isə dünyada nadih.

Bən ana vəliyəm ki, vəlilər sevər anı,
Bu eşqə ədu olana sən dəxi fəna dih.

* * *

Sevdüm səni bən, ayıd axı tədbir nədür,
Hiylən var isə, ayıd axı təqsir nədür.

Vəslün bu canı kim ölüdür diri qılısar,
Çün xeyrdurur, bihudə tə'xir nədür.

Fürsət varü mövsüm xoşü əshab müvafiq
Kim nə bilisər tanla ki, təqdir nədür.

Xancaru baxarsam, sənəma, səni görürəm,
Billah, di axı, bu düşə tə'bir nədür.

Zahirdə ikidür, biri aşiq, biri mə'şuq,
Batində ikisi dəxi pis bir nədür.

* * *

Tövbədən pərhiz qılmax eşq ərinə pişədür,
Yarı xoşnud eyləməklik könlinə əndişədür.

Cövr taşını atalı qan axıdur gözlərüm,
Necəsi döyisər ili bir könül ki, şişədür.

Yel pərişan etdi zülfüni tolaşdı boynuma
Bu keşakeşdən məzərrət həm yenə dərvişədür.

Şol günəş yüzündə yalğuz xali ənbər görəli
Bəllü bildük ki, qara gün dünyada bixişədür.

Canü könül azışup zülfündə bilə düşdilər
Çox səadət buldılar yüz rəhmət ol azışadur.

* * *

Neçə ki, bu şüəra zülf ilə xali dedilər,
Nurını görməyibən anları xali dedilər.

Ləbinə nöqtə dedilər bu güman idi yəqin
Belini bənzədibən qıla mühali dedilər.

Qaşların qövsi-fələk dedilər isə, nə ola,
Vəsmeyi-nilisinə tiri-səmavi dedilər.

Hüsnini lütfi-ilahi deyü anar anlar
Könülüm eşqi içün hökmi-xudayi dedilər.

Bədr ayı nisbət edən yüzünə əksük demiş,
Günəşün nəqsini tapunda rübayi dedilər.

Dərd ilə yaxdıvü həm könülümi cadu gözi,
Lə'li-ləblərin anun cana müdavi dedilər.

Əqlü dildən ağızı vəsfini sordum bən dün
Deyiməzüz bizə təng etdi məcali dedilər.



* * *

Zi təl'əti-mövzunü zəhi xub şəmail
Ki, gəlmiş ana xilqət ilə xil'əti-kamil.

Bu xani-məlahət ki, çələb anda dökibdür,
Məhrum necəsi qalısar dünyada sail.

Mə'şuq ilə aşiq arasında nəsənə yox,
Bir ism ilə bir cism durur ortada hail.

Göz yaşı, bəniz sarusıvü cism nizarı
Yetməzmi əcəb eşqümizə bunca dəlail.

Sənsüz bana zəhr ola, şəha, şərbəti-heyvan,
Tiryək ola lə'lün yolma səmmi-həlahil.

Dövri yüzünün oldı bu gözümdə müməssil,
Könülüm olalı, sənəma, eşqünə mail.

Xəttün yazalı könülümə yarlığı xanı
Var lütfün ümidi ki, ola halümə şamil.

Gözlərümə gözikmiyə bir nöqtəcə aləm
Saidlərüni qılur isən bana həmail.

* * *

Sənün eşqündən özgə nola hasil
Ki, ol baqi durur özgəsi zail.

Sözün dilümdə, qulağumda sözün,
Könüldə eşqü boynumda səlasil.

Cəmalun bağü zülfün zağa bənzər
İzarun ağü çün pərri-bəvasil.

Xəyalünə, şəha, müstağraquz biz
Gəlürsən topuğuna tax xalaxil.

Xuraman yöridügüni severəm,
Vəleykin qorxaram qopar zəlazil.

Həzəran can dilərsə ol fədadur
Bihəmdillah, müvafiqdür müamil.

Könüldə necə qala sirri məktum,
Çü eşq odı oldı bana şamil.

* * *

Zülfündə, əşha, eşq əri avarə gərəkdür,
Tərk eyləyibən çarəyi biçarə gərəkdür.

Anca araya könülümi zülfi içində
Ki, tərk edübən anda qala arə gərəkdür.

Yüzini sevən döyməyə gözinə gərəkməz,
Bir gül diləyən səbr edə yüz xarə gərəkdür.

Əqlü dilü can aldı gözivü qılur inkar
Mə'şuqə ki, şux ola əz in karə gərəkdür.

Cadu gözi qəmzələrinün oxları ilə
İnsaf verə heydəri-kərrarə gərəkdür.

* * *

Sərvün sala özgə kişiyə sayə rəvamı,
Gün ki, keçə sənsüz ömürə saya rəvamı.

Yoxsul ilə baya dəxi taqət qomaya ol,
Yoxlu qıluban cümləsini baya rəvamı.

Alnunla yüzün tə'nə ura günəşə, aya
Kirpüklə gözün əsridəvü aya rəvamı.

Qəmzəsi bənüm yürəgümi yaraladı vay
Vayım ilə dilbər ki, bula vayə rəvamı.



Bən ox deyiciyəm hələ şol ox ilə yaya,
Ol aldayıban hər yaxaya yaya rəvamı.

Odun kibi hicri odına qaya tenümi
Ol gövdəsi nəsrin yüregi qaya rəvamı.

Süd yerinə eşqini içürdi bana dayə,
Ol veslini özgələrə adaya rəvamı.

* * *

Tubi qəddün ilə həq sərvi xuraman yazmış,
Bu səri hüsnün ayağına yasəmən yazmış.

İşvələründən umaram, sənəma, görə yaxa
Dəftəri-mədhi ki, şol hüsnünə Səlman yazmış.

Könülə irdi nişan necəsi isdəməyəyüm,
Zər vərəq üsdinə bu alı ki, şol qan yazmış.

Gözümün qıl qələm ilə yazusın zər halda
Döymədi lə'li-ləbi k'anı zənəxdan yazmış.

Dil zənəxdanına əgər düşdi təəssüf qılma,
Dutalum Yusif idi, həq ana zindan yazmış.

* * *

Hiç kişidən eşqə inkar olmadı,
Kim ki, bazar isə, bizar olmadı.

Ey səba, dəprətməgil zülfi qılın,
Dəxi can oynamağa car olmadı.

Eylə ki, bu dari-dünyada bənəm,
Dövr içində dəxi dəyyar olmadı.

Ədl ilə viran dəxi abad olur,
Zülm ilə dünyada bir şar olmadı.

Lə'li nuşü kirpügi bir nişdür,
Gül dəxi aləmdə bixar olmadı.

Eylə əsritdi gözün canumı ki,
Hacəti-dükkani-əttar olmadı.

Yaxdı gözün yıxdı eşqin könlümi,
Ləblərindən bana bir yar olmadı.

Ey gözi dərdi səpişkən dünyada,
Gözüni kim gördi bimar olmadı.

Hüsn əkilsə, eşq bitürür könül,
Leykin işbu şəhrə me'mar olmadı.

Çox firəngə axdı hindu çərisi,
Zülfi kibi ceyşi-cərrar olmadı.

Kərrü fərrar oyındur bu dünyada,
Eşqi kərrar oldı, fərrar olmadı.

* * *

İzün qubarını, şaha, gözümə qıl sürmə,
Vəli bu dövləti bizə visal içün sürmə.

Eşigün itlərinün razıyuz səadətinə,
Aları dövlətə irüribən bizi sürmə.

Günilər isə xəyalün tənümdə quşca canı,
Kəməndi zülfünə bağla gərək isə sürmə.

Cəhan çü halümi bildi içümdə od yaxıban
Gözüm yaşın axıdup bənizümə qan sürmə.

Gözündə mərdümi-aləm çü məsti-sağərdür
Rəvamıdur ki, dəlü könüli qılur sürmə.



Taş ilə dəmür arasında ol əcəb olmaz,
Əcəb gərək isə yüzüni yüzümə sürmə.

Nəsim ayaği tozını gətürdi qanlu gözə
Dedüm ki, sürmeyi-xas oldur işə sürmə.

* * *

Vəqti-səhər ki, gözlərün atdı yüregümə səhər
Dildə cəfamuzı xətün yazdı çü nəqş filhəcər.

Nuh kibi bu gözlərüm dənizə gəmi eylədi,
Əl götürip müxalifə dedi ki, rəbbi-latəzər.

Ney şəkər oldı boyunü gül yüzünü ləbün şəkər
Şükr ki, verdi həq bana ol ikisində gül-şəkər.

Gərçi sözi təvil edər qamətinün qiyaməti,
Leyk qılur totaxların kəlecimüzi müxtəsər.

Bən necə pər bıraxmayam sünbülinə gisusınun,
Susən ala əlinə tiğ, duta yüzinə sipər.

* * *

Daq tutmağıl rəva dəgül axır bu məstünə
Çox cövr etməgil, sənəma, bütpərəstünə.

Sındur könülümi, vəli zülfünə bağlağıl,
Kimdür ki, bəstə olmaya sənün şikəstünə.

Əsritdi bəni ayağun əhsənt ayağuna,
Sa'idlərün dəpələdi şabaş dəstünə.

Zülfün ağını dirşür axı arizüni aç
Nə qaldı ki, düşürmədün anı bu şəstünə.

Belün ilə yoğam, vəli barı ilə tağam
Nistün ilə nist oluramü bəst həstünə.

* * *

Gözün yaraladı bizi tirü kəman ilə,
Ağzun dəpələdi yenə bizi güman ilə.

Bən bu zəmində şöylə bilürəm ki, gəlməyə
Sənün kibi nigar dəxi biç zəman ilə.

İmana qəsd zülfünə hey de rəva dəgül,
Gisun elinə girdi könülüm aman ilə.

Gördüm sənivü səni sevərəm sevisərəm,
Bən söyləyiməzəm sözümi tərcüman ilə.

Lə'linə can verürəmü könül tutuquram,
Netdün ki, satmadun anı bizə zaman ilə.

* * *

Badi-səhər nədir əcəb biləməzüz bu bülbülə
Ki, nagəhin anun ilə gülşənə düşdi qülğülə.

Bülbül inilərü vəli gül gülə qarşu xoş gülər,
Gəl gülşənə, ey əhli-dil, eylə təfərrüc gül gülə.

Nə dedi oyağa ləbün cür'ə eşitdi olamı,
Düşdi sürahilər bu dəm ola səbəb ilə qülqülə.

Mövsüm olü müğənni bu eşqi xu necə vəsf edəm,
Saqiyi-simsaq sun mül bizə salma mülmülə.

Ləbləri Misrün şəkərin qarətə verdi şur ilə
Bənləri odlara düşib tə'nələr urdı fülfülə.

* * *

Ömrüm sənəmüm gisusı ya rəbb mədid et,
Bəndən anı ayru diləyənləri qədid et.

Bən eyd edərəm hər gecə gisuları ilə
Dəgnək gözi bizdən diləgüm ol ki, bəid et.



Azad dəgül bəndəyi qıl hizmətə məqbul,
Andan gerü sultanları qullıxda abid et.

Bən sana dilü əql ilə canı biribirəm,
Sən dəxi nola bana xəyalüni bərid et.

Can eşqi ziyad oldıvü dil dərdi həzaran
Dedüm ki, təvil etmə sözi eşqi fərid et.

Nərməm, sənəma, qəmzələrün oxına çün mum
Sən cana yarasını dilədükcə şədid et.

Kim dilər isə ki, mütəvəhhid olam andan
Sevdügi canından anı sən tizdə vəhid et.

Gər dilər isən ki, ola Mahmudi-əvaqib
Necə ki, əlün yetər isə fe'lə həmid et.

İslama dökildi çərisi gisularunun
Canü könül ana tolaşurlarsa, şəhid et.

* * *

Olursa zöhrə bizə müştəri bu gərdişdə
Rəvadurur ki, bizüz eşq içində vərzişdə.

Bənüm canumıvü bənüm kibi bəgün canını
Qəbul edər, vəli dəgməz qılına ərzişdə.

Birişdə oldı vücudum həvası odı ilə,
Əgərçi hiçdürür, gərək oldı bir işdə.

Ləbini düşdə görürsəm özümi unıduram,
Əcəb necə ola halum görür isəm dişdə.

Yüzümdə sikkeyi-altuna urmayınca bən
Urmadum adumun sikkəsini gümişdə.

* * *

Eşqin, nigara, könülə canı dəgülmidür?
Cövrün bənüm bu canuma canı dəgülmidür?

Dükkan qurdı lə'li-ləbün canlar aparur
Yaquta can alur nişə kanı dəgülmidür?

Cənnətdürür yüzün, şəha, şəftalu dilərüz
Şəftalu yemişi, nola, danı dəgülmidür?

Kişində eşqinün, sənəma, tir olmışam,
Qurban olam qaşuna kemanı dəgülmidür?

Bən çoxdurur ki, eşqün içün canı vermişəm,
Lə'li-ləbün həyatı əmanı dəgülmidür?

Lə'li-ləbün ki, hücrəsi gey müxtəsərdürür
Bən soraram sərayi-mə'anı dəgülmidür?

Hərçənd yıxdı könülümi gözi qəmzəsi,
Eşqi sərayına yene banı dəgülmidür?

Zülfün xəyalı yaxdı, şəha, könülümdə od
Başumdağı imamə duxanı dəgülmidür?

Bən ləblərün sirinə qul oldum əyan, şəha,
Sirrüm bənüm ləbünlə əyani dəgülmidür?

* * *

Biz sənün eşqün odından yanaruz,
Biz sənün lə'li-ləbündən qanaruz.

Sən şəkərsin şöylə ki, varsın, nola,
Gər şəkərxanaya barmax banaruz.

Necə ki, ayru olavuz tapundan
Biz bizi yenə sənünlə sanaruz.



Ölürüz ləbündürür abi-həyat,
Cayiz olamı tapuna tanaruz.

Gözlərün qəmzələrindən hər zaman
Əql ilə könül qamumuz qanaruz.

* * *

Gözün əcəb, sənəma, necə bir apara könül,
Ya necə eşqüni başara bilə yara könül.

Cəhan könülümi görüp fəğanü zarı qılur
Məgər ki, gül bədənündəki səngi-xara könül.

Cəhan qarara gözümə göricəgəz saçunı
Necəsi təndə tura bilə bir qarara könül.

Könüli göz oda yaxar anun içün gözümi,
Neçə ki, uyımağ isdər isə, oyara könül.

Könülümi görürəm gözlərün içün tolu qan
Ki, nardanə bişürür məgər xumara könül.

* * *

Öldüm yolına anun, bilməzligi nədəndür,
Candan tuzağ eylər, ilməzligi nədəndür?

Dögdüm gözüm yaşını yoluna gecə-gündüz,
Lütf ilə anı bir dəm bilməzligi nədəndür?

Dil dilədi gözi ki, diləydi məgər anı
Bən canı bilə verdüm dilməzligi nədəndür?

Qıl-qıl qılı saçınun dilədi ki, qıla qıl
İşbu tənümi bənüm qılmazlığı nədəndür?

Bilmədügüm bildüm ildüm saçına anun,
Bilmədügin biliməz, bilməzligi nədəndür?

* * *

Apar könlümi, şaha, gözün ilə
Məni tək tazə qılğıl yüzün ilə.

Yüzün gündüzdürür, saçun gecədür,
Gecəyi görəyüm gündüzün ilə.

Al ayinə ələ gör anı nədür,
Bəgüm, insafa gəl öz-özün ilə.

Ləbündən söz nigara necə çıxdı
Gümana düşmişəm bən sözün ilə.

Odağunı yalunuz sevməzəm bən,
Sevərəm bənün ilə yüzün ilə.

* * *

Eşqin var isə cəhd edü məhbuba irişdür,
Görürsə gözün, sə'y edü bir xuba irişdür.

Məcnun olıban Leylini qovu gecə-gündüz
Eşqüni bana, səbrüni Əyyuba irişdür.

Bən hacibüni sevərəm, ey şahi-zəmanə,
Sən salma hicabı, anı məhcuba irişdür.

Sən Yusifi-dövransınü Yə'qubi-zəman bən,
Pirahənünün teybini Yə'quba irişdür.

Eynüm, sənəma, qəlb isə çün saldun oduna,
Heyf eyləməgil sikkeyi-məzruba irişdür.

* * *

Neçə-neçə zülfün içün, sənəma, qıl olam incə,
Niçə və'dələr qılurdun bana könlümi alincə.

Ayağuna dökərəm bən taru kibi yaşlarumı,
Nəzər etməzəm ana ki, bəni rədd edər birincə.



Bu necəsi qəmzələrdür ki, bən ana ox deyəyüm,
Yürəgə birisi dəgsə, ivərəm yenə urıncə.

Nə əcəb narincə şivə ki, qaçan ki, anı gördüm
Bənizümə baxan aydur yüzi bənzəmiş turuncə.

Can anun saçı piçinə çü girincə ölür idi,
Nola gər tolaşdı isə ol arada bir girincə.

* * *

Qana boyandı yürəgüm suçı nədür soraram,
Ləbündən ana şəfa sun ki, ana can sunaram.

Yüzündən özgəyə neyçün baxa gözüm çün yox
Nəzir dünyada sana əgərçi ba nəzərəm.

Həzar can aparursın ki, bir nəzər qılasın
Və leyk bin canı bən yoluna birə sayaram.

Həyat şərbətidür ləblərünü bən təşnə
Çü girməz ol ələ həsrət ağusına qanaram.

Görəli zirü zəbər zülfüni pərişanəm,
Vəli həmişə boyuna tolaşmağı sevərəm.

* * *

Dilər isən ki, görəsin ayı nə,
Gün toğıcax əlünə al ayinə.

Yoxsulına-bayına bu aləmün
Gər yüzüni gösdərürsən bayına.

Sanma kim sayına alduğı könül
Zülfinün zira k'irişdi sayına.

Gözi ilə məst olan könül qaçan
Ki, yeyə qəmzəsi oxın ayına.

* * *

Zülfiylə xali olalıdan damü danəsi
Canü dil oldı eşqi quşı aşiyanəsi.

Nəti-cəhanı şəh rüxi tar etdi canuma
Evləri tutdı qalmadı cüz mat xanəsi.

Qəmzəsi dil dilər isə dilərsə səhl ola
Nə nəsnə ola can dəxi bunda yacanası.

Sevdalar ilə oldı pərişan bu könülüm
Hammam içində tolaşalı zülfə şanəsi.

Könül elini tutalı sən, külli yanmışam,
Yanmax budur ki, qalmadı hiç bəndə yanası.

* * *

Bürqeyi-zülfi gözümə gör nə hicab gösdərür,
Lə'li-ləbin şərab edər, bağrı kəbab gösdərür.

Ləblərinün əmin könül dilədi idi, əm dedi,
Dürr ilə dutdı lə'lini hüsni cəvab gösdərür.

Gözümə xab-xab olur gözlərüni görəlidən
Yürəgümün qanını göz qarşuna ab gösdərür.

Zülfi ki, piçü tabdur bir yazu idi alnuma,
Dəftəri-eşq əlindədür əqdü hesab gösdərür.

Göz odı ilə göz yaşın gərçi axıtdı çox zəman
Leyk həvası dilbərün anı türab gösdərür.

* * *

Apardı bənüm könlüm bir dilbəri-məstanə,
Boynına taxıb zülfin iləddi şəbistana.

Sa'idləri göstərdi canuma yədi-beyza
Andan bərü bağlandum bən eşq ilə dəstana.



Mərdümlik edüb gözüm saçalı sana incü,
Bən dəxi quşanmışam uş eşqünə mərdanə.

Könül topını saldum çövkanına zülfünün,
Kimün var isə eşqi uşda, gələ meydana.

Könülümi salmağıl çuxurına ənəgün
Olmaya düşə nagəh Yusif yenə zindana.

Eşqün odına yanub bən nur olayım külli,
Eşqündə əgər hacət olur isə bürhana.

Sevüb səni biz bizi qərq eyləmişüz səndə
İslama irişməkçün verdük dini imana.

Xəttünə dedüm müşgi-lə'lə nə aparursın
Qarınca məgər töhfə irürdi Süleymana.

Tuz dənizi gördüm bən şol hüsnü cəmalündə,
Gözümdən irürəyim yüz qətreyi-ümmana.

Bən eşq ilə tolaşdum gisularuna, şəha,
Yoxsa göri dururam bin dam ilə bir danə.

Hər kişi bu aləmdə bir nəsnəyə adanur,
Bən kişi ana derəm ki, eşq ilə adana.

Mə'şuqə ilə aşiq hər biri adanurlar
Kim lütfü cəmal ilə, kim xülq ilə ehsana.

Zülfün azıdur könli eşqündə və leykin həm
Əl tutıcıdur qayət eşqün ilə azana.

* * *

Saqi, tolu sun əyağı ki, ruzə dəgüldür,
Bu ömr becüz möhləti-dəhruzə dəgüldür.

Sirət sevərəm, surətə yoxdur meyələnüm,
Bəzmi dilərüz məqsudumuz kuzə dəgüldür.

Mərkəb var ikən cəhd edü mə'şuquna irgil,
Hiç kimsə əcəl tazisini üzə dəgüldür.

Əbləq atına işbu cəhanun inen uyma,
Ki meyl edə ol qaraya ya boza dəgüldür.

Bu fəsldə ki, gül yolına yaxıla bülbül,
Kimün könüli saz ilə bir sözə dəgüldür.

* * *

Dəmidə oldı yer üsdində yenə səbzə, bəgüm,
Qiyaməti gözə-göz görü bax bu rəmzə, bəgüm.

Nə var, adum yoğ isə eşq içində rüknəm bən,
Hürufi-əbcəd içində nite ki, həmzə bəgüm.

Nigar qəmzəsi oxına biç yürək doymaz,
Əgərçi Rüstəmi-dəstan Əlivü Həmzə, bəgüm.

Cəmal tonduru şaha tirazı tapundan
Cəhanda görmədi hüsni gişi bu tərzə, bəgüm.

Ləbün ki, yadı xoş olsun, ağızı bərkdürür,
Nəfir qəmzələründən quşandı qəmzə, bəgüm.

* * *

Bu nə hüsn olur, nə boy, nə sin, bəgüm
Hurimisin ya pəri, nəsin, bəgüm.

Sərvi boyuna necə təşbih edəm
Ya günəşi yüzünə nəsin, bəgüm.

Dünyada bir ləhzə olursan bənüm
Kim sayar bir çöpə ifnasın, bəgüm.

Boyamışsın qanuma xod əlüni
Barmağuna urma xınnasın, bəgüm.

Altuna döndi yanağum görəli
Gümiş alnunda minasın, bəgüm.



* * *

Yüzi gül, gisusı udi-qımarı
Yetər oyna bizüm ilə qımarı.

Ləbün tolu verür əsrügə əyax,
Gözün oxa tutar miskin xumarı.

Neçə tatarı zülfündə ki, gördüm
Giriftar eyləmiş yüz bin tatarı.

Bir od urdı, şaha, eşqün könüldə
Ki, çıxdı göklərə anun buxarı.

Sevərəm vəsüni, hicranunı həm
Ki, gül sevən gərək ki, sevə xarı.

* * *

Müşk ilə bağlamış saçun ay yüzünə gireh sənün,
Dök saçunı ki, dökilə şah tənünə zireh sənün.

Bin zihü yüz bir afərin qopa cəhanda bigüman
Gər qaşunun kəmanına düşər olursa zeh sənün.

Sən şəhü biz gəda qulun eşqini sana bağlamış
Bizdən olursa bin yaman, umaruz ola bеh sənün.

Məh kəh olur ki, ta məgər anı apara kəhrüban
Bən kim olam ki, qurtılam cümlə kih ilə meh sənün.

Lə'li-ləb ilə sərv qəd, cadu göz ilə gül yanax
Diməzəm olmaya ola söyləyəyümmi eh sənün.

* * *

Könülümi aparanun kirpügi oxın bulmışam,
Neçə ki, ol dilər isə ki, bini olam, olmışam.

Gözləri uyımış ikən kirpügi oxlarını bən
Anca yedüm cigərümə k'uyır ikən oyanmışam.

Qanuma qanalı gözün qanmadı hiç susalığum,
Gərçi ki, bən totağunun bunca qanına qanmışam.

Gisularun qılı kibi yeridür incəlür isəm
Özgə ilə visal içün gər sanuları sanmışam.

Bən Yəmənə yəmən derəm zira ki, eşq odı içün
Ol yana dərdümə dəva istəyübən əmənmişəm.

* * *

Eyni-fitnədür əyan əsrük gözi,
Qəndi sındurdı anun şirin sözi.

Toğmağını-batmağını günəşün
Əhsənül vəch ilə gösdərdi yüzi.

Ol günəşdür necə olmaz mühtəriq,
Hər k'ana oldı müqarin yılduzı.

Bən ol oldum vəslü hicran qalmadı,
Toğru eşid ud sözün azı özi.

Can Buraqı himmətə binmiş durur,
Yer yüzində olmaz ol atun izi.

* * *

Nedəlüm çü vəsfi sığmaz bu ibarətün içində,
Yenə biz xərab olalum bu imarətün içində.

Dilü əqlü can ilə tən qamusını oynamışuz,
Gəl axı yaz assımuzı bu xəsarətün içində.

Bu gözüm dənizinə bax dəxi yürəgüm halin gör
Nə çəkər fəraqun ilə bu hərarətün içində.

Bu nə fitnədür saçunda ki, verür tanuxlığ əlhəq
Ki, qiyamət oldı pinhan qəddü qamətün içində.



Xəbər oldı dün ki, vəslə irə yolına ölənlər
Bu gecə uyımamışam bu bəşarətün içində.

Gözün ilə bən saqiməm ki, gözün dəxi saqimdür,
Nə səlamət anlaram gör bu səqamətün içində.

Dəm ilə ölü dirildür ağızun nitə ki, İsa
Necə kiçük edər özin bu kəramətün içində.

* * *

Lə'lə dönmişkən yaşumuz dilbəri-dürdanədən,
Çəkmədi dil atı başın həmleyi-mərdanədən.

Bən gərək ki, canü əqli oynayam yar yolına
Ki, görən deyə ki, böylə toğsa bir mərd anadan.

Deyr ilə məscid sizündür, büt bizüm olsun həmin
Ki, bənüm məqsudum oldur Kə'bəvü bütxanədən.

Zülfi qoxusın aparur Çinə yel kibi nəsim,
Pəs həzər vacib durur gisularına şanədən.

Nöqtə lə'lindən anun kim ki, tatar isə zülal,
İsdəməyə hiç özünün şəhdini şeş xanədən.

Zülfünün sevdaisiyəm, qomazam əldən dəxi,
Toğru eşidgil, nigara, bu sözi divanədən.

Yardan ayrılan yürəgin parə qılmazmı fəraq,
Hiç xəbər işidmədünmi üstuni-hənnanədən.

* * *

Səndən ayrulıx könülün afətidür, afəti
Sənün ilə canumuzun rahətidür, rahəti.

Ləblərün İsa dəmindən dəm urur zi dəm bizə
Ölü canumi dirildür, ayətidür, ayəti.

Qayəti-hüsni-cəmalün qayətidür ay yüzün
Eşqi anunçün könüldə qayətidür qayəti.

Fitnə ki, derlər cəhanda gözləridür, gözləri,
Şol qiyamət ki, qopısar, qamətidür, qaməti.

Könül alıb, can aparub əql tarac eyləmək,
Şimdi qopmadı, özinün adətidür, adəti.

* * *

Ey qəmzən ilə hər dəm işbu yürəgdə yara
Gisun necə yasanup gösdərə bizə qara.

Ağzumdan od saçıla çarpa yalın gözümdən
Nə toğısardur oddan illa məgər şərarə.

Zülfiylə əqdi-əhdi bağladı idi könlüm
Turmadı ol siyəhkar eylədügi qarara.

Gözləri cadulardur əfsun bilür totağı
Könlüm ol ortalıxda biçarədür nə çarə.

Əqlüm ki, pir idi, uş tifl oldı lə'lün ilə
Əlbəttə, əmməg isdər hər tifli-qahvarə.

Canı gözüm yolından saçdum sözinə anun
Nosi ola fəriqün şol dürri-şahvara.

Gözlərini görəli şimdi gözüm yürəkdən
Bişürə hobbi-rümman hər sübhdəm xumara.

Necə qaçarsa qaçsun, bən qovısaram anı
Ana degin ki, irəm ya gəndüzi xod ara.

Gər gözi fitnə isə şükr ana xüftədürür
Bu dünyada qiyamət sərvi qədi qopara.



Gözdən yaşum çıxarsa, tutma əcəb sən anı
Döymez təcəllisinə tağ ilə səngi-xara.

Sahir dəgül der isən, gəl imdi yüzinə bax,
Bir barmağ ilə bədi göstərdi iki parə.

* * *

Nedəlüm, neyləyəlüm dünyada bu xub ilə biz,
Yanalum-yaxılalum haliya məhbub ilə biz.

Zülfün aşüftə qılur gözün edər qarət can
Bəllüdür, nolısaruz bu qamu aşub ilə biz.

Xət yazar büsni ki, yə'ni qulıyuz varlığ ilə
Nedə könül çü qul oldux ana məktub ilə biz.

Gözün ilə, sənəma, əsridi əql ilə könül
Əsridük, əsrimişüz sanma ki, məşrub ilə biz.

Eşqi sərkubdurur, fürqəti zərkubdurur
Zər qılalum hələ gül yanağı zərkub ilə biz.

Hacibi məhcub ikən avladı əql ilə dili,
Bilməzüz, neyləyəlüm, hacibi məhcub ilə biz.

Can zəifü könül oğrıvü gözüm səhl nəzər
Bəllüdür ki, nedəvüz bu qamu mə'yub ilə biz.

* * *

Günəş yüzi üsdindəki bədr ayma baxun,
Cəm camını dilərsənüz, uş ayinə baxun.

Sübh isdər isən öricəgəz gisuların gör
Gecəyi qaçan ki, çözinə yayına baxun.

Başdan keçürür yaşı bəni salar ayaxdan
İdman dilər eyləyə bu sərpayına baxun.

Bəni çü xəyal eylədi mə'şuqə xəyali,
Cana nə qılur işvəyi-hər cayinə baxun.

* * *

Günəşüm gülşənün içün aylar,
Şol hilali qaşun içün yaylar.

Şəkkəri təngini əcəb tutma
Belinə bax ki, görəsin taylar.

Sərv ilə tubiyə nəzər qıl rast
İkisi doxi oduna neylər.

Lə'linə çün nəzər qılına müdam
Qılmaya kimsə içməgə meylər.

Dərdüm içün bənüm dəva dedi key,
Qaçan edə bana dəva keylər.

Zayi olmaya olamı dəmi-sübh
Nə'rələrün yatur ikən caylar.

* * *

Eşq odına düşər könülüm yazıla doxi
Məxmur xumarı yazıla, yazıla doxi.

Azıla könül gisularun çox girehində
Eşqün ilə azmışdır azar azıla dəxi.

Zülfün tuzağına könülüm azıla düşdi
Bunun kibi quş ol tuzağa az ilə dəxi.

Yazılamı aşiq könüli qəmzən oxıyla
Ey neçə bənüm tək sana qul yazıla dəxi.

Şəhnazı ilə Rast bəni qıla mühəyyər,
Qaçan ki, mübərqa ola Şəhnaz ilə dəxi.

Bazı ilə gözləri qılur seydi-dilü can
Şöylə ki, kişi avlayımaz baz ilə dəxi.



* * *

Könlüm yenə ah etdi həva ilə həvəsdən
Gözüm dəm ura başladı Nil ilə Ərəsdən.

Şol səbzeyi sordum bu gecə lə'li-ləbindən
Aydur ki, şəkər necə ola xali məgəsdən.

Taldı könülüm zülfinə gözindən üşənür
Zira ki, gecə qorxar olur məst əsəsdən.

Lütfündən ümidüm çox umaram ki, irişəm
Hər ləhzə dərayi diləərəm səvti-cərəsdən.

Can mərkəbi təndürü fəda qıldı rüxünçün
Gər fil isə nə qıla çü ayrıldı fərəsdən.

Biz biri-birümüzi çü dün içrə buluruz
Pəs faidə nə, bu qamu bəvvabü hərəsdən.

Saqi tolu vcr, gözümə ənqa məgəs olsun
Şöylə ki, rəvayət qılınur şəmsi-təbəsdən.

* * *

Zülfünə düşən könül sərdən keçər
Xam ola şol söz ki, ənbərdən keçər.

Zülfə tolaşdı başı ilə oynadı
Zi rəsənbazi ki, çənbərdən keçər.

Zülfidür məqsud çün müşg anavuz,
Lə'lidür sözüm çü gövhərdən keçər.

Eşq sıdı dil bütini nedəlüm,
Çün xəyali-hüsni Azərdən keçər.

Müştəhayi-nəfsdür sögməkləri
Z'an səbəb ki, hövzi-kövsərdən keçər.

Din qərib olmış saçında dilbərün
Kimdürür bu eldə kafirdən keçər.

Qılmadı hərgiz əsər könülinə
Gərçi ahum səngi-mərmərdən keçər.

* * *

Həvaya uydı könülüm yenə bu ney səma'ından,
Neyimiş bu ki, yandurdı könüli istima'ından.

Keşişlər gördi könülüm nigarınun saçından ki,
Ümidi yox, qurtıla dəxi anun niza'ından.

Saçından bürqə əyləndi ki, dəgməyə yavuz gözlər
Göz insanı haris oldı ana ol imtina'ından.

Yüzüm toprax nəsimə ki, irürür bana hər sübhün
Nigarınun qoxusını irax-yaxın qina'ından.

Yüzündə günəş ilə ay qiran eylədi mizanda
Fəraq oldı bənüm xəttüm bularun ictima'ından.

* * *

Geç toğduğun üsdümüzə ay, ay, nə səbəbdən
Gövdəmi hilal etdügün ay, ay, nə səbəbdən.

Gözlərünə dersin ki, bəni əsridə hər dəm
Lə'lünə deməzsin bunı ay, ay nə səbəbdən.

Zih dilədi canı, qaşı yaya dedüm əbsənt
Araladı qəmzən anı a yay nə səbəbdən.

Hüsnün çavı rövşəndürür axır bu cəhanda
Yüzündə sitarə əcəb ay, ay nə səbəbdən.

Güneşümə yaxın olıcax bədr oluram bən,
Əksilə yaxın olıcax ay, ay nə səbəbdən.



* * *

Şol yar var ikən can gözi bədr ayı görürsə
Həm özini görsün yenə bədr ayı görürsə.

Ray anı bulısar könülüm ki, ola yarun
Arayanı bu qaşunun arayı görürsə.

Gözləri müdam əsridisərdür bu könüli,
Neçə ki, gözüm ana baxıp ayı görürsə.

Günəş dəxi zərrin ola yüzüm kibi rövşən
Bədr ayına baxıp tolu simayı görürsə.

Ay nola hilal oldı isə qaşlarun içün
Günəş dəxi ola əgər ol yayı görürsə.

Arayı könül dəxi neçəsi bula aram,
Gər gözin açıp hüsni-dilarayı görürsə.

Reyhan ola od nöqtəcə qılmaya məzərrət
Könlümə bənüm ənbəri-sarayı görürsə.

* * *

Bədr ay işinə bu gecə tana qaluruz biz,
Müntəzir olup görməgə tana qaluruz biz.

Bir söhbəti ki, bir nəfəs ol yar ilə keçdi,
Neçə ki, ömür var isə, ana qaluruz biz.

Xoş ana ki, xoş anladı qədrini bu dəmün
Nə eşqi canumuza, nə ana qaluruz biz.

Bən bəni tapunda göribən qaldum özümə
Görinməsün özün bu ki, sana qaluruz biz.

Bir lütf umaruz cövrün içində, şaha, övqat
Dəxi bu cəhan içrə yanana qaluruz biz.

* * *

Nigara, hər bilür baxmaz könülüm gözi bədr aya,
Canum eyləmi əsrükdür sənün ilə budur aya.

Gözüm ol gün gülistanda nəzər qılmış gülə bir gəz
Təbərra qılmışam andan ki, neyçün uydı bəd raya.

Həva zülfini gidərdi yüzindən sübh vəqtində
Həman dəm oldı rövşən ki, inam olmaya qaraya.

Belindən saçınun qılın necə seçə idi aqil
Və leykin saçınun fərqi şükür düşmişdür araya.

Saçuna gecə der isəm, nigara, göz qarasından
Ya neçə gisu yaraya gecədən özgə yaraya.

Könüli qılmışam xali, nigara, səndən özgədən
Xəyalüni biribigil ki, anı qıl-qıl araya.

Əgər xaraya toxınsa, keçər tidər gözün oxı,
Bilimezəm, ey yarənlər ki, qandadur bu xaraya.

* * *

Sən nə cansın kim, ayağun tozma can dökilür,
Sən nə kafirsin yoluna dinü iman dökilür.

Necə qandur ləblərün kim gözlərüm görməyicək
Gözüm ilə yüzüm arasında bin qan dökilür.

Gözləründən qəmzələr kim yağar işbu canuma,
Dərd sanurlar iraxdan leyk dərman dökilür.

Ol oxun kişindəyəm ki, sağlu sollu yayına
Can ilə dil kimdə ki, var isə qurban dökilür.

Əbri-nisan kibi kim dökilə gülşən üsdinə
Yaş güli-xəndan yüzünə qarşu giryan dökilür.



Könlümün odını gor zahir edəm bu dünyada
Gökdə uçan canvərlər yerə biryan dökilür.

Könülüm meyl etdi kondüm gün yüzinə dilbərün
Lacərəm, əşk olıban uş yerə üryan dökilür.

* * *

Riza qəzayadurur bu qəzada çarə bizə
Çəkəlüm anı ki, rəhm edə səngi-xarə bizə.

Cigərdə qalmaya taqət yürək ana döyiməz
Əgər saçın yasayup gösdərürsə qarə bizə.

Belün əgərçi ki, barikdür vəli bari
Bilür ki, barına biz razıyuz dübarə bizə.

Belün ilə könülüm eşq bazi dilər edə
Günəş yüzünə tağıt saçunı sitarə bizə.

Boyun qatında nədür sərv bir quru ağaç,
Ləbünə lə'l nə nisbət, çü səngparə bizə.

Kənara irmədi canum, şəha, miyanundan
Çü düşdi ortaya gösdər bəgüm kənarə bizə.

İmarət olalı eşqün xərab oldı könül,
Könül xərabalığıdur bu gün imarə bizə.

* * *

Nigar yolına can tərk qılmağ ərligdür,
Can oynamax tonı bənüm boyuma tərlikdür.

Əgərçi yeksüxən olmadı ləblərün cana,
Könülə gözlərünün işi yek nəzərlikdür.

Gözündən anlamışam bən ki, hər ki, səni sevə
Sənünlə neçə cəhan olsa işi birlikdür.

Ölüm doğülmi tapundan irax düşənlərə ki,
Yaxın olanlara işvələrün ki, dirlikdür.

Başum fəda ayağuna ki, başdurur ayağun
Ayax başa sayılur bu işikdə sərlikdür.

* * *

Gəldi yenə uş gülşənə səd naz ilə qöncə,
Bülbül necə eyləyə bu naz ilə qüncə.

Bənzədi gözümün yaşına türfə budur ki,
Bənzətdi yanağum qızılın rəngi turunca.

İçincə süciyi, sənəma, bizüm ilə faş
Xəlvətdə yeg imiş qanumı içsən içincə.

Bilincə ağızıyla belin təngdil oldum
Ağızına vəhm irməzü qayətdə beli incə.

Dilincə dilümi dilə al dedüm ana bən
Söz söyləmiş oldum yenə həm özi dilincə.

Qılınca nəzər qıl ki, gözi canı saçında
Atar yayını qatı oxı iti qıl incə.

Yirincə canı qəmzənə qo ki, hədəf olsun
Kim düzmişəm anı oxı ucında yirincə.

* * *

Tapunı sanma, nigara, bə rayegan sevərəm,
Neçə sənün kibiyi bən bərayi-qan sevərəm.

Sevərəm anıvü sevgüm dükənməz anun ilə,
Ləbiylə dişi içün gənci-şayəqan sevərəm.

Neçə ki, gisularun qılları var isə, şəha,
Ərinmədin bən aları yegan-yegan sevərəm.

Əgərçi gisularunı həzin dilər canum,
Ləbün ilə gül yanağunı şadiman sevərəm.

Əgərçi cani-cəhansın, sən ey cəhani-can,
Nedəm bu cani-cəhanı cəhani-can sevərəm.

Əmindürür könül, əgər aman dilərsə nola
Ayağı toprağını bən həmin-həman sevərəm.

Belüni görəli inçgə xəyalə düşmişəm,
Görəli ağzunı şirin, budur güman sevərəm.

Top oynamağı sevərəm belünlə zülfün içün
Gözüni görəli ox, qaşunı kəman sevərəm.

* * *

Necə könül quşı saçuna ilə,
Dilə qılma nəzər, canumı dilə.

Tolaşuram saçuna qorxum yox,
Tolaşam hər qıla, dəxi nə qıla.

Gözə mərdümlik eylədi kirpük,
Hər nəfəs silə gözlərümi silə.

Abi-əşk ilə gil qılam xaki
Ki, görə qılduğın bu abü gilı.

Şol ağu əyağıyla əsrükəm
Qətrəsin içər isə məst ayıla.

Can yitügin ləbündə sezərəm
Nolısar soralum bola ki, bilə.

Əm ilə çarə olsa dərdümə ki,
Ləbün işbu ləbüm ilə əmilə.

Nəm ilə oduma dəva qıluram,
Yoxsa döyəydüm odına nəm ilə.

Bənzümi saru qıldı hicri ilə
Dəm verür şimdi gözümə dəm ilə.

Ləbün əmsəm derəm vəli zülfün
Sehr edər gün keçürür əm-səm ilə.

Buldum əlüm irərsə otogünə,
Kə'bə içrə məqami-zəmzəm ilə.

* * *

Gözlərinə qul olunuz ya ibad,
Ki bulasız eşq içində izdiyad.

Gözlərün oynar fəridü ha ötər,
Yeg dəgülmi səd həzaran əz ziyad.

Bən yoluna can verəmü can ütəm
Adəmiyə dünyada yetər bir ad.

Bu dəmün xaqani sənsin iç ayax
Qanı qeysər qanı Kəsravü Qubad.

Sən bu mülkə nişə qıldun e'timad
Çün Süleyman taxtını gördün be bad.

* * *

Surəti-ziban, ey sənəm, aləmi-can nüsxəsidür,
Dəstə durur gül yüzünə necə ki, gül dəstəsidür.

Eşqin çərisi şöhrəti mülk ilə yayıldı çoxdur,
Zülfün anun ilə qomaz hənuz dəxi yayasıdur.

Gözi yaraladı bəni, yetdi yarası canuma,
Dəmrəni çıxmadı hənuz səhl ola yar yarasıdur.



Dört gögi yaşmax edinür, gün baxımaz cəmalünə,
Zülfünə qarşu gecə gər gözikə yüz qarasıdur.

Bən tapuna irəməzəm zülfi xəyali könülə
Müşg qoxusı qorxaram dünyalara çıxasıdur.

* * *

Sabahın gülşənə girdüm, dedüm: "Kim dürdi?" – dedi hu
Nə qoxudur dedüm, aydur: – Səbadan gəldi bana bu.

Ləbün əsrügiyəm nola şəkər bəndən dökilürsə, –
Ki sünbül yeyicək müşgi göbəginden dökər ahu.

İqab edər üqabı eşqi sırça könülümüzə
Fəda olsun hələ baza necə ki, xurd isə tihu.

Qulıyam yürək odınun irişdürür işin gögə,
Dəgül yaşı tok ki, ol axıdur yaşını hər su.

Qılurdum zari gülşəndə, ögərdüm yarımı ol gün
Ügeyik dedi gü-gü-gü, gögərçin dedi bu-bu-bu!

* * *

Yenə gözüm, şəha, eşqünlə rövşən
Ki, açmışdur günəş yüzünə rövzən.

Şəha, gisun nəsimindən axan su
Əcəb dəgülmi ki, geyindi cövşən.

Yüzün gülini biz sevdük nigara,
Dedük bülbülə ki, gülləri sev sən.

Bənəfşə gisuların dərdi ilə
Düta olup əlino aldı gəvzən.

Könülüm könləgini parə qıldı
Ki, qıldı kirpügündən anda suzən.

Yürək tamarlarından qan tamar çün
Gözünün qəmzələri oldı rəgzən.

Ümid əkdi könüldə eşqi yarun
Vəli verdi həvaya cümlə xirmən.

* * *

Tərk eyləmişüz sənün içün darü diyarı
Ta xoş görürüz hüsnün ilə bağü baharı.

Bülbül ləbünün qönçəsini görəli diltəng
Xürrəm yüzünün gülşəni hüsniylə saharı.

Ol gövhəri ta çıxara taşdan bu könülüm
Gərək ki, oda ura qamu hüsnü hisarı.

Cari qılur isə qanı göziylə rəvadur,
Ta qıla könül hökmini sevdüginə carı.

Kə'si ölümə tolu verü ari gözətmə,
Çün eşq yolında bir olur kə'sivü arı.

Mə'şuqə qovan necə qaçar tirü təbərdən
Gül dirənə nə görinisər zəhməti-xari.

Lə'li şəkərindən könülüm çün məzə iltür
Səhl ola yürəkdən gözi gər yaza xumarı.

Gözümə qararı gələli zülfi xəyali
Təndə qomadı canıvü könüldə qərarı.

Gözün kibi çin laçini bən görməmişəm hiç
Kim öz ayağı ilə gəlür ana şikarı.

Hər kim ki, kənarında görə muyi-miyanın
Necəsi miyanından anun qıla kənarı.

Yüzümdə çü urıldı anun sikkəsi zərdə
Ayruxsı dəxi olmayısar möhri-əyarı.



* * *

Ey gözi qaraxçı, ləbi saqi, bəni meynuş,
Vey qaşları hacib, yüzi xan, kirpügi çavuş.

Saçun girehi sehrini yetürdi şuna ki,
Bədr ayı yerə endüribən aldı dər ağuş.

Totaxlarun alduxları canı üləşiməz
Düşmiş hələ aralarına xuni-Siyavuş.

Kim gördi gecə güneşi ürkər güpəlücə
Ya kimün ola dünyada bir sərvi-qəbapuş.

Sevdası nədür müşk saçınun əcəba ki,
Ayru duramaz hiç zi kafur binaguş.

Al ölümi eşqün dənizi aşdı başumdan
Tufani-məhəbbət bu yürəgümdə qılur cuş.

* * *

Ey siyəh gisuvü səpid zəqən,
Gisularında səd həzar şikən.

Şəm necə ki, dili uzun isə
Nurun ilə məqamı oldı ləgən.

Can gisusı ilə pərişandur,
Gözinün guşəsində qıldı səkən.

Gözlərüm cə'fər oldı, çün totağı
Birisidür Hüseynü biri Həsən.

Qıl biliyçün tənümi qıl qılayım
Olayım yolına Üveysi-qəran.

* * *

Müsahiblər, gəlün, billah, qılun bir rayi-ruhanı
Ki, kim düşmiş ay üsdində əcəb bu dəstə reyhanı.

Dəxi nazük dilər isən aşağarax nəzər eylə
Ki, bir nöqtədə cəm etmiş motaı bəhr ilə kanı.

Əz insan gözün insanı ki, bir dil qoymadı salim
Əcəb olamı hurisin diyəməzəm k'əz-insanı.

Ləbündən bana bir cür'ə ki, zadi hər dü aləmdür,
Yegirəkdürür ol sudan ki, gəlür buyi-heyvanı.

Görəli işbu barı kim belünə barı vurmışdur,
Qomazam canı belündə ki, gösdərdə giran canı.

* * *

Odlar gəmişdi canumuza xali bu gecə,
Dərdi qomadı könülümi xali bu gecə.

Kəşf ola gözlülərə bu halüm bənüm gərək
Əhvəl gərək ki, anlaya əhvali bu gecə.

Yelda dedükləri gecə bir yılda bir olur
Bir aya satdum isə nola sali bu gecə.

Zülfeyni eşqinə ol urun çəng qılına
Dindürmənüz söziyilə qəvvali bu gecə.

Təsrif edərsə nola həva zülfini anun
Əldən çü gözi qomadı e'lali bu gecə.

* * *

Hər dəm bu könül quşını bu şəhbaza oynaram
Mə'zur tut həvadan əgər aza oynaram.

Zülfi həvaya oynar isə başını, nola,
Bən bir qıl ilə canumı sərbaza oynaram.

Sənün ilə sazkar olısaram demiş idi,
Bu söz içində bən yenə ol saza oynaram.



Vəslində əqlü canü dil oynamayam demə,
Hicrində çün qamusını bir naza oynaram.

Var pərdəvü məqam ilə avaza, sufiyə,
Aşüftə aşiqəm ki, hər avaza oynaram.

* * *

Bana yalan di gər ləbüni qanda bənzədəm,
Abi-həyatı bən şəkərə qanda bənzədəm.

Çoxlar ləbüni bənzədə çox nəsnəyəvü bən
Sirri-həyatı aləmə türvəndə bənzədəm.

Təşbih sünbülə necəsi zülfüni qılam
Layiq dəgül ki, mürdəyə bir zində bənzədəm.

Bən bəndə səndə kəndü özümi bulımazam,
Təndəgi cana leyk səni bəndə bənzədəm.

Ömrümdürür saçunu dilərəm uzun ola,
Sənsüz bu ömrümi dəxi bən bəndə bənzədəm.

* * *

Bəndə fəqiri-fəqrü qəniyi-qinadür ol,
Əsirgən ol qulı ki, əsiri-ə'nadur ol.

Mehrab qaşı gözləri yetər bana imam,
Əqsayi-məqsədü ərəfati-səfadur ol.

Bəndən əsirgəmə ayağun izi-tozını
Ki, xəstə gözlərümə bənüm tutiyadur ol.

Al canü əql ilə dili lə'lüni sun gerü,
Məcmuyi-zaye' olur isə xunbəhadur ol.

Bən canü əql verdüm, ana qılmadı qəbul
Mə'şuqə nazı səhl ola, zira rizadur ol.

* * *

Rəhm edə yar aşiqün gözləri yaşına gərək,
Anca dökəm gözüm yaşın ki, yüzüm aşına gərək.

Bən sevərəm cəmalini ol yürəgümün evini
Anun içün içümdəki taşına taşına gərək.

Eşqi dənizü əqlümüz əcnəbidür bu dənizə,
Könülümə xəbər qılun çün buna aşina gərək.

Gözlərümün yaşını bən yürək odıyla yaxaram,
Dəniz əgər görür isə yaşumı aşına gərək.

Zülfini bax səba yeli necəsi vorhəm eyləmiş
Hər nə ki, qıldı könülüm irişdi yaşına gərək.

* * *

Ağzun, sənəma, lə'li-ləbün əmə gərəkdür
Can xəstədürür, cəhd qıla əmə gərəkdür.

Bən canumı verdümü şahun şol totağına
Götürmədi gözinə, dedi nəmə gərəkdür.

Dedüm könülümə ki, irax yüri belindən
Dedi nedəyim anda bana nəmə gərəkdür.

Bibərgü nəvayuz hələ çəngi qılıban saz
Gəh ziro əl urasınü gəh bəmə gərəkdür.

Əksüklüyisəm aşiqünəm, ey şəhi-kamil,
Artux nəzəri sən qılasın kəmə gərəkdür.

* * *

Toldı içüm ol gözdəki nəm nəmə gərəkdür,
Can xəstəvü lə'li-ləbün əm əmə gərəkdür.

Sübhi yel ilə dəm verə zülfi bizə necə,
Dəm qıla məgər yürəgi dəm dəmə gərəkdür.



Yar yüzi bana Kə'bəvü gözüm yaşı zəmzəm
Həc mövsümidür eşq ilə zəmzəmə gərəkdür.

Bihəm olalı bahəm oluruz qamu üşşaq
Nə halət isə çünki bəhəm həm gərəkdür.

* * *

Aparun bəni yara, görişəyüm,
Yüzümi ay yüzinə sürişəyüm.

Totağı qanum içdi bən qanını,
Ol qanı anun ilə sorışayum.

Gözə-göz, yüzə-yüz canum aparur,
Ağız-ağız anunla sorışayum.

Bən könüli nişanü ol qaşı yay,
Yenə bən anun ilə qurışayum.

Bən ağızumı ağızına anun,
Qəmzəsini canuma urışayum.

* * *

Nay ki, əsli saz ola sazını naya bənzədəm,
Kirpügi ilə qaşını ox ilə yaya bənzədəm.

Ayü günəşdə çün gözüm gördi xüsuf ilə küsuf,
Ayipə yüzüni necə günəşü aya bənzədəm.

Ağızun ilə ləblərün abi-həyatü gül-şəkər
Sögməgüni anun içün cana duaya bənzədəm.

Çünki nicati könlümün həm yenə səndən olısar
Gözlərünün işarətin cana şəfaya bənzədəm.

Belün əgər xəyalümə gələ, xəyal ola xəyalı
Bu necəsi xəyal ola k'anı liqaya bənzədəm.

* * *

Can Xosrəvün cəmalinə Şirin dəgülmidür
Yürək hədiyyə yolına narin dəgülmidür?

Mehrab qaşlarında gözinün imamına
Uydurmayan nəmazını bidin dəgülmidür?

Boyı əlifü, mim ağızı, zülfiyivü nun
Qaşı olana alxışum amin dəgülmidür?

Qaşları qövsü kirpügi tirü özi həməl
Bədr ay yüzivü bənləri pərvin dəgülmidür?

Yüziylə zülfi ənbəri kafura saçdılar
Şol xətti-səbz ortada miskin dəgülmidür?

* * *

Gögə çıxdı sənün ilə, sənəma, rayəti-eşq,
Mö'ciz oldı, ey bəgüm, hüsnün ilə ayəti-eşq.

Səndə gördi bu gözüm gözin açup qayəti-hüsn,
Gösdərür anun içün gözlərünə qayəti-eşq.

Bən imamam qaşı mehrabına qarşı tururam,
İrürürəm kimə ki, gərək isə qaməti-eşq.

Eşqə möhtacdurur hər ki, vücudu var isə
Olmaya dünya vücudına dəxi hacəti-eşq.

Afət uğradı səmavi, sənəma, könülümə.
Kimsənün könülinə uğramasun afəti-eşq!

* * *

Yüzün dəri ilə bu gözüm nəm-nəm olısar
Olmaz olur isə bu gözüm nəm-nəm olısar.

Dəmdür yürəgüm qəmzən iləvü dəmidür kim,
Ol dəm dilü canumda bənüm dəm-dəm olısar.



Bən gözlərünün sayrusıyam, vardur ümidim
Kim lə'li-ləbündən canuma əm-əm olısar.

Çün yar cəmali ilə eşq irdi kəmalə,
Bu ortada şimdən girü bəs kəm-kəm olısar.

Dökiləli zülfi yüzinə bildi canun kim,
Şol yerdə ki, şadılığ ola həm-həm olısar.

* * *

İrürsə gərək eşq əri eşqin sənə bari
Bu də'viyə inanmaz isən gəl sınə bari.

Günəş yüzini aləmə gər gösdərür isə,
Sən köksüni aç, de günəşə gör sinə bari.

Bənəfşə neçün zülfün içün ola pərişan,
Zi yüzi qara halinə bax nəsinə bari.

Lə'lündən əgər failə irməzsə canuma
Bən razıyam andan hələ bir yasına bari.

Tağda qoyı, ver keyigi, dik sərvi çəməndə
Billah, nəzər et bu boy ilə bosına bari.

Canü tənü əqlü dil ilə başumı cümlə
Bir xəmsdürür ki, qomışam xəmsinə bari.

Bən cəhr ilə aydıram eşidün, tanuğ olun,
Yar dərdini irürür isəm həm sinə bari.

* * *

Neçə ki, ömrüm var bənüm yüzün kibi yüz görmədüm
Vallah ki, yüzün görəli özgələrə yüz görmədüm.

Boyün kibi sərvi-rəvan, gözün kibi nərgisi-məst
Zülfün ilə yüzün kibi gecəvü gündüz görmədüm.

Ay alnunı, gün yüzni hüsnündə bən görəlidən
Gətür həmayil içəyüm andı ki, yılduz görmədüm.

Varlığum elini, şəha, şöylə cəmalün aldı ki,
Ayinəyə qılup nəzər bən beni sənsüz görmədüm.

Bin gəz dəxi görür isəm, hər dəm səni toyımazam,
Bunca zəman keçmişdürür hənuz dəxi yüz görmədüm.

Eşqün düşəli içümə yandı cəhan dəxi bilə,
Dərdüm kibi bu dünyada səpişkən uyuz görmədüm.

Sənün kibi gözi xəta, saçı həbəş, özi xütən
Belün kibi bir bel dəxi yüzün kibi yüz görmədüm.

Bitdi yerindən görəli boyunı sərvi-bustan
Ayda bunun kibi alın, günəşdə bu yüz görmədüm.

* * *

Əyağı içməzü tutar tolu bu saqini gör,
Oxıru tutmaz oxıduğını yasaqını gör.

İrağ edər bizə vəslin yaxın qılur hicrin
Yaxınına nəzər etməvü bax iraqını gör.

Yüzinə gəl nəzər eyləvü hur vəsfini bil,
İzinə baxıban altındağı Buraqını gör.

Visalinə irişicək ərir bu var cigərüm,
Visali böylə olur isə gəl fıraqını gör.

Sən, ey könülalıcı, canaparıcı dilbər
Könülü can qatuna vardı uş yaraqını gör.

* * *

Çü saqi tapun ola sun bizə dəniz içəlüm,
Şunun ki, içməz əyağın gətür ki, biz içəlüm.

Əlündən ayağa bin canü dil ucuz verəlüm
Ucuz dəgül isə oğlan gətür ki, qız içəlüm.



Gözün şərabı ilə dünya xalqın əsritdi,
Gəlün bu dünya sücüsin ki, bizü siz içəlüm.

Əgərçi səbrümüz apardı xor qıldı bizi
Təhəmmül eyləvü sun anı biz əziz içəlüm.

Cəhanun ırmağını bimehaba dəniz içər
Çü saqi tapun ola, sun bizə dəniz içəlüm.

* * *

Lütf eyləvü aç said ilə saqı bu gecə
Andan tolu sun bizə əyax, saqi, bu gecə.

Car eylədi ki, bixud olavuz bu gecə eşq
Dirşür özüni saxla bu yasaqı bu gecə.

Ömrün keçəni keçdivü baqisi bilinməz
Xoş gör bunıvü qıl anı dər baqi bu gecə.

Şayəd ki, ləbi-lə'li xəyalini nigarun
Gösdərdə bizə sun meyi-bərraqi bu gecə.

Fərxundə ki, üşşaq işidür yarı gözətmək,
Mə'şuq gərək isdəyə üşşaqi bu gecə.

Bu rəsm ilə pərran edəlüm eşq ilə könli
K'ərvah tuta toptolu afaqi bu gecə.

Qanı mey edibən könüli yürək edəlüm,
Andan qılalum gözləri əyaqi bu gecə.

* * *

Tutalum ki, tutamazuz, şəha, zülfün ucını,
İçməzuz dəxi meyi-lə'li-ləbün məmzucını.

Qılalum hər gecə bayram qaşunun ayı ilə
Çü günəş yüzün ilə tutmışuz uş orucını.

Hüsni qorusına bən könülümi salmışam uş,
Özgələr sormağa qorxar ki, qanı qorucını.

Bən ururam özümi irməgə yar söhbətinə
Dünyada kim yığa bilür irici urucını.

Yar gözi türkü qaşı yaydurü qəmzələri ox,
Var ana görə qiyas eyləvü gör qılıcını.

* * *

Nigarına neçün yoxdur qərarun,
Cəhansın olamı yox e'tibarun.

Nə xunisin ki, qanum dökdügünə
Tanuxdur ləblərün ilə nigarun.

Miyanundan kənara irməyincə
Nə vəchi var miyanundan kənarun.

Nə ahusın ki, bin canü dil ilə
Pələng olmışdurur kəmtər şikarun.

Nigar içün nola gər çəkər isə
Kişi cövrini hər bir nabəkarun.

Bana səhra bu dəm dami-bəladur,
Çü sənsin rövnəqi hər mürğzarun.

Şəha, zülfündə bən nolam ki, vardur
Səba bigi həzaran biqərarun.

* * *

Yüzün çün toğdı məclisdə münəvvər qıldı ətrafı,
Xəcil qaldı cinan əhli dəgül əshabi-ə'rafı.

Ləbün qatında qara bən şuna nisbət qılur ancax
Sanasın, bir qara quldur qomış yerində sərrafı.



Əgərçi Qaf olmışdur günəhlərüm bu həzrətdə
Kərəm cümləsi olmazsa bana kafidürür kafi.

Tolu ver içəlüm cami ki, qanda bulınur hər dəm
Yaranlar cəm işböyləvü şahid, saqi, mey safı.

Ləbünə vəqf qıldum can ki, aləmlər həyatıdur,
Cəhan xalqı ululara qılurlar isə övqafı.

Bu eşqi dərdinə hərgiz ləbindən özgə dərman yox
Anun içün yörəsində xəti yazmış hüvəş-şafı.

Bəşər qandavü sən qanda ki, nuri-nursın, vallah,
Nə var, ilhaq edər isə səni anana bir qafı.

* * *

Zi rəhməti-rəhmanü zəhi lütfi-ilahi
Ki, xəstəyəm dərdə şəfa oldı şifahi.

Müzmər yüzi bədrində anun dövr müsərrəh,
Zülfi girehi silsiləsi namütənahi.

Sevdası budur zülfi-siyahını görəli,
Bu gözlərümün ki, qaralar çevrə siyahi.

Ərz edər isə hüsnüni yılduzlara gecə
Dəxi deməyə müştəri bədr aya ki, mahi.

Layiqdür ayaxlarına ki, irürələr baş
Şunlar ki, ayağı tozına qodı cibahi.

Gözi qanuma girdi xəta etmədi zira,
İnsan qodı dünyada yenə eyni-günahi.

Kuh isə tənün, eşq odına kah gərəkdür,
Ahun fələgə irsə, gərək olmasa vahi.

* * *

Dərdün odına, şəha, eşq ilə yanam nə isəm,
Bağrumı dəlibənün səndə görürəm nə isəm.

Göz yaşı dənizinə qərqəəmü, qılmaz əsər,
Ol dənizdən bu bənüm oduma bir nəm nə isəm.

Çün dəlük-dəlük edər bağrumı hər dəm dəm ilə,
Var ümidüm ki, ləbi-lə'linə irəm nə isəm.

Necə ki, sərvinə əl irməz isə xizmətinə,
Başdan-ayağa dəgin külli quşanam nə isəm.

Eşq əri başını neçə ki, kəsər ney kibi dost
Urayım aləmi fəryad ilə bərhəm nə isəm.

Bəni gər hiçə sayıb yar odına salar isə
Ol oda anca bənüm kibiyi yaxam nə isəm.

Vəslü hicran deməyüb lə'li-həvasında anun
Galı zir iniləyəm, gəh çağıram bəm nə isəm.

* * *

Xumarumuz çü yazıldı, tur imdi badə gətür,
Keçən ömürlərümüzi bu ləhzə yadə gətür.

Xumar ikən tolu verür idün əyağı bizə,
Xumarumuz çü yazıldı əyax ziyadə gətür.

Çü tolu içəli əyağı, qalmadı əğyar,
Əyağı bizə sulu verme sırfü sadə gətür.

Şikəstə bəstə bənüm tək ki, bəsteyi-zülfəm,
Gözün içün nola bir xəsteyi-fütadə gətür.

Rüxün içün neçə şah fillərini tərh qılur
Atını salduruban nəthünə piyadə gətür.



* * *

Gül biki bülbül içün bən yaxamı çak edəyüm,
Zöhrə zəhrəsin alıb ah bir əflak edəyüm.

Hələ şayəd ki, xəyali gələ könlüm evinə,
Qeyri taşra süribən məclisini pak edəyüm.

Zülfi tək oynayayum başı həvasında anun
Can yaxıban odına tən yolına xak edəyüm.

Sən keyik gözlücəyə seyd edəyüm var canumı
Zülfüni vərhəm edüb boynuma fitraq edəyüm.

Nöqtəvü xət necəsi qismətə qabil olmaz
Silinürək salını gəl anı idrak edəyüm.

Eşqi ümmanü ya dərdi tamu yesə nə qəm
Təni xar odınavü bəhrinə xaşak edəyüm.

Bəhrü bər dinləməgil, xüşkü təri isdəməgil,
Dili qəmnak edibən dideyi nəmnak edəyüm.

* * *

Hüsni bazarında canum mən yürid olmış bu gün
Eşqi tək dərdüm anunla vər məzid olmış bu gün.

Olalı Mənsur canum zülfi fitraqində uş
San ki, könlüm əqlüm ilə bayəzid olmış bu gün.

Piri-eşq irşad edəli könülümi bu yola
Bin cəvan Məcnun olub uşda mürid olmış bu gün.

Ey neçə də'vi ziyad edüb təvil etdi sizi,
Gər həzaran cəhd edər isə, fərid olmış bu gün.

Saqi, camı tolu sunü mütrib nəva ağaz qıl,
Yar ilə məclis yaraşmış ulu eyd olmış bu gün.

* * *

Ey eşq əri, gəlgil bərü bən sana yoldaş olmışam,
Qalmadı hiç gizlü işüm uş aləmə faş olmışam.

Bən bir zəman zahid idüm təsbih ilə, təhlil ilə,
Şimdi ki, gördüm yüzüni, uş rindü ovbaş olmışam.

Anca yüzümi qılmışam toprağ ayağun tozına
Ki, başını qoyanlara yoluna bən baş olmışam.

Paludə qıldı kirpügüm, inəbidən göz yaşını,
Bən varlığumla şimdi uş həlvaya xaşxaş olmışam.

Özümi rüsva qılmışam dünya qovanlara ki, bən
Eşq əhli meydanında uş əhsəntü şabaş olmışam.

* * *

Əcəb neçün bəni səndən fələk dilər ayıra,
Rəva dəgül axı yardan ki, yarı yar ayıra.

Çü məclisündürür uçmağumü tapun huri
Güman aparma ki, bəndən tapunı nar ayıra.

Cəhanda budurur adum ki, qoymadum adı-sanı
Ya necə bəni tapundan bu nəngü ar ayıra.

Bu eşq dənizinə göz yumıb özini salan
Nə əcəb ola öziyçün əgər kənar ayıra.

Özinə sürmə qıla ayağun tozını, gözüm,
Əgər səba yeli bir lütf edüb qübar ayıra.

* * *

Necə fəraqun ilə can bu oda yana könül,
Bu dərdü həsrət ilə hələ irdi cana könül.

Səni dilər, səni sevərü səndən ayrılmaz
Tapundan ol sanuyı sanma ki, usana könül.



Necə ki, xülqi yaman isə can anı taplar
Tolaşdı, qanda baxar yaxşıya-yamana könül?

Anı sevən yolına oynasa gərək canı,
Bu yasağı xu eşitdi gərək yasana könül.

Düzəli qaş-yayına kirpük oxı türki gözün
Qılupdurur öz-özin ol oxa nişana könül.

* * *

Tolu sun əyağı ki, içəlüm sabahadəkin
Həramı xoş görəlüm, k'irürür mübahadəkin.

Ləbün çü rahəti-candurü can anun bədəli,
Kişi ki, rahata irməz irürə rahadəkin.

Gözi qan etdi yürəgümivü ləbini bən
Qisas yazdı çələb dünyada cərahadəkin.

Gözi uyır idi, dilədüm ol sunam ləbino
Qaxıdı, qurdı yayın urdı əl silahadəkin.

Çü qəlbdür yürəgüm, eşqünin yolında gərək
Ki, irürəm könülüm quşını cünahadəkin.

* * *

Nigarına, nigarına be qayət bivəfasın sən,
Cəfanı görməyəyim ki, səfa içrə cəfasın sən.

Görəli məst gözüni nigara, xəstəyəm xəstə
Şifahuna irər isəm, sanasın ki, şəfasın sən.

Saçun ömrüm kibi gərçi uzanmış leyk müşkil bu
Ki, baxıban görimezəm əcəl tək dər qafasın sən.

Bilürəm hurisin, şaha, bəni adəm dəgülsin xud
Bilimezəm ki, neyçün pəri tək dər xafasın sən.

Çü bən səndən görimezəm vəfadan, şaha, bir zərrə,
Bana nə fayidə qılur, tutalum ki, vəfasın sən.

* * *

Nedəlüm bilimezüz biz könül ilə, könül ilə,
Cəhanı xərab edərsin könül ilə, könül ilə.

Canı ortaya qoyarlar, vəli könülə uyar can
Canı oynar ol ki, gəlür könül ilə, könül ilə.

Bu cəhana yayar isən, sənəma, saçun tuzağın,
Dəxi quşı umma illa könül ilə, könül ilə.

Necə əqlü can turursa bu tənümdə bən gedərəm,
Zənəxi-çahına yarın könül ilə, könül ilə.

Könül ilə dedüm ana könül ilə dinləmədi,
Könül eylədünsə eylə, könül ilə, könül ilə.

* * *

Ya çələb dərdümüzə çarə qıla,
Ya könül könləgini parə qıla.

Oda salar özini dürri-ədən
Ta bənünçün yüzini qarə qıla.

Ay yüzündən günəş utanduğıyçün,
Bulıdı özinə sitarə qıla.

Belünə sundum isə eyb etmə,
Qərq olan cəhdini kənarə qıla.

Kəməri bir qılı iki bağlar,
Sözi bir nöqtəyi dü parə qıla.

* * *

Gəl, ey saqiyi-səmənbər, bizə tolu badə vergil,
Biribi həvan odını qəmi cümlə bada vergil.

Yüzünün niqabını aç ki, günəşi unıdalar,
Saçunı əlünlə tağıt, zülüməti badə vergil.



Sənəma, sənün həvanı dü cəhanü cana aldum
Dəxi kimün artuğı var hələ bir məzada vergil.

Bu cəhan sənün əlündən otur imdi fitnəyi bas,
Yoxısa tur uru salın, qamusın fəsada vergil.

Yanıcı kim isə dərdə yenə şərbət ana gərək
Ləbi-lə'lünün şərabın məni-namurada vergil.

* * *

Tolu ver əyağı bizə ərinmə, ey saqi
İçür ki, bixud olalum boşaltma yasaqi.

Gəlün dirilün, içəlüm əyağı, xoş keçəlüm,
Bir-iki gün bu ömürdən çü buluruz baqi.

Qılıcağ uçmağumuz bu irağı ol aləm
Gəlün ki, yasanalum bu yaxını, iraqı.

Gözüm yumub salaram canı şol dənizə ki,
Nə ortası görinür, nə görinə qıraqı.

* * *

Canum sevərəm səni, səni, illa səni bən
Ol bunı sevərü bu anı, illa səni bən.

Gündüz-gecə ay günəşi qovar, günəş ayı
Hər birisi qovar qovanı, illa səni bən.

Alan alana derlər isə işbu cibanda,
Alsun nola alan alanı, illa səni bən.

Bən zülfünə ildümü gözün bağruma düşdi,
Düşən düşən ilən iləni, illa səni bən.

Eşqün bana biliş idivü yad idi hicrün
Yad yadıvü bilən-biləni, illa səni bən.

* * *

Bən ki, hər ləhzə bu canumı cəhana verürəm,
Nola öz işüm içün canı çü cana verürəm.

Ləbi içün dökərəm yaşı gözümdən nə əcəb
Lə'l içün incü düzümini dükana verürəm.

Ol qanatdı yürəgümivü totaxlarını bən
Varlığı üsdə neçün hələ bu qana verürəm.

Can vücudumda yeganə dururü bulur isəm
Dünyada canuma ərzanı yeganə verürəm.

Ol bana zülfi girehlərini gər eylədi dam
Göz yaşı incüsini bən ana danə verürəm.

* * *

Öldüm ləbün içün bana abi-həyat irür,
Eşqünlə yayağam, paşa, lütf eylə, at irür.

Sən şəh rüxi içün bu dəm oldım piyadə bən,
Gərəksə qayimə dökü gərəksə mat irür.

Bən susamış bu eşq yazısında qalmışam,
Ülitməgə dimağı ləbündən nəbat irür.

Xəttün dilər ki, dərdümə nüsx qıla dəva
Vəqtüm çü nazik oldı, təbibə dəvat irür.

Sən hüsnə bayü vəslünə bən qatı yoxsulam
Tanrına bax, ey bayü fəqirə zəkat irür.

* * *

Baxmaz oldun bizə, can, eyləmi, könül alalı
Can quşın görməmişəm dəxi saçuna iləli.

Dünyavü axirəti hiçə dəxi almamışam
Canü könül verübən eşqüni əl-əl alalı.



Seyl axar oldı qanın gözlərümün yaşına bax,
Lütf edüb anı gecə yağluğun ilə siləli.

Yürəgüm yarası qanda onunla əql dəgül
Tuzı əksilmədi hiç, kirpügün anı diləli.

Əql nəsnə qomamış idi ki, vermədi ana,
Tifli-şeş ruzə kibidür hələ səni biləli.

* * *

Hər ləhzə gözün könülümə ox şaşayım der,
Zülfünə tənüm anun içün oxşaşayum der.

Şeş gögsüni dersə ki, yürəgünə uram ox
Bin canü dil ilə yürəgüm ox şaşayum der.

Məxmur görüb gözüni gözüm ana hər dəm,
Yüzümi yüzünə uruban çox şaşayum der.

Tən incovü könül tarü yürək qan idi bən,
Oxşaşduğum içün yar ilə oxşaşayum der.

Sərviyi rəvan eyləyicək gülşənə sübhin
Gövdəmdə varı sünügümün qaxşaşayum der.

* * *

Aşiq ki, oynayımaya canını xam ola,
Verməsə ay varın günəşə natəmam ola.

Gəh zülfi tağıdub, gəhi saçını dərməsə
Əhli-təriqətə necəsi sübhü şam ola.

Gər şah ola nola könül əlində ol qulam
Sultan ikən bu can bələ ana qulam ola.

Sən öz-özüni sevü nigarun odına yax,
Taş çün sınavü gör oda yaxıla cam ola.

Kimdə ki, varlığı qarışa qəlb ola yəqin
Saf oldurur ki, aşiqi mala kəlam ola.

Uydurmışam nəmazumı gözünə, ey nigar
Uymamağ olamı çü gözün tək imam ola.

Qanum həram ikən çün ana qılmışam həlal
Vəsli həlal ikən nə rəvadur həram ola.

* * *

Yenə bu xatirə düşdi müsahibani-qədim
Ki, zöhrə çəngivü ay saqi, günəş idi nədim.

Əzabı əzbi-ləbindən bizə irax olıban
Visali ne'məti bu canumuza idi nəim.

Çəməndə xəlvəti vəslini ixtiyar edicək
Bizə nisari-gül edər idi nəsimi nə sim.

Eşikdə gecə idi hacibü səba fərraş
Tapuda gözüm idi saqivü həvası müqim.

Nə nəfxi-sur ki, ol hur gər tərənnüm edə
Qopa gələ lahidindən qamu e'zami-rəmim.

Bana dedi ki, canun ver ki, bən sənün olayım,
Murada irdüvi irmədi və'dəhayi-kərim.

Yüzi günəşi, qaşı ayı, müştəri totağın
Görəli bildi könülüm ki, şol dəm oldı saqim.

Banavü dilbərümə yox nəzir aləmdə,
Vəli cəmal anavü eşq bana oldı qasim.

Gəlün baxun yüzinəvü mö'cizəsini anlan, –
Ki, qılmış ayı giçi barmağı ilə bədü nim.



* * *

Əya Şirin nə Xosrovsın ki, şirin can sana şeyda,
Cəmalün çaşti-sultanı uzun saçun şəbi-yelda.

Şəha, hüsnün içində sən çü bir yalğuzək olmışsın
Nola eşqün içində bən fərid olur isəm fərda.

Bizə və'də qılupdur tanla uçmağ ilə hurilər,
Nola imruz olur isə bizə ol və'deyi-fərda.

Əgər məqsuda irərsəm, zəbi ne'mət, zəhi dövlət
Əgər irməz olur isəm həzaran həsrəta dərda.

Çü sadiq aşiqünəm pəs sənün eşqinlə bən biləm,
Çü mən bir Məcnun əsliyəm mənü Leyli bilə bəyda.

Gərək anca çağıram bən eşigündə səhərgəh ki,
Qulağıma nida gələ ki, ya ləbbeyk, ya əbda.

Yüzünlə belün apardı can ilə könüli külli
Kimi zahir, kimi batin, kimi pinhan, kimi peyda.

* * *

Hüsni cəmalünə şaha, bağı-irəm derəm,
Nə olsa olsun, ana bən hələ irəm derəm.

Badam gözlü, alma yanax, şəftalu totax
Cümləsi cəm səndə, oları dərəm, dərəm.

Oban iti ayağı tozın sürmə çəkərəm
Firdovs uçmağındağı huri yirəm, derəm.

Bir busə dilərəmü anı tartınur bizə,
Bin canü dil dilər isə, ana verəm derəm.

Bən bir əyax sunaramü içməz əlümdən ol,
Gər zəhr sunar isə, əlindən yerəm derəm.

* * *

Eşq ilə dərdüm qatı lütf ilə de əm, bəgüm,
Şərbəti-heyvan imiş totağun əmsəm, bəgüm.

Sərvi-qədün hər nəfəs gözümə bir-bir xəyal
Gözlərüm anun içün yaş ilədür nəm, bəgüm.

Lə'li-ləbün eşqinə qara qan oldı cigər,
Zira ki, bulınmadı dərdimə həmdəm, bəgüm.

Dür dərini görəli gül yüzinün üsdinə
Vəqti-səhər başladı ki, düşə şəbnəm, bəgüm.

Bənümlə saz etmədi eşq nəvası dəxi
Neçə ki, zir inlərəm yolına ya bəm, bəgüm.

* * *

Bizə tolu ver əyağı bəharı bilməyəlüm,
Saçunı çöz, şaha, leylü nəharı bilməyəlüm.

Təbəssüm eyləgilü söyləmə bizə hərgiz,
Dilək bu isə ki, sirrü cihan bilməyəlüm.

Niqab tut ağızunavü gözlərüni yum,
Dilək ol isə ki, xəmrü xumarı bilməyəlüm.

Həzar şur qılur zülfi bir səba yelinə,
Nəcəsi arizin ümmivü arı bilməyəlüm.

Bizi yəsara irürgil eyni-yəmin ilə
Tolu əyağunı sun ki, yəsarı bilməyəlüm.

Hər öpməgə ləbünə can borcumuz vardur,
Ləbünlə əsridür isən şümarı bilməyəlüm.

* * *

Məxmuri-ələstəm nola gər oldum isə məst,
Saqi, tolu ver sağərü mütrib qatı ur dəst.



Mə'şuqə sənün dilər isən ki, olam külli,
Sən dəxi gərək anun olasın hələ sərbəst.

Belün ilə kaham, vəli kuhəm kəmərünlə
Varlığum ilə sənünəm ər nist, vəgər həst.

Bən daneyi-xalündən irax düşməyisərəm,
Zülfün neçə ki, şura bənüm könlüm içün şəst.

Bən badi-həva ilə könül atını qoşdum,
Zülfün ilə şimdi nola gər can ola həmdəst.

* * *

Qanısın, qanısın, qanısın sən
Ey canum, yürəgüm qanısın sən.

Könlüm elini nişə yaxdun,
Bu şarun, ey bəgüm, xanısın sən.

Dini yox səni sevməyənün,
Bu dinün imanısın sən.

Totağun yenə lə'lə bənzər,
Sanasın ki, kanısın sən.

Bu nə tən, bu nə can ki, sənün var
Sanasın canumun canısın sən.

* * *

Ayinə al əlünə ola ki, bir yüz görəsin,
Ayı nədür deyibən ola ki, bir yüz görəsin.

Bən sənün birünə ömrümdə kişi görməmişəm
Hər nəfəs sən səni sevən birünə yüz görəsin.

Ay ilə günəşi səni görəli görməmişəm
Sən rəva olamı hər gecə ki, yılduz görəsin.

Bəni bəndən ilədürsin görəməzəm səni bən,
Zənnüm oldur ki, dilərsin bəni sənsüz görəsin.

Tən xu yoxdur, can apardun dinü iman qomadun
Dilədün xəlvət edüb, yə'ni xu dinsüz görəsin.

* * *

Əya şahi ki, bən sənsüz cəhanda dirligüm yoxdur,
Çü bən sənəmü sən bənəm daxila birligüm yoxdur.

Gözün qılduğını cana necəsi şərh qılayım
Hələ müxtəsər oldur ki, sünükdə iligüm yoxdur.

Gözi yağıdurur bana, girişmələri sülh eylər,
Vəli necə ki, qurmışdur qaşını illa kim yoxdur.

Həzaran Rüstəmi-dəstan eşigümdə ayaxcıdur,
Vəli Bəhram gözini göriçək ərligüm yoxdur.

Tənümə eşqünüz könləkü dərdünüz qabaçadur,
Cəfanuz boyuma oxcarü leykin tərligüm yoxdur.

* * *

Gözi yenə başladı bənüm könülümə cəng
Mütrib yenə hərbi çala başlağıl axar cəng.

Can məstdürür əql qılur də'viyi-zöhdi
Ey eşq uru turu bırax şişəsinə səng.

Xunin dökərəm yaşumı meygun ləbün içün
Gül yüzün içün nola içəm badeyi-gülrəng.

İncəldi tənüm belün içün leyk yeridür
Çün pistə ağızun içün oldı könülüm təng.

Şəhnazı ilə rast mühəyyər mən anunçün
Kim eşqi içün sübhədəkin qıluram ahəng.



* * *

Gəlün sabaha dəgin yaxalum bu misbahı,
Verün ki, rahəti-raba irürəlüm rahı.

Ağızı lə'l xəzanəsinə kilid urmış,
Canumuz isə fədadur olursa miftahı.

* * *

Olmaya bənüm biki aləmdə bərgiz mərdi-dil
Sürxi-əşkü zərdi-rüxsara dərun pür dərdi-dil.

Fərdi-hüsn oldur, anunçün fərdi-eşq ana bənəm,
Ol müsənna qaşına qıldum fəda uş fərdi-dil.

Gərmü sərdi-eşqini çox çəkmişəm anun içün
Qomışam yolına əşki-gərmü ahi-sərdi-dil.

Şeş cəhətdə niçə hissi çarsudan bağladı,
Tasi-eşqə kəbəteynün yin salalı nərdi-dil.

Canumuzdur ləblərün anun içün, anun içün
Dökərüz ayağına bu əşki-canpərvərdi-dil.

* * *

Göziylə xəstəyəmü gözi dəxi xəstədürür,
Şikəstə zülfi ilə zülfi həm şikəstədürür.

Yüzinə gül ya bənəfşə, saçına necə deyəm,
Həzar ikisi biki yüzində dəstədürür.

Könül şikayət edər gözlərinə der ki, qaçan
Xitab xüftəyə yaxud itab məstədürür.

Ləbiylə əsrügəmü gözi ilə məxmuram,
Bu iki hal cəhan içrə meypərəstədürür.

Könül şikəstəvü canum saçuna bəstə ikən
Əcəbləmə sözümi gər şikəstə bəstədürür.

* * *

Sevərəm, sevərəm usanmax bana yoxdur,
Nə kim dersən uyaram, çəkinmax bana yoxdur.

Tana qaldı bu gecə yüzi bədrin içün can,
Çü bədr ay ana irdi oyanmax bana yoxdur.

Əgərçi ərimişəm anun şivəleriylə,
Şunı kim ələ aldum bıraxmax bana yoxdur.

Sənünçün olan əsrük bu yolda ayığ oldı,
Bənəm sərxoş-əsli ayılmax bana yoxdur.

Qamu irmağı irmax olur cəhd qılıcax
Bənəm eşq dənizi ki, ayırmax bana yoxdur.

* * *

Ah əgər sənün ilə bən tana çıxaram bu gecə,
Nə ki, gündüzin yaparsam şimdi yıxaram bu gecə.

Gözlərün bəni dilər zülfün ilə biliş isəm
Eyd olmaya anda çünki yuxaram bu gecə.

Zülfün ilə bən ənbərəmü xalün ilə çün udam
Müşk saçunun yolına odda qorxaram bu gecə.

Bən ki, eşq oğlanıyam ayrılmazam andan
Sormadın şərrü hüzün ana çoxaram bu gecə.

* * *

Gözündən əsriməgə dilərəm şəha dəstur
Ki, məst olıcağaz olmayısaram məstur.

Saçun qoxısı ilə diriyəm şəha bunda,
Nigara, lütf edibən yelini bizə əstür.

Əzəldən əsrügəmü şimdi olmışam məxmur,
Tolu ver əyağı saqivü mütribə dəst ur.



Qaşı yayına gözi kirpügi oxın gizlər,
Canum fəda sana tək qaşı yayını yastur.

Gözün oxı canuma dür, nigara, abi-həyat
Və leyk özgəyi səstürməz ol bəni səstür.

* * *

Nə dürlü cəfa var isə qıl cana ki, sənsin,
Qayırma bu aşq canını çün sən əsənsin.

Eşqə ki, Əlidür nə Yezid oldı fəraqun,
Lə'lün çü Hüseyn oldı tapun, çünki həsənsin.

Mənsur olur isəm nola bu eşq yolına
Şol zülfü qəd ilə bana çün darü rəsənsin.

Məcnun olar isəm nola bən eşq ilə hər gün,
Ey Leyli, bana hər gecə çün silsilə sənsin.

Ay yüzün ağılında könüllər sürülənmiş
Oğlansın anı anlayımamışsın, o sənsin!

* * *

Gördi görəli görmədügini gözüm bənüm,
İrdi irəli irmədügünə özüm bənüm.

Biliş idi əzəldə canum yar canına,
Andan barışdı yarum ilə yılduzum bənüm.

Şol söz ki, suzi olmaya badi-həvadurur,
Suzi gərək ki, ola cəhanda sözüm bənüm.

Şəkkər ləbünə tuza axar tək axar könül,
Ana şükür ki, şəkkəri qıldı tuzum bənüm.

Yoluna bin bənüm kibi qurban nə nəsnədür,
Hər dəm hilal qaşuna qurban yüzüm bənüm.

* * *

Canum mühəyyər oldı çü şəhnaza başladı,
Saqi əyağa çalıcı avaza başladı.

Mən azucux ilə tağaram ayağı tozın
Çoxlar izindən ol şahumun aza başladı.

İrdüm tapusına yükünüb sundum əyağı,
Almadın əlinə əyağı aza başladı.

Kirpügi yazmaz idi könül butəsini hiç
Qış olalı qaşı könüli yaza başladı.

Zərbazdur yanağumü sərbazdur başum,
Zərbaza baxmadı gözi, sərbaza başladı.

* * *

Hər gecə tanadəkin yüzün içün, ay bəgüm,
Tana qalıb sayaram yılduzları, ay bəgüm.

İşbu uzun gecədə çəkdügini könlümün
Zülfün əlindən dilüm deyiməz, ey vay, bəgüm.

Sən qəni möhtac, bən necəsi hal qılısar,
Dünyada bu müşkili yoxsul ilə bay, bəgüm.

Lə'li-ləbün axıdur yaşlarumı qan nola,
Bir dəm əgər tolamaya seyl ilə bu çay, bəgüm.

Könülümi kirpügün şişlədi eşq odına,
Zira kəbab edilür içilicək mey, bəgüm.

Zülfün ilə başuma gəldügi sevdaları
Bu gecə yeldadurur bən deyəyüm, say, bəgüm.

* * *

Lə'li-ləbindən soram qanı yürəgüm qanı,
Qanını xud görürəm qanı yürəgüm qanı.



Canuma canidürür canı, vəleykin təni
Bana dedürür hərə şi'r ilə bu təni.

Çin deyəlüm gözləri rast xətayidürür
Bu könülüm Misrinün pəs nədən oldı xanı.

Qəbqəbi kafurıvü müşgidürür bənləri,
Yanağı gülgün, vəli gisuları susəni.

Eşqi odı tamğalar yeni gələn könüli,
Zülfi kəməndi ilə ram qılur tusəni.

* * *

Ləbünə susamışam nola bana əm deyəsin,
Bəni əgərçi gözün xəstədür əməm deyəsin.

Yürək qanı bu gözümdən ləbünçün axar seyl
Çü e'tidarına gələsin ana nəm deyəsin.

İçüm yanarü fəğan edərəm gecə-gündüz
Kiminə zir deyəsin, kiminə bəm deyəsin.

Neçə ki, gisularunçün nə qəm qılam gecələr
Sən ana urmayıban qulağun, nə qəm deyəsin.

Sən idügüni bilüb qıluram sana secdə,
Bu secdəmi sana səni, sənəm, sənəm deyəsin.

* * *

Çü arar isəm bən, bana nə nam gərək,
Tolu ver əyağı, saqi ki, mey müdam gərək.

Əya məlik ki, sanadur bu dəm mələk bəndə
Tapunda zöhreyi-çəngi fələk qulam gərək.

Saçun ilə gecədəyəm, yüzün ilə gündüzdə
Hər ayinə bizə dünyada sübhü şam gərək.

Anun içün ölürüz, anun içün ölisərüz
Ki, neçə ki, diriyüz bu cəhan bokam gərək.

Çü xas bən sənünəm, mütləqa bənüm ol sən,
Bu ortada neyiçün elm xasü am gərək.

Sənünəmü sənün olısaram gecə-gündüz
Bənünlə zülfün ilə pəs nə danə dam gərək.

Sücud qılmışuz ol həqqə ki, buyurdı bunı
Qu'ud isdəyonə əvvəlin qiyam gərək.

Çü hüsnün içinə girdüm dedüm səlamu əleyk
Qapundan içərü girənə bir səlam gərək.

Əgərçi qalmamışam dünyanun məta'ına bən
Bu xalü zülfü xədü qəddünə qalam gərək.

* * *

Kirpügün tir olalı, qaşun kəman
Bəllü bildük yoxdur əcəldən aman.

Şəkkər ağzundan acı dil verəli
Yaxşılardan başladı gəlür yaman.

Nə ki, həzz alam tapundan diləröm,
Bir məkan içrə sənünlə çox zəman.

Belünə baxdum nə gördüm bir xəyal,
Ağzunı gördüm, nə gördüm bir güman.

Bənzüm ilə gözümi görür axı
Dəxi nə hacət arada tərcüman.

Dünyada hüsnüni sevdüm bən həmin
Cövri bənüm canuma qıldun bəman.

Bəni qul qılurü hüsni-xət yazar
Özi şahid gözləri olur zaman.



* * *

Qılmadı eşqə kimsənə də'va bənüm kibi,
Olmadı yoluna kişi rüsva bənüm kibi.

Hərgiz dimağ mətbəxi içində dünyada
Zülfə bişürmədi kişi sevda bənüm kibi.

Bu dünya xoşlığına ki, bən şimdi haviyəm
Bilmədi səni qayəti-qüsva bənüm kibi.

Əsrimişəm gözündən o lə'lüni umaram
Yoxdur xumar ki, uma həlva bənüm kibi.

Bən toprağamü gözlərüm irmağ, od içüm
İşbu həvada olmaya dərya bənüm kibi.

Bən bir tənəm ki, canumı isdəb bulımazam
Məcmu'ədə olamı müəmma bənüm kibi.

Kim ki, kitab oxıdıvü eşitdi qissəyi
Oxımadı, eşitmədi qovğa bənüm kibi.

* * *

Eşq əri üğüş dərd ilə heyran ələ girsə,
Mə'şuqə dəxi töhfeyi-dövran ələ girsə.

Can aldı xəyalini gerü qodı qatumda
Can getdi, vəli şimdi geri kan ilə girsə.

Badi-səhəri tək yüz eşiginə sürəydüm
Bir sübh əgər kuyinə seyran ələ girsə.

Cənnət nə gərək, hurü qüsurun nedərüz biz,
Anda bizə bir sidq ilə rizvan ələ girsə.

Fəriştədə bu şuxlığü pəridə bu lütf
Olur isə, insan bari z'insan ələ girsə.

Uçmağı qoyaydumü uçaydum eşigünə
Filcümlə əgər adəmə teyran ələ girsə.

Keçən ömürüm getdivü getdi dəxi gəlməz,
İrincə anun vəslinə qıran ələ girsə.

Bilməgə bənüm dərdümi Məcnun gərək idi,
Şərb eyləməgə eşqümi Səlman ələ girsə.

Gözün könül apardıvü eşqin qomadı əql,
Gəlürsə xəyalün bari qurban ələ girsə.

Zülfünlə gözün hindü həbəş çərisi ilə
Könlümə axar sülhə müsülman ələ girsə.

* * *

İlahi, ilahi, ilahi, ilahi,
İlahi, ilahi, ilahi, ilahi.

Xətünçün qələm urup, qədəm urdı yüzünə,
Hələ müşk ilə kafur rəqəm çəkdi siyahi.

Soyılub suya girüb yüzün gösdərəlidən,
Sana oldı müsəxxər zi məh ta ki, be mahi.

Mübərqa görəlidən üqul oldı mühəyyər,
Cəmalüni çü irdi fəda cana ki, mahi.

Həzaran edərəm ah, həzaran edərəm vah,
Kişi sanmağil anı ki, ahı ola vahi.

* * *

Taldı könülüm zülfünə biçarə, ne çarə,
Yaraladı gözün yüregi parə, nə parə.

Gözün canumı sehr ilə bir guşəyə saldı,
Zülfün dəxi dilər ki, özin qara, nə qara.



Göz ki, səni görməyə nedər uyxuyı gecə,
Zira ki, xəyalün dəxi bu ara, nə ara.

Canum parəsisin, vəli gözün yürəgümi
Hər ləhzə qılur naz ilə səd parə, nə parə.

Carı budur anun ki, yaşumuz ola cari,
Ol cara gərək irişə biçarə, nə çarə.

* * *

Saqiya, sun içəlüm ağunı biz,
Məzə edinəlüm ayağunı biz.

Öpməgə can dilər imiş totağun
Tutalum şimdi ol yasağunı biz.

Uçmağa uçmağı qodux çün kim
Bizüm eyləmişüz bu bağunı biz.

Şol totağundan iç de çünki içür,
Urmışuz bu cigərdə dağunı biz.

Busəyə can demiş, şəha, hüsnün
İçəlüm şəhdün içün ağunı biz.

Hər totağun könüldə dağ etdi
Soraruz candan ol totağunı biz.

* * *

Nigar eşqi çirağı könüldə yana gərək,
Ev issi çoxdur, uyır nagəhin oyana gərək.

Gözün könül qanını içdi, bunca yıllardur,
Dəmidürür totağundan bu qana qana gərək.

Cəmali saçını tuzax düzərü danə məgər
İradət ilə əsirəm nə damü danə gərək.

Çü kirpügi oxü qaşı yayü atıcı özi,
Ola könül dəxi labüd ana nişanə gərək.

Cəmal içində çü məhbubdur yeganeyi-əsr,
Anı sevən dəxi dünyada həm yeganə gərək.

Saçun uzun, ağızun dürrü səni sevən
Neçə ki, rizqi tar isə yaşı uzana gərək.

Gərək ki, aşiqü mə'şuqü eşq bir olalar
İkisi qatılıban aşiqə boyana gərək.

* * *

Nə kim nazundan aydursa, dilümüz nazənin söylər,
Gözüm ilə dilüm lütfin həman görür həmin söylər.

Gözüm saçun çərisində görür yüz bin kəmin leykin
Bu məclisdə qamusını deyiməz bir kəmin söylər.

Bənüm bu ölü canuma totağı İsayidügin,
Nə biləydüm ağız-ağız anı ruhul-əmin söylər.

Saçının hər qılı içün bən eylə oynaram can ki,
Fələklər derlər əhsəntüm, mələklər afərin söylər.

Saçından der isə təbüm pərakəndədür inanma
Qədindən necə uzadursa, sözin rastın söylər.

Müzəlzəldür, müsəlsəl zülfinün sözinə inanma
Vəli könül kəmərgahi sözini key mübin söylər.

Cəhanda fitnələr qopar çü can qəmzələrin aydur
Qiyamətlər qopar çünkim könülüm qamətin söylər.

* * *

Qışun xumarını yenə yaz yaza başladı,
Səbzə xət ilə halümüzi yaza başladı.



Taşdı yürək könildi gözüm yaşı irmağı,
Çünki əridi qüssə qarı yaza başladı.

Yazmaz ikən könüli cəfa kirpügi oxı,
İrdi vüqası şükrana ki, yaza başladı.

Bən şanəsində qıl kibi asılmışam anun,
Andan bərü ki, gisuların yaza başladı.

Bana tolaşdı zülfi dəxi kimi qoyısar,
Qancaru vara fil çü o yaza başladı.

* * *

Bən xətün kibi xamə yazmamışam,
Ol xəti hiç xama yazmamışam.

Yazmışam xət ügüş bənü kibi leyk
Rumda dəxi Şama yazmamışam.

Azmışam gisusı içində vəli
Eşqi yolında rast azmamışam.

Gözün azdurdı zülfünə qomadı
Azmışam çünki anda azmamışam.

Yazmışam yazmadın xatun yazusın
Yazmışam yazduğumı yazmamışam.

Dənizə girmədən saçı ənbər
Lə'li yaqut əgərçi qazmamışam.

Zülfi dami tutam ki, bəni yaza
Düşmişəm bən xu dama yazmamışam.

Yazmışam qanlu göz yaşın idrar,
Gər xəyalünə camə yazmamışam.

Müşk ilə bərgi-güldə nəsx edəli,
Kimsə adına namə yazmamışam.

* * *

Əlümə alam başumı girişəm girişməsinə
Balını yağuma qaram qarışam qarışmasına.

Necəsi deyəm ki, irəm kişi irmədiginə leyk
Var ümidüm ana ki, bər irişəm irişməsinə.

Necə yabana salarsa bəni qaşı zülfi ilə
Qılı yarıban gərək ki, ilişəm ilişməsinə.

Ləbi can qanlusıdur, qanı bəllüdür baxarsan,
Diləröm ki, anun ilə sorışam sorışmasına.

Tutalum miyanı anun ki, kənara gəlməyisər
Nola cəhdi edəlüm ki, girişəm girişməsinə.

* * *

Sərv olamı boyunuza oxşaşa,
Qaşun olamı yürəgə ox şaşa.

Cəm edəydüm eşqini könüldə bən,
Firqətində leyk dünya qaxşaşa.

Uyır ikən kirpügi qırdı bizi,
Vay əgər gözi oxı oyax şaşa.

İnçgəyəm belinə oxşayam derəm,
Kim ola k'anun belinə oxşaşa.

Bir oxından kimdürür qeyd eyləyən,
İlla gözləri oxın soyax şaşa.

* * *

Tapundan ayru dirilmək bana muhal olısar,
Və leyk bilməzəm ana qaçan mahal olısar.

Yüzini necə qılam vəsf necədür diyəyüm,
Ütarid anda çü şəl zöhrə çünki lal olısar.



Boyum qaşunla yay oldıvü ox kibi toğru,
Derəm ki, bədr yüzünlə tənüm hilal olısar.

Könül düşəli ağızuna oldı key diltəng
Tənüm xəyali ilə belünün xəyal olısar.

Belün qıl etdi, qala urdı eşqün odı,
İkisi dəxi çü oldı nə qilü-qal olısar.

Ümidüm ol ki, totağun ola bana qismət
Əgərçi nöqtələrün qisməti məhal olısar.

Müfərrih isdərəm ol ləblərüni sevdama,
Cəvaba razı dəgüləm çü ol sual olısar.

* * *

Necə uzun gecə canum yana sevdası ilə,
Necə dərdümə əm ola yədi-beyzası ilə.

Necə Nilindən ola gözlərüm yaşı Fərat
Necə qərq ola tənüm ol yaşa miqyası ilə.

Necə yas eyləyə yası oxı ilə könülə
Necə hər məclis içində gələ əyası ilə.

Belünün vəsli yolı incədürü qatı uzun
Hələ razıyam ana bu qamu qovğası ilə.

Ol xətayi ki, gözün qıldı könülümə bənüm,
Qanda çəkə bilsər cürmini obası ilə.

* * *

Beli nə çəkər dilbər anı gör bilə nolur,
Ol çəkdügini gör çəkə aləm bilə nolur.

Sən dil dilədün, bən sana canı dəxi verdüm
Çün bir dil imiş hər dü cəhanı dilə nolur.

Bən biribidüm badi-səbayi ana fərraş
Zülfi gözümün silsiləsin gör silə nolur.

Qıymadı gözükə bən anı sevdügüm içün,
Bu dünyada bir aşiq əgər əksilə nolur.

Ol nəsnə ki, qıl etdi anun incə belini
Bən suxtəyi dəxi əgər qıl qıla nolur.

Şol kişi ki, bədr ay ilə qalmış ola tana
Tana qalısar yıldız ilə, ay ilə nolur.

Biz qatlanalum yar yarasına yarı içün
Dərmanını dərdi verə qovğa ilə nolur.

* * *

Eşqün əyağın tolu çəkəlüm yenə hey hay,
Yürəkdə necə şərh edəlüm qəmzəni ey vay.

Ayağuna baş qomağ içün sərv çəməndə
Keçdi neçə müddət ki, qərar eylədi bər pay.

Qanda aparam könlümi bən gözi əlindən
Hər kirpügi bir oxdurur, hər bir qaşı bir yay.

Al çəngüni çəngünəvü qanununı bəklə,
Gər dilər isən ud kibi oda yana nay.

Bu iş necə üşşaq arasında olısar rast
Ki, aşiq ola bixudü mə'şuq ola xud pay.

* * *

Qanı gözləri badam, qanı sərvi-güləndam,
Qanı yari-dilaram ki, olmadı bana ram.

Qanı yari-novamuz, qanı eşqi diləfruz
Ki, keçdi dünü imruz, keçisər yenə fərdam.



Tolu sun bizə camı, irür canuma kamı,
Yetür göglərə namı, qul et Rum ilə Şamı.

Ana başla qulamı, bizə kəsmə salamı,
Gözət işbü nizamı, ləbündə canum idğam.

Necə canuma alı əya dişləri lali
Gəl ey yanağı xali ki, gisu ilə xali.

Yüzi hüsn ilə vali, əya badi-şimali
Bulursan zərü mali cəmalinə qıl ən'am.

Əya dilbəri-dilbənd, əya nazikü-ləbqənd,
Əya türki-şəkərxənd, əya xali Səmərqənd.

Zəhi gisuyi-pürbənd ki, bin can ana dərbənd,
Zəhi lə'li-şəkərqənd verürsə qulına vam.

Gəl, ey canuma canı, gəl, ey qəsdi-amani,
Gəl, ey cövhəri-kani, gəl ey ruhi-məkani.

Əya İsiyi-sani, əya eyni-mə'ani,
Tapun tək dəxi qanı ki, bən püxtəvü sən xam.

* * *

Kişi gərək ki, diləgin ömürdən alu görə
Yuca gözədür özin aludən alu görə.

Saçını gör yasamışü xətin dəxi düzmiş,
Necəsi girə səba ana, çün yayalu görə.

Dilərəm eşiginə yüz sürəm həmişə vəli
Nedəyüm üşənürəm nagəhan obalu görə.

Ləbinə canı bəha qomışam nigarun ta,
Mətaı çox gətürə, şəhrə çün bəhalu görə.

Könül quşın alamazam gözi əlindən hiç,
Xuyı budur laçinün çünki bir yaralu görə.

* * *

Gəl imdi bi düvü çar, ey həbibi-məh çöhrə,
Ki, şeşdər oynamağ içün salaram uş möhrə.

Çü bəndə müştəriyəm, müştəri məhəlli yox
Görürsə zöhro bu haləti çak edər zəhrə.

Xəti yüzində yazar ismi-ə'zəmi leykin
Gözi kirişmələri irürür anı səhrə.

Dişün münəzzəm edər əqdi-lö'löyivü saçun
Tağıtdı müşgi öləyim, bu nəzmə, ol nəsrə.

Əgərçi sırdı könülümdə eşqü hicrün cəhr,
Fəda bu sirr ilə cəhrəm bu sirrilə cəhrə.

Əgərçi kuyunı, şaha, kuy etmişəm leykin
Sənün yoluna hələ şöhrə olmuşam şəhrə.

Küpəsi ürkərü qaşı tərazudur leykin
Bənatiünnə'ş qılur kəh dürusını nəsrə.

* * *

Qəmzəsi ox urur cana ki, qanı gözikməz,
Bən ox didüm ol oxa, vəli qanı gözikməz.

Kömür kibi yandum oda, ol cövhəri içün
Bən razıyam ol oda, vəli kanı gözikməz.

Kim aşiq isə eşq dənizinə girəlüm,
Dinini bulımazamü imanı gözikməz.

Zülfində könül girdi qaranulığa miskin
Aydınlığı çü şərbəti-heyvanı gözikməz.

* * *

Sana könül verəni qala cana, sanmağil,
Tartına əqli canını yacana, sanmağil.



Bir murdur könül, nəyi apara bəllüdür,
Payi-mələxdən özgə Süleymana, sanmağil.

Dərman dedi ləbün könülə dərdi qatıdur,
Ol dərd qatlanamı bu dərmana, sanmağil.

Zülfün küfürdürür neçə tatarı var isə
Bən götürə biləm anı imana, sanmağil.

Can gözlərüm yaşına, şəha, aşina idi,
Hiç yirə saldı kəndüyi tufana, sanmağil.

* * *

Hərgiz önülməz, ey sonəm, canda gözünün yarası,
Önülməyən yaraları bir dəxi yenə yarası.

Əsritdi gözlərün bəni, kirpügün urdı ox ilə
Tut bəni ki, uyımışam işböyləmi oyarası.

Anca çəkişdi ləblərün işbu yürəgümi bənüm
Qan oldı çəkişik ilə ol ikisinun arası.

Baxdı bəninə gözlərüm, düşdi gisusı ağına,
Hey nələr etdi canuma işbu gözümün qarası.

Bən yanmışam sənün içün külli ki, yox yanmamışam
Şəm'üni al əlünə gəl, varlığı canda arası.

* * *

Şaha, ayağun basduğı yüzümə qədəmdür
Nə dəm ki, tapundan ola ol ayrü nədəmdür.

Xalün könülümün həcərül-əsvədi oldı
İncitməgil anı dəxi çün seydi-hərəmdür.

Xəttün ki, qubar idivü uş oldı mühəqqəq,
Tutmağil ana dəq, sənəma, səhvi-qələmdür.

Əlmas yağar gözlərinün qəmzələrindən
İlla ləbini sorma ki, nə kani-kərəmdür.

Zülfi həbəşü rum yüzi, gözi xətadür,
Şimdən gerü əksügi məgər təblü ələmdür.

* * *

Şol aşiqə yar nişə tolu sunmaya badə
Kim tərh edüb atı rüxinə oldı piyadə.

Bana fəridəm nə təvil etdi cəfasın,
Qıldı bana cövrini həzaranü ziyadə.

Bana əyağı sırf ver, eya saqiyi-məhru
Başəd ki, qıla bu könülüm lövhini sadə.

Ver badə ki, dadın verürüz işrətü eyşün,
Verme bu bizüm ömrümüzi hiç yerə bada.

* * *

Canumda eşqinün irmağı taşa başladı,
Məhəbbətini qılur nəqş taşa başladı.

Qomadı qurıda bir yer ki, yaxmadı eşqün
Qanın axıtdı bu gözləri yaşa başladı.

Necəsi münkəsir olmaya gisusı çərisi,
Ki, bir yel ilə boşaldı, taraşa başladı.

Könül başa aparısar bu eşqi zira ki,
Çü əvvəl urdı əl-ayax bu başa, başladı.

Əlümi zülfinə sundum, əgərçi bir qıldur
Çü eşqinün dənizi mövci aşa başladı.

* * *

Yarun cəmali dünyedə bədr aya bənzəməz,
Sərxoş gözi cəfası bizi aya bənzəməz.



Qaşları aya bənzərü zülfi tağuxları
Könlüm məhəbbətin yabana yaya bənzəməz.

Bir sayəyəm ki, göz görürü yoxdurur tənüm,
Bu hali yar bana ömürə saya bənzəməz.

Gündüz-gicə fəraqı əlindən inilərəm,
Bu yolda hiç vayə şükür vaya bənzəməz.

Haciblərünə hay de, atar çərxə tir ilə
Yoxsula baya girmə der, obaya bənzəməz.

* * *

İnayətüni, ilahi, qulundan ayırma
İki cəhanda dəxi bəni hiç qayırma.

Edəsin etdünü edəsüni edisərsin
Edəcəgüni edərsin, suçı bizə yırma.

Ana ki, sən diləmişsin əzəldə təslimüz,
Necəsi dəgşürisərsin qəbul dəgşürmə.

Ümid həzrətünə tutaram ola məqbul
Ki, dirməyincə ədu dəftərin bənüm dirmə.

Sənün yolunda ayax basanun ayağı tozın,
Kim edə bilə bana sürmə gözünə sürmə.

Bu xaki nə oda kim salar isən, sən bil
Yelə savur, suya sal, asılığ adın urma.

Nəyüz, nədənüzü dünyaya nəyə gəldük,
Canumuz anlamadın ol cəhana aşurma.

* * *

Yüzüni görəli sana cananədür deyəm,
Sanun əcəb nə idi ki, cana nədür deyəm.

Dürdanədür dərünü vəli bən söyləyiməzəm,
İncü dişün qatında ki, dür danədür deyəm.

Samana saymadı bu sözi yar yolına
Qayət budur ki, bən sərü samandur deyəm.

Xaliylə zülfini kişi bəndən sorar isə
Müşkil dəgül ki, dam ilə bir danədür deyəm.

Şəhnaz kuçegəm deyü neçə qılur isə
Novruz içində əzm sipahanədur deyəm.

* * *

Nigar canü dil aparduğına dil xoş imiş,
Təvazö əhli imiş saçı, qəddi sərkəş imiş.

Səba sabah irürmiş bənəfşədən ana
Bir-iki qoxu k'anunla saçı müşəvvəş imiş.

Xəyali gəldi qopardı qübarü əzəldən,
Vəli şükür ki, yüzüm əşk ilə mürəşşəş imiş.

Sitarəsin götüribən yüzinə baxdum idi,
Özinə müştəri qıldı bəni ki, məhvəş imiş.

Bir araya gəlicək çarü pəncü həft ilə nüh
Qamusı hiç imiş, var isə yarın şeş imiş.

* * *

Ey badi-səba, zülfini qıl qıla bilürsən,
Gəl qıl bu tənümi dəxi qıl, qıla bilürsən.

Əqlü tənü can ərçi ki, dildür bu tirüdə,
Küllisini aparmağa dil, dilə bilürsən.

Bən taxalı boynuma saçı silsiləsini,
Gəl gör gözümün yaşını sil, silə bilürsən.



Bən biləli, şaha, səni bilmədüm özümi
Biz ikimüzün halini bil, bilə bilürsən.

Can ruhun içün tərh edüb at oldı piyadə,
Mat oldı əgər fil isə fil, filə bilürsən.

Qərq eylədi göz yaşı canı zülfünə sundı
Atdı ana ilməsini il, ilə bilürsən.

Gün-gündən əgər bilməz isə halümi yüzün
Zülfün ola ki, anlaya yil yilə bilürsən.

* * *

Bilməzəm halümi halin bilənə sor halümi,
Çün münasib bulmazam əf'alümə əqvalümi.

Can dilər ki, sata ol bazarda bu könlümi,
Bən xub ilə sataram kala ilə dəllalümi.

Yar diləgi atına kim ki, dilərsə can əsər
Bən sərəfrazam asarsam üstə sər ğərbalümi.

Xalq amali cəhanda mal isə nola əgər
Can ilə malı qoyub avlar isəm amalümi.

Ol nəqiyyü-xəd yüzində gərçi xümrə anladum
Şol bəyanında cəmaət rast tutdı falümi.

* * *

Necə bini seyd qılmış gəl axı bu gencümi gör,
Bu yola baş ilə canı qoyıban güvəncümi gör.

Ələ gənci girdi, gənci nə bana həsəd qılursın,
Bu viran könül içində nəzər eylə, gəncümi gör.

Necə dilər isə zülfi ki, büriyə Rum elini,
Tağıdur səba yeli tək həbəşi firəncümi gör.

Sənün ilə bir olıban ulaşalı qaşlaruna
Yenə işbu tas içində şeşü çarü pəncümi gör.

* * *

Gözüm yaşı ki, seyl olıban axa dəmbədəm
Nə fayidə çü yürəgümi yaxa dembədəm.

Bən canda gizlərəm, sənəma, eşqünün sirin,
Qanlu yaşum, saru bənizüm çaxa dəmbədəm.

Neçə ki, can həvana qapu bağlamax dilər
Zülfün həvası həlqeyi-dər qaxa dəmbədəm.

Yanub-yaxılıban yaxana can ara dedüm,
Cadu gözi salar bizi iraxa dəmbədəm.

Günəş yüzi şərəfdədürür, anun içün ol
Gəh gözünə təmamü gəh oyaxa dəmbədəm.

Qanı qan ilə yuyavü hərgiz könül quşı
Boyundan özgə qonmaya bir şaxa dəmbədəm.

Hər ləhzə tazə könül aparur şahin gözün
Umaxludur, qaçan baxa ol ğaxa dəmbədəm.

* * *

Bən aşiqəm, nə eyb ola, yarı dilər isəm,
Eşqünlə acizəm nola yarı dilər isəm.

Sevdüm yüzüni, kirpügini dəxi yaxşırax,
Sevsəm gülün içün nola xarı dilər isəm.

Bari yaratdı barını inçgə belin içün,
Barı nola beli ilə barı dilər isəm.

Car etdi gözi qamu gözləri axıda,
Cari gərək qılam gözi cari dilər isəm.

Namusı, arı tərk edübən ari olmışam
Hammam içində görməgə ari dilər isəm.



* * *

Canuna can kəsəgi bu həsəd həsəd aparur,
Cəhan canını dünü gün bu xalü xəd aparur.

Saçun içün gözümün yaşı silə silsilədür
Ki, yedi dənizə andan gözüm məded aparur.

Gəhi taşar, şaha, eşqünü gəh yaba dirülür,
Bizi miyanəsinə işbü cəzrü məd aparur.

Gözün nə caduluğ eylər, hənün nə dəm qılur,
Saçun kəməndi xu aləmdə nikü bəd aparur.

Əzəldə əhli-könüllərə bey' verdi gözün,
Çü həqqidür, hələ uş gəldi ta əbəd aparur.

* * *

Bülbül olğil ki, bir gülə irəsin,
Ağlayu isdə ki, gülə irəsin.

Bidil ol dilə ki, dilüni dilə,
Gər dilərsən ki, bir dilə irəsin.

Aşiq ol, arif isdə dünyada,
Ta ki olmaya aqilə irəsin.

Göz mülin dökü iç üzüm meyini,
Saxın olmaya mülmülə irəsin.

Sərxoş ol aydan-aya ayılma,
Zülfini avla ki, yelə irəsin.

Necəsi sayıla, şaha, lütfün
Lütf edüb gər bu sayilə irəsin.

Nəfs naqisdürür, özün görmə,
Ta məgər ola kamilə irəsin.

* * *

Tacir dilər səfər edə, həmraha bağludur
Çoxlar muradını dilər, ol şaha bağludur.

Kimün diləgi var isə ulu xəzanədən,
Olur vəleyk sidq ilə, bir aha bağludur.

Əyərləmişəm atımı, bağlanmışam təmam,
Yönəlmək ana cəzbeyi-nagaha bağludur.

Bən bəligümi bəndə yavü qolmışam hələ,
Varlığü yoxluğum bu dəm Allaha bağludur.

Mövcud gəh kibivü ana kəhrüba
Xasiyyəti zühuri anan kaha bağludur.

* * *

Nili içün qızıl irmağ axıdur yaş gözüm,
Yaşı uzun ki, kərəm eylədi şabaş gözüm.

Anı ki, qılmış idi yüregümə bir nəzəri,
Dəmbədəm işdə bulur şükr ana padaş gözüm.

Həcərül-əsvəd olalı iki mehrab qaşı
Rind olur gahivü gahi olur övbaş gözüm.

Bən könüldə sirüni saxlamışam, Tanrı bilür,
Dəmbədəm neyləyəyim çünki qılur faş gözüm.

Nətəvan görəli könlüm bigi gözüni, şəha,
Lə'li-ləblərünə qıldı özin oxşaş gözüm.

* * *

Çox olmayıcax dünyayı yarum nedərəm bən,
Qılmaz göz anı görməsə yarum nedərəm bən.

Zülfeyni ilə qarularum bağlamışam bən,
Bən ana fəda bu ola qarum nedərəm bən.



Darum dilərəm, dara urur canumı zülfi,
Dərdinə yanam bu oda darum nedərəm bən.

Bən varumı verdüm, nəsənə ummadum andan,
Sən gər umar isən hələ varum nedərəm bən.

Sən gülşənə irməgə yenə bən oluram xar,
Gür xara irişməzsə, baharum nedərəm bən.

* * *

Gözünə güvənəni gör, özünə özənəni gör,
Sözünə sevinənə bax, qəddünə qıvananı gör.

Necə cadu isə gözi, necə tatlu isə tuzı,
Necə şirin isə sözi, sən ana inananı gör.

Könülüm çələb evidür, yöni ol yola qavidür
İki dünya bir cevidür, bu qanına qananı gör.

Bəni canumun sipəndi, saçı əqlümün kəməndi
Canına salub bu bəndi, ol odına yananı gör.

Bu nə saç müəttər olmış, bu nə yüz münəvvər olmış,
Nə yanax güli-tər olmış, canını ya cananı gör.

* * *

Şol dil ki, yıx dedün, anı mə'mur olmaya,
Məst olmayan gözün ilə məstur olmaya.

Könlümdəki məhəbbəti dilə gətürməzəm,
Kim faş edərsə gövhəri gəncur olmaya.

Çəkər cəhan canını hər ləhzə zülf ilə
Aqil kirişmələrinə məğrur olmaya.

Yaxın zəmanda qomadı gözi kişidə us,
Sehri-həlali var, der isəm dur olmaya.

Məvsul dərdinə olü hiç ayid isdəmə,
Bunı tutan zəmirdə məhcur olmaya.

Rəf et hicabunı ki, bənəm əzb qəmzənə
Eşqüni cəzm edən gişi məksur olmaya.

Tağıt saçunı ki, gündüzi gözlər göriməyə
Gidər yüzündən anı ki, dəycur olmaya.

Məqtul dilərəm anı, gərçi Cüneyd isə,
Ki, müşg saçlarun ilə Mənsur olmaya.

* * *

Eşqün sənün, ey dilbər, içərüdən içərü
Sevmək kibi səvməzlər səni anarü bərü.

Qardum sana bən bəni, qoydum yoluna dini
Saxlarsın bana kini, bumıydı bana qaru?

Yaxar bəni avazun, artuxlağudur nazun
Çaxar səni qəmmazun, göz yaşlu, bəniz sarı.

Ahum ilə yaşum gər xüşkü tərə yetərsə,
Az gündə yaxındur ki, ol bəhr ola, bu quru.

Könüldəki yar ola, özgəyə nə bar ola
Cuy şaha şikar ola, ayruxlardur qoru.

* * *

Zənəxdanın çəhi babil sanasın
Saçı türrəsi əbabil sanasın.

Mümessəldür yüzün nəqşi gözümdə
Dəxi tədvirə sən mayil sanasın.

İki aləmdə səndən ayru görmə,
Hicabı ortada hayil sanasın.



Mücibəm varlığa bir nəzrə neyçün
Bəni həmçün ki, hər sayil sanasın.

Şəha, cadu gözün zalimdürür bax
Yürəgümə əgər adil sanasın.

* * *

Nə sahib ola bilə bu sabah sahib olan
Səadətə irişə bu nəfəs müsahib olan.

Gözün şah oldı kirpüklərindür avdaçı
Qaşundurur, sənəma, sağlu-sollu sahib olan.

Saçun gecəsi bəratını qüdrət ilə yazar
Xətündürür bizə pəs, ey sənəm, məvacib olan.

* * *

Yaxdı bağrumı, nigara, atəşi-dərdü fəraq
Saldı vəhşət dəhşətinə bəni yenə iştiyaq.

Çünki alnumda yazılmışdı əzəldən əlvida,
Pəs nida qıldı münadiyi-əcəl ki, əlfəraq.

Gərçi candur eşqi ilə ol nigarun həm səbəq,
Dərdi ilə şimdi qılur can ilə könül səbaq.

Eylə yaxıldı oduma aləmi-kövnü fəsad,
Ki, fəsada varısar anun ilə səbi-təbaq.

İctimaından düşəli ayru canum mümtəhan
Sən günəşdən ayru olalı könüldə ehtiraq.

Dərdi hicrün ilə ciftüz biz, nigara, dəmbədəm
Salalıdan bəri səndən bu zəmana bizi taq.

Bən səfa ilə vəfadan oy verürəm eylə bil
Çün nifaqundən dəm ururam, anı sanma nifaq.

* * *

Dərdün ilə canum canı yanar könül oda,
Oldı nedəyim dərdünə canum könül oda.

Yüzümdən axırsa, yaşumı tutma əcəb sən,
Əlbəttə gülab axa, düşər isə gül oda.

Bən düşmişəm ol dənizə kim düşmədi kimsə
Düşməmiş ola bənciləyin hiç qul oda.

Bir cüzvdürür can ki, odıyla kül olupdur
Bir cüzv nədür, nola olur isə kül oda.

Şükrana verəm can ol oda kim girür isə,
Özgələr əgər tartına canını ol oda.

* * *

Şol dəm ki, yardan cana göz dəgdi sanasız,
Kim nagəhin qamışlığa göz dəgdi sanasız.

Yarun odına döyər idüm buncadan bərü,
Qalmadı taqətüm dəxi göz dəgdi sanasız.

Şol dəm ki, bəxş olur idi hər yerə bir nəsə,
Bağruma odu yaşuma göz dəgdi sanasız.

Qəmzələrün şol işi qılur hər nəfəs bana
Kim qayır ilə dikənə göz dəgdi sanasız.

Hər nəsnə ki, dilə düşə ana dəgərdi göz
Bizüm içün ana dəxi göz dəgdi sanasız.

* * *

Yenə səba yelinün zülfün ilə razı nədür?
Yenə xumar gözünün bizüm ilə nazı nədür?

Səlasilünə tolaşanun axı bana degil
Ömüri qısası ya qissəsi dirazı nədür?



Zəmandurur yanaram ateşi-ləbiylə anun,
Biləlüm axı bu sözün nola bu sazı nədür?

Cigər qanı ilə bən qıluram vüzu' hər dəm
Vüzusı böylə olanun əcəb nəmazı nədür?

Diləgün ol ki, ola aqibətlərün Mahmud
Ki, nə bilə kişi ki, bu yüzün Ayazı nədür?

* * *

Gəldi xəyali olamı könlüm aparmağa,
Ya uyxuda sanıp bəni bəndən oyarmağa.

Bən uda müşk saçı sirini demiş idüm,
Şeşta nə tuydı ki, toladı anı barmağa.

Dürlər dökər gözüm ləbün ilə dişün içün
Dilər olamı xeyr edübən sala ırmağa.

Cadular oxlarü sücü veribən əsridür,
Kim bula gözləri kibi top yağı qırmağa.

Sormağa qorxaram totağını ki, qandadur
Zəhrə qanı ki, cəhd qılam bir ısırmağa.

Gəlün ki, ruzə tutalumü qılalum nəmaz
Ki, diləyən ola yarı yardan ayırmağa.

Bənüm canum kibi yoluna səhl ola həzar
Zinhar, qılmağıl ana dəgməz qayırmağa.

* * *

Su aşdı, şəha, başdan könlümdə xəbər vardur,
Canumda fəraqundan hey-hay ki, nələr vardur.

Könlüm gözüm içində qanlar axıdur le'lün,
Şol vəchilə işbu qan arada məgər vardur.

Cadu gözünə hindu derlərü xəta derlər
Nərgis xu nədür haşa ol gözdə nəzər vardur.

Bir sərvi-rəvan nerdə bitərsə boyun içün
Qarğu kibi yüz yerdə belində kəmər vardur.

Can belinə düşəli bir qılca qərarı yox,
Dəvlət doxi şundadur kim anda xətər vardur.

* * *

Neçəsi qatlana gişi, şəha, cəfana sənün,
Çü əl irməyə bu dünyada vəfana sənün.

Küdurətün dənizinün dibində qərq olana
Nə qəm qaçan ki bilə ki, irər səfana sənün.

Əgərçi xəstə gözündür, fütadəyəm məcruh
Şifahun ilə nola gər irəm şəfana sənün.

Payunı necə qoyamam ki, alnuma yazmış
Ki necə ki, ömürüm var düşəm qafana sənün.

Necə dilər isən, ağzunla belüni gizlə,
Ki zahir eyləmişüz eşqi biz xafana sənün.

* * *

Kişi gərək ki, iniləməyə cəfa içün
Yarı özi içün sevə yox ki, vəfa içün.

Yar yolına fəna çü bəqadur, bəqa fəna,
Aqil bəqayi tərk edə gərək fəna içün.

Qanum su oldı yolına bən xak ayağına,
Yanam gərək ki, odına işbu həva içün.

Dərdə dəva dilər bu cəhan əhli bən həmin
Dünyada dərdini diləröm həm dəva içün.

Hərgiz nəcib olmaya aləmdə ol kişi,
Var xoşlığını verməyə bir dəm səfa içün.



* * *

Candur nola gər yar bu dəm cana girürsə,
Ya qəmzə oxı ilə gözi qana girürsə.

Ümman könülüm lə'li-ləbi kan isə nola,
Can kana gedüb sevdügi ümmana girürsə.

Zülfün həvası ilə durur gər nəfəsi-sübh,
Yüzin qaturub sünbülü reyhana girürsə.

Əcəbləməzəm gözüni zülfüni yüzündə,
Küfrün qaranulığını imana girürsə.

* * *

Aşiq yolına can oynın özinə sud edinmişdür,
Cəhanü canü dil tərkin sana behbud edinmişdür.

Odunı canına mərsumü yaşı gözinə idrar,
Visalüni zülalü hicrüni uxdud edinmişdür.

Gözəlləri könül sevmək, könül könüllər aparmax,
Bu gün dəgül ki, dünyada bu iş mə'hud edinmişdür.

Bu micmərdə əgər könülün buxur olursa, səhl ola,
Çü eşqün odına canum özini ud edinmişdür.

Qiyamətdür bizə gözünü zülfeynündürür məhşər,
Nedəlüm, səhl ola, çünkim bizə məv'ud edinmişdür.

* * *

Sevərəm səni vəleykin zi dilü can sevərəm,
Dərtlüyəm dərdüm içün əlbəttə dərman sevərəm.

Ola ki, yetürə zülfün qoxusın badi-səba
Hər səhər atlanıban gülşənə seyran sevərəm.

Gözüni əsrükü ləblərüni meygun görəli,
Dayima öz-özümi əsrükü heyran sevərəm.

Sən bəni qul dəxi qapunda rəva görməz isən,
Bən könül təxtinə tapunuzı sultan sevərəm.

Odunı şöylə sevərəm k'ol oda yanmağ içün
Dünyanun qamusını cümlə neyistan sevərəm.

* * *

Sana ey dilbəri-canı səlamullah, səlamullah,
Ey lə'lün canumun kanı səlamullah, səlamullah.

Axıdur gözlərüm qanı bizə və'dələrün qanı,
Özündür xublarun qanı səlamullah, səlamullah.

Canum qaşuna qurbanı, ləbün dərdə dərmanı
Qulun tapuna ərzanı səlamullah, səlamullah.

Əya misbahi-ruhanı əya miftahi-cismanı
Əya əsbahi-reyhani səlamullah, səlamullah.

Varursa sidqi-Səlmanı, ola çün zirə Kirmanı
Əya təxti-Süleymanı səlamullah, səlamullah.

* * *

Nigarına, nigarına, nigarın
Sözün abi-həyatdur eşq narın.

Mənəm məxmur cüz lə'li-ləbündən
Yazılmaz kimsənə anun xumarın.

Qərarı zülfünün yoxdur nedəlüm
Nə qılalar hələ şol biqərarın.

Bizə yaramazın gerü salalum,
Gətürəlüm aramuza yararın.

* * *

Qarğu boyum vacibmidür qaşun içün kəman ola
Yazuğ olurmı qəmzədən canuma gər aman ola.



Yürəgümi totaxlarun hiç yerə çəkişür, şəha,
Mə'zur tut lütf eyləgil gər arada bir qan ola.

Tutdum yarun ətəgini eldən dəxi qoyımazam,
Qomayısaram bən anı, necə ki bir imkan ola.

Dərdüm ləbündəndür, şəha, meyzədə meyni qoymağı
Bən dərdi qoymayısaram başəd ki, bir dərman ola.

Lə'lünə gərçi qıluram bin can fəda həm qorxaram
Ta olmaya ki, fi'lməsəl çün zirəvü kirman ola.

* * *

Bizdən yana bir rəncə qıl, ey sərvi-rəvani,
Ta ana nisar eyləyəlüm ruhi-rəvani.

Saçun qılı şol belünə dəgülmi kəmər bəs
Qanda ki, lətif ola çəkər bari-girani.

Mərrix gözü zöhrə qaş, ay alınü gün yüz
Bu lütf ilə aləm gözi görmədi qırani.

Gözüm yaşı qopardı bu dəm aləmə tufan
Ahum boyadı idi kögi dəxi duxani.

Görmədügümi bana cinayət yazar ol yar,
Aşiq nə qıla çün canı böylə ola cani.

* * *

Apardı canı, gər könül apara, səhl ola
Bin canü bin könül dağı ol yara səhl ola.

Könül ki, eşqünə düşə zülfünə tolaşur,
Səni sevən bu sağışa avara səhl ola.

Qəmzələrün olamı ki, almasdur, şəha,
Uğraduğını yandururü yara səhl ola.

Yarun yarası zəhməti yara irincədür,
Yara ki, yar yarına irə yara səhl ola.

Məqtul olur isə nola məqbuli-yar olan,
Mənsur əgər çıxar isə bərdara səhl ola.

* * *

Ol günəşi sevərəm ki, nurını aya verür,
Günəş oldur nurını yoxsula, həm baya verür.

Ahü fəryad edər isəm yolına həm yeridür
Zira vay anun yolına könülümə vayə verür.

Könül alur hindi zülfivü verür göz qaşına
Nə ki, girürsə əlinə ox ilə yaya verür.

Bir sənün tək oğlanı qaçan ki, toğura fələk
Hüsni lala qılurü lütfi ana dayə verür.

Başdurur sərmayəvü səni sevənlər assısı,
Oldurur ki, yoluna eşq ilə sərmayə verür.

* * *

Nigara, tapuna bəndən səlamü əlf səlam,
Cəmali-cana bu təndən səlamü əlf səlam.

Könül al, könül al canum gedicək,
Gerü gəl canum əl-eyş, əl-eyş, əl-eyş.

Ləbünə ki, ərir anun qatında qəndü nəbat,
Ki qandan olü bu qandan səlamü əlf səlam.

Sevərəm, sevərəm, sevərəm suçum ol,
Suçum ol canum əl-eyş, əl-eyş, əl-eyş.

Cəhanı canum içün sevərəmü canum sən
Sana ey can, bu cəhandan səlamü əlf səlam.



Sənünəm, sənünəm, sənünəm bənüm ol
Bənüm ol canum əl-eyş, əl-eyş, əl-eyş.

Bizi dikən görür isən, ey gül, qəbul etgil,
Sana ey gül, bu dikəndən səlamü əlf səlam.

Gəl, ey gül, gülə gəl, könül al, gülə gəl,
Könül al canum əl-eyş, əl-eyş, əl-eyş.

Neçə ki, almaz isə can səlamumızı bizüm,
Holə tapusına candan səlamü əlf səlam.

* * *

Sabah tur tolu sun bizə saqi əqdahı,
Ki ruh rahətidür hər səhərgahi rahı.

Xumar ilə ularuz canda şadılıx çirağı
Səbuhı sun bizəvü aydın eylə misbahı.

Çü ruha rah münasibdürür tolu sunğil
Bizə, ey saqiyi-adil, şərabi-tüffahı.

Gözüni məst görəli tolu çəkərəm cam,
Rəva degül ki, gözün məst olavü bən sahı.

Neçə ki, nəqş edərəm eşqinizi altun ilə
Yüzümdə qan-yaş ilə gözlərüm olar mahı.

* * *

Saqi, tolu sun, aşiqi-şeyda gecəsidür,
Mütrib devü usanma ki, yelda gecəsidür.

Saçunı tağıt yüzünə sübh olmağa qoma,
Bu gecə bizi əsro ki, sevda gecəsidür.

Qurtar bizi bu çunü çəradənü əyax tut,
Məcnun ilə Leylisivü bəyda gecəsidür.

Qafil kişi ömrini verür hiç yerə yelə
Bu gecə uyıma ki, hüveyda gecəsidür.

Şimdi olacax nəsnəyi sən tanlaya qoma,
Bu gecə dəxi həm yenə fərda gecəsidür.

* * *

Can içün ki, can verəm bin qatla cananan nə qəm
Hər nəfəs isar edərsəm varlığı cana, nə qəm.

Bən dilərəm ki, verəm varlığumı yar yolına
Bən can əhliyəm verürəm yolına cana nə qəm.

Şol zülalündən dəmidür oduma bir qətrə saç,
Tutalum bir eşq əri odun ilə yana nə qəm.

Hüsnünüz rəhmət dənizidürü bən susamışam,
Əksilür olur isə bir qətrə ümmana nə qəm.

Könlümə gir ki, nə cansın gösdərəyüm bən sana
Yusufı Yə'quba sorğıl şəhri-Kən'ana nə qəm.

* * *

Gəlməyə bənüm kibi dəxi dərtlü cəhana,
Ki qalmaya nə əqləvü, nə tənə, nə cana.

Çox kişi bu dünyada deyə eşqə əsirəm
Aşiq ol ola, gösdərə eşqinə nişana.

Gözün sənün ol tiri-xətayiyi atar ki,
Ol tiri atana dəxi hacət nə nişana.

Yürək qanına lə'li-ləbün şöylə giribdür,
Bin hindu gözün kibi gərək ol qana qana.

Bən canı fəda qılmışam ol hindu gözinə
Yoxdur nigaranum dəxi ol bana əmana.



Bən canı bəhanə dilərəm yolına anun
Yolına rəvan edər isəm canı bəha nə.

Ağzıylə belini görəməzəm be həqiqət
Leykin verürəm canı həqiqət bu gümana.

Hiç yerə bəni sanma ki, eşqinə tutıldum,
Gör zülfi bigi damivü xal bigi danə.

Usana der isən bəni ol sanuyı sanma
Ol sanuyı sən sanma ki, can səndən usana.

* * *

Yardan yara gər yer isəm, hiç qayurma yara-yara,
Yara yara sırf iç tolu eşq əyağın, yara-yara.

Bir gün dilərəm ki, qatam canumı yaram canına,
Xoş qarılavuz yatavuz, eşq odına qata qara.

Canü könülü baş ərə gərəkməz illa yar içün
Biz qamusını oynadux yar yolına həq başara.

Bir dəm çəkəm cövr əlindən toptolu dərdi dürdini
Bir ləhzə heyvan suyını lə'li-ləbindən aş ara.

Yaxdıvü kül etdi odun, şahum, bənüm varlığumı
Anca axıdam göz yaşın kim olan yaş ara.

* * *

Bu zəmanda ki, yenə bağü çəmən rövnaqıdur,
Bülbülə naleyi-zar eylə ki, gül yasaqıdur.

Yenə fərraşı səbavü yenə rəşşaşi-bulut
Gül yenə şahü gülistanlar anun cövsaqıdur.

Yaşlarum seyldürür tutdı cəhanı, sənəma,
Gözümə birbi xəyalüni ki, anun zəvraqıdur.

Ayt xumarı gözünə ki, canuma əyağını
Tolu verə ləbün ilə ki, anun zəvraqıdur.

Hüsnün ruyinəvü muyinə qulam zira,
Bu cəhan gündüzi-gecəsi anun əblaqıdur.

* * *

Hər ləhzə badeyi-inabidən axar yaşum,
İnnabı rəng ilə bəni a'ma çaxar yaşum.

Mərdümligini gör ki, həbibün xəyalinə
Zərrin tabaqlar ilə dökər düri-tər yaşum.

Mehmanlığını çox yaş ana xud necə deyəm
Tufana verdi rumı hələ ma hezar yaşum.

Su saldı bu cəhana ki, gözüm şol evümi
Qürrəti-ü'yuna zihi sahibnəzər yaşum.

Xuni-cigərdürür ki, od içində göz axar,
Al ilə xud sana qıla zahir gühər yaşum.

Necə ki, axar isə dəxi tiz olur odum,
Yaş dəgül olamı bu gözümə axar yaşum.

Həm varəyüz suyın gətürür həm dökər dəxi,
Şuridə qıldı aləmi zirü zəbər yaşum.

Ah etdi faş sirrümüzi aləmə bəli
Mə'zurdur necə çəkə xuni-cigər yaşum.

Sevda çü başdan aşdı hələ dökərəm yaşı,
Ki başa iltə, yoxsa başuma yetər yaşum.

* * *

Nəqqaşi-əzəl surəti-nəqşini yazaldan
Düşdi bu dil ayaxdanü getdi bu göz əldən.



Qan oldı çəkidə yürəgümdən bu gözümə
Ol dilbəri-ziba bana gözini süzəldən.

Zülfi izi ilə yüzinə yol buluram bən,
Nagah həva əsdivü getdi bu iz oldən.

Bu dayirədən çıxmamışam həq bilür anı
Nəqqaş əzəldən hüsninə dairə cizəldən.

Bozıldı könül müntəzim etdi yaşı gözüm
Şol ənbəri məşşata bu kafura düzəldən.

* * *

Bu həva qubarı içün düşəlüm biz oda-suya,
Ya libas edə vüsalin, ya vücudı külli soya.

Bu nigar qamətinə bən əzəl qiyamətindən
Yüzi-gözi öğrədici ki, dutar bu hayü huya.

Yürəgüm səbuyi-xundur yürəgini taş sanasın
Hələ bu fədadur ana gər ura taşı səbuya.

Gəhi bənzümi sarardür, gəhi yaşumı qızardur,
Necə bənzədür bəni ol əcəba güli-düruya.

Necə muyə qıla sünbül, necə nalə edə bülbül,
Necə çak edə tonın, gül düşə cösti-cüstü cuya.

* * *

Yüzündən özgə yüzini bən aya saymazam,
İşbu xumarı cüz ki, ləbün aya saymazam.

Qaşun yayında kirpügün oxına ox dərəm,
Zülfün iki cəhana anı yaya saymazam.

Sənsin ki, bir nəfəsdə apardun həzar can
Sən alduğun reva dəgül obaya saymazam.

Canan qatında cana məhəl yox anun içün
Bir qətrə suyı bən dəxi dəryaya saymazam.

Bən saya sayaram yüzüni xətlərüni hiç
Bin canü dil apara birə saya saymazam.

* * *

Niçələr can yoluna faxtədür,
Gülşənündə həzar faxtədür.

Bir kirişmə qılursa ala gözün
Neçə canlar nisara saxtədür.

Bən bilmişəm sənünlə əzəldən
E'timadum hələ şinaxtədür.

Çox ümidüm tapunda var leykin
Əcəlüm uş əməl iraxtadur.

Sən yuxarı baxanda xeyr umma,
Bunarun yaxşısı aşaxtadur.

* * *

Gözündən oldı könül uş nigara yaralu gör,
Ləbündən anun içün lütf eylə yar alu gör.

Lətif nöqtədürür ağızun bu dairədən
Könül məmalikinə gəlü yüz diyar alu gör.

Əgərçi urdı cəmalün könüllərə sikkə
Yirincə qəlbdürür[1], gəl bizə əyar alu gör.

Kəminə işvənə kəmdür bəha iki aləm
Vəleyk əgərçi bulınmaz cəhanda yar alu gör.

Gidərdi ögümi lə'livü canum aldı gözi,
Bu cövri canuma çox etmə huşyar alu gör.

[1] Qəlpdir



* * *

Satalum canü dili, işbu dəmi satmayalum,
Qatalum canı cana ortaya söz qatmayalum.

Görəlüm biz bizivü görməyəlüm özgələri,
Atalum lütf oxını, cövr oxını atmayalum.

Axalum ayağuna, axmayalum özgə yerə
Satalum canı sana, özgələrə satmayalum.

Eşqinə bilişürüz, cövrinə biliş dəgülüz,
Aşinayuz batalum, dənizinə batmayalum.

Turalum-turmayalum iki cəhandan səndən
Yarü əğyar yolına yatalumü yatmayalum.

* * *

Bən şuna qulam ki, ol bir nami-namus eyləyə,
Bir dəm içün dünyada bir yili əfsus eyləyə.

Gözini zülfi çərisinə qaravul qılıban
Könüli gözləri elçisinə casus eyləyə.

Bən anun lə'li içün canumı məqtul eyləyəm,
Ola ki, lütfini könülümdə məhsus eyləyə.

Gözi dilər idinə qarət edər könül elin,
Razıyam, nəmdür əgər, gözümi tərsus eyləyə.

Tənümi al boyadı gözlərümün yaşı ilə,
Yaxdı içümdə odın yə'ni ki, fanus eyləyə.

* * *

Necə bir sən sən olub dünyada bən bən olalum,
Şimdi gəl ortaya uş bən sənü sən bən olalum.

Candurur bana tənünü təndürür canuna can
Vəqtidür gəl bərü ki, can canü tən tən olalum.

Ləbüni sun bana iç uş yürəgümün qanını,
Ayruluğı gidərüb yenilə it qan olalum.

Nüsxəsini xəttünün nəsx edəlüm könüldə
Şe'rünün şə'ri ilə dəftərü divan olalum.

Ayruğa qaxıyıban necə urasın başuma.
Razıyuz bu kürədə peykünə sindan olalum.

* * *

Yer yaşıl, ağac ağ oldı, gül qızıl,
Yar əlin al, bağubana qul yazıl.

Gül bulıd ağladuğına gül bigi
Şəbnəm ol günəş yüzi içün əzil.

Gah nərgis tək göziyçün xəstə ol,
Gah sünbül tək saçı içün tağıl.

Gəh sərəfraz ol anun sərvi ilə
Gəh anun işvələrindən ol xəcil.

Gəh pərişan ol saçı zülfi içün
Gah diltəng ol ağızıyçün diril.

* * *

Rəva dəgül ki, gözün yürəkdə qana girür,
Yazuğını qoyalum, aşikarə qana girür.

Könül oğurluğa vardı, asıldı zülfündən
Cəzasıdur zira oxımadın dükana girür.

Neçə ki, qıl yarar isə bilünə girmədi əql
Anun içün axı bilün həmişə cana girür.

Bədi' xatunı görəli hiç mə'ni yöni
Bulınmadı kim anun üzrinə bəyana girür.

Sipər bıraxalı çoxdur bilemədüm neyçün
Xətayi gözləri ox gözləyüb kəmana girür.



* * *

Gözlərüm yaşın dürəfşan sanasın,
Ləblərün lə'lin dürəfşan sanasın.

Üsdünə fəsli-bahar ilə xəzan
Dər kəmin kimin zərəfşan sanasın.

Xəttün arasında şirin yarunı
Zülmət içrə abi-heyvan sanasın.

Zülfi almış çevrə şol ay yüzini
Küfr içində nuri-iman sanasın.

Ey fəriştə, bən sana sərriştəyəm,
Sanma ki, bəni əz insan sanasın.

Bən ki, sormışam bilürəm ol nədür
Sən anı lə'li-bədəxşan sanasın.

* * *

Gəl, gəl ki, səndən özgə bu dərdün şəfası yox,
Dərdüm dəxi yoğ isə bu eyşün səfası yox.

Bu az ömürdə qılma bizə hicr ilə cəfa
Qılğıl vəfa ki, işbu cəhanun vəfası yox.

Bəndən gidənə ol demədi lövhəşallah hiç
Həm yenilə gələnə anun mərhəbası yox.

Lütfi anun ölü könülümi qılur diri
Pəs kim deyə bilə ki, anun kimyası yox.

Nəyçün qan olmaya gözi səndən irağ olan
Çün ayağun tozından anun tutiyası yox.

Zəxm etdi hicri bal totağunun içində leyk,
Müşkil budur ki, vəsli ilə mumiyası yox.

Görməzmi dəri gül yüzi üstində bu bulıt
Ki, gül yüzinə suyını saçar həyası yox.

Yaqut qut olmağa lə'lün qatında hiç
Dişün qatında yalğuzəqün xud bəhası yox.

Baqi durur fəna diləyən eşq ilə vəli
Kim fan olmaz isə, bu yolda bəqası yox.

* * *

Can aparıban qaçan oğrılayın qancaru
Sana həlal alduğun getmə, şəha, dön gerü.

Ah edərsəm boyanur ərşə bənüm tütinüm
Etməz isəm nedəyüm üşdi balına aru.

Də'vimə inanmadı eşqiyçün gözləri
Nəqd ana iki tanux yaş qanü bəniz saru.

Hicr ilə qəm vərəli arxasın arxasına
Vəsl ilə şadı, şəha, oturur uş rubəru.

* * *

Əksi gül yüzünün çü camə düşər
Gül sanasın ki, camə-camə düşər.

Müşg saçına saçma gül suyını
Gicəcidür ki, ud xama düşər.

Bən qərib anlaram yüzində bənin
Həbəşi sanasın ki, şama düşər.

Bən dəva bilməzəm məgər dərdin
Kim düşərsə buna dəvama düşər.

Gözlərüm yarım eşigini sular,
Bu saqasını gör, saqama düşər.



* * *

Çü içmişüz tolu eşqinün əyağın əzəli,
Şərabı sırf verünüz xumarumuz yazalı.

Bu dar çünki fənadur bir-iki beyt düzərüz
Qazəlümüz yolına eşidürsə bu qəzəli.

Totaxları içün ol şahidün ki, şəhddürür
İçüm çü şəm yanarü yüzümdürür əsəli.

Bəsit ərzi gəzüb görmədüm, şəha, hərgiz
Sözünlə sallanışun kibi qövl ilə əməli.

Boyunda yüzüni, qaşunda alnunı görəli
Ayı tərazuda gördümü günəşi həməli.

Ləbün əməli deyübən əməldən qalmışuz uş
Ləbün yolında əməl barmağın, şəha, əməli.

Necəsi düzə bilə surətün kibi Mani
Çü düzmədi yeri-gögi düzən anı düzəli.

* * *

Xumar qılma bizi, saqiya, tolu mey içür
Tolu əyaxları al əlünə peyapey içür.

Sal oda udıvü çəngi nəvaxt qıl novruz
Cəhan geçər çalınurkən bu dəf ilə ney içür.

Dilərəm anca içəm ki, tənümdə var nəfəsüm
Ləbüni ağızuma ur gəl nəfəsümi say içür.

Cəmalə bay sənü bən yoxsulam, şəha, səbrə
Çü çarə bulmadı bu dərdə yoxsulü bay içür.

Sığadı sa'idini, saqi aldı tolu əyax
Nida irişdi fələkdən qəribdür hey içür.

* * *

Nazlucasın, nazəninsin bilməzəm cananəsin
Canumuzsın, canumuzsın bilürəm cana nəsin.

Sərv boyundur qiyamət qorxaram bundan qopa
Fitnədür xüftə gözün, üşənürəm o yanasın.

Can ləbünün qanma dilər ki, qana-qana qan
Necə sən qanlu yürəgümün qanına qanasın.

Qulluğa canum yasandı, necə zülfün yasana
Zülfünün bəndində bəni sən usana sanasın.

Can ilə könül apardı əql acıdı eşqdin,
Assısından bixəbərdür ki, ziyana yanasın.

* * *

Gözün mədhin aydan mədih, şəha, sehri-mübin söylər,
Dişündən söz açan şair, bəgüm, dürri-səmin söylər.

Əgərçi zülfi bəndinün hisabın kimsənə bilməz
Bu bəndə anda gördügi kəminün kəmtərin söylər.

Xətü zülfü qədü xəddini bənmi söylərəm yalquz
Bənəfşə sünbülü sərvi-rəvanü yasəmin söylər.

Qaşı ilə boyı neyçün deyənlər əgrivü toğru
Qaşı çün əgri demişdür boyı çün rastin söylər.

Ögənlər sərvi boyını geyik sənin unıtmazlar
Bu boyın, bu sinin görən ol ikisin nəsin söylər.

Görəli şol büti-çini yəqin oldı ki, hər kim ki,
Xəbər verürsə Mani nəqşinün vəsfini çin söylər.

Könül zülfündə, ey dilbər, qərib əndər qərib oldı,
Bunun tək sözi başı börkin urıban çoxın söylər.



* * *

Aç imdi eşq qapusın əlündədür miftah,
Gidər bu hicr gecəsin ey faliqü'l-əsbah.

Sımarladum tapuna eqlü can ilə tənümi,
Tanuxdurur bunun üsdinə cümleyi-ərvah.

Tamu fəraqunuzu vəslünüzdürür uçmax,
Qara saçun gecəvü yüzün ortada misbah.

Hicaba girür isən can mücəssəd ola, şəha,
Təcəlli qılur isən cümlə ruh ola əşbah.

Saçun girehlərinün müntəhasına yitməz
Gəzər olur isə yüz yil ol arada əşbah.

* * *

Bən eşq əri şuna derəm ki, eşq ana ayin ola,
Yar yolına can oynamax ana imanü din ola.

Neyləyisər şol göz ilə bu biçarə miskin könül, –
Ki hər nəfəs aşiqinə kəmin işi kəmin ola.

Hər ləhzə isar edərəm bən ana canü əqlü din,
Dəxi bilməzəm nə dilər aşiq varı həmin ola.

Hər dəm anun hindu gözi dilər xəta qıla cana,
Bən dəxi şunı dilərəm ki, ol xətası çin ola.

Yar ilə söhbət dilərəm neçə ki, dünya var isə,
Bir xəlvətdə gök arada bir kişilik zəmin ola.

* * *

Tağıtma zülfüni, şaha, təşviş olmasun,
Yüz vermə qəmzən oxına bir iş olmasun.

Könlümdə od yanarü gözümdən axar seyl,
Ol odü su içində bu dərviş olmasun.

Tərk eylədüm özümivü andan yavuxları
Bənciləyin kişi dəxi bixiş olmasun.

Bir xəlvətə dilər sənün ilə girə könül,
K'anda tərənnubü taqü sərvəriş olmasun.

Qəmzən oxını əgəlavü canumuza ur
İlla, saxın cigər tovşanı riş olmasun.

* * *

Geç gəlür oldı bizə əyax, gör bu saqini,
Gündüz qılur bizə gecəyi, gör bu saqini.

Buyurdı eşq şahı ki, heç ayağ olmaya
Bir qulıyuz anun hələ tutdux yasaqını.

Almaz isə əlümüz əlinə səhl ola,
Bən başum üsdinə götürəyim ayaqını.

Yaxar bəni yaxındanü iror irağına,
Bən yaxına götürəyim anun iraqını.

Saldum özümi bir dənizə kim qatı yaxın
Görməz netə ki, dəniz olursa qıraqını.

* * *

Hindu zülfünə könül vara dilər,
Zi dəlü öz-özin avara dilər.

Gözün işi xu yara-yaradurur,
Türfə budur ki, könül yara dilər.

Qara saçun ax yanağa dökilür,
Küfr ilə dini qata qara dilər.

Can dilər ki, yardan ayru olmaya,
Bu diləgi el-elə, şara dilər.



* * *

Gecənün rövnəqi şol mah ilədür,
Aşiq asayişi bir ah ilədür.

Rüxləri qıldı piyadə könlümi,
Oynumuz hələ bizüm şah ilədür.

Tutma xalini ənəgində əcəb,
Zira cadu olıcax cah ilədür.

Bən sevərəm anı özgələri ol
Bazkəşi işün Allah ilədür.

Totağun könlümi bir çöpcə qapar,
Kəhrəbanun işi çün kah ilədür.

* * *

Yürəkdə neçə ki, gözün oxı əsəridür,
Yaşum dəxi saru bənizümdə cigəridür.

Gər xari-cəfa zəhməti aşiq çəkə nola
Mə'şuqı yüzi ana çü gülbərgi-taridür.

Zülfeyni çü ömrümdür, uzun et anı yarəb
Necə ki, cəmali dəxi dövri-qəməridür.

Necəsi kənar edə gişi incə belindən
Çün can dilü can ilə həmişə kəməridür.

Dükkanı şəkər dəgül isə lə'lün əfəndi
Acı gəlicək dəxi neyiçün şəkəridür.

Gər derlər isə ki, gözüm özgəyi görəsin,
İnanmağıl ol sözə ki, düşmən xəbəridür.

İçümə odun düşəli ah urdı şərarə,
Ümman edəli eşqüni yaşum gühəridür.

Gözüm döyiməz yüzünəvü baxa zi müşkil
Budur ki, dəvası be zərurət nəzəridür.

* * *

Xuzayı-əzzə və cəli gər qulına yarı verə,
Ümidim ol ki, gənəzlik ilə nigarı verə.

Diyari-yarı sevərəm ki, yarı anda bulam,
Zəhi kəramət əgər yar ilə diyarı verə.

Qərar qalmadı, səbrüm dükəndi zülfi içün,
Anadogin ki, çələb zülfi-biqərarı verə.

Günah keçdi sağışdan, hesabdan aşdı
Məgər hesabumuzı lütfi-bişümarı verə.

Yəmini yəmni bilə çün Yəməndən aldı qoxu,
Yəsari-canumuza həm yenə yəsarı verə.

Vücud zübdəsi oldur bana ali versün,
Çü ol bənüm ola əlbəttə elü şarı verə.

Canumuz ortaya saldux kənarı içün anun
Miyanın alan əlindən necə kənarı verə.

* * *

Nə çəkdügümi bən bilürəm yara irincə,
Kirpügün ilə yürəgümə yara irincə.

Biçarə fəraqun odı ilə yanısardur,
Ta vəsli-zülalindən ana çarə irincə.

Məxmuramü məstanə gözün ilə yanaram,
Ta lə'li-ləbündən yenə xəmmara irincə.

Zülfün ilə bərdar olur isə nedə könül,
Tapun bigi bir töhfəcə dildara irincə.

Gözləri ilə xəstəyəmü lə'li şəfadur,
Lütf eylə, şəha, şərbəti-bimara irincə.



* * *

Ey büti-qəllaş evə gəl bizi bazarı qıl,
Evə gəl, namus tonından bizi tez arı qıl.

Bən gözündən xəstəvü məcruh uşda düşmişəm,
Lə'lüni əm dedilər, bir şərbəti-əttarı qıl.

Qılma bizarı, şəha, bəndən ki, bən bazariyəm,
Bənüm ilə özgə bazar eylə, gəl bazarı qıl.

Hüsni carı bu ki, aşiq yolına can oynaya,
Sən dəxi oyna canun yarun carını carı qıl.

Bən anun yolında Mənsur olmağa uş razıyam,
Zülfüni düzgil rəsən tubi qədündən darı qıl.

* * *

Xəstə canuma gər ləbi-əttar ola bu gün
Əql özini gər qurtara, əyyar ola bu gün.

Can sənün ilə şöylə qılur xəlvəti, ey can
Ki, tən dəxi bu ortada əğyar ola bu gün.

Bən xəstəyə bir şərbət əgər irə ləbündən
Bu cümlə cəhan adəmi bimar ola bu gün.

Könlümdəki eşqün dənizi şöylə taşar kim,
Bu gözlərümün cəfəri təyyar ola bu gün.

Gəl yar ilə bazar olü ayruğ ilə bizar
Dilərsən anun ilə ki, bazar ola bu gün.

Barı nola gər verür isə belinə barı
Qayda ki, lətif isə giranbar ola bu gün.

Qəddüni görüb sərvi səhi gər salınursa,
Toğru deyəlüm imdi səbüksar ola bu gün.

* * *

Saqiya, ayağunı əlümə ver
Nəzər eyləyibən bu halümə ver.

Əlümi tut, derəm, ayax veribən
Sən cəvabumı bu sualümə ver.

Bədrün içün hilal oldı tənüm
Nola sən bədrüni hilalümə ver.

Xalün içün bəni xəyal etdün
Gəl həqiqət bəni xəyalümə ver.

Bən əlümi al ələ deyiməzəm
Verəcəgüni sən bu əlümə ver.

* * *

Üşənmə, tolaş silsiləsinə nola dersin
Qanlu yaşunı sil siləsinə nola dersin.

Hər qılma qıl can ilə əqlüni giriftar
Əsirgəmə hiç qıl qılasına nola dersin.

Zülfi tuzağını görü tartınma canunı
Yum gözünivü il iləsinə nola dersin.

Səni dilümə gətürüməzəm dilümə gəl
İnanmaz isən dil diləsinə nola dersin.

Eşqi sirini bən bilürəm könülüm ilə
Sən dəxi səba bil biləsinə nola dersin.

* * *

Ey rəqbi iraqı hələ üşşaqa xəbər qıl
Şəh nazi içün aləmi gəl zirü zəbər qıl.

Ey badi-şimali əgər əlün irər isə,
Qo başunı ortadavü zülfinə güzər qıl.



Ey gözləri Mərrixü qaşı Zöhrə bərü gəl
Yürəgümə-bağruma diləgüncə əsər qıl.

Ey qəmzələri dönməvü çöngəlmə bərü gəl,
Yüzün ilə alnunı bana şəmsü qəmər qıl.

Bən tapun ilə qisseyi-Məcnunı unıtdum
Sən bənüm ilə işveyi-Leyliyi səmər qıl.

* * *

Bir ləhzə turun əl alışup – yazı görəlüm,
Necə bəzəmiş gülşəni bu yazı görəlüm.

Zülfini yarun oynar imiş badi-bəvaya
Bir varalum ol hinduyi-sərbazı görəlüm.

Bən xud deməunder eşqi sirin əqlümə dəxi
Ol mə'ni içün qəmzeyi-qəmmazı görəlüm.

Dərdümi başarmadı qələm yazı göribən
Sən yazma hələ qəmzeyi biz yazı görəlüm.

* * *

Saqi təldur qədəhi canü cəhanı içəlüm,
Dərdini nəql edəlüm kövnü məkanı içəlüm.

Könüli qan edübən qanını cama qoyalum,
Ləbünün eşqinə sun bəhr ilə kanı içəlüm.

Ağızun nöqteyi-mövhumu yarun anda güman
Vəhmi-nüql eyləyəlüm, şimdi gümanı içəlüm.

Vüslətün cənnətü hicranun odı nari-cəhim
Bundan artux olamı narü cinanı içəlüm.

Lütf ilə dərdi nətə sud olavü cana ziyan
Saqi, sun tolu qədəh sudü ziyanı içəlüm.

* * *

Ruh əlindən gətürün tolu sürahi içəlüm,
Rahətindən irəlüm rahata rahi içəlüm.

Bir nəfəs canı haram isə nola nuş edəlüm,
Necə bir xuni-cigərləri mübahi içəlüm.

Lə'lini bu gecə sağər ki, alır ağızına
Saxla ögledəki qanını sabahi içəlüm.

Şöylə məstanə gözün bixud edər könüli ki,
Gecə-gündüz tolu peymaneyi-sahi içəlüm.

Gər gözün cigərümün qanın içərsə içsün,
Hələ sun əyağı biz xuni-surahi içəlüm.

* * *

Hər kişi nə çəkdügini bilür özi haliylə,
Sor xalinə hər gecə halümi xəyaliylə.

Şol günəşə qul olam ki, bədr ay anun içün
Məhv ola hər ayda bir qaşları hilaliylə.

Lə'li-ləbinə anun qaçan irişəvüz çün
Heyvan suyı səb' idi zulmata zülaliylə.

Vəslini haram etdi qanumı həlal eylər,
Fəryad haramından bin ah həlaliylə.

Yürəgümi qan etdi gül yanağı rəngiylə
Şimdi su qılur qanı fitnə gözi aliylə.

* * *

Tolu sunun əyağı bizə yar saqi imiş,
Dənizləri sümürəlüm anun yasaqi imiş.

Cəhan bu dəm durur uş da gəl imdi xoş görəlüm,
Yaranlar ilə ömürdən bunı ki, baqi imiş.



Kişiyə yarı əlindən ağudur abi-həyat
Zülal düşmən əlindən ağu əyaqi imiş.

Canum könül ilə əqli gidərdi bu evdən
Nigarı də'vət edərmiş anun yaraqi imiş.

Çəkişdi eşq ilə əqlüm könül evini canum,
Buyudı eşqə k'əzəldən anun vəsaqi imiş.

* * *

Atəşi lə'lüni görən oduna yana düşər,
Qəmzən oxını yiyən uyxudan oyana düşər.

Bu xətayi gözünün rast nəzərliğini gör,
Cigərümdə oxına bax necə boyana düşər.

Hər gözi qanlu deyip bir yana çəkər könüli,
Bəllüdür anun işi ki, iki divana düşər.

Qan dökər ləblərün içün, sənəma, qara gözün
Qandura bəni zülalünəvü ya qana düşər.

Suzuna düşmiş ikən suzumı sən tutma əcəb,
Odlara düşər isə eşq əri mərdanə düşər.

Düşəyim oduna bən, sən dəxi qıl bəni qəbul
Şöylə ki, yaz gecəsi şəm'ünə pərvanə düşər.

Zülfünə canum apardum nə görəm canü cəhan
Bana der zirə dəxi cəhl ilə girmana düşər.

Bən əzəldən, sənəma, eşqün ilə biliş idüm
Aşinalığ ilə bəhri dəxi ümmana düşər.

Dür dişün lə'l ləbünçün bu gözüm incü dökər
Bu əcəbdür ki, yaşum bəhrəvü həm kana düşər.

* * *

*Lə'lüni dərdümüzə əm dedilər,*
Canı təşnə göribən əm dedilər.

Qəmzələrün yürəgi qan etdi,
Tutdılar nəbzümüzi dəm dedilər.

Hüsnünün bağına irəm dedüm
Neçələr *ol* bağa *irəm dedilər.*

Cəhd edər can ki, irə şəftalu
Özgələr simü zər dərəm dedilər.

Xublar gözlərümi nəm deyicək
Sallanup gözlərümi nəm dedilər.

Qıyma canumuza ki, eşq əhli
Aşiqə ahuyi-hərəm dedilər.

Əhli-irfan bu dünya içində
Xublarun diləgin üməm dedilər.

Eşq içün nüh fələk çü çərx edər,
Qılsa aşiq nağəm nə qəm dedilər.

Çünki aləm tüfeyli-dilbərdür
Eşq ayağına cami-cəm dedilər.

* * *

Müşəvvəş qıldı zülfini səba yeli səhərgahın,
Gəl imdi bulasın anda çirağ ilə bu gümrahın.

Canumı gözi sehr ilə hələ bağladı zülfinə
Qatı lütf ola qılursa ənəgün çuxurı çahin.

Anun eşqinə gər ahən olursa, mum umaram ki,
Anun ayinə yüzinə çələb irürməyə ahum.



Əgərçi dəgmə qeyd ilə könülüm seyd olmazdı,
Nedəlüm şimdi çün düşdi saçı bəndinə nagahın.

Nola bən bir qəribəm ki, gözi guşəsinə düşdüm
Əgər bir hindu caniyçün gətürə yada Allahın.

* * *

Zülfünə düşən çıxmağı müşkildür, əfəndi,
Şol quş ki, düşə damuna bismildür, əfəndi.

Bən dil ana dərəm ki, dözə qəmzən oxına
Hər andan özin saxına bidildür, əfəndi.

Cəhd edibən ayağına toprağ ola görgil
Xalindən irax yöri ki, fülfüldür, əfəndi.

Gör təşnə isən ləbləri cüllabını sorğil
Xalindən irax yöri ki, fülfüldür, əfəndi.

Gər zalimi xunxar isə hindu gözi səbr et
Qaşları tərazu ilə adildür əfəndi.

Gər bizdə nəva yoğ isə, bu rəqbdə nola
Üşşaq bayı-yoxsulı məhmildür, əfəndi.

Bən görməyəyüm ki, gözüm özgələri görə
Söylər isə ayruğı dilüm dildür, əfəndi.

* * *

Şəha, bizə nəzər qılğıl ki, dərvişivü dərvişan
Bu ahumdan həzər qılğıl ki, dərvişivü dərvişan.

Bu yolda bir səfər qılğıl, keçən ömri səmər qılğıl
Bu meydanda hünər qılğıl ki, dərvişivü dərvişan.

Hilalini qəmər qılğıl, saçın bilə kəmər qılğıl,
Ayağın başa sər qılğıl ki, dərvişivü dərvişan.

Cəhanı pür ibər qılğıl, saçunı çün ipər qılğıl
Yüzün gülbərgi-tər qılğıl ki, dərvişivü dərvişan.

Könülə bir xəbər qılğıl, günahumdan güzər qılğıl
Cəfayi-sorbosor qılğıl ki, dərvişivü dərvişan.

* * *

Çün yarun işi aşiq ilə qüncü naz ola,
Aşiq tənində can be təriqi-məcaz ola.

Bən razıyam ki, bir nəzər ilə verəm canı
Çünki murad yar eşigində az-az ola.

Xüftə gözinə can gözin açup uçurmışam
Şahini xüftə gör ki, necə çeşmbaz ola.

Bən yarun ayağını başuma götürəyim
Başın qoyan yar ayağına sərəfraz ola.

Bən rasti mühəyyərəm ol bir mübərqa'a,
Lütf edər isə bizə nühüftə hicaz ola.

* * *

Xüftə gözün içün, şəha, bixab gözlərüm
Püstə ləbün içün, şəha, innab gözlərüm.

Tazə tər eyləyəm deyü sərvi xəlayini
Tartar cigər qanı ilə dolab gözlərüm.

Təşnə olalı ağzınun suyına canum
Oldı yürək qanı ilə sirab gözlərüm.

Günəş yüzini örtəli zülfi bulıtları
Axıtdı işbu aləmə seylab gözlərüm.

Dişlərinün xəyalini başəd bulam deyü
Qıldı özin dənizlərə qərqab gözlərüm.



* * *

Yanam bu cəhanda ləbi-heyvanına təşnə
Zi canına toymış, kim ola qanına təşnə.

Dərdüm cadu gözindənü dərmanı ləbindən
Dərd ağusın içən ola dərmanına təşnə.

Bir küfr dənizin sanasın zülfini anun,
Küfrində anun qərqəmü imanına təşnə.

Qaşın görəli kirpüginün kişinə girdüm
Eyd eylərəm ol dəm vəli qurbanına təşnə.

Eyd edəli altında Fərat axdı gözümdən
Qaldum bu ikisi ilə ümmanına təşnə.

* * *

Sənəma, belüni gördüm gözümə xəyal olamı,
Nagəhan tuzağa düşdüm yenə zülfü xal olamı.

İrə gəlibən susamış totağun qanına qandum,
Çü canuma irmiş idüm əcəba vəbal olamı.

Gözümə nəzər yüzində çü haram qıldı dilbər
Gözinə qanumı içmək əcəba həlal olamı.

Gözi hinduvü xətadur kim ana ki, türk der isə
Ləbinün tadı şəkərdür, vəli rəngi al olamı.

Boyını əlif sanasın cadu gözi ha başıdur
Boyum ağzınun miminə nəzər et ki, dal olamı.

Bizə vəsli yeli anun sanasın ki, bir nəfəsdür
Dəmi hicr haşəlillah ki, görəm çü sal olamı.

Ləbün ilə belüni bən dilərəm ki, ola qismət
Xətü nöqtə qismət olmax, sənəma, mühal olamı.

* * *

Eşqi Bağdadında oldı gözi əyyar, əpsəm ol,
Qomadı bu könlümün elində dəyyar, əpsəm ol.

Hüsni əflakində rəsmi-cudı sabit eylədi
Qılmadı bizdən lətifliğini səyyar, əpsəm ol.

Biz yara verdük könülivü yar bizə qıldı özin
Bəklə bu iqrarı sən, qılursa inkar, əpsəm ol.

Çün bizi bimar qıldı gözləri, nola əgər
Zülfi qıldı badi-sübhi şimdi əttar, əpsəm ol.

Yar yürəgümi yararsa yarama yara bu gün
Yara canumuz toludur hələ oğyar, əpsəm ol.

Həmçü İsa ya Zəkərya sirrüni faş etmənüz
Qoyalar bıcğu başa ya ələ mismar, əpsəm ol.

Gərçi mərsum eylədi bizə cigərdə eşq odın,
Qıldı yürək qanını gözümdə idrar, əpsəm ol.

Ləbləri məxmuriyəm ditrər yürəgümü nə qəm
Çünki var hüsni şarında gözi xəmmar əpsəm ol.

* * *

Ey ki, tapunda mühəyyərdür üqul,
Əql ol aradadur bir bülfüzul.

Çün səba yeli şimali irişə
Həm dəburı dəxi olısar qəbul.

Bən anun eşqi ilə üftadə məst,
Sən anun vəsfi ilə pəs ma təqul.

Bən anun eşqi ilə şadam vəli
Ol bənüm dərdüm ilə olmaz məlul.



* * *

Zülfünə düşən əlbəttə gümrah olısardur,
İşi dünü gün nalə ilə ah olısardur.

Şol ləhzə ki, tolaşdı könül zülfünə bildi
K'ana zənaxunun çuxurı çah olısardur.

Qaşları hilalin görəlidən bərü bildüm
Düşmişlərün əlin tutan Allah olısardur.

Ana düşəli dünyada düşdümü bilürəm
Gündüz yüzi günəşü gicə mah olısardur.

Eşqi yolıdur yara yolumuz dəxi şol kim
Bir yola dəxi yüriyə birah olısardur.

* * *

Səhər bizə gəl, ey can, həyatı səhərün sən
Görən görməyənə kim sifatı qəmərün sən.

Aç alnunı ki, canum hilal qaşuna qurban
Yaşınma ki, baxalum zəkatı gühərün sən.

Sən ol sərvi-rəvansın ki, can sana rəvandur
Qamış nola olıcax nəbatı şəkərün sən.

Xəta xətti qoma kim yaza yüzünə hüsnün
Qələm dillü nigara dəvatı qədərün sən.

Şifahun çü şəfadur cəfan bizə vəfadur,
Əlümüzi al imdi nicati nəzərün sən.

* * *

Könül neçə-neçə, ey şahi-mən, yana sənsüz
İrəməyə canına vara acana sənsüz.

Bu eşq badiyəsində visalünə təşnə
Rəvamı oda yanavü qana-qana sənsüz.

Yüzünlə zülfüni görən necəsi dün ilə gün
Fəraqun ilə uyıyavü oyana sənsüz.

Sənünlə ömri-əbəd bizə ola ləhzə kibi
Gərək ki, can baqi ömrindən usana sənsüz.

Ömür necə uzun isə, sənünlə qıssadur
Neçə ki, qısa olur isə, uzana sənsüz.

* * *

Həmvar assıdan ola canana can verən
Bu yolda qəlb yazıla ya cana can verən.

Mərdümlik eyləyə gözünə can verən könül
Heyvana bənzəyə dəxi insana can verən.

Göz yaşı irmağını çü ümman edə gərək,
Lö'lövü lə'l içün ləbü dəndana can verən.

Bu eşq dərdi dərdinə dərmanü həm yenə
Gərək bu dərdə qatlana dərmana can verən.

Derlər ki, İsa verür idi tənə canü sən
Zican ki, oldı lə'li-ləbün cana can verən.

* * *

Yarlıx dəxi düşməsə iki yar arasında
Zira ki, düşər ol dəxi əğyar arasında.

Dəstar ilə sər bir ola ol şir qatında
Ki, olmaya fərqi sərü dəstar arasında.

Boyunı görən rast budur oldı müheyyər
Çün görmədügin gərdi bu ədvar arasında.

Könül ki, düşə gözün ilə zülfünə yarəb,
Nedə bu qamu caduvü bimar arasında.



Bu dövrdə yox kişi ki, qul olmaya sana
Bir nöqtəyəm uş bən dəxi pərgar arasında.

Yar bana bir iş etdi ki, əğyar anı qılmaz
Bu nil sifət günbədi-devvar arasında.

Könlümi gözün xəstə deyü rəd nişə qılur,
Oldur çü anun fəxri könüllər arasında.

* * *

Necə-necə zülfün içün işbu canum miskin ola,
Könülücügüm qəmgin olup qanlu gözüm nəmgin ola.

Görməyəli ayını göz qəddi hilal etdüm düta,
Bu işi adət eylədüm ta dünyada ayin ola.

Belün görincə yoğ idi qılca qərarı könlümün
Ol yöreyi görəlidən başladı ki, səngin ola.

Eşq əhli bəni taşladı bənzüm saruluğı içün
Yaşumı döndərdüm qana kim yanağum rəngin ola.

Pistə ağızun şəkərün təngi durur, təngi dəgül
Təngi şəkər çün şöylədür pəs şəkərün təngi nola.

* * *

Xəttüni qomağil ki, yad oxıya
Şuna gösdər ki, bin bir ad oxıya.

Gözünə göz çün qıla tə'vid
Ləbün içün vəinyəqəd oxıya.

Aşiq oldur bişürə canü dilin
Ta sala dər kəmin irad oxıya.

Müşg xəttindən oxıruz elmi
Özgələr kağızü midad oxıya.

Ol əlif boylunun yüzinə baxan
Nola mimü sinü sad oxıya.

* * *

Ol nigaran ki, saçı ənbərdür
Yüzi gülgün, ləbi mükərrərdür.

Xali bir dam danədür leykin
Xətti həmçün ki, cənnət əxzərdür.

Canü könül fədadur ayağına,
Baş dəxi ol arada sərbərdür.

Bu vücudum odına ud oldı,
Yürəgüm dərdi ilə micmərdür.

Ləbiçün şəkkər olduğı nə əcəb,
Ləbi şəkkər, vəli mükərrərdür.

* * *

Gəlün ki, badeyi şimdi sizünlə nuş edəlüm,
Necə fəraq ilə gündüz-gecə xüruş edəlüm.

Neçə bu qəmzəvü suzu neçə bu işvəvü naz
Gözün işarəti ilə həmişə cuş edəlüm.

Cigər kəbabü gözün saqivü yarın meydür,
Totağunı dəxi bu dəm şəkərfüruş edəlüm.

Cəfası neçə ki, yaxın isə irax qılalum,
Vəfası neçə ki, irax olursa uş edəlüm.

Çü ərzə qıla cəmalini gül nədür bülbül
Səba ilən dəxi yolında köhnə puş edəlüm.

* * *

Yenə bizdən dilər gizləyə özin
Yenə hüsni qılur can ilə özin.

Könülüm uydı şol məstə zi dəlü
Eşidür şahidi-məcruh sözin.



Təmə' dəndanını saldı yürəgə
Gidərməz ol aradan hiç gözin.

Rəvamıdur yüzin gösdərə ol büt
Şüna ki, yuyı bilməz dəxi yüzin.

Yürək qanı suya döndi yaşumdan
Məgər ol qıla sakin işbu sözin.

* * *

Könülüm irdi canına yenə şol canı ilə,
Nə cəfadur bu ki, çəkər yinə şol canı ilə.

Cadu gözün yürəgüm qanını dökər hər dəm,
Ləblərindən soralum uşdadurur qanı ilə.

Xanıdur xuni gözün könlüm elinün leykin
Sözi yox qanın içərsə qulının xanı ilə

Can anun eşqi dənizindədürür bir qətrə
Bəllüdür qətrə ki, nə apara ümmanı ilə.

Hicrini göribənün kesmə visalindən ümid
Dərdi həq bilə yaratdı zira dərmanı ilə.

* * *

Cövrini bizə cadu gözün yavlağ uzatdı,
Qəmzələrini bağrumuza qatı uz atdı.

Tutdı nə oxı k'attısa canuma gözün
Eşqin sazına bizi anun ilə düzətdi.

Gözətdi yüregümə özün neçə kim atdı
Bin atdı isə yazmadı anı zi gözətdi.

Yüz etdi yüzi canumuza zülfi ağını
Kimə göz atar isə hələ bizə yüz atdı.

Suz etdi bizə eşq odını can başına
Vəsli suyın ol suzumuza qatı suz etdi.

Andan ki, saçı gül yüzinə müşg ilə düşdi,
Miskin könülüm bir qıl ilə müşkilə düşdi.

Eşqi dilümə düşdivü bən xalq dilinə
Var imdi qiyas eylə anı ki, dilə düşdi.

Canum quşı pərvaz edər ikən anı bildüm
Kim zülfi ağınun tuzağına ilə düşdi.

Bu ömr cəfasını qılur bana bu ləhzə,
Bu dəm qılıcax lütfi canuma yilə düşdi.

Rəhmi bana bu ki, gözünün yaşını sil der,
Ağlan anı ki, gözi yaşı silsilə düşdi.

* * *

Eşq əhli sənin odun ilə yana gəlürlər
Kimlərdə ki, könül var isə cana gəlürlər.

Zülfün ilə dindən gişi çıxarsa nə əcəb,
Küfr əhli çü yüzün görə imana gəlürlər.

Diləməz isəm əhli-dili cövrü cəfa qıl,
Bu xəlqi-cəhan lütf ilə ehsana gəlürlər.

Xublığuna yasanavü odlaruna yana
Şunlar ki, bu aləmdə ada-sana gəlürlər.

Kim tərk edər isə özini ademi oldur,
Yağmur varıban dünyada dürdanə gəlürlər.

Tacir ana derlər ki, yolı, ölümi sormaz,
Məstanə varanlar hələ mərdanə gəlürlər.

Can ilə könül aldılarü dəxi dilərlər,
Şol iki ləbün kim qanuma qana gəlürlər.



* * *

Eşq suyı ilə durur toprağı canun xəmir,
Anun içün zülfünə oldı bu canum əsir.

Yoluna könül nədir, bicigərü can san
Canuma hüsnün nədür bi bədəli-dilpəzir.

Ahum eşitməz gişi, həqdürür ana səmi,
Dərdümi kim nə bilür, oldurur ana bəsir.

İnilərəm bəm anun dərdi ilə gündüzin
Çağıruram hər səhər eşqi həvasiylə zir.

Bana müxalifdürür qaşlarıvü qəddi rast,
Getdi İraq elinə bu ikisindən nəfir.

Zülfi qaranu gecə yüzi günəşdür bana
Kirpügi cana dəgin leyk tənidür hərir.

Eşq ki, ümmandurur verdi gözi könlümə
Cam ki, verdüm ana töhfədürür pəs həqir.

* * *

Kimdür ki, əsir olmadı şol zülf ilə xalə,
Ya canü dilin vermədi şol hüsnü cəmalə.

Vəhm əli anun nöqteyi-mövhumına irməz
Misli belinün neçə gecə hiç xəyalə.

Alnına nə bənzəyə gəlür meh be terazu,
Ya ləblərinün renginə cüz mey be piyalə.

Misra şəkəri təngi sözi irişəlidən
Təngi şəkəri gör ki, neçə girdi çüvalə.

Nərgis cigəri dağ durur gözi alından,
Al qana boyandı ləbi alı ilə lalə.

Gülgun yüzünə gül özini nisbət edimez,
Hərçond həyadan dökilür üsdinə jalə.

Ay ilə günəş dövrü təsəlsül gecə-gündüz,
Gəl dövri-qəmər halinə gör bax bu mühalə.

Tədbiri-nücumı fələki faidə qılmaz
Şuna ki, düşə üqdə arasında vəbalə.

Qəddi sifatın badi-səhər sərvə edərsə,
Lərzə düşə əndamına yaprağını sala.

Gözümə təcəlli qılü yüzüni gör anda
İrmaxda göricək ayı fərrux ola falə.

* * *

Şunda ki, gələ yar ala bin cana məhəl yox,
Yaqutı olan arada bin kana məhəl yox.

Heyvan suyı ağzı yarı qatında nə bir su,
Heyvan suyı nə ola ki, insana məhəl yox.

Şol gişi ki, saxlaya bilə canını andan
Qatında anun Rüstəmi-dəstana məhəl yox.

Dərdün odı qatında cəhənnəm odı rahət
Gözüm yaşını görənə ümmana məhəl yox.

Cənnətdür anun yüzi və leykin od içində
Anı görənə tin ilə rümmana məhəl yox.

Qurbanıyam ol eyd, hilali qaşunın bən
Bu neçəsi eyd ola ki, qurbana məhəl yox.

Dərman dilər ol gişi ki, bu dərdə irişür
Bən uğraduğum dərd ilə dərmana məhəl yox.

Cananəyə can töhfə aparuramü hərgiz
Zira necə ki, çox ola kirmana məhəl yox.



* * *

Gəl k'ayağun tozına fəda ola cani-can
Bin can ver dəgül ki, fədadür cəhanı can.

Lə'lünə irimədümü irimeyə fikrü vəhm,
Belün xəyalinə irimeyə gümani-can.

Boyuna can necəsi deyəyüm ki, çün əlif
Dayim görürəm anı yazılmış miyani-can.

Məcmuəsin bu nis ilə can üzrə, ey nigar,
Zahirdürür tapundan anun çün nihani-can.

Dərdündən özgə töhfə bulımaz sana könül
Nazik mətadur ki, ola ərməğani-can.

Qəmzəsi ilə gözlərünün xəstəyəm, nola
Xəstə gərək ki, tuta tənin pəhləvani-can.

Eşqün odına çarə çü bulımadı bir aqil
Mərdanə saldı oda özini cüvani-can.

* * *

Şunlar ki, həzaran qan ilə cana irərlər,
Ol cana irürincə canı cana irərlər.

Zəhmət çəkibən dərdinə dərman tələb etmə,
Eşq əhli yenə dərd ilə dərmana irərlər.

Gözlərümün irmaxları incü dişün içün
Anca dökilür yerə ki, ümmana irərlər.

Ləbləri xəyali cigəri anca qan etdi,
Barmaxları aparur isə qana irərlər.

Odlara girəm ta ləbi-lə'linə irişəm
Zülmətə girüp şərbəti-heyvana irərlər.

* * *

Qaşun yayına zih deromü gözün oxına təhsin,
Ki dayim dəlü könlümə atarü kəsməz arasın.

Özin qılmaz xəta gözi ki, özini dəxi görməz,
Yəqin bilmişdi anı ki, xuzəbin olmaya xudbin.

Qaram gözləri vardur ki, qaraxladı biri-birin
Gör imdi ki, nolasardur könüldə gözi tə'sirin.

Günəş yüzi həməldədürü bədri qövsə irişdi,
Qanı Bəhramı-Çubin ki, yürəkdə əgləyə tirin.

Sənün hüsnünlə eşqümdən həzaran yil gər aydursam,
Diməmiş ola dil hərgiz, şəha, bindən dəxi birin.

Yürəgi ox ilə ururu ya süci dilər andan,
Nə hikmətdən irağ işdür, görün bu xəstə tədbirin.

Səba kəşf etdi zülfindən yenə və'ş-şəms yüzini,
Zəhi həl eylədi billah bizə və'lleyl təfsirin.

* * *

Eyşümüzün səfası yox, nedəlüm,
Hicrinün intihası yox, nedəlüm.

Bu zəman yarı yardan ayru salar,
Hiç işində xətası yox, nedəlüm.

Qamu dərdün dəvası var leykin,
İşbu dərdün dəvası yox, nedəlüm.

Necə ki, könülümi bən araram,
Bir dəxi masivası yox, nedəlüm.

Necəsi sevməyəm səni ki, dəxi
Dünyada bir sevəsi yox, nedəlüm.



* * *

Şol ləhzə ki, bizdən saru yarun nəzəridür,
Cana nə məhəl ola ki, bir ma-həzəridür.

Tubi qədivü bərgi səməndür təni anun,
Reyhan saçıvü yanağı gülbərgi-taridür.

Ənbər saçıvü dür derivü gül suyı əlhəq
Şahid bu iki halətə badi-səhəridür.

Tavusdurur zeyn ilə, avaz ilə bülbül,
Tuti söz ilə, şivə ilə kəbgi-dəridür.

Şöylə ki, xəyal eyləmişəm belini anun
Canumdan anı qısğanuram ki, kəməridür.

* * *

Ey zülfün türrəsi pərri-əbabil
Zənəxdanuna quldur çahi-Babil.

Bu necə lütf can verür şəmalə
Bu nə işvə xəcil andan şəmayil.

Dimağumdadurur sevgüsi heykəl,
Vəli olmaz bana qolı həmayil.

Çü geçdüm bənligümdən bən sən oldum,
Dəxi nə var gətür ortada hayil.

Qoyalum sənligi, bənligi bən
Dəxi hacət dəgül rüslü rəsayil.

* * *

Göz yaşı qan olsa, yürəgüm qanı ab olsa, yeg
Ləblərün yadına əlümdən meyi-nab olsa, yeg.

Nərdə ki, əshabi-əncüm kibi cəmiyyət qıla,
Nöql ağızlarında ər əfvahi-əhbab olsa, yeg.

Dildürür bəni salan gisusı piçapiçinə
Ol dəxi lütfi kibi buyında kəmyab olsa, yeg.

Ta ola ki, xatiri bizdən nə ola inşirah
Zə'fəran aşiq yüzi-gözi xu dolab olsa, yeg.

Gözlərinün biri baxtıduru, biri fitnəsi
Bəxt oyanuğ olsa, xoşrax fitnə dərxab olsa, yeg.

* * *

Könülümə dərdün odı dağdur
Zülfünün hər bəndi cana bağdur.

Sol ağızlu nə gərəksə söyləsün
Xəstə gözin bən bilürəm sağdur.

Oduna yanmağa könüllər varur
Çünki ol candan bizə yasağdur.

Belün incəsinə baxmaz könülüm
Can kəmərgahunda sənün tağdur.

Xalüni gördüm yüzündəvü dedüm
İşbu gülşəndə nə gülçin rağdur.

* * *

Şuna ki, yüzi bədrü boyı sərvi-rəvandur
Toğrusı budur can ilə könül nigərandur.

Bən möhtərəm bəxti-şua'ında yüzinün
Şəms ilə hilalün zirə yüzində qırandur.

Eyb eyləmə canuma belünə tolaşursa,
Qayda ki, lətif ola ol arada girandur.

Canum ayağı başı nola sərvi qatında
Keyneyn anun ayağı başına rəvandur.



Yüz gəz yüzümə irdiyidi ayağı tozı
Andan bərü gözüm yaşı üsdündə dəvandur.

Dövrində yüzinün bu könül silsiləsidür,
Ol silsilə bu könül arada dəvərandur.

Əyyuqa irürəydi könülüm bu odını,
İlla ki, nedəm çevrə yanumda dəbərandur.

* * *

Qılur gigusı içində həzar cadu kəmin,
Təmamını necə deyə çü dil deməyə kəmin.

Şol iki hindu dilü əqlü can aparmağ içün
Birisi gösdərür özin, birisi qaldı kəmin.

Nigara, fatiha görəli ləblərində könül,
Beşarət oldı bu sayruya çünki buldı əmin.

Əcəb degül könülüm nəzın edər isə dürlər,
Görəli eyni-yəminin çü gözüm oldı yəmin.

Könül odı əsir oldı yaşa qılmaz əsər
Neçə ki, tiz olur isə, gidərimədi nəmin.

Xəyali gəldi gətürdi şərabü şahidü şəm,
Gözümdən abi-rəvan ilə guşə yedi həmin.

Yəsar gözi ilə canü dil çü buldı yəsar,
Yəmin vəsfini necəsi deyə İbni-Yəmin.

* * *

Yenə bir baz avlamışdur gözün, ey kəbgi-dəri,
Baş quşın sərbaza necə olısardur sərsəri.

Gözlərüni görəli bildüm anı ki, göz əri
İki gərək biri uyırsa, oyağ ola biri.

Ləblərüm xüşkü gözüm tərdür görəli hüsnüni
Xeyli müddətdür ki, qodum yoluna xüşkü təri.

Necəsi sağmal qoyundan döndərə yüz dünyada
Pəhləvan qoç ki, çələp fəzlindən ola pərvəri.

Belünün barı girandur ləblərünün barı yox
Nərdə var sərvün, nigara, böylə bir barü bəri.

* * *

Yüzündə hinduyi-cadu ki, dürdi-gülçindür
Həzar huri başı verürlər isə ki, çindür.

Hər ox ki, ata gözün xəta ilə könülə
Fələkdə qulğuleyni-afərinü təhsindür.

Əgərçi eyni-yəsarı nəzər qılur könülə,
Qulami-eyni-yəminəm ki, məsti-xudbindür.

Belüni qıl görənün qıl ola gözində məgər
Qılı iki yaramadı zəhi xəta bindür.

Əzəldə canlarumuz verdilər idi əl-ələ,
Cəmalü eşq aralığında pəs nə kəbindür.

* * *

Gərçi ki, hər dilbərün vardur gözində bir nəzər,
Bu nəzər ki, bir nəzərdən geçə, qanı, kimdə var?

Lə'lüni sevər könülüm anun içün təng olur,
Xəstədür canum gözündən, lacərəm, xəstə sevər.

Sağ gözüni sevər isəm, eymündür eymün,
Sol gözüni dilər isəm, təkdürür həq dilər.

Can ilə dil kəndüdən gedər səni görməyicək,
Çünki yüzüni görəm ikisi dəxi bəndən gedər.

Can çü kah oldı tolaşdı zülfünə ayrılmaz,
Saç ki, yerdə sürinə ana nə gərəksə ilər.



* * *

Sun, ey saqi, əlündən içəlüm mül,
Yüzün gülinə qarşu zar bülbül.

Gəl, ey dilbər ki, qöncə gülşən içrə
Baxıpdur yüzünə ki, güləsin gül.

Cəhan içrə əgər can gəzər isə,
Bulamaya sənün tək şuxü şəngül.

Gül olam oduna yanam, ola kim,
Sana bən Xosrov olam, sən bana gül.

Bir ayax mül dilər idüm əlündən,
Diriğa ki, ol ayağ oldı mül-mül.

* * *

Yara, yaramı bilürsin, yarama yar əm gərəkdür,
Necə hicr duzaxında irəmə irəm gərəkdür.

Gözi vəslə və'də qılurü dəmiylə lə'li bozar,
Çü əlindədür qamusı nədəmə nədəm gərəkdür.

Ləbün ilə diri olan zülümata nişə vara,
Çü cəhanda hicrün ola adəmi nəsəm gərəkdür.

Çü təbibi canun oldur zikirüm gər əm der isə,
Könüli rizası içün ol əmə öləm gərəkdür.

Çü əsiri-eşq oldı gişi, yanar od gərəkməz,
Çü şərabi-məclis oldı ne'əmə ne'əm gərəkdür.

* * *

Gər bədr qaşunı görə, şaha, hilal olur,
Bülbül görürsə yüzüni, gülşəndə lal olur.

Bizə haram olduğı vəslün nə nəsnədür
Gözünə qanumu bana hicrün həlal olur.

Nazikliğini incə belünün bilimədüm,
Canun təsəvvüri zira əqlə xəyal olur.

Ol nəsnə ki, əzəldə tuzağıdurur canun,
Zahirdə görəsin anı ki, zülfü xal olur.

Necə sögər isən bana sən sög ki, qəm dəgül
Ağu qaçan ki, ləbünə irə, zülal olur.

* * *

Sun əyağı, ey saqi, uzatma bizə və'di,
Eşqə nə bəhanə çü toğa taleyi-sə'di.

Zülfün anıcax dünyada əttarı nedərlər,
Vəsfüni qaçan ki, bən aydam, mat ola Sə'di.

Eşqini tuta gəldügümün əvvəli yoxdur,
Həm yenə anun axırınun olmaya bə'di.

İrağü yaxın vəsl ilə hicran bizə birdür,
İxlas olıcax bir olur qürb ilə bu'di.

Mürsəl qılma düşdivü qurtılamadı can
Zülfində həzaran vay əgər tolaşa sə'di.

Bu fəsl bəharü yüzi gül, bülbüli bənəm,
Bulıt gözümü bərq dişi ah ola rə'di.

Bən zülfi piçinə tolaşalı yəməniysəm,
Bana nə əgər Zeydü ya Əmr ola mi'adi.

* * *

Gər görməz isəm yarumı bir ləhzə nəzərdə,
Eynümə bənüm gəlməyə kimsənə bəşərdə.

Ömrümdür anun zülfi yanağı yörəsində
Yarəb uzun et ömrümi şol dövri-qəmlərdə.



Bən görməmişəm hiç anun ağzı kibi peyda,
Ya beli kibi nazikü bar ilə xətərdə.

Dil neçə ki, qıl isə fəda ola yüzinə
Can neçə ki, ağır isə, əslinə kəmərdə.

Can zülfi həvasında biri-birnə toxunır
Aşiq canı anda neçəsi gələ şümürdə.

Hərgiz könülüm kibi bəlada görməzəm,
Qədri ilə olmamış ana cövr qədərdə.

Leyli çü sənün kibi cəhan görmədi hərgiz,
Məcnun dəxi bənüm kibi olmaya səmərdə.

Gül düşdi yüzi suyın yerə kəmişdi,
Çün gördi sənün gül yüzünün lütfini dərdə.

Gözindən anun günilərəm əksümi bənüm,
Namərd ola ol gişi ki, qəsd eyləyə mərdə.

* * *

Can dilərsən can kəsə gey bizə gəl, tək can apar
Ətək-ətək gözlərümdən lö'lövü mərcan apar.

Dərdün oldur ki, yanam dərdün ilə bən dünü gün
Dərdüni derdüm birini hər nəfəs dərman apar.

Can biribirdüm ləbünə yenə əqlüm bana der
Dirşür özüni yetərsən zirə ba Kirman apar.

Bən bu dünyadan, şəha, eşqün odın aparuram
Sən dəxi xoş var bizümlə xeyr ilə ehsan apar.

Varlığı aşiq verür bir türrəsinə zülfinün,
Buncılayın kim bulısar küfr ilə iman apar.

* * *

Görəli səndə, nigara, sələsili-miskin
Bu bəndə bəndə tolaşmağı eylədi ayin.

Yüzündə məh be tərazuvü sünbüldə günəş
Anı görüp necə yanmaz münəccimi-miskin.

Özi lətifü gözi xişmidür nəhayətdə,
Təni hərir, vəli yürəgidürür səngin.

Əzəldə ki, qamusın ruh yaradur idi çələp
Məlahəti olalı qıldı hüsninə kəbin.

Qaraxcı gözidürür, xuni saçı sevdayı
Totağı atəşidürür, belidürür narin.

* * *

Gözlərün kibi, nigara, dilrüba göz görmədüm,
Kəndü özin gösdərici biriya göz görmədüm.

Bunca şairlər ki, mədh edər xətayi gözləri,
Bən cəmalün görməyincə bir xəta göz görmədüm.

Can alə'l-amya gəzər ki, görə bir göz gözi tək
Neçə gördümsə anun tək bir bəla göz görmədüm.

Yüz görürlər ayü günəş yüzün içün yüzə yüz
Bən gözün kibi gözə-göz bir məla göz görmədüm.

Necə ki, eyn adlu göz yaratdı isə ol çələp,
Gözlərüni görəli hərgiz beca göh görmədüm.

* * *

Təlu sağraq içərüz çünki xumaruz nedəlüm,
Dərdünə döyəməzüz, zarü nizaruz nedəlüm.

Baş qoruz yel kibi ayağun izinün tozına
Ağızun yadı çün od kibi yanaruz nedəlüm.



Eşqün odı toludur içümüzü pərdəsi biz
Sənün yanağun içün töhfə fənaruz nedəlüm.

Totağun qanum içər uşdadurur qanı ilə
Qanlumuzdan qana biz dəxi qanaruz nedəlüm.

Sən cəhan vayəsisin, ey nəzər əhli, sor anı
Biz dəxi arada barmağı banaruz nedəlüm.

* * *

Özini göndərəli gözümə bir arada ol,
Ayıtmazam ki, anun tək nigar yarada ol.

Neçə ki, sorar isəm lə'lüni bana derlər
Ki, incü ilə durur hər gecə bir arada ol.

Cəhan tolu ola ud ilə nafeyi-miskin
Qaçan ki, suya giribən saçını tarada ol.

Cəmal içində bulınmaya saçınun qılı tək
Əgər bu aləm ilə ol cəbanı arada ol.

Qərar etdi könül zülfi-biqərarında,
Qərar edər isə dəxi nola qarada ol.

* * *

Yüzüni gözləyəli hiç mahtab gəlməz,
Gözüni görməyəli gözümə xab gəlməz.

Vardum ləbünə ta ki, soram könül dəvasın,
Çoğ intizar çəkdüm hərgiz cəvab gəlməz.

Şol dəm ki, qəmzən oxı qıldı dili nişanə
Qan axar oldı gözdən bir qətrə ab gəlməz.

Gözləri ilə yarun mey toludur bu yürək
Nola əgər ləbinən ke'si-şərab gəlməz.

Bəhr edəli cəhanı göz yaşı ilə yara
Bəhri-mühit gördüm həmçün sərab gəlməz.

Aləmdə kimsə könli gözünə könülüm tək
Sağü əsən varıban məstü xərab gəlməz.

Gərçi suya girübən gözə gəlür xəyali,
Mərdümligə sayılmaz çün bihicab gəlməz.

* * *

Könül ki, səndən irax düşə, bir əzaba düşər
Gözüm fəraqun odından, nigara, aba düşər.

Gözün könül qanını mey deyü ki, tolu içər
Çü sərxoş oldı son ucı qaraqı xaba düşər.

Səxavəti ki, gözüm gösdərür bu aləmdə,
Cəvabını deyəməz kimsənə, səhaba düşər.

Hicabı tən gidərübən dilüm irər ləbünə,
Hicab tənün arasında canum hicaba düşər.

Visali yolına cəhd edərəm verürəm can,
Tənümlə bu oda yanan qamu səhabə düşər.

* * *

Bir gecə sənün ilə gər bizə səbuh ola
Nə rahəti-ruhani, nə əsli-futuh ola.

Bir ləhzə sənün ilə çəkdügümi yazarsam,
Yüz dəftər ola andan bin cüz şüruh ola.

Çün cana dəva yardan həm dərdi olısardur
Gərək ki, bu bağruma mərhəm cüruh ola.

Bən özümi salaram dənizinə eşqünün
Ya qərqə çü fir'ovnü ya silm çü Nuh ola.

Bən tövbəyi qıldum ki, ayrux dəxi qılmayam,
Var ümidüm Allaha bu tövbə nasuh ola.



* * *

Ey yaranlar, yar yolına nəm qaldı ki, yanmamışam,
Bunca ki, yandum yanaram, billah ki, usanmamışam.

Xəmmarı gözindən anun bir tolu ayağ içmişəm,
Andan bərü sərxoşam uş hiç dəxi oyalmamışam.

Can dilədi bəndən gözün əqlü könül verdüm bilə
Tanrım tanux bən can içün mə'şuqə yacanmamışam.

Lütf eyləyüp sən tut əlüm saç oduma rəhmət suyın,
Zira odıma düşməgi bən kimsəyə tanmamışam.

Tap yax oduna canumı, vəqtidürür iksiri sal
Nə bıtə qaldı k'anda bən bin qatla qaynanmamışam.

Can ilə iki cəhanı əqlü könül nə var isə
Eşqi əlindən içmişəm illa ki, hiç qanmamışam.

Səni dedüm sinə dəgin səndən usanmax yox bana,
Bin gəz ölüb-dirilmişəm ol sanuyı sanmamışam.

Gözüm yüzüni görəli görmədi rahət gündüzin
Yurd edəli can zülfüni bir gecə dolanmamışam.

İçüm qara, bənzüm saru, yaşum qanü qanum sudur,
Dəxi nə qaldı k'ana bənə eşqində boyanmamışam.

* * *

Gülə qarşu gər niqabın sala aça yüz göz ilə,
Qıla könləgini şol ləhzə qəbaçə yüz göz ilə.

Yüzüni cəmalə eşqün qılur isə ərzə şol dəm
Saçunı saçun deyibən ana saça yüz göz ilə.

Şunı ki, qılıcı ilə açmadı Samü Rüstəm
Anı səhli qəmzə ilə gözün aça yüz göz ilə.

Kim ola ki, cadu gözləri kəminə işvəsiylə
Diləməz ki, qıla özin sərü paça yüz göz ilə.

Şol imam gözi ilə qaşı məscidin görəli,
Kim ola ibadət edə dəxi xaça yüz göz ilə.

Göz anun yüzi cəmalin neçəsi qıla təəmmül,
Çü təəmmül edəməz ki, baxa qaça yüz göz ilə.

Qaşunun yayın görənə, əcəba, rəva olamı
Ki Diməşqə vara yaxud gedə haca yüz göz ilə.

* * *

Gəl imdi, gəl ki, gözüm seyli axar uşda qanın
Kim ola ki, yüzini görə verməyə canın.

Gərək ki, arı ola ardan qoya namı
Tapuna aşiq olan neylər adı yoxsa sanın.

Dilər isən ki, bu aləmdə alavuz zövq,
Bizi sevəni sevəlümü qovalum qaçanın.

Şol oğlanı görəli eşqüm oldı yenə yigit
Bu əqli piriyə neyçün düritdi tifli-conin.

Gözün həramiliğ edər yüzündə gündüzlə
Ki, biri gösdərə özinü biri qıla kəmin.

* * *

Sorunuz naya ki, yanar yar odına nə içün,
Bən dəxi həm yanaram anun odına nə içün.

Zərd ruyu od içümdə başumı aldum ələ
Yaşumı axıduram uşda ləgəndə nə içün.

Neyiçün bağlayuban parə qılur isə bəni
Hər nəfəs ki, ola adanam adına nə içün.



Ney kibi yandumü tağıtmadı hiç bəni həva
Quşanuram yenə yüz yerdə qadına nə içün.

Sayılıb ar tonından çəkər isəm qürbət,
Nəfəs azdurmayam ol dost yolına nə içün.

* * *

Şəha, gözün kibi didə nədidə
Nədide qanda olısar çü didə.

İki hindu dəxi xud fitnələrdür
Vəli ol birisidür kəs nədide.

Qələm uzatdı dil ki, barmağundur
Sözə gələydi oldı sər büridə.

Neçə qönçələr ağzunçün, nigara,
Çəmənde oldı pırahən dəridə.

Məgər gördi gözün vəhdət nişanın,
Vahidüd-dəhrdür bax bu fəridə.

* * *

Gözün ilə yürəgüm yaradurur
Neyləyəm zalim gözün qaradurur.

Yandı könülümdə İbrahim odı,
Çünki zülfi ənbəri-Saradurur.

Gözlərümdən şol xəyal əksilməsün,
Ol dəxi bunda bir idraradurur.

Çünki hüsnün came' oldı, ey nigar,
Noldı gözüm eyni-fəvvarədurur.

Var niyazum nazuna əksilməsün
Çünki nazun lütfü hüsn aradurur.

* * *

Zülfün qaçan ki, yasaya, ey şah, xeylini,
Gündən gərək ki, yeg görə eşq əri leylini.

Bir nəzrə cana deyü münadi buyur, şəha
Ki, saçasın yüzünə könül əhli meylini.

Gözlərüm intizar ilə nə kim çəkər isə,
Dildən irürə xun ilə ümmana seylini.

Ey eşqi möhtəsib qanısın, gəl bu həlqəyə,
Kim gəm dutar gör axı bu bazar keylini.

Müşg ilə ənbərə saçını necə bənzədəm,
Məgər ki, zülfi lütfi bana örtə zeylini.

* * *

Cananəyi gərək sevə, kim canı var isə
Eşqini yarun din tuta imanı var isə.

Günəş ki, camalini qılur ərzə, cəhana
Rövşən ola de'viləri, bürhanı var isə.

Ağzun ki, güman ana can aparayıdux
Güncayişə ol arada imkanı var isə.

Gisusına miskinüzü ləblərinə möhtac
Vacib bizədür lütf ilə ehsanı var isə.

Gözi könüli oxladıvü lə'li-ləbindən
Bir şübhə düşər anda əgər qanı var isə.

* * *

Eşq qalamı dilə ya canamı?
Eşq əri can vermegə ya canamı?

Usanamı şol, sənəma, dil verən
Yaxu dəxi sanuları sanamı?



Çeşməyi-xun oldı bənüm hər gözüm,
Təşnə gözi gözlərümə qanamı?

Bu yaş ilə bu nəmi gözlərümün
Neçə ki var, hicr ilə tən yanamı?

Müşkilüm oldur ki, çü üryan olam,
Saç dügledügümə inanamı?

Eyşümüz ağızı ilə oldı teng
Zülfi ilə dərdümüz uzanamı?

Gözlərünün mərdümi gizləmiş ox,
Qılmağ içün həmleyi mərdanamı?

Apara idüm yüregi tolu mey
Bilsə idüm ki, gözün oyanamı?

* * *

Yolunda cümlə fədadür vəleyk cana diriğ,
Tapundan ayrun içün bir nəfəs cəhana diriğ.

Neçə yüregümə urur gözün bu qəmzə oxın
Nigara, oxuna yazux, şəha, kəmana diriğ.

Ayağunun izinün tozıyam bana bu yetər
Bənüm adum gəlür olursa, şol zəbana diriğ.

Qıl eylədi bəni zülfünü qıldı sevdayı,
Həzar vay əgər irməyəm ol miyana diriğ.

Buxari-eşqin iləvü duxani-hicrün ilə,
Fələkdə irdi buxarum yenə duxana diriğ.

* * *

Aləmdə budur adəminün həddi-kəmali,
Ki ana təcəlli qıla bir nuri-cəmali.

Boyın görəli dil yügürür idi uzağa,
Gösdərəli ağızını təng oldı məcali.

Bir nöqtəyi nitq ilə dilər ki, edə qismət
Bir söz ilə sabit dilər eyləyə mühali.

Rümmanə əlif, qəddinə dali olalıdan
Olmaya əcəb qəddüm əgər oldısa dali.

Dəftərdə ki, hər nəsənənün misli yazılmış
Xalinə ki, yox misli rəqəm çəkdi ki, xali.

Gör qüvvəti-xəmri ki, neyimiş zəhi xəmmar
Ki əsrük edər cür'əsi bir parə sifali.

Seyd etmək içün sadı yazar eynini ol həq,
Nə'li düzədür çərx güməytinə hilali.

* * *

Derdi-fəraqı bən nə dəlilə bəyan edəm,
Oda yanar cəhan bu siri gər əyan edəm.

Uzatmamax gərək ki, saçından nə çəkərəm,
Yegrək budur ki, ləbləri eşqin nihan edəm.

Kirpügün oxına dilümi rast qılalı
Başlamışam qədi ki, qaşıyçün kəman edəm.

Zülfün belündə tağıdalı qıl tuzağını
Can der bana ki, varlığumı dər miyan edəm.

Bir ləhzə ləblərünə könül gəç varur isə,
Sevda gəlür başuma ki, nagah qan edəm.

* * *

Afərin şol qəddü qamət ki, qiyamət gözikür,
Afərin xəstə gözünə ki, səlamət gözikür.

Badi-sübhiyə əgər qul yazılam yeridürür,
Əsdügincə bana hüsnində kəramət gözikür.



Can pərişan göricək gisusını vəhmə düşər,
Ki qiyamət qopacağ olsa əlamət gözikür.

Bən ömür anı bilürəm ki, visalünlə keçər
Səndən ayru bana işrət çü nədamət gözikür.

İstiqamət bana şoldur ki, görəm qamətüni
Gözüni görməyicək bana səqamət gözikür.

Eşqi könüldə əgər olmaya xud olmasa can
Eşqinə düşər isəm nola məlamət gözikür.

Könülüm xəstəliğin şərh edər idüm gözinə
Toğradı qəmzə ilə yə'ni həcamət gözikür.

* * *

Yüz qana girdi xuni gözün fe'lü al ilə,
Ki damü danə eylədi şol zülfü xal ilə.

Sehrin zəhi kəmalə yetürdi gözün ki, ol
Bin şiri bəndinə gomişür bir kəm al ilə.

Qurarsa qaşı yasın ki, ata qəmzə navəkin
Rüstəm bərabər olmaya şol yalü bal ilə.

Şol nöqtə ki, cəmali kitabında həq qomış,
Necəsi şərh idilə sualü cəvab ilə.

Susamışam ləbünə zəman oldı yanaram,
Cəl həccə var suvar susamışı zülal ilə.

* * *

Dilərəm ayəti-hüsnini ki, təfsir qılam,
Nə rəvadür ola ki, bir nöqtəyi təğyir-qılam.

Bu gecə özümi zülfündə müsəlsəl gördüm,
Gördügüm kibi gərək düşümi tə'bir qılam.

Bən anun sərvi-rəvanına əgər tubi deyəm,
Qissə sanu sanuban mədhinə təqsir qıləm.

Tutalum saçı kibi bu ömürüm uzun ola
Bində birini bu dərdün necə təqrir qıləm.

Şol xətün vəsfini kim müşg ilə kafurdurur,
Qələmü kağıd ilə bən necə təhrir qılam.

Diləməzəm ki, olam aşiqü mə'şuq ola ol,
Dilərəm kəndizümi anun ilə bir qılam.

Gah zülfinə uyup Ruma salam axın bən,
Gəb xətaya uyuban qarəti-Kəşmir qılam.

Aldı külli bənı, andan nəsənə bulımadum,
Bəni ya yarumı bulmağa nə tədbir qılam.

Nöqtə ağızını səthində yüzinün görəli
Cism ilə canumı xətti ilə tədvir qılam.

* * *

Nigarına nəçün bizdən güzin etdün fəraqı sən,
Rəva gördün cənumuza bu suzü iştiyaqı sən.

Günəş yüzünə uş bənəm ki, oldum müştəri candan
Və leykin canuma qoydun bu saət ihtiraqı sən.

Əlüm tutğıl nigarına ki, eldən getmişəm külli
Xiraman idübən sərvi əlümə ver, əyaqı sən.

Mühəyyər qalmışam novruz, nühüftə saxlamax olmaz
Hicaza vardun, eylə bil, düzər isən İraqı sən.

Haramını xumar alup canumı bəndinə saldı,
Sənün olsun ayağ ilə içərsən bənd saqi sən.



* * *

Nola canum oynar isəm sən dilbəri-mövzun içün
Ya qan edərsəm yaşumı lə'li-ləbi pürxun içün.

Ur çəngüni çəngünə, ta bin dəftər edəm eşq ilə,
Ney kibi oduna yanam dünyada bu qanun içün.

Bən pirəmü aşiq, vəli ol oğlanü umaxludur
Fərhadi-Şirin düşmişəm ol Leyliyi-Məcnun içün.

Lə'li içün canlar verüb zülfeyninə tolaşmışam
Əldən qomazam anı çün zəmin gərək mədyun içün.

Düşdi könül gözlərinə şimdi oxından uçınur,
Görün ki, can nələr çəkər bitü dili-məftun içün.

Baxdı bu gözüm yaşına göz dəgməsün deyü məgər
Altında bir Nil eylədi gözümdəki Ceyhun içün.

Zülfeyni məğruq olalı bən qüssəyə peyvəstəyəm,
Bən qüssəyə peyvəstəyəm şol qaşları məqrun içün.

Sevdayiyəm var altunum yüzümdəvü uşdur yaşum,
Lə'lündən umaram əgər sunar isən mə'cun içün.

Bən aşinayam eşqinə anun içün göz yaşınun
Dənizinə uş talaram şol lö'löyi-məknun içün.

İlla ki, gözün könlümi yaşumı idrər edübən
Əqli xəyalünə sənün vəch eylədi su sun içün.

Lə'lün, şəha, oğrulayın içdi yürəgüm qanını
Toqquzladısarəm anı törə ilə yusun içün.

* * *

Dünü gün zülfü rüxün vəsfini gər yazar isəm,
Başarmaya məgər andırasın yarar isəm.

Dilü can zülfünə düşibən olur sərgəştə
Zülümat içrə ayıblaman əgər azar isəm.

Baxırum var isə yax oduna kim bən əriyəm,
Yoxsa ur sikkeyi bu canü dilə gər zər isəm.

Eylə qılmadı pərişan saçunı badi-səba,
Ki ana qıla vəfa bu ömürüm düzər isəm.

Bəni dəllak edünürsən ki, tarayam saçunı,
Canumı üzgil əgər kəm qılını üzər isəm.

Eşqi dənizinə bən biliş idüm əzəldə,
Aşinayam nola əşkümdə əgər yüzər isəm.

Bir parə biz kibi saldunsa bəni bu bucağa
Giricək ulu suya tutınasın mi'zər isəm.

Ol səadət ki, yüzündən, şaha, irdi gözümə,
Ələ girməyə iki aləmi gör süzər isəm.

İrməz olüm ki, dirəm sərv boyun şəftalusın,
Var ümidüm ki, irəm dirməgə gər üzər isəm.

* * *

Ömürüm keçdi zar səndən irax,
Tənüm oldı nizar səndən irax.

Zülfün aşüftə qıldı öz canumı,
Getdi bəndən qərar səndən irax.

Ayinə yüzünə, şəha, ahum
Dəgməsün zinhar səndən irax.

Sən gedəli çü zülfün oldı bizüm
Cəmümüz tərümar səndən irax.



Nara döndi könül fəraqundan
Yürəgüm tolu nar səndən irax.

Aşiqünə irişməz olur isən
Dəpələr intizar səndən irax.

* * *

Saçun qılı girehinə əcəb nə qıla könül
Məgər ki, canü dilin tərk qıla qıla könül.

Özini qıl qıla incə belün içün canum,
Saqıl olmayayum deyü şol saqilə könül.

Saçuna iləli can xəttüni gözə ilməz,
Kəsir qılmadı qılmayısar qalilə könül.

Gözün rəva sora gəldi bu könlümə bənüm
Əlildür nə dəva qılısar əlilə könül.

Canum saçun kibi sərgəştəvü pərişandur,
Bu halət ilə hələ ortada vəsilə könül.

* * *

İlahi, şol dili ki, yaxdı eşqi-yar odına,
Gərək ki, yaxmayasın dəxi intizar odına.

Fəraqü cövr odıdur ki, əzab edər könülə
Və gər nə kim gərək isə, yanar nigar odına.

İrağ olursa fəraq odına yanar könülüm,
Vüsal olursa, yenə həm yanar kənar odına.

Qərar qıldı könül ki, qərar eyləmədin
Dünin-günin yana şol zülfi-biqərar odına.

Rəvamıdur ki, meyi-lə'li var ikən ləbünün
Dəxi bu aşiqi-miskin yana xumar odına.

* * *

Sevən səni gözün kibi bimar gərəkdür,
Həm dərdün ilə canına timar gərəkdür.

Kim ki dilər isə kim, ola eşq ilə Mənsur
Müşgin saçun ilə hələ bərdar gərəkdür.

Üşşaq arasında bənüm kibi müheyyər
Bulmaxlığa bu dünyada ədvar gərəkdür.

Əqlü könüli zülfünəvü gözünə canı
İsar edərəm bu gecə bazar gərəkdür.

Gözlərümün irmağını yoluna axıtdum
Labüd bizə bir cə'fəri-təyyar gərəkdür.

Əfkarımı çün cəm edərəm bunı bilürəm,
Kim canü könül eşqinə əfkar gərəkdür.

* * *

Necə qıla gözlərün könlüm elinə axın,
Ayı nəyə bənzədəm, ayinə al, bir baxın.

Əql belün görmədi, vəhm ləbün anlamaz,
Göz xu qaçan irisər, sən səni səndən saxın.

Ləbləri canı nedər, əql nə vəchə sığar,
İlla dedüm zülfünə könlümi heykəl daxın.

Hüsninə cəm eyləmiş müşk ilə kafurı gör,
Atəşi-yaqut ilə lö'lö'i-sirab axın.

Zülfünə nədür ömür ol uzunü bu qısa
Hicrünü ölüm nədür bu irağü ol yaxın.

* * *

Bu nə sünbüli-taridür, bu nə zülfi-ənbəridür,
Əcəba, bəşərmi yaxud məlekü ya pəridür.



Saçınun səlasiliylə bilişəli həlqə-həlqə
Necə can qələndəri isə dilü əql heydəridür.

Ayağı tozına ölüm ki, gözümə kəhl edinəm
Əgər irməz isə başum bu tənümdə sərsəridür.

Yüzi gözi yüz-göz etdi sanasın bənüm yüzümdə
Bu hesaba pəs bu yüz-göz yaş anun müsəvvəridür.

Tənü canü əqlü elmi qədı ləblərün yolına,
Dəxi qiymətin yetürməz bu könül ki, cövhəridür.

Saçı ilə gərçi qıldur bədənüm beliylə leykin
Qaşınun hilali ilə fələk oldı çənbəridür.

Bənüm işbu suzişümi yolına əcəb sanasın
Neçə aşiqi var anun ki, kəminə kəmtəridür.

* * *

Anda ki, hər büti-şəhanə ola,
Nola hökmi əgər cəhanə ola.

Necə tutılmayam bən ol tuzağa,
Ki saçı damü xalı danə ola.

Bən qılayum düganə qaşına çün
Dünyada hüsn ilə yeganə ola.

Bən miyanından istəyəmmi kənar
Çü kənarı anun miyanə ola.

Bu cəhan hüsninə əsir oldı,
Zülfi tək ortada bəhanə ola.

Aşikara ləbini bən sorayım
Aşikar olmasa nihanə ola.

Bən dedüm çin xəta qılur zülfün
Cəhd edər kim yasax bu şanə ola.

* * *

Bən suxtəyəm eşqünə hər xam gəliməz,
Hüsnün kibi ya danəvü badam gəliməz.

Bən hüsnün ilə canəmü camun ilə xaməm,
Hər cam ki, hüsnün ilədür xam gəliməz.

Gör tağıdasın küfrini sən gisularunun
Bən nə qılayum anda çü islam gəliməz.

Çün danədürür gisuları dam bənündür,
Ol şaməyə dünyada səmən şam gəliməz.

Bən xas sənünəm dilərəm söhbəti-xası
Çün am, gələ ni'əm olısar am, gəliməz.

* * *

Ta biləli bən, nigara, yüzünün mahiyyətin
Məhv qılmışam könüldə aləmün şey'iyyətin.

Niyyətüm oldur ki, niyyət özgələrə qılmayam,
Yeg demişlər mö'minün zira əməldən niyyətin.

Seni ol fərdü səməd kim fərd yaratmışdurur,
Hüccət ilə qıldı sabit kəndünün fərdiyyətin.

Ta bənüm eşqüm içün hər gecə ağlaya bulıd
Bəhrü bər virürlər ana kəndünün ma'iyyətin.

Eşq baqidürü ariyyət həyatı dünyəvi
Baqisin hasil et rədd eyləgil ariyyətin.

Odda xasiyyət budur ki, cinsi cinsə qovuşurur,
Eşqi odına yanam ki, bulam ol xasiyyətin.

Ol həva başına toprax ki, yaşı yağmur dəgül
Yana könül ilə ana, saçmaya nariyyətin.



* * *

Şəha, cəfanuzı tağlar təhəmmül eyləməyə,
Yeridür ana işində tə'əmmül eyləməyə.

Necəsi lə'li-ləbini təsəvvür edə kişi, –
Ki, bu Əli dəxi bilin təxəyyül eyləməyə.

Günəş yüzini həməldə görəli xeylidürür
Əcəb dəgülmi ki, andan təhəvvül eyləməyə.

Bən ana eşq əri derəm ki, lə'linə qarşu
Tolu çəkə sevü camın tə'əllül eyləməyə.

Necəsi mö'min ola ol ki, yüzini görübən
Canını odına atub təvəkkül eyləməyə.

* * *

Saqi, tolu ver ki, gedə bu zöhd ilə salus
Ki, çox yerüz içmədügümüz günlərə əfsus.

Gər avçı isəm arü həya vəchümə sığmaz,
Avdan kişiyi qoya irax ar ilə namus.

Ləblərünə hiç irəmədi vəhmi-xəyali
Gözüm yaşı uzun ki, görür anları məhsus.

Can saldı saçuna könüli bir xəbər içün
Bəllüdürür işi çü qatı gecikə casus.

Zülfün ilə yüzün banadur gecəvü gündüz
Söhbət ki, xəyalünsüz ola olmaya mə'nus.

Əldən gəlicək başı fəda qılmağa nə var,
Qaçan ki, bana hasil ola dövləti-pabus.

Ümmid ilə gəldi könülüm, şaha, eşigə
Olmaya rəva qaytarur isən anı mə'yus.

* * *

Dürdi-məhəbbət bizə çün oldı saf,
Nişə qılur sərvi bizümlə xilaf.

Vəsl ilə hicran bir olur aşiqə
Bülbül urur lafı həvadan güzaf.

Ta ki, yürəkdən sevüsi çıxmaya,
Özinə geydürdi yürək bir ğılaf.

Ahum ol ahum içün ola ki, ol
Xüşk edə qanınü qıla müşgi-naf.

Od tütüni irdi həvadan gögə
Bəlkə gögün bir qatın etdi şikaf.

Biz yanaruz səndən irax eşq ilə
Ləblərünüz dayima qılur züfaf.

Gözi dilərsə ki, fəna olavuz
Nimə işarət ola ana kifaf.

Gül sipər oldı yüzivü gözi ox
Ki, qılalar yox canum ilə məsaf.

Nəzm edəli gözlərümün nəsrini
Saldı yürəgümə həzaran zihaf.

Kə'bədürür yüzi, mücavir könül,
Gecəvü gündüz qılur anı təvaf.

Gördi könül hicrətinün dərdini,
Dedi ki, yarəb nəccini mimma axaf.

* * *

Zəmanlardur geçər eşqim sənün hüsnünlə sərtayı,
Əsirünəm, həqirünəm, mü'tiəm, hərçi fərmayı.

Cəhan qarardı gözümə, nigarına, saçun ilə
Başum çəkzindivü əqlüm, nigara, oldı sevdayı.



Bənü yüz bin bənüm kibi fəda olsun ayağuna,
Ki icadumuza bizüm tapundur illəti-ğayı.

Şəha, hüsn ilə səni həq irürmiş qayətə leykin
Netə ki, cud ilə irmiş cəhanda Hatəmi-Tayı.

Şəha, sən bulımazuz bizə həm sən səni göstər
Obadan şöylə çıxıcax dəxi bulmazuz obayı.

* * *

Mütrib əlinə alıban çəngi çü saz eylədi,
Neçə ki, binəva isə əzmi-hicaz eylədi.

Yolına girdi könülüm gördi saçıyla ağızın
Yə'ni ki, cana bu yolı təngü diraz eylədi.

Gördi qaşında dil gözin aldı vüzuyı qan ilə
Ta ol imama uyıban eşqi nəmaz eylədi.

Can dilədi ki, naz edə könülümə niyaz ilə
Qılmadı qılıd ol niyaz nazına naz eylədi.

Xüftə idi cadu gözi xəstə idüm anun ilə
Yə'ni şikayət eylədüm çeşmini baz eylədi.

Eşqi odı əcəb neçün vəslini tərhü qılmadı,
Çünki bu kimya içün canı güdaz eylədi.

Sazını söz eylədi canuma eşqi bir zəman,
Çünki yetürdi qayətə, sözini saz eylədi.

* * *

Eşq ilə eşqi içində könülüm avarədür,
Başdan-ayağa dəgin yürək yolına parədür.

Cana necə cani isə gözlərün dönməz canum
Necəsi dönə əzəldən çün məhəbbət barədür.

Bən zənaxdanında anun gizlədüm canü dili
Qorxaram ki, hüsni gözi ol nigarun qaradur.

Dutdı eşqün yürəgüm yaxasını aldı gedər,
Qorxaram əlində qala yaxa parə-parədür.

Könülüm miskin tolaşdı gisularun bəndinə,
Tolaşıxdan tolaşığa çarə yox biçarədür.

* * *

Kim gördi kəkligi ki, urur pəncə baz ilə
Gəh lütfü naz ilə gəhi fəqrü niyaz ilə.

Mehrab qaşları gözi canlaradur imam
Kim görmiş ola könül alalar nəmaz ilə.

Üşşaq pərdəsində nəvalar ki, qıluram
Pəst eyləmək dilər qamusını hicaz ilə.

Həmsayə olalı boyına sərv sərbəsər
Əş'ar içində adı dəfatirdə yazıla.

Qəddində zülfinə tolaşur rasti könül
Başəd ki, məqsuda irə rahi-diraz ilə.

Yazuğa yazılamı ləbündən, əya sənəm,
Can içər isə canı xuman ki, yazıla.

Qurdı qaşın dedüm zəhi qəmzəsini atdı ox
Gətürdi canı qəbzəsinə çəngü baz ilə.

* * *

Yarun fəraqı gögdəki bulıdı zar edər
Gözüm nola xəyalinə lə'li nisar edər.

Yar etdi yar eşqümüzə hicri odını
Gözüm dəxi bulıtları özinə yar edər.



Çəkdi bənəfşə dilini gisusı qeyrəti
Hüsni təravəti gülofi şərmsar edər.

Həm tarımar olup, tolaşur boynuma bənüm
Gisusınun ki, könülüm tarumar edər.

Zülfi ilə bu dəlü könül biqərardur,
Ol ikisi cəhanı dəxi biqərar edər.

Ol şöhrə şəhri qıldı bu oqlümüzi əsir
Könül elində qarəti-nəhbü tatar edər.

Canum yeri əzəldə gözün guşəsi idi,
Andı yenə vətənini əzmi-diyar edər.

* * *

Yüzüni sevdügi içün məlamət olamı dil,
Bu gözlərüni göricək səlamət olamı dil.

Həzar yerdə dəlükdürü qanları axar,
Əcəb bu xəstəliğ içün həcamət olamı dil.

Görəli gözlərini fitnə oldı bu könülüm,
Görürsə qamətini, bəs qiyasət olamı dil.

Cigər kəbabü yüzündə şərab düzdi könül
Gözi xumar idi, dedüm, kəramət olamı dil.

Dotağı dotağuma der ağız-ağız hər dəm
Ki, oldı bana müsəxxər, tomamət olamı dil.

* * *

Nə həva yardan bu yara gəlür,
Könülün könləgini yara gəlür.

Zülfünə tolaşub qədünə çıxar,
Könül öz ayağıyla dara gəlür.

Zülfi sevdası düşicək başuma
Bu cəhan gözümə qərara gəlür.

Bir düz uzun, quru ağaç ola sərv,
Sərv qəddün qaçan ki, bara gəlür.

Nərgisi nisbət edicək gözünə
Qorxusından yüzi sarara gəlür.

* * *

Ey bəni dəlü qilan, hicran edərsin eyləmi?
Eşigündə dayima heyran edərsin eyləmi?

Gündə bir kəz yüzüni göstərür idün sən bana,
Şimdi özgə yanaya seyran edərsin eyləmi?

Dəlü qıldı bəni eşqün cövri təklif eyləmə,
Zülm edübən dəlüyə fərman edərsin eyləmi?

Qaşlarun kişindədür bənüm könülüm ta əbəd,
Ol iki yaya bəni qurban edərsin eyləmi?

Cövhəridür gözlərümü sərrafidur ləblərün,
Anun içün anları dükan edərsin eyləmi?

* * *

Yeründən turı gəl, saqi, bizə sun tolu peymanə,
Ki eşqündən dəlü olan turımaz əhdü peymana.

Sənün eşqündürür bir od, bənüm dərdümdürür tutrux
Bu od ilə bu tutruğa bu aləm yanamı, yana.

Əgər zülfüni götürə nigarına səba yeli,
Yəqin oldı ki, kafirlər gərək gələlər imana.

Bədi' olmaya lə'lünçün çü təng oldı bu könüllər,
Ki tam olsun deyü təşbih, uru qanına boyana.

Sənün şol xüftə gözündən gər irür isə bir qəmzə,
Bu sərxoş könülüm gərək ki, uyur ikən oyana.



* * *

Söhbətünsüz, nigara, vayə qanı
Ol səadət fəqirə, baya qanı.

Ayağun toprağuna yaş dökərəm,
Uçaram hələ bir həvaya qanı.

Dərdüm oldur ki, totağuna irəm,
İrürəm dərdi bu dəvaya qanı.

Qaşlarıdur hilalü yüzi günəş,
Öləyüm ol ox ilə yaya qanı.

Can verürəm, şəha, sənün yoluna
Kim apara xəbərü paya qanı.

Böylə tağuğ ikən könüllər alur,
Ah əgər zülfini yasaya qanı.

Canuma canı və'dəsin verür,
Və'də gərək irə vəfaya qanı.

Biz ayağı tozın hüma görürüz,
Kim irürə bizi hümaya qanı.

* * *

Gəl ey dilbər, gəl ey dilbər ki, bən getmişəm özümdən,
İçümdə yanan odları tapun anlaya sözümdən.

Gözümlə məstü zülfünlə qatı təşviş içindəyəm,
Ki üzümə düşicək bən gərək qarara üzümdən.

Qamu xublarun içində anı ayruxsı yaratmış
Sanasın yəlğuzəkdür dur ki, ayru düşdi düzümdən.

Yüzüni nagəhin gördüm sabahın gülşən içində
Həqi budur ki, utandum be qayət gəndü yüzümdən.

Tuza axar gibi axar könüllər zülfinə anun
Zəbi insafsuz şol ki, bəni mən' edə tuzumdan.

* * *

Gəl imdi eşqi gözət, qalma namü nəngə, bəgüm,
Könül şişəsinə bax, qatlanamı səngə, bəgüm.

Tağıt ki, zülfün ilə saydun ola, hindü həbəş
Yüzüni gösdərü hökm eyləgil firəngə, bəgüm.

Bəni diri dilər isən gözünə hay de, şəha,
Yürək duyamı, qiyas eyləgil xədəngə, bəgüm.

Könül talarü can alurü tənümi qıl edər
Biliməzəm nə qılam işbu şuxü şəngə, bəgüm.

Dəfi əlünə sənü ağzuna neyün sən al,
Ki zöhrə çəngini dilər ki, ala çəngə, bəgüm.

Necə bu qöncə ağızlu bu surı gül yüzlü
Təbəssüm eyləyisərdür güli-dü rəngə, bəgüm.

Gözün bizüm ilə qə cəng eyləsün nola,
Həzar sülh fəda qıluram bu cəngə, bəgüm.

Necəsi düşdi şəhümün bu eşqi şonqarı,
Vücudi-lağər ilə işbu zehni-ləngə, bəgüm.

Gər oldı nola uzun zülfi ilə qüssəvü qəm
Ağızı ilə könül niçə düşdi təngə, bəgüm.

* * *

Neçə-neçə sənün içün oda yanam, çələbi,
Dəm oldımı ki, ləbündən qana qanam, çələbi.

Gözün şərabı ilə çox zəmandur uyıram,
Dəm oldı qəmzən ilə şimdi oyanam, çələbi.

Sana irəli, şəha, sanmamışam ol sanuyı,
Ki özüni göribən səndən usanam, çələbi.



Nə gül ki, gül dəxi nazüklügünə oldı muqir
Əgərçi bülbülünəm eşqünə yanam, çələbi.

Nə əql qoyamü nə canü tən yoluna sənün
Sənün boyan nə isə, an boyanam, çələbi.

* * *

Zülfün xəyali təndə bu canı xəyal edər,
Sevda dimağa irişicək çox xəyal edər.

Canı bənüm yürəgümi qan eyləyə dilər,
Bərgi-səmən yanağı arasında al edər.

İki hilal qaşı, yüzini qılalı bədr,
Günəş yüzi qədümi bənüm çün hilal edər.

Xəmmar gözi içürəli dürdi-dərdini
Dil könül ilə tərki-şərabi-zülal edər.

Mehrab qaşı, gözi imamü xitam misk
Budur ki, qara xalini anda bilal edər.

* * *

Zəhi rüsvayi-eşq oldı, şəha, dil
Zəhi düşdi zənaxda bir çəha dil.

Həvasildur, nigara, köksün ağı
Neçün zülfündürür pərri-əbabil.

Anadil gülşən içrə çağırurlar
Ki, düşmişdür yenə əndər ana dil.

Gözün zülm etdi bənüm könlümə çox,
Ətəgünü əlüm, ey şahi-adil.

Zəlazil qopa aləmdə qaçan ki,
Səba dəprədə zülfündən səlasil.

Bana vəslündürür tiryaqi-əkbər
Bana hicrün durur zəhri-həlahil.

* * *

Kimsə yüzi qaşı tək yüz yazamı,
Qəmzəsi hərgiz yürəgi yazamı?

Kim görürsə növbaharın yüzinün
Meyl edə bu dünyada hiç yazamı?

Beli qıl etdi, canı aldı saçı
Yük düşər bu işdə şol ənbazamı?

Binəvayam, rastivü mübərqa sevərəm,
Ud olıban yanayım şəhnazamı?

Lə'lüni kiççük görür kutəh nəzər
Himməti-ali aza hər azamı?

Bir xıramış qıldı kəbk, oldı xəcil
Yə'ni yolı gösdərür şəhbazamı?

* * *

Səni sevən içün qafa bir cana deməgil,
Şol lə'li-ləbüni sorıban qana deməgil.

Bin oda girürsə ki, sana irməyə olmaz
Hicranum odı gey qatıdur yana deməgil.

Dəlü könüli oğrı gözün eylədi həmbaz
Divanədürür gəlmədi divana deməgil.

Peyman edərəm dəniz edə yaşumı peyman
Əsridi bəni, durmadı peymana, deməgil.

Bir qöncədə gördük iki yaqutı bilürüz,
Bir sərvdə gördüm iki rümmana deməgil.

* * *

Yenə başladı bülbüllər təkəllüm,
Qılurlar gül fəraqından təzəllüm.



Könül əql ilə canı vəsli içün
Qılur təslim qılımaz təsəllüm.

Nola hicrindən anun ölür isəm,
Ki təndən ayru can bulur tə'əllüm.

Yüzün şəm'inə qarşu yanmağı can
Qılur pərvanədən hər dəm tə'əllüm.

Xəyalün eşqinə gözüm yumaram,
Ki düş görməz isəm qılam təhəllüm.

* * *

Könül qıldı yenə şol yara me'rac,
Ki kimsə bulımadı ana minhac.

Müdam olmışdurur bu yürəgüm qan
Xumarı gözinə olalı umac.

Eşigündən səfayı şöylə bulur
Canum ki, mərvədən bulımadı hac.

Çü mümkin olmaya vəslün bu canum
Nə vacibdür ki, ana ola möhtac.

Ləbün bir dəmdə bulur şol səvabı,
Ki susamış suvarur, toyurur ac.

Dilərəm bən piyadə rux ruxuna
Uram şol rəsmə ki, mat ola leclac.

Könülüm qöncəsində bunca sir var,
Ki kəşf etməz anı illa ki, həllac.

* * *

Vəsfi cəmalünün dəgül eylə ki, dildədür,
Bən şərh necə qılam anı ki, dildədür.

Adəmdür ol şah eşigində başı ilə
Zərdü nizarü zar olıban abü gildədür.

Hər günü hər gecə ayü günəş cəhanlara
Toğar və leyk bən nedəyüm bana yıldadur.

Ömrümdürür saçı, anun içün be baddur
Əsirgənüz həyatını anun ki, qıldadur.

Gözün ki, dil dilərsin ana, dil dilər isən,
Dilə demədügində nəzər bil ki, dildədür.

* * *

Cigər fəraqun odından kəbab oldı, kəbab
Yaşuma bax ki, gözümdən şərab oldı, şərab.

İmarət edəli eşqin şarın dimağumda
Könül vilayətinə bax, xərab oldı, xərab.

İçəli eşqin əlindən canum tolu əyağı
Yetürdi əqlivü könli sərab oldı, sərab.

Gözüm içinə xəyalün basa deyü ayağın
Yaşum çü lə'lü yanağum zərab oldı, zərab.

Həvan ilə yüzümün suyını yerə dökdüm,
Tənüm oduna yanuban türab oldı, türab.

* * *

Könüli aldunü candan salam sana, bəgüm,
Dilər isən anı dəxi salam sana, bəgüm.

Müdam lə'li-ləbündən əyağ ələ girməz
Vəleyk xuni-cigərdür müdam sana, bəgüm.

Yüzünlə zülfünə aşiq könül gecə-gündüz
Nə nim ruz fəda mülki-Şam sana, bəgüm.

Çəməndə sərvi ki, azad derlər idi bu dəm
Xilaf yox ki, olupdur qulam sana, bəgüm.

Həlal qılmaz isən vəslüni bana, şaha,
Qılısaram bu cəfayı haram sana, bəgüm.



* * *

Can qədri səhl ola vəli canıdurur, canam,
Sən sanma ol sanuyı ki, bən andan usanam.

İnanmaz oldı bana xəyalini bir gecə,
Yıllar bən ana canü dilü əqli inanam.

Yürək qanına qandı, ləbi nuş der ana,
Gün ola, bən dəxi ləbinün qanına qanam.

Əzəldən əbədə yanayım bən sənün içün
Bən şəm doğüləm ki, yarınam gecə dükənəm.

Gözin görəli uyımışam şimdi qəmzəsi
Acıtdı bəni dilər olamı ki, oyanam.

Baş oynayan yolına ad alur bu dünyada,
Bən canü əqlüm oynayayım ta ki, adanam.

* * *

Gəl ki, qılalum bu gecə tolu qədəhi nuş,
Hərgiz qoymayalum təbəqi ortada sərpuş.

Məstur alalum həzzi nigarun totağından
Qafil olur isə nola məxmur ilə məhşuş.

Gər dəxi kişi sevər isə könül oda sal,
Kim odda gərək qəlb qaçan ki, ola məğşuş.

Bu müşkili kim həl qıla məgər ki, totağun
Sən hüsn ilə aşüftəvü bən eşq ilə mədhuş.

Göz yaşın anunçün dökərəm işbu yüzümə,
Ki ola xəyalün odağı qapusı mərşuş.

* * *

Yürək ləbün ilə, şaha, qanadı, nedəyim,
Qəmzən cigərdə qomadı qan adı, nedəyim.

Bir dəm ləbüm ləbünə irüp halini desə,
Abi-həyata ola ki, qanadı, nedəyim.

Könül quşı nə hal isə irərdi vəslünə
Şimdi yolındı qalmadı qanadı, nedəyim.

Könül qan oldı isə nola gözdürür yolı,
Tapuna irişür isə qan adı, nedəyim.

Qəmzən xəyali dün gecə gəldi bu könlümə,
Yürək xəyalə döymədi, qanadı, nedəyim.

* * *

Bana cənnət dəxi sənsüz nigarına cəhənnəmdür,
Cəhənnəm bana sənünlə buta-firdövsi-ə'zəmdür.

İki bayram ayı qaşun banadur illəti-şadı,
Olardan özgə sevinmək bana bir gün məhərrəmdür.

Cəhanda şadi ilə qəm bana vəslü fəraqundur,
Olardan ayru kimsə yox, və gər bişü və gər kəmdür.

Gözüm yaş içrə qərq olup çü hər nəsnəyi göriməz,
Gözüm çün nəsnə görimaz nigarına bənüm nəmdür.

Mühəyyər qalmışam, şaha, yüzünlə zülfün əlindən
Birisindədürür şadanü birisində matəmdür.

* * *

Razıdurur cahimə anun nazın eşidən
Bülbüli qanda isdəyə avazın eşidən.

Nə gizləmiş bilimezəm ağzı içində ki,
Məcnun olur bu dünyada razın eşidən.

Bir gəz xitab qılsa qulına ki, abdəna
Əncamını bilə idi ağazın eşidən.

Gər bir nəfəs cəhana ləbündən çıxar isə,
Mə'lum eyləyə ki, nəsin azın eşidən.



* * *

Tolu ver əyağı, saqi, susamış canı suvar,
Ol əyaxdan özgə kimdür ki, qəmi bizdən qovar.

Al ayax, ur bir əyax, ver toptolu əlümüzə
Kim canumuz əlümüzdə tolu əyağı sövər.

Gözüm incə belini qalın yağıya uğramış
Sən xu bilürsin bənüm könlümi ki, yağı yasar.

Bir əsiriyəm anun hiç bilməzəm hüsni neçün
Gisusını bölük eyləyübən qoşun yasar.

Bən özin sevərəm ol özgəyi tə'riz ilə,
Ortaya gətüribən neyçün bizə özin qarar.

* * *

Sən bu ərənlər cəm'inə divanə gəl, divanə gəl
Kəndü hesabun anlayup dəftər qılup divana gəl.

Bən canumı yaraxlayup, eşqi ana bindürmişəm,
Var isə atun çapacax, meydana gəl, meydana gəl.

Bir görməgə varlıx deyü qıldı münadı möhtəsəb,
Bazara könlün var isə, dükana gəl, dükana gəl.

Bən əql ilə canü dili zülfün içün oynamışam,
Dinün var isə gör bəni, imana gəl, imana gəl.

Canuma çoxdur yetmişəm, şol canuma yetəm diyü
Sən dəxi, ey can, bu yola ya cana gəl, ya cana gəl.

* * *

Könülüm dərdini, şaha, necə deyəm dil ilə,
Könülüm dərdi bənüm şöylə dəgül kim, dil ilə.

Belüni görəli halüm qatı nazik oldı,
Can yüki ağır olur, ol arada bir qıl ilə.

Düşmişəm silsiləyə zülfün ilə yaşum içün
Həm nəyə yaşum içün müşkilə bu silsilə.

Görəli xalüni qalmadı könülümdə qərar,
Saldı hind elini könülümə bir fülfül ilə.

Canı-canı ola hər kim çəkinə səndən anı
Vəli özgəyi dilərsə, könül ol dil dililə.

* * *

Ta ki, qıldun can güdazı, ey sənəm,
Qomadun könüldə razı, ey sənəm.

Zülfüni görəli eşqə qılmışuz,
Biz duayi-can dirazı, ey sənəm.

Qanum içəli biçildi lə'lünə,
Cübbeyi-cama dirazı, ey sənəm.

Bizciləyin iki görimədi eşq,
Bir şəhidü bir qazi, ey sənəm.

Bən həqiqət eşq odına düşmişəm
Böylə olamı məcazı, ey sənəm.

Bən cigər qanı ilə qüsl edərəm
Ta məgər olam nəmazı, ey sənəm.

Bir könül ki, yoğ ola necə çəkə,
Gah nazı, gah niyazı, ey sənəm.

* * *

Könülüm yar yolına yanasıdur,
Şivəsi tək anun bəhanəsidür.

Zülfi ömrümdürür şükür həqə kim,
Gəlincə gedər dəxi uzanasıdur.



Zülfi çərisi yıxdı könül evin,
Zira ki, gözi xəyl xanəsidür.

Bən usanmayayum cəfasından,
Zira son iş ol usanasıdur.

Qaşları yayü girpügi oxıdur,
Saçıdur damü xali danəsidür.

Bən kənar isdərəm miyanından
Ki, kənarı anun miyanəsidür.

Yanasıdur bu varlığum yolına,
Yanmayacax olursa ya nəsidür.

* * *

Lə'li-ləblərünə, dişlərünə dür deyiməzəm,
Eylə qurdun qaşunı, bir dəxi qur deyiməzəm.

Bən ləbündən sora vardum gözünün xəstəliğin
Canumun sayrulığını ana sor deyiməzəm.

Fitnəsin badi-səbanun, sənəma, zülfün ilə
Aləmi bir-birinə diləsən ur deyiməzəm.

Zülfün ilə gecələr bən necə sevda çəkərəm,
Gündüzin yüzünə qarşu zi səbur deyiməzəm.

Yüzüni görəli bərkidürəm imanı vəli
Haşəlillah, gisularuna küfür deyiməzəm.

* * *

Görün yenə nə yaratmış bu malikül-əmlak,
Ki səcdə qılmış ayağına hur ilə əflak.

Şol müşkü ənbər açavü boyana fərş əgər
Saçını tarar isə şanəsi ilə dəllak.

Bən ana müştəri oldum ki, şəmsi şəmsisidür,
Nə zöhrə ki, dəm ura anda zöhreyi-əflak.

Şəha, ləbün necə məmsuhi-lə'ldür kanı,
Nə gördi, nə görisər hiç dünyada həkkak.

Libasi-eşqi-tura mən be dər bexahəm kərd,
Be həqqi-an ki, bepuşid xil'əti-ləvlak.

* * *

Bu dünlə eşqünün məhi-tabında xoş geçər,
Ol aya can fəda ola ki, bəndə xoş geçər.

Bən hər nəfəs yolına anun xan qoyam nola,
Çün bu könül anun ilə payəndə xoş geçər.

Hər bəndini saçınun bəndə saymazam,
Bən bəndə necəsi sayayum bəndə xoş geçər.

Bən lə'l qəndini sorararn qandasın deyü
Bilməzmiyəm könülümi ki, qanda xoş geçər.

Könül gedərü eşq gəlür, şükr edəm həqə
Könlümdə çün rəvəndəvü ayəndə xoş geçər.

* * *

Tana dəgin bu gecə naləvü fəryad edəlüm,
Necə bir fövt olan ömrümüzi yad edəlüm.

Gözlərümüz yaşını axıdup irmağ edübən
Qeysəriyi dəxi bu yaş ilə Bağdad edəlüm.

Bən Həsən yüzi sevərəm, tanuğum veysi-qaran
Qıssa qıl qissəyi, sun ayağı, dil şad edəlüm.

Bəndə zülfün girehində tutalum bəndə düşər,
Səvüni dəprəd axı bəndəyi azad edəlüm.

Biribi bizə xəyalüni gəlin işbu gecə,
Biz dəxi cəhd edübən könüli damad edəlüm.



* * *

Neçə-neçə könülüm gisusı ilə yedilə,
Neçə-neçə totağı dərdi ilə qan yudilə.

Fəraqı ilə cəhanda çü qıldı xu yürəgüm,
Tamuda dəxi bu gəlməyisərdür ol od ilə.

Cəhanda eşq ilə məşhuramü visalə nə qəm,
Cəhanda işini çün kişi işləyə ad ilə.

Sənün ilə bilişəm özgələri ilə yadam
Niçəsi diriləlüm biliş ilə ya yad ilə.

Diləgüm ol ki, irişəm ayağunun tozına,
Ki dövlət üsdə yilicək adım adəm ad ilə.

* * *

Yad olmışam yenə bu gün biliş ilə, nedəyüm,
Yenə bu ilməlü eşqim ilişilə, nedəyüm.

Bana həvasını verdivü canü dil dilədi,
Çü ba araya gizlədi alış ilə, nedəyüm.

Könül cəfaya qılur də'vivü könül səbrə,
Çü eşq ömri uzundur biliş ilə nedəyüm.

Gözüm ki, göz idi çün seyl axarü yar silər,
Çü bən bu seyl ilə qərqəm siliş ilə nedəyüm.

Əgərçi aşiqi çoxdur, bənüm kibi yoxdur,
Bən anı külli dilərəm ülüş ilə, nedəyüm.

* * *

Can çün yüzüni gördi, yılduzı neylərəm bən,
Dil çün saçunı gördi, gündüzi neylərəm bən.

Saldun oduna bini iksiri-tutiya saç
Mis olmaz isə altun bu sözi neylərəm bən.

Könlüm cadu gözündən işvələrini umar,
Hər dəm yürəkdə tiri-dilduzı neylərəm bən.

Bir nəm dilər könülüm ta əm ola ləbündən,
Hər dəm bu gözdə əşki-xunrizi neylərəm bən.

Hüsnün nə veclə sığar göz səni görməyincə
Hüsnüni görməz isə, bu gözi neylərəm bən.

* * *

Can mülkinə sənün kibi məxdum olmaya,
Baş oynayan eşigünə məhrum olmaya.

Taş ola, bən ana necə dəmür deyə biləm,
Ki eşqün odına sənün ol mum olmaya.

Ərvahi-mülki-şahi tapundır əcəbdürür,
Ki ayağın tozına fəda rum olmaya.

Aşiq ki, yana yoluna haşa ki, məhv ola,
Madih ki, mədh edə səni məzmum olmaya.

Hər kim sabah gözin açup baxa yüzünə,
Bən zamin ana ki, dəxi məğmum olmaya.

Məhrum olmaya ayağun tozına irən,
Səndən irax düşən kişi mərhum olmaya.

* * *

Bu gecə dilbərümün gisısı şəbgir qılur,
Diləgi ol olamı dilləri nəxcir qılur.

Badi-sübhiyi sevərəm ki, yüzünə toxınup
Vəzzüha surəsi mə'nisini tə'bir qılur.

Nazik oldur ki, nə ki, zülfi qulağına deyə
Mübəmü cümləsini könlümə təqrir qılur.



Xətti təhrir dilər ki, edə könülüm bitigin,
Bən də inanımazam zira ki, təzvir qılur.

Varlığı mülki gərək ki, ola fani külli
Kim ki, kəndü özini anun ilə bir qılur.

* * *

Bu gecə sübhə dəgin iş nəğmə ilə meydür,
Könülüm anulmaz isə axır dəvası keydür.

Ol dəm ki, bən bin canı bir sözün içün
Mə'lum ola sana kim yüz hatəm adı Taydur.

Bən ivərəm ki, irəm bir dəm ilərü sana,
Əcəb dəgül bu ucl, çünki əcəl be peydür.

Zərdü nizarü zaram, həm oduna yanaram,
Olamı bu vücudum, şaha, yoluna neydür.

Bən zindəyəm sənünlə barı buna nə minnət,
Çün mürdələr, görürəm ki, sənün ilə həydür.

* * *

Yürəgümi yaraladun bu yarama mərhəm qanı,
Odlara yandurdun bəni, yarun ilə bir nəm qanı?

Təbiətüm sənün içün gör nə nəticələr verür
Bu fikri-bikrümi görüp, hər dəm ana bir dəm qanı?

Gözün yüzün zülfün ilə cümləsi aşiq dəpələr,
Bunda işrət qandadur, zülfündəki matəm qanı?

Hər dəm ləbün qanum içər, səhl ola nuş olsun ana
Gözün bəni caduladı, anun içün əmsəm qanı?

Lə'lün ki, dəmdəm dəm urur, dəm eylədi cigərümi
Ey Məryəmi-İsa nəfəs uş ölürəm, bir dəm qanı?

Cümlədə səni kamil yaratmış ol çələp,
Hüsnü cəmalün gözikür, cövrü cəfada kəm qanı?

Sərvi-rəvanun rasti başın yetürmişdür gögə,
Zülf ayağuna baş qomış anun içün bər xəm qanı?

Yüzünə yetər vəzzühavü zülfünə vəl-leyl tanux
Belünə ki, varlıx verür bir ayəti-möhkəm qanı?

Xalün həcərül-əsvədü bana eşigündür məqam,
Ey basəfa yarum, bənüm gözüm kibi zəmzəm qanı?

* * *

Bən canı nedərəm, vəli canana saxlaram,
Bən əql ilə könülümi şol cana saxlaram.

Mərcan gözüm yaşıdurü yaqut dişlərün,
Yaqut ləblərinə bu mərcanə saxlaram.

Bən gözlərümi görmək içün səni gizlərəm
Qanlu yürəgi şol ləbü dəndana saxlaram.

Hicrün cəfasına döyəməzəm vəleyk bən
Vəslün xəyalini qatı mərdanə saxlaram.

Şahanə nəqşüni bu könül taxtasında bən,
Gər saxlamaz isəm dəxi, şaha, nə saxlaram.

* * *

Nə türkidür bu ahuyi-tartarı, –
Ki, qıldı şəhri miskin zülf tarı.

Ana canlar nədür həqqü'l-qüdumi,
Ana əql ilə dillər ya nisarı.

Görəli gül yüzüni gül həyadan
Ərəq qıldı görün bu şərmsarı.



Bənüm karum çü zar oldı həmişə,
Nişə qılur gözün bu karzarı.

Ləbünlə məstü məxmuram gözünlə,
Yene meygun ləbün yazar xumarı.

Şikarunam, əşha, səni qovaram
Əgərçi özgələr qovar şikarı.

Ləbi İsa ölüyi zində qıldı,
Saçı Musa ki, müşk eylədi marı.

Səba yelinə bənzər əhdi yarun,
Ki bulınmaz anun bir dəm qərarı.

Səba dün gecə vardı eşiginə
Dedi ki, sürünüz bu xaksarı.

* * *

Hər kim ki, tutar sa'idi-simin ilə pəncə,
Sa'idlərini bıraxur əli ilə rəncə.

Cövrün ilə canuma şikəncə nə qılursın,
Yetməzmi könül düşdügi zülfünlə şikəncə.

Ol gəncə ki, bən irdüm anı kim bilisərdür,
İlla, məgər ol kişi ki, irmiş ola gəncə.

Səncə kim ola xud olur isə dəxi belün,
Kim gəlməyisər eşq tərazusına səncə.

Narincə görüb anı təni qıl kibi qıldux,
Bənzümüzi bənzətmişüz uş rəngi-turunca.

Bu ğüncü dəlalə necəsi duyə bu könlüm,
Gülşəndə çü deyimədi birisinə ğöncə.

Çincə kələci bu ki, dilər can ki, ləbünlə
Bir xəlvət ola ki, sora halini içincə.

* * *

Könüldə bən bənün ilə şəhdanə saxlaram,
Canumda bən dişün ilə dürdanə saxlaram.

Sevdası zülfünün gözümə bir xəyl edər, –
Ki, kirpügümi anun içün şanə saxlaram.

Belünlə tən nizarü canum səmridi nola,
Çünki hilal qaşuna qurbana saxlaram.

Yürəkdə şol qanı ki, şəha, düzdi ləblərün
Dərd oldı, leyk bən anı dərmana saxlaram.

Mərdümlik eylədi bu gözüm, dökdi incülər
Toldurdum ətəgümə, ol insana saxlaram.

Yürək kəbab qıldıvü gözüm çəkidə mey
Bana haram, anları mehmana saxlaram.

Eşqün ki, candaduru sirün ki, könüldədür
Şiranə açaram yenə, mərdanə saxlaram.

* * *

Dilarəm bən nigarına ləbündən abi-heyvanı,
Məgər heyvan ola ol ki, diləyə abi-heyvanı.

Gözüm insanı gözündən qatı ögrəndi mərdümlik
Bu dürlər ki, dökər rizan dəgülmi eyni-insanı.

Könül mülkini sər cümlə gözün bir ləhzədə dutdı,
Gözünə dəgməsün gözlər gəl, ey İsgəndəri-sanı.

Şəha, qıl belünə qolum əgər irəydi bir qılca
Ləbün ləbümə yüz bin gəz deyəydi sirri-pinhanı.

Qomaz canumı bu gövdə kim ol canuma qavuşam
Gəl imdi, ey canum canıvü xoşnud ed bu səccanı.



Bana der necə aşiqsin, nədür bu eşq hay-huyı,
Dedüm virbi xəyalüni buyur yağmaya dükkanı.

Yürək bir xoş kəbab etdi, gözüm mey hazir eylədi
Yüzüm düzdi təbəqdə dür ki, yara qıla mehmanı.

* * *

Şol həqqayi-yaqut ki, vəhdətdən urur dəm,
Bir camdurur ki, dəxi görmədi anı Cəm.

Təngi-şəker ol şəkkəri-təng içinə müzmər
Barı gühər ol lə'li-gühərbarına müdğəm.

Dil dəm urmaz, bir nəfəs ol dərd ilə zira
Casusı səba irürür anı ana dər dəm.

Sərkeşligi sərvün nə sürur ilə durur ki,
Qəddi qədəminə beli əflakün olur xəm.

Belündə təzəlzül var idi incəligindən
Barı biribidi ana həm ayəti-möhkəm.

Gəndüm bilürəm ki, yanağundağı qara bən
Şol danə durur ki, verə canın ana adəm.

Lə'lün yüzünə bir nəm içün canum apardı,
Can verəyim ana, der isə necə inanam.

* * *

Ləbün ilə, şəha, oldı şəkər Misirdə kəsad,
Fəridi-eşq olanun sözi necə ola ziyad.

Nigara, eşqün odı yürəgümdə qomadı su,
Savurdı toprağumı, yə'ni hər çi bada bad.

Gərək ki, aləmə ola gözüm yaşı tufan
Nola yıxıldı isə seyli ilə bir Bağdad.

Çü gördi tubi qədün ənbərin saçunı,
Görək ki, oduna ud ola sərv ilə şimşad.

Çəmən əruslarını qulü qaravaş tapuna
Məgər ki, sərv ilə sevsən, qılur isən azad.

* * *

Necəsi tərk edə gişi darın diyar ilə,
Məgər ki, xatirinə anun dərdi-yar ilə.

Şol yar ilə nə qıla gişi ki, fəraqınun
Bir qılı aləmə düşər olursa yarılə.

Mehrabum əldı qaşıvü oldı beli imam,
Qalmadı dildə meyl dəxi karü bar ilə.

Dil möhrəsinə bağladı yol hüsni şeşdəri
Əlqissə, utdı gözləri bizi qumar ilə.

Eşqinə ixtiyar ilə düşdi dəlü könül,
Kimsə salamı özin oda ixtiyar ilə.

Qatlan fəraqı odına kə'bi-həyatı var,
Çox görmişüz bir arada biz verdi xar ilə.

Dök zülfüni yüzünə ki, mö'cizdürür qatı,
Görmək bir arada gişi leyli nəhar ilə.

* * *

Könülüm eşqün odıyla, sənəma, yana gəlür
Verəyim eşqə özümi, görəyim ta nə gəlür.

Əvvəlin nəzrə ki, qıldum yüzünə düşdi bənə,
Adəmün gözinə uçmaxda zirə danə gəlür.

Necəsi küfr deyəyüm, sənəma, zülfünə ki,
Göricək kafir anı sidq ilə imana gəlür.



Nə ki, üşşaq demiş könülümün vəsfidürür,
Qanda irmax var isə, son ucı ümmana gəlür.

Dil kəbab oldıvü yaşum çağıru gözüm cam
Məgər ol yar xəyali bizə mehmana gəlür.

Tən ilə canun işini nə bilür hər mürdə,
Bir könül canına irincə necə cana gəlür.

Dövləti-eşqi əgər irdi bizə dutma əcəb,
Dövlətün yegrəgi hər bisərü samana gəlür.

No əcəb dari-şəfadur, sənəma, lə'li-ləbün
Könülüm uslu varur anavü divanə gəlür.

Diləgüm ilə oduna necəsi yana idüm
İlla, dəlü könülüm bu işə pərvanə gəlür.

* * *

Çü püxtəyəm, bana, saqi, şərabi-xam gətür,
Çü aşıqi-əzəliyəm, məyi-müdam gətür.

Nə gecə bəl ki, nə gündüz yüzini görməyənə
Yüziylə zülfi kibi dəxi sübhü şam gətür.

Qənaətüz saçı qoxusına səbadan anun,
Bənəfşə kibi deməzüz zəban pəyam gətür.

Könül quşını qara ağına gəmişməg içün
Saçıyla xali gibi qanı danə dam gətür.

Fəraqı xəstəsiyəmü dəvam vəsli durur,
Əlinə, saqi, ayax ver ələ'd-dəvam gətür.

* * *

Canisin canuma, leykin sən canumun canısın,
Lə'l kanıdur totağun, sən şəkər dükkanısın.

Eşqdür dinüm bənüm ol sənün ilə rastdur,
Pəs həqiqət baxıcax sən dinümün imanısın.

Ağızundan təngü belündən girandur canumuz,
Nə ki, canlar çəkər isə yoluna ərzanısın.

Can zənəxdanı çəhində özin azıtdı dedüm
Sana nə gəldi, özün aldurmağıl, mehmanısın.

Səndən özgə könülüm taxtında şah oturmaya
Çün bu elün xanısın, sən xanısın, sən xanısın.

Müştəri olmax dilərdi günəş anun eşqinə,
Bax gözi tirinə dedüm bil ki, bir keyvanısın.

Zəhr ilə tiryaki həq cəm eyləmiş bir yerdə gör,
Vəslü fəsl ilə cəfana dərdünə dərmanısın.

Sən qamu insanı eyni olduğun dəgül əcəb,
Bül əcəb oldur ki, sən bu eynümün insanısın.

Bən necə can aparam k'ol həzrətə ola qəbul,
Çün qamu zirələrün sən, ey sənəm, kirmanısın.

* * *

Şaha, könülüm qaşuna peyvəstə dəgülmi,
Saçun girehi ilə canum bəstə dəgülmi?

Zülfün ilə sünbül çəmən içində pərişan
Gülşəndə qızıl gül yüzünə dəstə dəgülmi?

Aşiq əli sərvünə sənün qandı irisər
Dilərsə göçə zülfünə peyvəstə dəgülmi?

Paludə qılur göz yaşını bu inəbidən,
Gözdə gözə-göz kəndüzi nişəstə dəgülmi?

Birlik yoğ isə, ortada bimar gözündən
Gözlərini işbu könülüm xəstə dəgülmi?



Qaşlaruna düşdi könülüm, dəxi yığılmaz
Bir tir ki, ol yaydan ola, cəstə dəgülmi?

Ölmiş tənümə eşqi anun ruh dəgülmi,
Qəmzəsi ilə dil dəxi məcruh dəgülmi?

Eşqiylə quşandı könülüm yolına anun,
Eşq ilə qaxılan qapu məftuh dəgülmi?

Kirpügi nə qılduğını sən sanma müəmma
Könlümdə anun yarası məşruh dəgülmi?

Bin yılda əgər Nuh yaşadı isə bin yaş
Ol yaş bana bir ləhzədə məmnuh dəgülmi?

Mə'şuq ilə aşiq bir olur eşq odı ilə
Madih dəxi bəs həm yenə məmduh dəgülmi?

* * *

Bu mürdə tənə sənciləyin ruh ələ girsə,
Könlüm kibi gözlərünə məcruh ələ girsə.

Səbr ilə şükür qılmağa bu hicrü vüsalə,
Bu dünyada Əyyub və ya Nuh ələ girsə.

Məxtumdurur ləblərünün püstəsi, şaha,
Ol badə bənüm canuma məftuh ələ girsə.

Mətnündə sənün gisularun oldı müqəyyəd,
Hüsnün, sənəma, aşiqə məşruh ələ girsə.

Bir ruh nə yetsün, sənəma, gözün oxına
Hər ləhzədə ol oxlara bin ruh ələ girsə.

* * *

Əqldür divanəvü aqil könül,
Yüz göz ilə sana verdi dil könül.

Bir qıl əksük görmədi hüsnündə hiç
Gəzdi başdan-ayağa qıl-qıl könül.

Könlün içün baxmadı göz günəşə,
Sən dəxi bax könülümə bil könül.

Dil dilin faş ola deyü söyləməz,
Yeni təsnif eylədi bir dil könül.

Rastdur sərvi, müxalif olmağıl,
Ol günəşdən olma sən mayil, könül.

Zülfi sehri gözi dəgmişdür sana,
Qollarından bir həmayil qıl könül.

Gər zənəxdanında dutar bin məqam
Olma zülfindən anun zayil könül.

Andan ayru olmamışsın bir nəfəs
Nə axıdursın dəmi-sayil könül.

Qo bizi bizəvü çıxgil aradan,
Şimdi sənsin ortada hayil könül.

Eşqi odı canı irürdi ana,
Qancaru ki, dilər isən, yil könül.

* * *

Qatlanımaz bu könülüm dilbərinün fəraqına,
Könül əgər olur isə, yerü gögün iraqına.

İki hərəm nə nəsnədür səhl ola bu yedi fələk
Gər binür isə könülüm himmətinün Buraqına.

Bax qəraqına gözinün neçə qəraqladı bəni
De günəşə ki, tiğini qata gecə qəraqına.



Oldı hilal bu tənüm qaşlarınun qıranına,
Şimdi neçə döyə könül günəşi ehtiraqına.

Eşigüni qılam məqam gözumi zəmzəm eyləyəm,
Ta ki, hicazına irəm, salam özüm İraqına.

* * *

Dilbəra, onılmadı könlümdə qəmzən yarası,
Bulmadunmı xüftə gözdən ayru dil oyarası.

Zülfünə dedüm açıl ki, xalüni görsün gözüm,
Dərlədi yüzi həyadan, dedi ki, yüz qarası.

Ərzə qıldum könlümi zülfinə dedi bu nədür,
Dedi ki, canum dəgüldür, illa canum parəsi.

Aşiqü mə'şuq arası səhl ola ixlas ilə,
Könülə cayiz dəgüldür aralıxda arası.

Can sanurdum lə'lini, könlümə sordum bu nədür,
Aşiqü miskin dedüm gisularun biçarəsi.

* * *

Könül lə'lün ilə qana boyandı,
Gözün ilə uyır idi oyandı.

Əsir etdün könüli dəpələmə,
Ki lütfün işvələrinə inandı.

Xəlayiq andıdur müshəf həqiyçün
Sənün eşqinədür könülüm andı.

Usanmax səndən asan olmaya ki,
Tapundan usanan candan usandı.

Dəgülmi aşiqün imanı mə'şuq,
Usanursa imanı yoğa sandı.

Əsirəm yüz göz ilə eşigində
Nə lazım boynuma taxar kəməndi?

Əmərsə tifli can nola ləbündən
Zəmanlardur ki, eşq ilə əməndi.

* * *

Ey neçə yaxa sənünlə çakdür,
Şadiman ol ki, sana dəllakdür.

Dəniz olmışdur yaşumdan bu zəmin,
Ahum odı dud bər əflakdür.

Boyun içində belün toğaru bədr
Xaric əz mahiyyətə idrakdür.

Bəllü bildum ki, nəzər əhli qanıu
Ağızunun nöqtəsində xakdür.

Bən səni sevdügümi könlün bilür,
Çün könüllər arıyı şəbbakdür.

Sərv qəddün sərvə qılur sərzəniş
Kim ki, toğrudur bəli bibakdür.

Od içinə eşqün odı od salar,
Yel həvan ilə sənün çalakdür.

Su rəvanın tapuna qılur rəvan,
Xak düşmən gözinə xaşakdür.

Mö'cizi-əhyayi-mövti səndədür
Gər Məhəmməd sahibi-ləvlakdür.

* * *

Oxuna uğrayan könül səlamətdür, səlamətdür,
Tapundan ayru keçən dəm nədamətdür, nədamətdür.

Yürək başlu, gözi yaşlu od ilə su arasında
Cəhanda səni sevənlər məlamətdür, məlamətdür.



Salınup bağa girürsən xəzandan qurıyan ağac
Bəşarət gətürə çiçək qiyamətdür, qiyamətdür.

Ümidüm saçuna uzun vəli eyşüm ləbündən tar,
Həyatum tatlu, ömr uzun kəramətdür, kəramətdür.

Güman etmə ki, tək tənha yanaram eşqin odına
Ki, tənhayi-cəhan cümlə təmamətdür, təmamətdür.

* * *

Axşamın vardum saçuna göz görə,
Söyləyiməzəm yüzüni yüz görə.

Sən var ikən hur görməz gözlərüm,
Göz günəş görməyicək yılduz görə.

Göz yüzin tək görimeyə yüz dəxi,
Özgələrün yüzi kibi yüz görə.

Eşqümün vəsfini hər dilsüz deyə,
Yüzünün hüsnini hər gözsüz görə.

Zülfün ilə key pərişan çak ola,
Şol ki, səni özgə ilə düz görə.

* * *

Eşqindən anun bu könülüm olmadı xali,
Andan bərü ki, gördi gözüm olmadı xali.

Al ilə yanağı yaşumı dəxi edər al
Göz ki, nə ləlalı dökər ol ali-ləlali.

Beli qılı iki yararu nöqteyi-lütfi,
Kim görmiş ola buncılayın qil ilə qali.

Eşqini kəmalə gərək irürə bu könlüm,
Çün gördi bu gün yarı cəmal ilə kəmali.

Eşqə nə yüzüm ilə gözümdən tanuğ istər,
Dali qədümüz eşqinə olmayamı dali.

Fərrux ruxunı kim ki, sabahın görür isə
Mal ola ədusıvü mübarək ola hali.

Əli ucı ilə gösdərür isə yədi-beyza,
Dəstan ilə biçarə qılur Rüstəmü Zali.

Qəd qaşı içün olsa hilali n'ola olur,
Bədr ay dəxidür əksəri-əyyam hilali.

Hüsn ilə, şəha, övcə çıxalı bu cəmalün
İrişdi günəşə dəxi aləmdə zəvali.

* * *

Lütf edübən bizi bu gün, sənəma,
Şol eşikdən bizi irax sanma.

Qan derəm ləblərünə dil qanımaz
Kim deyü bilə könülə qanma.

Dilü əql ilə cana bir busə
Dilədüm ləbləri dedi nə nəmə.

Can fəda qıldı dil dedüm neyiçün
Dedi sayru məgər irişə əmə.

Ola ki, bitürə yemişini eşq
Çün irürdi yaşum nəmini nəmə.

* * *

Yüzün özini gösdərəli əndər ayinə
Rövşən qılur zəmirini dayim hər ayinə.

Lə'li-ləbiylə dür dişini kəndüdə görüp,
Təkyə qılur xəyali ilə bər zər ayinə.



Bin gəz görür nigarıvü könlində saxlamaz,
Bənzər ki, sadə dil durur ol kafər ayinə.

Pulad zəngi ay yüzünə qarşu turmasun
Həm afitab ola yüzünə dərxur ayinə.

Görməgə hüsnini əgər ayinə diləyə,
Günəş gələ sərayına əndər sər ayinə.

* * *

Gözün yaşı şərabü yürəgi kəbab edər,
Lə'lün təbibi xəstə könülə cəvab edər.

Ayru geçən ömürümi hiçə sayar könül,
Qaçan ki, assı ilə ziyanın hesab edər.

Hərçənd xabi düşdə dəxi görmədi gözüm,
Çünki xəyalüni diləyə əzmi-xab edər.

Tizabi hicrünə bu nə xasiyyət ola kim,
Göz yaşını qanü cigərüm qanın ab edər.

Zülfün çinini gösdərəli ahuyi-tatar
Mülki-xətada göbəgini müşgi-nab edər.

Gəncini gizlədi könülümdə, şəha, ləbün
Dilər ki, sirr edə anı şimdi xərab edər.

Cana ki, sən əzab edəsin rəhmət ola ol
Sənsüz bu hicr canına yüz bin əzab edər.

* * *

Can vermişəm bən yoluna ta bir zəman can vermişəm,
Dərdün ki can dərdi idi, dərdünə dərman vermişəm.

Dünyayı yaşum su qılup gözətmişəm qaşun yasın,
Nagəh ki, düş oldı gözüm, canumı qurban vermişəm.

Bir dəm ki dəm verdi ləbün canuma ölmiş mə'niyə
Bu nəzm tonın geydürüp, tazə-yeni can vermişəm.

Yusif oturdı taxtına, işbu könül şəhrində pəs
Divə, pəriyə bən dəxi möhri-Süleyman vermişəm.

İrmax ki, ırmağa yarar, nə baxşı var bizüm ilə,
Gözüm ilə hər dənizə bir bəhri-ümman vermişəm.

* * *

Şəha, nazik tənün bir cana bənzər,
Əgər cövr edəsin ehsana bənzər.

Zəlixadur tapun, Yusif canumdur,
Zənəxdanun çəhi-zindana bənzər.

Xəyalün könülümdə oldı möhkəm,
Dəxi getməgi yox, imana bənzər.

Şikəstə görürəm, şaha, saçunı
Pərişan eyləmişdür şanə, bənzər.

Bəni divanə deyü gisuları
Aparur bağlu ol divana bənzər.

Xəyali qomadı əqlü dilü can,
Həramidür, vəli mehmana bənzər.

Dükan açmış ləbün aluru verməz
Ziyan olsun həmişə kana bənzər.

* * *

Hüsnün təravəti, ey bəgüm, yaza bənzəməz
Qəmzəsi gözünün cigəri yaza bənzəməz.

Avazə düşdi kim yanıban yardan ırmışam
Qaplan ki, ac ola, bəgüm, avaza bənzəməz.



Sultan olursa aşiqi, mə'şuqa quldurur
Mahmud kibr edər isə, Ayaza bənzəməz.

Belün xəyalimi ya xəyalün xəyalimi,
Sirmidür ağızun, sənəma, raza bənzəməz.

Nəqqaş çox gələ, sənəma, leyk hüsnüni
Can dildə nəqş qılduğını yaza, bənzəməz.

Hər bir kirişməsi gözünün bəni dəpələr,
Nazun əzabdur, sənəma, naza bənzəməz.

* * *

Pür müşg edəlüm zülfün ilə şamı bu gecə,
Ələ alalum lə'li-mey aşamı bu gecə.

Dildən geçəlüm, ram olayım cövrinə yarun,
Gər bulur isəm yari-dilaramı bu gecə.

Ol dövlət ələ girəmi ki, sərxoş olam bən,
Yar püxtə içübən duta yaxamı bu gecə.

Zülfünə yeridür ki, səba qıla pərişan,
Küfr ilə dilər büriyə islamı bu gecə.

Bu gecə ki, həq qıldı bizə vəslini ruzi,
Ey sübh, nola qılmasan ibramı bu gecə.

Söhbət xoşü xəlvət bizəvü yar müsahib,
Saqi, nə turursın, tolu ver camı bu gecə.

Lə'lün əgər əlümə girürsə sorısaram,
Ki nə olısar eşq sərəncamı bu gecə.

* * *

Əgər aşiq səhər ki, ata ahın,
Gərək ki, ol oxa döyməyə ahın.

Nə lazım zülfi çərisin yasamax,
Çü bir badi-səba bozar sipahın.

Kəmər bağlandı ney-şəkkər qədiyçün
Səmən şövqindən əgri qur külahın.

Qorarı yox xəyalinün gözümdə
Çü sevda eyləmişdür təkyəgahın.

* * *

Nizamı nəzmümün vardur, şəha, dürri-səminündən,
Başum gögə yetər ana irərsə toz zəminündən.

Kəmanun oxına könül hədəf qıldum fəda olsun,
Hənuz imin olımazam gümanum var kəminündən.

Qolunı sunğıl əlümə müqəllət andı içəlüm,
Ki dutalı sənün əlüni dönmədüm yəminündən.

Həva bəndə, könül səndə zəmanlardur əmanətdür,
Əmanət hoqqi nə gördük ki, içəydük əminündən.

Nə halətdür ki, yanaram oda lə'lün nəmi içün
Saçun kibi qıla döndüm, nigara, yasəminündən.

Könülüm halini sordum tətağundan, həmindür der,
Həmin bunı eşitmişəm gedəli ol həminündən.

Rəvamıdur ki, şad olur ləbün bir qara xəbərdən
Ki der qulağuna zülfün həvadari-qəminündən.

* * *

Müşg ilə anun saçı qılı riştə dəgülmi,
Kafur ilə güldən təni bisriştə dəgülmi?

Hicri banavü cövri canuma necə qılur,
Bizi yaradan Tanrı əcəb iştə dəgülmi?



Məxmur gözi bağrumı şeşlər, nə rəvadur,
Eşq odına yürək barı şeştə dəgülmi?

Əzəldə ləbün dişləmişəm ballü bilürsin,
Şimdiyə dəgin dadı anun diştə dəgülmi?

Eylə dəgüləm ki, səri ariyyə severəm,
Canumda məhəbbət toxumı kiştə dəgülmi?

* * *

Hər gecə sübhə dəgin zarü nizaram çü şəm,
Yaşum ilə yüzümə eşqi yazaram çü şəm.

Şəminə pərvanəyəm leyk həvəsi ilə
İşbu zəif gövdədə həbsi-fənaram çü şəm.

Narı bənüm könlümə nurdurur, od dəgül,
Gərçi ki, hicri ilə şimdi sararam çü şəm.

Ayru düşəldən bəri tatlu yarumdan bənüm
Fürqətinün odına gör nə yanaram çü şəm.

Gərçi ki, eşqin sənün bu canumı əridür,
Eşqün odı yolına yoğ ilə varam çü şəm.

Bülbüliyəm dilbərün həm güli yaranların
Leyk bu rövşən durur k'oğrıya xaram çü şəm.

Eşqüni avlamışam əql ilə canum verüp
Ol odı ki, avladum ana şikaram çü şəm.

* * *

Gərək bu gecə tana dəgin yanasın, ey şəm,
Pərvanəsüz olmaya ki, dükənəsin, ey şəm.

Saz eylədilər sözi bu dəm cümleyi-üşşaq
Olmaya ki, sər ortada usanasın, ey şəm.

Eşq əhli qaçan ki, yana qan dökə gözindən,
Sən nola yüzündən əgər utanasın, ey şəm.

Sən zində ikən özüni çün mürdə sanasın
Pərvanəyə pəs nə sanular sanasın, ey şəm.

Yar şəminə ta kim yana pərvanəsifət can,
Gərək yanasın bu gecə pərvanəsin, ey şəm.

Göydüm şuna dogin ki, qamu xalq oyandı,
Şimdi dəmidür ki, gərək oyanasın, ey şəm.

Bən oda yanaram ki, dəxi yanmamışam hiç,
Sən nola əgər bu iş içün yanasın, ey şəm.

Bən yanıbanun göz yaşını dökəli dayim
Sən dəxi bənüm işümə imrənəsin, ey şəm.

* * *

Bu eşqə yar ilə əğyar döyiməz,
Bu yolda düzd ilə tərrar döyiməz.

Çü bağun yemişi bu kuydadur ah,
Buna bağ issi dəh salar, döyiməz.

Çü sən gisularunı tağıdasın,
Yüzə-yüz ləşkəri-cərrar döyiməz.

Saçun qıyalı hər bir tarını mar
Anun həmləsinə tatar döyiməz.

Könül əfgarı döyməz hüsnünüzə,
Tənüm zarü canum əfgar döyiməz.

* * *

Dilbər yenə yüz naz ilə bir naz ələ aldı,
Könül avına varmağa şəhbaz ələ aldı.



Saqi, tolu ver əyağı çünki əlün irər,
Mütrib yenə bir pərdeyi-dəmsaz ələ aldı.

Şaha, bu vücudun əcəba necə hərirdür,
Nə taciranı gördi, nə bəzzaz ələ aldı.

İvməz könülüm necə gərək isə cəfa qıl
Din nurı cəhanı hələ az-az ələ aldı.

Qəddün ilə dil sözi diraz edə dilərdi,
Diş qısdı ağızun hələ icazə ələ aldı.

Bən gizlər idüm eşqimi əğyar gözindən,
Nagəh sirümi qəmzeyi-qəmmaz ələ aldı.

* * *

Bıraxdı sənəm zülfi bizi bəndə, nedəlüm,
Bıraxmış ola necə dəxi bəndə, nedəlüm.

Qomaz bəni eşiginə ki, görməyə kişi
Bən xud görürəm kəndüzini bəndə, nedəlüm.

Dəgül kibi gər ağlar isəm səbəbi çoxdur,
Qöncə kibi bülbül yüzinə xəndə, nedəlüm.

Qanda olısar lə'li-ləbi tək şəkər-qənd,
Hazır şəkərün nisbətini qəndə nedəlüm.

Türvəndə yemiş verdi anun eşqi könüldə
Hüsni dəxi gəldi gözə türvəndə nedəlüm.

* * *

Gözlərüm kibi, şəha, düşməmiş ola gözə göz,
Könülüm kibi gözə düşməmiş ola gözə-göz.

Gözə göz düşmiş ola leyk yaş irmağı ilə
Kimsənün gözi gözə düşməmiş ola gözə-göz.

Yar gözi könülə gər düşər isə adətidür,
Dil könül ilə gözə düşməmiş ola gözə-göz.

Gözlərüm gözlər axıtdıvü könül yaxdı gözi,
Gözü könül bu işə düşməmiş ola gözə-göz.

Gözlərüm badə füruşü gözidür badəpərəst,
Böyləmə içkiciyə düşməmiş ola gözə-göz.

Qəmzəsini cigəri boyana dilər yürəgüm
Çü dəxi ox yürəgə düşməmiş ola gözə-göz.

Gözi gözümə, gözü könlümə həm göz bıraxur,
Bir göz iki göz edə, düşməmiş ola gözə-göz.

* * *

Bən məst olamü nigar məstur,
Bu dünya qalamı böylə mə'mur.

Nola qədəmini qılsa rəncə,
Ta bula səvabı yadı rəncur.

Yaşum çü şərabü gözləri məst
Gözləri xumarü bəndə məxmur.

Ol hüsni ilə cəhanda mə'ruf,
Bən eşqum ilə zəmanda məşhur.

Zülfi çərisində bin Cüneydün
Bizüm ilədür bu işi Mənsur.

Ta qıla könülümüzi miskin,
Gisularına yazıldı mənşur.

Bilündə qıl oldum isə nola,
Görmədimi Musa nuri dər Tur.



* * *

Nigara, eşq bünyadı keşişdür,
Bu yolda əql dəxi bir keşişdür.

Əsər badi-şimali, anla sözin
Nə der aşiqə, mə'şuqın irişdür.

Sivişür hər yil, eylər on gün-on gün
Bəni mə'şuqədən yana sivişdür.

İki xurma talı bir-biriylə
Sevişdilər, ey bağ issi, qoşdur.

Səbayı sünbülə, bülbüli gülə
Qoşan birini-birinə yaraşdur.

Könül oldı pərakəndə saçunçün
Pərakəndə qoma bizi dirişdür.

* * *

Bənəm sənün yolunda şeyxi-Sən'an,
Dilərsən gösdərəyim şimdi bürhan.

Cəhanda dərdü həm dərman yenə son
Səni sevdüm, səni sevdüm fil-əkvan.

Mə'anidə bənüm tək görmədün sən,
Cəhanda görmədüm sən tək dər ə'yan.

Dedüm hənnanü mənnan bunca gecə, –
Ki, hənnan oldı hicrü vəsl mənnan.

Gözün oğurlayıcax canumuzı
Könül oyanuğ idi, əql vəsnan.

Səgirtdi gözlərün bu könülümə
Dedüm, məstan, dedi ki, gəldi məstan.

Dedi dil eşq ilə rəstəm, nə rəstəm,
Vəli sa'idlərün eylədi dəstan.

* * *

Sən kəklig isən, bən dəxi şəhbazam, əfəndi,
Zülfün qılmun üsdinə canbazam, əfəndi.

Meygun ləbün ilə, sənəma, əsrücəgəm bən
Anunla xumarumı gərək yazam, əfəndi.

Miskin könülüm neyləyə müşgin gisusında
Əlümi əgər tutmaz isən, azam, əfəndi.

Səndən dilərəm ki, dilədügüm bənüm ola,
Sən sanma ki, ol yazuğı bən yazam, əfəndi.

Zülfün çərisinün çoğına qılma, şəha, fəxr
Nola tutalum anda ki, bən azam, əfəndi.

* * *

Şol dilbəri-simin təni gör ruh dəgülmi,
Könül gözi oxı ilə məcruh dəgülmi?

Mahiyyəti-hüsn ilə cəmalinə baxıcax
Yüzində anun cümləsi məşruh dəgülmi?

Çox qaxmış ola kişi məhəbbət qapusını
İşbu qapuda cümləsi məftuh dəgülmi?

Gər fil isə, mat ola gərək şəh ruxı ilə,
Canum pəs anun yolına mətruh dəgülmi?

Bu cövr ki, bən çəkərəm uzun gecələrdə,
Əyyub canum gisuları Nuh dəgülmi?

* * *

Gözüm qılur ləbündən bir hikayət,
Ki hüsnündür cəhan içində ayət.

Bidayət hüsnə kim nə bilə kimdən
Vəli təhqiq tapundur nəhayət.



Ləbündən könülümə gözdən gözümə
Qılıpdur qanü sərxoşlıq sirayət.

Cəmalün qayətidür hüsnün, ey dost,
Anunçün şe'rümüz irdi beğayət.

Ləbün fitva verür qana, nigara,
Ağız-ağız qıluram uş rəvayət.

* * *

Ah edər isəm, ah ki, ahumı eşitməz
Sən sanmağil, ey dost ki, bu ah iş etməz.

Vəqti-səhər ahum yetər ol yerlərə kim ox
Atıcı əlindən qatı yaydan ana yetməz.

Eşqi odı necəsi yaxar könli əcəb ki,
Şö'ləsini gizlərü tütünini tütiməz.

Əqlü dil ilə canü tənüm ana fədadur,
Yarun yolına hər nə ki, gedər isə yitməz.

Bən bir nəzərinə verürəm iki cəhanı
Nə qılayum ol zöhrə bu müştəriyə satmaz.

Bən könülümi qalxan dutaram qəmzələrinə
Qalxanı gidərməzəmü ol oxını atmaz.

Bən ömrini uzun dilərəm, gisusını ol
Ömrüm idügin bildi əcəb neyçün uzatmaz.

* * *

Nə qılduğın cigər əgər deyə ləbün ləbümə,
Susaya deyiməyə, bənzəyə ləbün ləbümə.

Ləbünə susamışam, sorаram dəvası nədür,
Qaxıya keyisəvü susaya ləbün ləbümə.

Ləbünə can qomışamu umaram andan ki,
Həzar canu diliylə qoya ləbün ləbümə.

Anı ki, sordı şəkərdən, şəha, ləbün bu gecə
Soraram anı gərək ki, deyə ləbün ləbümə.

Ləbün qanuma suşamışdururu qanına bən,
Çü cins imiş ya neçün pəs qıya ləbün ləbümə.

Ləbüm ləbünə uyar sorduğını gizləyiməz
Vəli qərəz budurur ki, uya ləbün ləbümə.

Zəmin təngü zəmanı uzun məqam gərək
Ağız-ağız ki, sirin söyləyə ləbün ləbümə.

* * *

Nişani-eşq nədür o! ki, binişan olasın,
Vücud içində ağızı kibi güman olasın.

Cəmal pərdəsi içində sirrün alur can,
Vədai-cana əgər nagəhin əyan olasın.

Həzar şəhri-məlahət ola yüzündə sənün
Olamı ki, bu cəhan içrə bir cəhan olasın.

Çü lə'l kanını kimsə cəhanda gördügi yox,
Ləbüni sorduğum oldur olamı kan olasın.

Ağızına baxu gözümi görgil, ey qəvvas,
Becid dəgül ki, varup qərqeyi-ümman olasın.

Diləgün ol isə ki, dökəsin bənüm yaşumı,
Bənüm iradətüm oldur ki, kamran olasın.

Özümdən azmışamu özümi bulımazam,
Bu eşqə diləgüm oldur ki, tərcüman olasın.

Bu tən ki səndədürür, lütfinə baxa dururam,
Rəva durur ki, bənüm bu tənümə can olasın.



* * *

Yaz oldı ki, günəş toğısar bürci-həməldən,
Ver tolu əyax, bilməyəlüm cami cəməldən.

Bən çağır əyağın içərəm, məst gözi qan,
Tutma əcəb anı, zira üsdindür əl-əldən.

Budur əməlüm ki, ləbini əm deyə bana,
Hiç bulmadum ol əməli andan əməldən.

Bu gözlərümün seylini zülfi ilə sildi,
İrmağı dəniz eylədi, taşurdı siləldən.

Məcnun kibi eşqi odına atdum özümi,
Əqli olamı eşq ərinün xali zələldən.

* * *

Nəsim irdi yenə bizə səbadan,
Ki üryan etdi dəstarü qəbadan.

Bizə qəmzən oxı bin mərhəmündür,
Bizə yig-sögməgün bin mərhəbadan.

Gözüm ilə gözün toymayısarmı,
Nigarına əcəb bu xunabadan.

Qaçan can aparısardur bu könül,
Ki yandı yara yari-dilrübadan.

Gözün könüli qəmzə ilə dələr,
Göhər dəlinə qalamı bəhadan.

* * *

Nə sərvər xubsın, can ki, canun sürurı var,
Nə günəşsin ki, günəşün cəmalün ilə nurı var.

Başun içün ki, hurinün tapundan hiç fərqi yox,
Məgər işbu qədər ancax ki, hurinün qüsurı var.

Şəha, zülfündə canların sağışın kimsənə bilməz,
Həzaran can asılmuşdur nə yerdə kim güsun var.

Şəha, məstanə gözlərün içicək qanum əyağın,
Könülüm şöylə məxmurdur ki, canumdan buxuri var.

Saçun ənbərdürür, şaha, vəleykin qatı bərhəmdür,
Ləbün şəkkərdürür, şəha, vəleykin türfə şuri var.

* * *

Rah gətür, rah gətür, rah fərəhlər arturur,
Hər qədəhi ki içərüz, gözi qədəhlər arturur.

Zülfün ilə cəmalüni buriyəsin rəvamıdur,
Günəşə bulıd gəlicək cana tərəhlər arturur.

Ləbləri nəməkindürür, həm nəməkin gözüm yaşı
Qanda məlamət olsa həm lütfü miləhlər arturur.

Qıldı xəta gözi anün çin könülümdə cşqini,
Bu necəsi xəta durur ki, dilə səhlər arturur.

Şəkkəri lə'lü dürdürür ləblərün ilə dişlərün,
Lə'lü düri şəkkərə qat, zira fərəhlər arturur.

* * *

Qəmzəsi ox urur cana ki, qanı gözikməz,
Bən ox derəm ol oxa, vəli qanı gözikməz.

Kömür kibi yandum hələ ol cövhəriyiçün,
Bən razıyam ol oda, vəli kanı gözikməz.

Kim aşiq isə eşqi dənizinə girəlüm,
Dinini biliməzəmü imanı gözikməz.

Zülfində könül gidi qaranluğa miskin
Aydınlığı qu, şərbəti-heyvanı gözikməz.

Eşqində anun anca ola bidilü şeyda,
K'ol ortada hiç Əhmədi-heyranı gözikməz.



* * *

Gisusından bizə nəsim gərək,
Andan ayru nə zər, nə sim gərək.

Andan ayru bizə nə'im cahim,
Anun ilə tamu nə'im gərək.

Nə sin olur ki, mim sin gizlü,
Ləblərindən bizə nəmim gərək.

Ləbi mey, gözi saqi, şəm yüzi,
Yenə özi bizə nədim gərək.

Nola zülfiylə tağıdır isə can,
Zənaxında könül muqim gərək.

Tur Turına Musa kibi girən
Yar ilə dəmbədəm kəlim gərək.

* * *

Neçə qapunda canuma bidad dad ola,
Könüldə gözlərün ilə fəryad yad ola.

Sərvünə canı su kibi şöylə rəvan edər,
Kim anı görə bağçədə şimşad şad ola.

Gərək ki, qul olan ana şah ola ayruğa,
Bu bəndəzadə kibi çü azad zad ola.

Bən xaki od ilə su içində tolaşmışam,
Zülfüni qoymazam ziravü ziyad yad ola.

Könlümdə ləffü nəşr qılur zülfi dilbərün
Gözi çü qıldı sən'əti-irsad sad ola.

* * *

Şaha, qəni cəmalünə dərvişdür könül,
Əlmas qəmzələr ilə dilrişdür könül.

Necə təməkkünün ilə sakin isə canum,
Zülfün qımıldusı ilə təşvişdür könül.

Üzdi özini xu başdanü bağladı bana,
Dəgmə suçına qalma ki, bixişdür könül.

Çox yığdı əqlü şər yüzündən bu gözümi,
İlla ki, gördi hər nə ki, dər pişdür könül.

Günəş yüzi içün saçı təkdür günüm gecə,
Şol nuşi-ləbləri ilə pür nişdür könül.

* * *

İşbu cigər kibi şaha ki, qərq qandadur,
Sorar isəm deyəmi ləbündən ki, qandadur.

Bəndə gərək ki, can tapuna qullığ eyləyə, –
Ki bəndələr deyə ana ki, bin bəndə bəndədür.

Ol qanda isə qəndinə bən toyaram anun
Şol dəm ki, özgələr deyə ki, dost qandadur.

Ölü gərək ki, dirilə ağzun dəmi ilə,
Şükranə şimdi halə ki, bu bəndə zindədür.

Biz gördük ol cəmali yüzündə ki, rəşk edər,
Görmədügiyçün anı Zəlixa ki, sindədür.

* * *

Canum ləbinə irdi irincə ləbinə can
Döndi suya qanumü yürəcügüm oldı qan.

İnanmaz idi gözləri könlüm odına, leyk
Qan yaş ilə saru bəniz axar yetər nişan.

Götürdi piçəsinü atar qəmzəsi oxın,
Yə'ni atar oxınıvü pinhan qılur kəman.



Hindu gözün çü çərx oxını düzdi cana de,
Ki bir dəxi yüzünə baxınca verə aman.

Gözün qomadı hiç bir əhli-dilə könül,
Şəh çünki məst ola necə mə'mur ola cəhan.

* * *

Nigar eşqidürür qüvvəti bənüm dəmimün,
Məhəbbəti ilə oldı səfası batinimün.

Vüsalı günlərinün şükrin edimədüm isə,
Fəraq ilə çəkərəm uş cəzasını qanumun.

Canum saçun ilə şöylədürür ki, ölür isəm,
Gərək ki, sünbülü reyhan ola otı sinümün.

Könüli çin ola dərdüm anun cəfasıyla
Həvaya döyimədügüm xətasıdur cinümün.

Mələklərün olur ayinivü bənüm ol ki,
Baş oynamax yolınadur kəmini ayinümün.

* * *

Bən bir otam ki, hiç bəni əttar bilmədi,
Şol süciyəm ki, zövqümi xəmmar bilmədi.

Sübhə dəgin xəyalün ilə bu uzun gecə
Bir söhbət eylədüm, k'anı dəyyar bilmədi.

İqrar qılmışuz tapuna can ilə dili,
Də'vim içində hiç kişi inkar bilmədi.

Lütfün dilər imarət edə könülüm evini
Anca xərabı var, k'anı me'mar bilmədi.

Bimar şöyləyəm gözin ilə ki, dərdünə
Lə'lündən özgə hiç kişi timar bilmədi.

Bazarilər necə bilə eşqimlə hüsnüni
Sərraf anı tanımadı, mismar bilmədi.

Bən şol mübərqə'ə hələ şöylə müheyyirəm,
Ki ol nühüftə sirrümi ədvar bilmədi.

* * *

Dəryayi-məhəbbətdə qaçan ki, qopa əmvac,
Səhl ola əgər ol arada qərq ola əfvac.

Şol iki rüxiylə könüli şöylə apardı,
Ki heyrətlə qaldı anun oyni ilə ləclac.

Şol dəm ki, xəyalün gələ həccüm bənüm oldur
İrərsəm ayağın tozına ol bana me'rac.

Zülfündə anun düzdi səba şol girchi kim,
Toxımaya bir girehini dünyada nəssac.

Şuna ki, güli sən olasın, neyləyə bülbül,
Tutisi tapun olana nə söyləyə dürrac.

* * *

Könüldə səlamı əksük olmaz,
Lə'lində müdamı əksük olmaz.

Öylə qalamı əcəb bilinməz
Şol sübh ki, şamı əksük olmaz.

Qapdı könülümi gisuları
Ol beldə həramı əksük olmaz.

Mehrab qaşına uydı könlüm,
Çün anda imamı əksük olmaz.

Gər irağ iə könül yolından
Bənümlə kəlamı əksük olmaz.



* * *

Əya könüldə gözümdən irax sana səlam,
Nə şahsın ki, bənüm tək həzar sana qulam.

Gözümdə qanlu yaşü könülümdə xuni-cigər
Gözün içün toludurur bu iki şişə müdam.

Boyun xəyali gözümdən qaçan gedə çünki
Kənari-abda qılur şəmişə sərv məqam.

Yüzünlə zülfün içün dərtlüyəm gecə-gündüz
Oyanuramu uyuram anunla sübh ilə şam.

Gəl imdi xoş görəlüm bu dəmi ki, bilinməzüz
Ki tanlacax nə qılısar bizüm ilə əyyam.

Pəs imdi çəngi nəva düzü söz ilə saz ed
Ki biz tolu çəkəlüm eşqinə sənün bir cam.

Məlahətün qamuya amındur, bana cövrün xas,
Vəleyk hüsnünə aşüftədür bu xas ilə amm.

* * *

Gözüni görəli ayılmağ oldı bana mühal,
Nə dəsti-yarıyi səbrü nə xud məcali məcal.

Gözümdə qeyri xəyalün dəxi nəsənə yox,
Cigərdə qəmzələrün oxı qanı malamal.

Yəmin edərəm ana kim yəminün ilə bana,
Əyax verəli bilimənmişəm yəmin zi şimal.

Əlüm ətəgünə irməz, gözüm yüzün görməz,
Qulax sözüni eşitməz, dilüm olmaya lal.

Çü səni gördi gözüm, özgəyi qaçan görisər,
Gərək ki, əhvalə ayruxsı gözükə əhval.

Saçun müfəssəl edər dərd şərhini könülün,
Əgərçi ağzun edər yüragüm qanın icmal.

Həzar silsilə bin dağ etməyə anı kim
Yürəgümə bənüm eylədi zülf ilə şol xal.

* * *

Ey sənün totağuna çeşmeyi-heyvan təşnə,
Necə candur totağun ki, ana bin can təşnə.

Təşnədür qana gözünü anı əcəb deməzəm,
Əcəb oldur ki, ola fə'lün içün qan təşnə.

Susamışam nola bən görməgə didarunuzı
Susadum şol yüzə ki, dideyi-dəvran təşnə.

Totağun can qanıduru canum ana susamış,
Görməmişəm dəxi bən zirə be Kirman təşnə.

Vəslünü hicrün ilə odu su içində könül
Gözüm anun ilə giryan dili bir yan təşnə.

Dərdüm oldur ki, bən dərdümi artux dilərəm,
Dərdüm oldur ki, ana daruyi-dərman təşnə.

Kimə gərək isə qaşun ilə bin eyddürür,
Ol hilalə necəsi olmaya quban təşnə.

Yüzünün dövri içün ayü güneş oldı hilal,
Vəsfüni yazmağ içün dəftəri divan təşnə.

Ağzunun yarı içün çeşmeyi-heyvan derlər,
Həşəlillah ki, ana dideyi-insan təşnə.

Hüsnünün qonuğıyam çahi-zənaxda susamış,
Nə rəva ola axı ki, ola mehman təşnə.

Lə'l ilə lö'löyi-sirabını görüp susaram,
Susaram şol ləbə ki, həm ana dəndan təşnə.



* * *

Badə ver, vermə ömri badə, paşa,
Sun əyağunı sərfü sadə, paşa.

Rux ruxuna uram deyü bu gecə
Atdan olmışam uş piyadə, paşa.

Sözi qılmayalım təvil ki, var
Lütfünüzdən umum ziyadə, paşa.

Qibləyə qarşı qaşlarun mehrab
Canuma gözlərün səccadə, paşa.

Səfərüm zülfün içrə uzundur,
Ləbləründən bizə zəvadə, paşa.

* * *

Gəl ki, qılalum bu gecə tolu qədəhi nuş,
Hərgiz qomayalum tabaqı ortada sərpuş.

Məstur alalum həzzi nigarun totağından
Qafil olur isə nola məxmur ilə məxşuş.

Gər dəxi kişi sevər isə könül oda sal,
Ki odda gərək qəlb, qaçan ki ola məğşuş.

Bu müşkili kim həl qıla məgər ki, totağun
Sən hüsn ilə aşüftəvü bən eşq ilə mədhuş.

Göz yaşın anunçün dökərəm işbu yüzümə,
Ki ola xəyalün otağı qapusı mərşuş.

* * *

Can camına ver ki, dökelüm ruh rəvanı,
Məst eyləyəm anun ilə ruhi-rəvanı.

Verdi yelə gisularınun eşqi həvası
Ki sirrümi aydam şəkər ağzına nihanı.

Ənbər qanı ki, zülfini görüp oda yana
Ya müşg qanı, k'am görüp qunya qanı.

Bir sərvdürür ki, qədi candan düriyüpdür,
Kim bənzədə sərvi-çəmənə sərvi-rəvanı.

Şol dürci-gühərdən dökəli lə'l ilə lö'lö,
Altun ilə gümüş dəxi bağladı dükanı.

Dedüm ki, bədi' olmaya əm xəstə canuma,
İsırdı ləbin gör bu mə'aniylə bəyanı.

Əqlü dilü canü təni ismarladum ana,
Bən taciri-xasam nedərəm sudü ziyanı.

Rəhmət dəmidür, saçunı çöz ki, tarasunlar,
Başəd ki, canuma irə ənfasi-yəmanı.

Dil xəlvəti içində xəyali ilə canum
Cəm oldı, kim anar bu zəmin ilə zəmanı?

* * *

Nigarun gisusı içün pərişanam, pərişanam,
Anun lə'li-ləbi içün həmişə şokkərəfşanam.

Dilü əqlü tənü canum fədadur cümləsi ana
Nə ki, qılursa ol qılsun ki, mən dər'ziri-fərmanam.

Hilali qaşını gördümü can verdüm be şükranə,
Bana bu dəm dəgülmi eyd, çünki ana qurbanam.

Zərürət halinə baxdumü nagəh gözümə nəqşi
İrə gəldivü aydur ki, sənün dərdünə dərmanam.

Atar qəmzən oxı iləvü salar bəndinə zülfün,
Ləbi-lə'lünə dedüm ki, nəsin axır müsülmanam.



Xətayi gözlərün ilə qaşun tatarlıx qılur,
Dedüm ki, Tanrıya baxun ki, bəndə tərki-imanam.

Bana vacibdürür ol kim, tapundan olmayam ayru,
Necə kim işbu aləm içrə əndər həddi-imkanam.

* * *

Uyxu gözünün əsrügini ayamı dersin,
Günəş yüzünün nisbətini ayamı dersin?

Sən sayə isən, nola kimün sayəsisin gör
Yüzini sənün tək kişi yasayamı dersin?

Ta yaya gözün qəmzələrin gözlədi, şaha,
Atlu gözünə dirinə bir yayamı dersin?

Dəvrində, şaha, ay yüzünün issi xu n'isdər,
Kimsə könülində qala sərmayəmi dersin?

Sən eşqini bil, yarını qanda bulısarsın,
Yə'ni irişəm dilbəri-hərcayamı dersin?

* * *

Əhmədəm kim ki, bana sana yaman
Zahira ol xilafi-millətdür.

Həq yolında təvəkkülü ixlas
Xilqətümdə bənüm cibillətdür.

Nəm olur nəm gözümdə leyk hələ,
Bu yürəgüm odına billətdür.

Xalq içində adum ilə vəsfüm
Ədəmi-insirafa illətdür.

Neçə ki, cəm olur isə ə'da
Səhl ola ki, cəmi-ğillətdür.

Dərd aparam gərək eşginə bən,
Ki səvab ol eşikdə ziddətdür.

Ayuğ eşikdə pazişah olmax,
Dər həqiqət həman məzəllətdür.

* * *

Bən necəsi diriləm səndən irax,
Bilimezəm nə qılam səndən irax.

Gözlərüm yaşıdurur sayil, şəha,
Bən dəxi həm sayiləm, səndən irax.

Dil dilərsin, can verürəm bən əvəz
Dilərəm ki, dil diləm səndən irax.

Qıl qılıyçün gisunun miskin olup,
Bu tənümi qıl qılam səndən irax.

Gözlərüm girür könülüm qanına,
Göz qanına mayiləm səndən irax.

Can canuma müttəsildür, ey nigar.
Həm yenə bən hayiləm səndən irax.

Səndən irax, səndən irax yanaram,
Sanma ki, bən qafiləm səndən irax.

* * *

Əya, nigar, rəvamı bu həqqi-nanü nəmək
Ki, zayi ola sənün yoluna yedügüm əmək.

Gözün yaraladı yüregi, lə'lünə sordum
Ki əm didi yaram içün ol xud əkdi nəmək.

Səməndər oldı könül eşqün odı dənizinə,
Nitə ki, yaş dənizinə bu gözüm oldı səmək.



Həzar dövr geçə, düşməyə bənüm kibi bir
Ki zülfi dövrinə düşürmiş ola anı fələk.

Necəsi canı bələk birbiyəm bən ol şaha,
Ki çünki əsriyə can bəxşişini qıla bələk.

* * *

Həzar canum olursa sənün içün, çələbi
Fəda qılam yalunuzca canün içün, çələbi.

Saçun girchləri çoxdurü silsiləsi uzun
Çıxımaz ana tolaşan anun içün, çələbi.

Canum ləbündürü canumı bulımazam bən,
Canumı bana irürgil canun içün, çələbi.

Qanuma girdi ləbün gözlərün tanuxdur ana,
Qanını bana buyurğıl qanun içün, çələbi.

Cəhanda binüm olası gərəkdürür külli
Zira ki, külli sənünəm, sənün içün, çələbi.

Tənün içün kişi vardur ki, ətegi yanmaz
Canumı yandururam bən tənın içün, çələbi.

Qəbul qılıban əğyarı, bizi rədd qıldun,
Hələ qəbuli budaddun tənün içün, çələbi.

* * *

Düşəli gözlərüm şol qara çeşmə
Axıdur gözlərüm sədbarə çeşmə.

Gözi ki, can dilədi, gahi könül
Bana əqlüm dedi vergil öcəşmə.

Ləbündən könlümə ən'am edibən
Gözümdən dökdürüp yenə ödəşmə.

Könüli zülfünə çün bağlamışsın,
Dağıtma, dəlü zəncirini şeşmə.

Əya könül, çü lə'li atəşidür,
Yaxılmax diləməz isən, yaxışma.

* * *

Saqi tolu sun ayağı bu meypərəstünə,
Bir lütf kələcisini de nistü həstünə.

Ölümə ver ayağunı ki, başuma çıxa
Gör necə sunaram hələ canumı dəstünə.

Məxmur gözlərün necə cövr edə canuma
Layiq dəgülmi lə'l ayağun nim məstünə.

Silküp bıraxma yabana könlümi, key dəgül
Zülfün ağını tağıduban saldı şəstünə.

* * *

Zülfün ilə sərgəştəvü gözünlə əliləm,
Əttar ləbündən nola dilərsə əlil əm.

Eşqi odı yaxdıvü tiz etdi odını,
Saldı bəni ol ortaya yə'ni ki, Xəliləm.

Mətlubı iki aləmün ol talibi bənvən,
Mədlul əyağı toprağı çün bən də dəliləm.

Beli necə qıl olmaya şol yar ilə, çün bən
Barı belinə verdügi barı ilə qılam.

* * *

Yarun necə bir çəkə könül güncii dəlalin,
Can necə təhəmmül qıla işvəsi mühalin.

Zülfeyni içün hər gecə könlüm uladur şur,
Ki badi-səbat at saluban yüzədı salin.



Başmax kibi çoxlar yüzin ayağına sürdi,
Bulımadılar leyk kəmərgahi məcalin.

Eşqimi görən anmaya Məcnunı dəxi hiç,
Hüsnüni görən tərk edə Leylisi cəmalin.

Ol cana məhərrəm qanumı qıldı mühəlləl
Olmaya rəva bana haram edə həlalin.

* * *

Bulıdun yağmurı çoxmı ya gözüm yaşlarımı,
Düşmən əgrimi bana ya yarumun qaşlarımı?

Naz ilə ne'mət içində işrət edərsin bana
Bən yeri döşək edüb, yasdanayum taşlarımı?

Eşq əhli başı bizüz, yoluna can qomışuz,
Göz yüzün görmək içün saxlayalum yaşlarımı?

Canü əql ilə könül oldı mülazim yoluna
Can girü gəlür isə qaxıya yoldaşlarımı?

İçdi meyxarə gözi qanumı, şişlər cigəri,
Gidərəlüm süciyi, çəkməyəlüm aşlarımı?

Sünbüli görgil pərişan, sərxoş anla nərgisi,
Anlara gözükdilər bu sübh oxşaşlarımı?

* * *

Can meyli xu var idi tapuna xəbər ilə,
Biri bəgə irişdi, çü gördük bəsər ilə.

Sehr etdi anun gözi ki, canü dilü əqli
Qəmzəsinə dikdi qamusın bir nəzər ilə.

Şirin ola hər nə ki, ola cəhd ilə hasil
Xasa ləbi ki, girdi ələ tərki-sər ilə.

Key töhfədürür nöqtədə otuz iki incü
Ya bağlamağ ol bir qılı zərrin kəmər ilə.

Bu sırça könül qarşu necə tura oxuna,
Ki çərx turımaya bu zərrin sipər ilə.

* * *

Canumı oynayam nəsimə gərək,
Nə zərə əglənəm, nə simə gərək.

Söhbət əl verür isə anun ilə,
Varlığumı verəm nədimə gərək.

Xəstəyəm ləbləri təbibümdür,
Halümi bən soram həkimə gərək.

Fürqət ilə cahimə girdüm bən,
Vüslət ilə irəm nə'imə gərək.

Bən ki, rami-kiram olup dururam,
Bintü kərmi verəm kərimə gərək.

* * *

Novruzdur cəhan yenə novruza başlağil,
Divü pəriri tərk qıl, imruza başlağil.

Bən zülfi həlqələri ilə heydəriyəm uş,
Canum qələndəri isə dəryuzə başlağil.

Bən xud neyəm ki, xidmətünə bağlanam kəmər,
Sözüm əgər yoğ isə, nola, saza başlağil.

Bari girandur belünün gərçi biz ucuz
Ucuz giranunı bizə ucuza başlağil.

* * *

Ey ləbün xəmrü gözlərün xəmmar,
Zülfünə irəli səba bimar.



Can gözi ilə aşina oldı
Saniya isnəyni izhuma fi'lğar.

Mən ki, Mənsuri-ləşkəri-eşqəm,
Nola zülfündə gər olam bərdar.

Rasti kim müxalif isə bana
Mayədür dər miyanəyi-ədvar.

Bən fələk filkosini aldum ələ,
Kim ola sabitü kimi səyyar.

Girdə çərxün əzəldə görmiş idi,
Bu fələklər ki, gözükür dəvvar.

Qoyımazam ləbüni ağzumdan
Çünki şirintər gərəkdürür təkrar.

* * *

Gisularınun içində gəzdüm,
Yaxdı bu yürəcügümi gəzdüm.

Hər nə ki, gözi yürəgə qıldı,
Bən bir qələm ilə yüzdə yazdum.

Kimsə varımaz gisusı yolın,
Bən dəxi nola bu yolda azdum.

Görmədi lətif gözlərün tək
Necə ki, gözümdə xalqı süzdüm.

Ta dikdi gözün həvayi-dildə,
Bən özgə məhəbbətini üzdüm.

* * *

Canü əqlü dil nigara, gərçi ki, mə'duddur,
Aşiqin üzri budur ki, cud bil-mövcuddur.

Bən vücudı ol nigara qılmağum gərək fəda,
Ol səbəbdən çünki vəhdət yar ilə məsduddur.

Bu dəmi xoş görəlüm ki, ömr bu dəmdür həmin,
Ömri xoş sürmək cəhanda çoxlara məhsuddur.

Əhməd ilə çün Süleyman gəldilər bir araya,
Ol zəman oldı yəqin ki, aqibət Mahmuddur.

Filməsəl gər bən ziyanı eşq ilə olam ziyan,
Bən ziyana saymazam anı ki, cümlə suddur.

Eşq içində cümlə reyhan ilə sünbül sayıla,
Gər bu aləm sərbəsər çün atəşi-uxduddur.

Ləblərinün könli tar oldı ki, lə'l oldı yaşum,
Dedüm axır qıl təəmmül əşki-xunaluddur.

* * *

Zülfin tağıdub hər gecə pürçin edər ol yar,
Yə'ni ki, canum eşqini perçin edər ol yar.

Qızıl yanağı, qara saçı, al totağıyla
Yaşum ilə bənizümi rəngin edər ol yar.

Məgər ki, xəyalini günilər bu gözümdən,
Hər ləhzə bənüm canuma bir kin edər ol yar.

Hərçənd ki, üşşaqı anun sağışa gəlməz,
Cövr ilə cəfaya bəni tə'yin edər ol yar.

Kirpüklərilə gözləri yürəgümi yazmaz,
Nazik budurur k'anları təhsin edər ol yar.

Gər ögər isə şol şəkər ağız ilə nola,
Andan nə ki, gəlür isə şirin edər ol yar.

* * *

Xumaruz, ver səbuhiyi sabahi
Həlal oldı bizə xuni-sürahi.

Mübah içər qanumuzı totağun,
Rəvadur gər içəm xuni-mübahi.



Bu eşqü fisq yazılu idi bizə,
Bunı yazan bizə yazmaz cünahi.

Dökəlüm göz yaşın yüz qarasına,
Ki, həm ol olısardur buna mahi.

Seversən ayı gecələr, oyağ ol,
Nə soxarsın qulağına nübahi?

* * *

Yarəb, bu könül dərdinə dərman olısarmı,
Dərman tələbinə cana fərman olısarmı?

Qaşları hilali ilə eyd oldı cəhanda,
Bu xəstə könül ol yola qurban olısarmı?

Göz guşəsini düzdümü idrarını yazdum,
Bir gecə xəyali bizə mehman olısarmı?

Qan dökdi gözüm ta ləbüni gördi gözə-göz,
Ləbün ləbümə söylər isə qan olısarmı?

Rəhm etməyəmi aşiqə lütfün, sənəma, hiç
Giryan gözivü könüli biryan olısarmı?

* * *

Necə bir canü dil apara gözi,
Necə bir yürəgümi yara gözi.

Gərək ax deyəyüm gərəksə qara,
Qoymadı can elində qara gözi.

Misk saçın yüzinə dökəlidən
Qodı kafurı müşgə qara gözi.

Biqərar eylədi səba zülfin,
Qoymadı bəni bir qərara gözi.

Zülfünə baxanun gözi qarara,
Yüzünə kəj baxan ağara gözi.

* * *

Sənün ilə, sənəma, eşqimiz nihani gərək,
Cəhan içində sevümüz sənünlə cani gərək.

Ləbün girür yürəgüm qanına bənüm hər dəm,
Canum totağuna irüp sorışa qani gərək.

Ömür dedükləri bir ləhzədür və leykin bən
Sənünlə xoş keçürəm azacux zəmani gərək.

Səfayi-eyşə gərəkdür zəman məkan ixvan
İkisi hasil olupdur bu dəm məkani gərək.

Bu gün ki, laləyə baxdum yüzindən utanuram,
Yüzinə baxmağa şimdi anun amani gərək.

* * *

Bu nə könüldürür ki, ala gözün,
Canı var ginməsün vəbalə gözün.

Gecədür zülfünü yüzün gündüz,
İkisi ilə dəxi ala gözün.

Ləblərün saldı ala gözlərümi,
Yürəgümi bıraxdı ala gözün.

İrürür sehrini kəmalə qaçan,
Ki, könül bağlaya kəm alə gözün.

Qanumı qıldı mey, könüli yürək
Şəm canı gözi, piyalə gözün.

* * *

Bən xumaram, nola gər müdam içər isəm,
Bu gecə tanla dəgül, anı müdam içər isəm.

İçdi qanumı aş olsun cadu gözləri həlal,
Ləbi yadına nola cami-haram içər isəm.



Eylə əsrük dəgüləm yüzi ilə zülfi içün
Ki, dəxi əsrük olam sübh ilə şam içər isəm.

Gözləri oğrı yarın içməməgə and iç der,
Sərvi-azadına bu bəndə qulam içər isəm.

Zülfini dam edübən xalini danə qıldı,
Bana möhtac dəgül danəvü dam içər isəm.

* * *

Ol can ki, eşqi ilə bu aləmdə yar imiş,
Hər nə ki, isdəyə yenə kəndüdə var imiş.

Bağrum kəbab idüp suyın altun tabaqda bən,
Tutdum gözinə baxmadı bənzər xumar imiş.

Qıl oldı canü dil beli çəkdügi bar içün,
Ağır əzab cana ki, bari-kibar imiş.

Dedüm səbaya zülfinə de geçə arizin,
Qıldı qəbulü qılmadı key biqərar imiş.

Bəni salardı gür ərəqi key təəccübə,
Miskin nigar yüzi ilə şərmsar imiş.

* * *

Haram olsun bana vəslün əgər hicrün həlal isə,
Boyum necə kəman olmaz əgər qaşun hilal isə.

Ağızun nöqtədür nola əgər könlüm ola diltəng,
Belün gözümə gəliməz nə içün gər xəyal isə.

Görəli cadu göz alin yaşumla yüzüm al etdüm.
Bu dəxi hala al olsun, gər anun işi al isə.

Cigərüm qanına girdi totağun al ilə çoxdur,
Alısaram bən ol qanı, necə ki, çox vəbal isə.

Pərişan qılısar könlivü canda urısar dağı,
Əgər başunda yüzündəki zülfeyn ilə xal isə.

* * *

Müşg ilə qanum qurıdan yenə şol ahumdur,
Göklərün qəndilini yaxan yenə ahumdur.

Cami-mey al əlünə, gir bu səmurin cübbəyə,
Çün zücacı oldı su verən tonı qaqumdur.

Eşq tacirləriyüz, can virürüz sultan həqin
Var hesab eylə ki, necə xərc namə'lumdur.

Saru bənzə gecə-gündüz dökərəm qanlu yaşı,
Qan ilə hasil qıluraın zə'fərani-rumdur.

Sararuban, ağlayuban, yanuban, tükənürəm,
Tatlu yardan ayru düşən qamusına mumdur.

Həq cəmali hüsn ilə qılmış qəni ay yüzüni,
Tanrı haqqın gizləmə çün sailün məhrumdur.

Həq cəmali çün sevər eşqün əlindən dünü gün
Naləvü zarum bənüm ya həyyu ya qəyyumdur.

* * *

Hüseyni lə'lün içün bən qana boyanayım həmi,
Gözümün yaşı seyl olsun oduna yanayım həmi.

Necə bir qanaya könlüm, nigara, ləblərün içün
Hələ şimdi ələ girdi ləbündən qanayım həmi.

Ömür bən anı bilürəm ki, sənünlə gecə, yara,
Tapundan ayru dəmləri ömürdən sanayım həmi.

Nigara, tavşan uyxusın verür cadu gözün bana,
Vəli qəmzələrün dürtər ki, bən oyanayım həmi.

Könüldə iki sevgü sığduğı yoxdur, bilür Tanrı,
Səni sevdi könül candan bəgüm usanayım həmi.



* * *

Mövc urdı könülüm ki, yenə taşa, əfəndi,
Sığmaya yazılara tağa-taşa, əfəndi.

Çün adəmi-kamil ələ girdi, nə baxarsın,
Səcdə bu nigara ola nəqqaşa, əfəndi.

Gözümü sözüm yüzümü özüm qamu sənsin,
Yoxdur dəxi bəndə ikilik, haşa, əfəndi.

Çün aşiqünəm, al bəni vəslün gəmisinə,
Ki, irdi yaşum başa dilər aşa, əfəndi.

Bən göz ilə qaş işi içün məstəvü məcruh,
Sanma bəni qaldum göz ilə qaşa, əfəndi.

* * *

Gəl, gəl gözümə, gözümə seylab gəlmədin,
Bu ömr gəmilərinə qərqab gəlmədin.

Gəl, gəl ki, qan gəlür bu gözümdən su yerinə
Qan yerinə yürəgə, bəgüm, ab gəlmədin.

Tifl idi əql dəxi ki, səni sevər idüm
Bu dəhrə şeyxi-fani ilə şab gəlmədin.

Qərrə qəzəl demiş ola bin hüsnünə canum
Bəthəyi-Məkkəyə dəxi ə'rab gəlmədin.

Canum xəyalün ilə qılur xəlvəti içün
Gəl sən, gəlür isən, gözümə xab gəlmədin.

Aşiq bənəm cəhanda dəxi eşq yoğ ikən
Məhbubdur tapun dəxi əhbab gəlmədin.

Qibləm bənüm əzəldə cəmalün degilmidi,
Kə'bə yapılmadın, dəxi mehrab gəlmədin.

* * *

Çoxdur ki, gisularun ilə dama düşmişəm,
Cadu gözüni görəli badama düşmişəm.

Aramı qılmadı dilümün görəli səni,
Aram bulmayam çü dilarama düşmişəm.

Lə'li-ləbünə de ki, bana camı pür verə,
Gisularunda bəndə çü acama düşmişəm.

Bulmaz isən bənüm kibi aləmdə qəm yemə,
Bən bir bəgəm ki, dünyada əyyama düşmişəm.

Bən xas sənünəm, vəli sonün yolun içün,
İmkanı vardurur nola gər a'ma düşmişəm.

* * *

Dürmidür güldə yaxu şəbnəm ola,
Ki, göz anunla ruzü şəb nəm ola.

Sözümə sazi-ney gərək zira,
Hər nəfəs bənüm ilə həmdəm ola.

Müzmər olalı dərdi canumda,
Eşqi odı könüldə müdğəm ola.

Gözi bimarıyam təbib ləbi
Sorayım umaram ki, mərhəm ola.

Nə pərisin ki, odlaruna yanan
Bir zaman sidq ilə bir adəm ola.

Qaşun ayı toğalı yanduğ oda,
Vəsli neyçün bizə məhərrəm ola.

Nöqtədür lə'li yüzi dəvrində,
Ki, fəda ana iki aləm ola.



* * *

Yenə zülfi çərisin gör, qərarı yox qarasınun,
Xəta ilə çini urdı, alur malın qarasınun.

Çəkişür lə'li-ləbləri bu könlümi zəmanlardur,
Və leykin qanı sorılmaz iki qardaş arasınun.

Suyı oda, odı suya dökərlər göz ilə könlüm,
Odı ilə suyındayam ol iki macərasının.

Anun pərdə sərasında könül pərdə səradur, leyk
Canum xəlvətsəra olmax dilər xəlvətsərasınun.

Nə afət qəmzən oxıdur yenə həm mərhəmi səndən
Ki, başı dəxi onılmaz yürəkdəki yarasınun.

* * *

Eşqin əyağın tolu çəkəlüm yenə hey-hay,
Yürəkdə necə şərh edəlüm qəmzəni ey vay! .

Ayağuna baş qomağ içün sərv çəməndə
Geçdi neçə müddət ki, qərar eylədi bər pay.

Qanda aparam könüli bən gözi əlindən
Hər girpügi bir oxdurü hər bir qaşı bir yay.

Al çəngüni çəngünəvü qanunını beklə,
Gər dilər isən ud kibi oda yana nay.

Bu iş necə üşşaq arasında olısar rast,
Ki, aşiq ola bixudü mə'şuq ola xudray.

* * *

Beli nə çəkər, dilbər anı gər bilə nolur,
Ol çəkdügini gər çəkə aləm, bilə nolur.

Sən dil dilədün bən sana canı dəxi verdüm,
Çün bir dil imiş hər dü cəhanı dilə nolur.

Bən biribidüm badi-səbayi ana fərraş,
Zülfi gözümün silsiləsin gər silə nolur.

De qıyma gözünə, bən anı sevdügüm içün
Bu dünyada bir aşiq əgər əksilə, nolur.

Ol nəsnə ki, qıl etdi anun incə belini
Bən suxtəni dəxi əgər qıl qıla nolur.

Şol kişi ki, bədr ay ilə qalmış ola tana,
Tana qalasın yıldız ilə, ay ilə nolur.

Biz qatlanalum yar yarasına yarı içün
Dərmanını dərdi verə qovğa ilə nolur.

* * *

Yara eybüm deyəyüm lütfü vəfayı sevərəm,
Dərdümi anladayum mehrü vəfayı sevərəm.

Gözüni göz görəli lə'lün içün öldügumi
Xəstəyəm tutma bana dəq ki, şəfayı sevərəm.

Çün səni bən sevərəm diləgün ilə birəm
Vüslətündən dəxi yeg cövrü cəfayı sevərəm.

Gər xəta düşdüm isə tutma bana dəq zira,
Çin diləyüm hələ çoxdur ki, xətayı sevərəm.

Çün dəva dərdümə həmdərdi ola dərd verür,
Dərd içün can verəyim, zira dəvayı sevərəm.

Ol cəmali ki, sevər Tanrı, bən anı sevərəm
Bana yetməzmi ki, məhbubi-xudayı sevərəm.

Hər gecə nalə qıluram tana dəgin çü cərəs
Qapundan taşğaru avaz dərayı sevərəm.

Şol sərapərdədə ki, sən olasın, ey dilbər,
Gülü mül bülbüli-xoş pərdəsərayı sevərəm.



* * *

Yenə zülfi kəməndinə dil ilə can əsir olmış,
Xəyali könlüm elində yenə bu dəm əmir olmış.

Saçı hindu, gözi türki, beli xət, ağızı nöqtə,
Bədi' olmaya zira ki, mir'ati-nəzir olmış.

Ləbi şəkkər, yanağı gül anunçündür kim əzəldən,
Gül ilə şəkkəri-misri türabına xəmir olmış.

Zəhi qadir ki, cəm etmiş gecə-gündüz cəmalində,
Könüli səngi-xara tək təni həmçin hərir olmış.

Neyi salmış cəmalində neyün qulağına mütrib,
Ki, yanıb odına bu dəm həvasında nəfir olmış.

* * *

Biçarə könül eşqi güzin etdi, nə çarə,
Sevdasına tolaşdı, qaçan gələ qərara.

Gözüm gözini görəli məxmuru dökər qan,
Rümman aşını çəkə dilər yə'ni xumara.

Əqlü dilü can salalı tasına nigarun
Nəfsüm qamu varlığını utuzdı qumara.

Zülfi qılına can quşını bağlamışam uş,
Şahin gözi şayəd ki, məgər düşə şikara.

Yürəgi əgər yaraladı qəmzəsi nola,
Can dəxi fəda olur isə yara nə yara.

Bu lütf ilə ənbər saçunı görəli gecə
Yıldızları qara yüzinə qıldı sitarə.

Aldı könüli qəmzəsivü canuma aydur,
De əqlünə k'əl-əqlu yekfihi isarə.

Bən necə kənara qılayum işbu miyandan,
Bu ortada çün hiç kişi irmədi kənara.

Zülfündə qərib oldı könül xeyli zəmandur,
Əglənimədi başun içün daru diyara.

Gözləri yıxar könüli sordum totağından,
Bir hindu əcəb yıxmağa yetməzmi bu şara.

Zülfün bəni çox gecədürür qıldı pərişan,
Belündən ola meyl məgər zarü nizara.

* * *

İşbu təriq içində rəfiqi bulımazuz,
İrməgə ol rəfiqə təriqi bulımazuz.

Susamışam ləbünlə yanaram zəmandurur,
Lə'lünlə sorışuruzu riqi bulımazuz.

Gərçi məcazdur gözi işvələri bizə
Biz razıyuz məcaza, həqiqi bulımazuz.

Bən qılmışam özümi ləbün yolına şəqiq,
Dəq tutma bizə çünki şəqiqi bulımazuz.

Yaqutun ilə göz yaşını lə'l edəm dedüm,
Biz razıyuz bu yolda əqiqi bulımazuz.

* * *

Nigara, niçə gözlərün könül ilinə axalar,
Kəminə işvələr ilə nəmüz var isə yaxalar.

Kimün ətəgi girürsə elə aşiq sorıcağaz,
Hələ biz razıyuz, tütün qodux, ortada yaxalar.

Sənün eşqini qılmışuz könüldə gizlü nə lazım,
Ki bəniz rəngi, göz yaşı dünyaya çaxalar.



Girisərəm kənarıyçün miyanına cəfasınun,
Bən ana iricək gərək iraxdan bunca baxalar.

Sevərəm, sevisərəm bən nə lazım qaları anun,
Ki əgrilik bilür deybən anı başuma qaxalar.

* * *

Saqiya, tolu əyax rəfi hicab edər bu dəm,
Tolu ver, çün nə qılur isə savab edər bu dəm.

Sən bizə qılma şərabı kəm ki, yarun işvəsi
Yürəgı bağrı qomaz cümlə kəbab edər bu dəm.

Ləblərindən dərdümə sordum dəva dedi hələ
Bəllü budur kim dəva içün cəvab idər bu dəm.

Qomadı canü könül əqli hesaba kim sayar,
Caduyi-məsti gözün yə'ni ki, xab edər bu dəm.

Gül cəmalinə həyadan düşdi şəbnəm olamı,
Qəsdi oldur tazə güldən kim gülab edər bu dəm.

Abı xun etdi gözümdə bən bilürəm bigüman,
Ki totağı yürəgümdə xuni ab edər bu dəm.

Gözləri oxladıvü ləbləri sorarlar qanum,
Gəh xətavü gəh səvabü gəh əzab edər bu dəm.

Ruzi-rövşən diləsə zülfin yüzündən gidərür,
Büridi zülfin məgər ki, mahtab edər bu dəm.

* * *

Başumadur saçun sevda bu gecə,
Cana eşqindürür qovğa bu gecə.

Görəli nili alnunda, nigara,
Gözüm Ceyhun, könül dərya bu gecə.

Qomışdur başını sərv ayağunda,
Sənünlə kim geçər sərpa bu gecə.

Sənün zülfündə onbər oldı miskin,
Lobünə lö'lödür lala bu gecə.

Ələ girsə idi zülfün görəydi,
Ki uzun olanı yelda bu gecə.

Nə dirlik, nə ölüm uçmağı nedər
Görən yarı əlin əldə bu gecə.

Zoman geçdi ki, Məcnunıyam anun,
Mənü Leyli ilə beyda bu gecə.

Ləbi axıtdı gözlərüm qanını,
Anunla sorışam də'va bu gecə.

Zəhi pərvanə ki, yaxıldı oda,
Qomadı aşiqə pərva bu gecə.

* * *

Eşqindən anun canumuza çarə olursa,
Bən eyləyəyüm kəndüzümi parə olursa.

Nühüftə edər yüzi qılur canı mühəyyər,
Ah, böylə müxalif əgər ədvara olursa.

Ol zəxmə ki, urdı gözi canumuza bizüm,
Döyməyə gər heydəri kərrarə olursa.

Baxdı gözi yürəgümə aşiqləri dedi
İş böylə gərək, yara əgər yara olursa.

Qəmgin ola bənəfşə, pərişan ola sünbül,
Zülfeyni anun böylə siyəh karə olursa.

Dərdinə anun çarə bulmadı könülüm,
Biçarəliğindən ola, gər çarə olursa.



* * *

Cana bəla qılan beli bari dəgülmidür,
Ol bari yüklədən bana bari dəgülmidür?

Yarı çü həq bəriyyəsində susuz olam,
Bənüm ağızuma yara yari dəgülmidür?

Bən xari sevərəm zira ki, sevərəm güli,
Yüzi gülinə kirpügi xari dəgülmidür?

Yüzi xəyali bir gecə gəlürsə gözümə,
Gözüm yaşı yolına nisari dəgülmidür?

Bən öləyüm qudumı qılur diri canumı,
Bəs kimya ayağı qubari dəgülmidür?

* * *

Nə əl olur nigarına, nə sa'id
İkisinə dəxi həqdür müsaid.

Saçı kafir, gözi cadu, özi türk
Könülüm ki, şəhidünə mücahid.

Nə şahiddür ki, qanumı bilür şəhd,
Qanum içdüginə ləbləri şahid.

Könülüm yüzünə abid olaldan
Dəxi yüzdən bu gözüm oldı zahid.

Bənəfşə rake'vü sərv oldı qayim,
Olalı hüsnünə bu bəndə sacid.

* * *

Neçə cana cəfasın, ey canıçux,
Gərçi lütfü vəfasın, ey canıçux!

Necə bir bu canuma dərd olasın,
Özgələrə dəvasın, ey canıçux!

Ləbünə sundum idi, dedi ki, hey
Bən dedüm xun bəhasın, ey canıçux!

Gərçi qıldun yüzüni Kə'bə bana,
Kə'beyi-basəfasın, ey canıçux!

Bən özümi yüzündə görürəm,
Cami-aşiqnümasın, ey canıçux!

Yerü gök əhli səni severlər,
Rəşki-ərzü səmasın, ey canıçux!

Gəh belün kibi ləngərün vardur,
Gah əndər həvasın, ey canıçux!

* * *

Səndən ayru könül xərab olısar,
Ləblərün ilə fəthü bab olısar.

Ta xəyalün basa gözümə məgər,
Yaşum incü, yüzüm zərab olısar.

Əzb totaxlarun xəyali ilə
Gecə-gündüz bana əzab olısar.

Dərdidürür şərabü vəsli sərab,
Ol şərabı bana sərab olısar.

Nə ki, zülfündə gündüzin gördüm,
Ol gözüm bu gecə xab olısar.

Ol xətayi ki, zülfi-pürçindür,
Hüccəti canuma səvab olısar.

Anca axa gərək gözümdən yaş,
Ki cəhan toptolu hübab olısar.



* * *

Oldum, sənəma, rast qədün ilə mühəyyər,
Urdum, sənəma, gisun ilə çərxi müdəvvər.

Qəmzənə könül qarşu tutaram nə qılayum,
Gər olmuş isə tiri-qəza bana müqəddər.

Ey şəm, bənüm rəngüm ilə əşgümə baxgil,
Lütf eylə bu məclisümüzi eylə münəvvər.

Qənd oldı ləbün, anda nəbatun əsəri yox,
Bən xət yazayum işbu söz üsdinə mükərrər.

Belünə giran olmaz isə can xu fədadur,
Dil dilər isən, al əgər olmaya mühəqqər.

Sən bəni özündən, sənəma, sanma irax çün
Nəqşün gözümə qanda isə ola müsəvvər.

Bu badi-səba necə girür zülfün ucına,
Böylə qalamı işbu cəhan işi müşəmmər.

Ud axıra yetdivü gişi micməri görməz
Çəngünə düşəli, sənəma, ud ilə micmər.

Bər dər yaturam bunca gecədür sənün içün
Başəd ki, səni görəm olamı deyü dər bər.

Xütbə necəsi bən aduna oxımayayım,
Eşqin yüzümə bax ki, urur sikkeyi bərzər.

Bən qəddün içün sərv necəsi deyəyüm rast,
Qatında bir ağaç ola tubi ilə ər'ər.

* * *

Nigara, qəmzən oxı uş yürəgümə toxınur,
Başumda nə ki, yazıldı yolumda uş oxınur.

Təvəkküli gərək ola bu yolda aşiq olan
Gərək ki, çöp düşə ol gözə ki, kişi saxınur.

Suya bıraxsa nə ki, güzgü varsa aləmdə, –
Ki yar görür özini, çünki güzgüyə baxınur.

Nigara, eşqün odına bir ola yaxın, irax
Gişi ki, aşiq ola, ol irax, yaxın yaxınur.

Səadət ilə şəqavət ikisi yoldadır,
Kimisi birini geyür, kimi birin taxınur.

* * *

İrdi bəgüm eşq ilə can canına,
Ərz edə gərək sözini xanına.

Lə'li ilə qana batubdır yürək,
Qan olamı irsə könül qanına.

Tanrı birü eşq birü yar bir,
Gələ qələt ikidir imanına.

Bir nəzər etsün saçına dilbərün,
Tə'nə qılanlar sözüm oranına.

Can ol ola ki, dilini oynayub
İriməyə qəddinün imkanına.

* * *

Dərdi-yarum çün olısar dər diyar olsa, nola,
Dər diyar olsam yalunuz dərdi-yar olsa, nola.

Dilbərüm oldı fəridüd-dəhr işbu dünyada,
Hüsninün eşqi ilə dil fərdi-yar olsa, nola.

Dilbərün çün yüzi axdur, eşqpərvərlikdə bəs,
Yaşlarum gər surxü yüzüm zərdi-yar olsa, nola.



Yar mərdi-eşq olıcax işbu fani dünyada
Qopsa bir gözəl dəxi ki, mərdi-yar olsa, nola.

Dərdi-yarı necə bir qürbətdə çəkə bu könül,
Dər diyar olur isə, həm dərdi-yar olsa, nola.

* * *

Bən canı sana aparam göz görə,
Canumı bən cana qaram göz görə.

Bu nə xəyal ola, zəhi müstəhil,
Gözi yüzündən gedərəm göz görə.

Diriligümüz sənsinü olmayıcax,
Bən bu həyati nedərəm göz görə.

Zülfi yüritməz gecələr könüli,
Yüzinə gündüz aparam göz görə.

Bən ki, xəyalünlə vüsal edərəm
Sənün ilə dəm dilərəm göz görə.

Nə dilü nə əql nə xud can qodı,
Gözləridür böylə qaram göz görə.

Gözləridür xüftəvü dutdum əyax,
Xuni-cigərdən göyərəm göz görə.

Ləblərinə halümi sordum ki, ta
Nöqteyi-mövhumi yaram göz görə.

Varlığı saldum sənəmün eşqinə,
Ta ki görəm bağı-irəm göz görə.

Gözümi bən yüzi içün saxlaram,
Uyır olursa, oyaram göz görə.

Özgələrə verür isə zərrə yer
Bən yürəgümi yararam göz görə.

* * *

Gögə irürdi duxanı könülüm cuşdan uş,
İrdi sevda başa gisuyi-siyəhpuşdan uş.

Dün gecə bəndinə saldı canumı gisusı, leyk
Bu gecə bəndini dilər aşura duşdan uş.

Qanda qulağına sözüm girisər k'altun ilə
Dür bulımadı, məcal asılıdur guşdan uş.

Təfriqə oldum isə zülfi ilə, dutma əcəb,
Canı tondən aparurü könüli huşdan uş.

Şəkkərindür totağun, leyk dəgüldür arusuz,
Gör ki, nə niş çəkərəm, bogüm, ol nuşdan uş.

Və'deyi-vəsli sərab oldıvü nələr çəkərəm,
Necə yaxın sanur isəm anı uş uşdan uş.

Yaş yüzüm, tolu gözüm, quru cigər, boş əlüm,
Nə bəladur, yaşü quru, toluvü boşdan uş.

Bəndə nola gör olam ənbəri-zülfinə anun,
Ki gözə-göz günəşi gösdərür ağuşdan uş.

Yuxa bulıtda sanasın ki, düşər qövsü qüzeh,
Al yanaxları ilə fıstuqı bərcuşdan uş.

Mey içicək şəkəri nüql edərəm, zira anı
Soraram ögrənürəm şəkkəri-meynuşdan uş.

Soraram hər dəm anun lə'li-ləbinün xəbərin,
Püxteyi-piri-səfa sirəti-dilruşdan uş.

* * *

Aşiqdə nə iş ki, ola, şahanə gərəkdür,
Aşiq bilə ki, kəndüdə şaha nə gərəkdür.

Şol göz ki, dökə şahi xəyali yolına dür,
Bin tə'nə ura qətrəsi ümmana gərəkdür.



Tərh eyləməgil bizi, nigara, eşigündən
Bir mur dəxi təxti-Süleymana gərəkdür.

Dərman tələb edən, sənəma, lə'li-ləbündən
Bilməzmi ki, bu dərdi, bu dərmana gərəkdür.

Şol murçə pa xəttinə əsirgəmə canı,
Zirə dəxi isə hələ Kirmana gərəkdür.

Bayram ayı tək kim ki görə qoşa qaşını,
Canını yaraxlaya bu qurbana gərəkdür.

Şol hinduyi-xali çü özin quyıya salmış,
Ol çəhdə verəm canı ğəribana gərəkdür.

* * *

Ləbün kihi meyi yoxsa səfası yox camun,
Əgərçi dərd isə, oldur dəvası əyyamun.

Qana bulaş ləbinə irişə gör, ey könül,
Ki qan ilə girisər yenə əlünə kamun.

Yüzini gördün isə canun oynağıl yolına,
Ki qayəti var axir bu cəhanda ən'amun.

Gərək ki, arizuna canü əql dil qoyıla,
Ki sərhəd anı bilürüz Rum ilə Şamun.

Oda bırax eyüyi yavuzı ki, bilinisər
Qoxusı ilə bahası bu püxtəvü xamun.

* * *

Necə bir zülfün ilə bu dili sərbaz edəsin,
Lə'lün ilə gərək uzun işümi az edəsin.

Rasti sərv müxalif olmıya qədünə,
Şol mübərqa yüz ilə xasa ki, şəhnaz edəsin.

Qıl gibi incəlü pür ənbərü müşg et özüni,
Ta ki zülfi kibi qulağına bir raz edəsin.

Ləbünün bir nəfəsi kanı şəkər qıldı dili
Bir dəm ilə neçə bin Sə'diyi-Şiraz edəsin.

Məryəmi-bikr ləbün hər dəmi bir İsidürür,
Kim sana münkir ola gər dəmi-e'caz edəsin.

Sən bəni külli fəna qıla bilürsin, leykin
Hikmət oldur ki, fənaya bəni dəmsaz edəsin.

Yaşumı bəhrə yetürüp, gögə ahum çıxarup,
Gəh bəni aşiqi-rüsva, gəhi qəmmaz edəsin.

* * *

Yaşumı qan cigər qanını ab edər gözüm,
Yarun xəyalini bana çün xab edər gözüm.

Eşq əkdi zə'fəranı yüzümdə fəraq ilə,
Qurrəti-üyuna k'anı sirab edər gözüm.

Ayı dilər ki, suda görə işbu çeşmbaz,
Yaş dənizinə aləmi qərqab edər gözüm.

Qeyrət qılır ki, qeyri anun gözə gəlməyə,
Hər dəm cigər qanı ilə seylab edər gözüm.

Xali bilal, imam gözi, muqtədi könül
Peyvəstə qaşını dəxi mehrab edər gözüm.

* * *

Səd ahu bin nəfidürür səd həzar dad,
Ki bulmadı bu aləm içində kişi murad.

Adəm əgərçi xakidür anı həvaları
Od ilə sunun aralığında verür be bad.

Sənlikdən özgə səndə nə ki, varu olısar,
Qılmışdurur qamusı yaradana inqiyad.



Fəqri səvadı vəch qılursan vücuduna,
Rövşən ola sana bu ki, ənnuru fi's-səvad.

Sat varlığunı yoxlığavü ir bəqaya sən,
Mövcudına çü cud edə kişi, ola cəvad.

Sözi təvil qılmağil, olağıl fərid sən,
Gər xanəgiri-vəhdət isən, isdəmə ziyad.

Ah, inani-güsistəyi çün gizləyiməzəm,
Boynına noxdasın toladum hər çi bada bad.

* * *

Sahibqirana cadu gözün olalı qərin,
Çəkmiş kəmanını, könülə eyləmiş kəmin.

Uzun ömür ki, gisularunla keçürmişəm,
Saymağa yaraya qamuya lə'lündən dəmin.

Aşiqlərün kəmi ki, bənəm səndən umaram,
Ki ləblərün qəbul qıla aşiqü kəmin.

Sa'idlərüni bana həmayil qılur isən,
Sənün əsirün olmağa bən urayım yəmin.

Qəddünə sərv qanda xilaf edə bilisər,
Gisun ki, həmsəridür, urur yüzi bər zəmin.

* * *

Gözləri mey, ağızı pistədürür,
Gül cəmali qatında dəstədürür.

Anca ki, gözlərindən içmiş mey,
Könülüm uş xumar xəstədürür.

Zülfi bağıylə ki, pərişandur,
Dəlü könül şikəstə bəstədürür.

Dəstə güldür yüzivü lə'li mey,
Ləbləri şəkkərinə pistədürür.

Bəndə yox nəsnə ki, fəna irişə,
Çün fənanun hululi həstədürür.

Xəttün ilə saçun bu gülşəndə
Kimi bər bəstə kimi rüstədürür.

Çünki düz olmadı bu hindu saçun
Ləşkəri şərqdən şikəstədürür.

Bu müsəlsəl yaşum qaçan irisər,
Ah ki, ol inan güsistədürür.

Həbəşi bənləri mübarəkdür,
Yüzi muqbil, saçı xucəstədürür.

* * *

Gözi dilər ki, dilə həmleyi-türkanə qıla
Zülfı dilər bizi bir qıl ilə divanə qıla.

Hər qıla bağlamayıncax özini varlığumuz
Zülfünün hər qılı ilə dəxi şaha nə qıla.

Təni bənzətdi qıla qılca belün, ey beli qıl,
Ta ki nə qıla bilür isə, anı cana qıla.

Qəmzəsi bəndə sala dünyayı gər həmlə qıla,
Məst ki, qılmaya həmlə ayığa ya nə qıla.

Zülfi miskiniyəm illa ki, pərişan keçərəm,
Ki bu cadu neçə bir tə'nəyi imana qıla.

* * *

Bu nöqtə ağzına bir qıl nəzər, nədən dəm urur,
Səfa ilə bəninə bax ki, Kə'bədən dəm urur.

Çü oldı gisuları qoxusı pərakəndə,
Bənəfşə dizdə başı müşg yaxadan dəm urur.

Saçı ki, səb'i-tival oldı gər bir ayətdür,
Müfəssəl anla ki, ol neçə surədən dəm urur.



Qara gözi dəmi sehri irürdi şuna ki,
Tən ilə can özinün bilür ortadan dəm urur.

Geyik gözinə olmağa yaraya zira,
Necə xətayı isə, dəxi nafədən dəm urur.

* * *

De gözlərünə ki, apararlar bəni bindən,
Necə ki, bəndə olam, görməzəm səni sindən.

Ayır, nigara, bu kafir saçunı imandan,
Müşəvvəş eyləmə, çıxarmağil bəni dindən.

Xətaya bəni biraxmavü qılmağil miskin
Bu müşg ilə ki, gətürür gisularun çindən.

Sabahın incə çıxup, gecə incə toğaram,
Bu eşq ayinin öğrəndüm iki ayindən.

Saçı tuzax, gözi ox düzdi, qaşları yaylar
Ki, canavar aparmaya canı yayindən.

* * *

Könül əgər dökə bir qan nişə şikayət edər,
Ləbində gördügi dəmlərini hekayət edər.

Hekayət etmədi müşgi-xətayi hiç miskin,
Bu silsilə ilə ki, saçların rəvayət edər.

Günəş gecəyi gidərürü gidərməz ay,
Yüzündə ayü günəş gecəyi himayət edər.

Yüzün cəmalidürür Kə'bə, ana gələn dil
Vücudi soymaz olursa, ulu cinayət edər.

Yürəkdə gözlərün urdı cigərdə hacət nə,
Bu yara çünki onılmaz, ona sirayət edər.

Dilər ki, nuri-cəmalüni örtə şol gişi ki,
Günəş deyüb, sənəma, hüsnüni kinayət edər.

Bu tarlığ ilə bu lütfi görən ağızunda
Bu məmləkətdə necə də'viyi-vilayət edər.

* * *

Yoluna oynamağa canumı ya canamıyam,
Bəsbə bən könülə peyvəstə əcəb canamıyam?

Dutalum qeyrət isbat edə əğyar bizə,
Gözə-göz görür ikən vəhdəti inanamıyam?

Uymayıb gisusı sevdasına anun nə qılam,
Böylə sevdayivü aşüftəvü divanəmiyəm?

Cigərüm qan edənün susamışam ləblərinə,
Biliməzəm ki, bən ol çeşmə ilə qanamıyam?

Yasanur gisusı könülümi əğyar sanıb,
Bu sanuyı dəxi yə'ni sana bən sanamıyam?

Dutalum zülfün uzana ki, irişə əlümə,
Bu işi başa irişdürməgə uzanamıyam?

Dutalum zülfün uzana ki, irişə əlümə
Bu işi başa irişdürməgə uzanamıyam?

Gözün əsritdi bəni, uyxumı qıldı qalib,
Urıcax yürəgümə qəmzəsin oyanamıyam?

* * *

Ağzına könülüm həqir gəlür,
İkisi vəhdət ilə bir gəlür.

Zülfi ilə ki, ol həvaya gedər
Atəşi könülüm əsir gəlür.

İştiyaqü fəraqü vəslü vida
Göz qamusı ilə qarır gəlür.

Eşqünə gözdə təxt qıldı xəyal,
Bu Süleymana zi sərir gəlür.



Kə'beyi-hüsnə sə'y edər aşiq,
Ki muğaylan ana hərir gəlür.

Gər xəyalün nəzirdür yüzünə,
Nişə gözümə binəzir gəlür.

Buluram izi ilə qanda isə
Zülfi miskini ki, əbir gəlür.

* * *

Varlığum dəxi yenə dilbərümün sayəsidür,
Öləyim anun içün k'anı bana sayasıdur.

Eşqi taladı bənüm varlığumı cana dedüm,
Səbr qıl atlusı gəlsün, bu hənuz yayasıdur.

Dürd əyağını tolu ver içəlüm, ey saqi,
Dil anun sərxoşıduru yenə ol ayasıdur.

Zülfünə şuriş ilə sirrümi dedüm bu gecə
İlla, aşüftədürür dünyalara yayasıdur.

Kim ki ol rast yürimez rəhi-üşşaqi yəqin,
Bən nühüftə deyiməzəm, qamunun mayəsidür.

* * *

Belümə müşg saçunı, şəha, kəmərlənürəm,
Neçə ki qəmzən ox ura cigərdə, fərlənürəm.

Şikəstə zülfünə necə ki, tolaşa könülüm,
Ə'dunun urıcağaz qəlbinə zəfərlənürəm.

Sözüm ləbündən, ey dilbər, olur iso şirin,
Nola çün ağızunı anıcax şəkərlənürəm.

Könüli ayinə qılup günəş yüzünə sənün,
Qaçan ki qarşu dutam, əlbətə qəmərlənürəm.

Yolunda şükr ilə səbrə çü can quşandı quşax,
Gəhi fəriştələnürəmü gəh həcərlənürəm.

Nə mayədür ki, bu ədvarda nəvası yox,
İraqa varsa mübərqa, bən ana nərlənürəm.

Nəzərdə gərçi ki yoxdur vücudumun qədri
Bu yox-varı dəxi öldür ki, bən nəzərlənürəm.

Qılur bəni səri-zülfi əsir bir qıl ilə,
Əgərçi bən dəxi bu ortalıxda sərlənürəm.

Hünər ləbünə müsəlləm ki, ölü diri qılur,
Bən ana vermək ilə canumı hünərlənürəm.

* * *

Dil necəsi söyləsün, dildə nə dil vardurur,
Hali gərək anlaya kimdə ki dil vardurur.

Odun ilə can gərək ki, ola idi həva,
Kəndü yalunuz dəgül abilə gil vardurur.

Neçə ki var varlığum, qılca vüsal ummazam,
Necə vüsal olısar, ortada qıl vardurur.

Qıldı qaşun eylədi bəni hilal, ey bəgüm,
Görməyəli anları gözümə yil vardurur.

Bənligi gərək ala, qomaya bəndə nigar,
Bəndə deməkdən axır nəsənə bil vardurur.

Eylə yaxışma yara ki, olasın cümlə ol,
Görməkü demək gərək, göz ilə dil vardurur.

Ayinədə gördi xal, dedi ki, Rum elidür,
Nerdə ki fülfül ola, həm ruxü fil vardurur.

* * *

Kişi ki sevməyə səni, ey bəgüm, canımı var,
Dəpələrlərsə anı, şər' ilə de, qanımı var.

Küfrü iman dutalum zülfün ilə yanağunı
Anlara tapmayanun de bana imanımı var.



Mərdümün nə işi var ki, girə aşiq gözinə
Gözdə mə'şuqədən özgə dəxi insanımı var.

Səni görən səni qoyub kimi sevə deyəsin,
Dünyada sənciləyin adəmün imkanımı var.

Eşqdür cümləyə gəldi, bizə gər artuğ isə
Nedəlüm, bu gələnün dirhəmü mizanımı var.

Su ki, sərv ayağına yüz yerə urur neyiçün
Qədi-sərvün kibi bari iki rümmanımı var.

Rəhmətün yağmurını dəmbədəm umaruz, ey şah,
Kimsənün sənciləyin xəznədə ümmanımı var.

Tutsağ olmax yüzünə, canumadur hər dü cəhan,
Ənbərin silsiləvü simdə zindanımı var.

Dərdünə düşənə dərman yenə dərdündən olur,
Dərdünə versün özini dəxi dərmanımı var.

* * *

Zülfünə tolaşanun yolı diraz ola gərək,
Pisteyi-lə'lün ilə zəhməti az ola gərək.

Hər ki şəh nazını canı ilə eyləyə qəbul,
Qanda seyr edər isə, ana hicaz ola gərək.

Eşqi tonın gişi ki təng geyə can tənino,
Nerədə yürir isə, camə bəzar ola gərək.

Sərvi-azad kibi hər ki qoyub barü bərin
Baş qoya yar yolına ömri diraz ola gərək.

Can özindən geçə bilə, vəli ondan geçməz,
İncə yoldur, bu həva yolı cəvaz ola gərək.

Gər boğuzlarsa həzaran gəz könüli şol nigar,
E'tiraz etmək çü olmaz ehtiraz ola gərək.

Nüqtələr ki nöqteyi-lə'li-ləbün ilə gidər,
Sənün ilə bizüm ortamuzda raz ola gərək.

Dil dilər ki, zülfün ilə bir rəsənbazi qıla,
Qəsdi ol isə, bu ipdə can güdaz ola gərək.

Faqruma olmış fəqir olu qinadandur qəni,
Naz edərsə ol bizə, bizdən niyaz ola gərək.

* * *

Gözlərindən əsrimişdür xəmrü xəmmar, əpsəm ol,
Rəqsə dilər ki, gələ bu səqfü divar, əpsəm ol.

Ləblərindən nuş qıldux badeyi-diləkçə biz,
Ələ girdi hələ şimdi dəmi-əttar, əpsəm ol.

Qılmağıl hərgiz şikayət yar ilə əğyardan
Nə görürsən yardur, yoxdurur əğyar, əpsəm ol.

Dilmi dilər ki, dilə, ey dil, diləgin dilə
Qəmzəyə özün sımarla, çar naçar əpsəm ol.

Şöylə gər şəkkər dilərsən aləmə ərzan ola,
Yürəgümi qan dilərsən dinmə, zinhar, əpsəm ol.

Dil məcazi çardur şəkkər atı oda salar,
Qılmağıl lə'li-ləbi sözini təkrar, əpsəm ol.

Bu günəhmidür ki, töxmi-eşqi canda əkərəm,
Bən olayım ortamuzda ol günəhkar, əpsəm ol.

* * *

Gözlərün atar canuma qıl yara,
Can sənündür, nə gərəksə qıl yara.

Dil dilərsin, yox deməgə dilmi var,
Yox dirigüm, dil dilərsən dil yara.

Sil bu gözüm yaşını silsilədür,
Bən dəlürdüm, silsilədür, sil yara.



Dil piyadədür rüxün nöqtəsinə,
Filfilünə döyimədi fil, yara.

Qılca əksük bulmadı səndə könül
Çox təfəhhüs eylədi qıl-qıl yara.

* * *

Bu xəstəyə ləbüni çünki sən şəfa qıldun,
Nə lazım idi ki, hicr ilə bin cəfa qıldun.

Dedün ağızun ilə ki, yaşunı xun edəm,
Yaşun uzun ki, bu və'dəyə xoş vəfa qıldun.

Həzar həclə bin ömrə ömürünə yazıla
Qaçan ki haciyi-eşq ilə bir səfa qıldun.

Şol iki cadu gözi mərdümi səni gözədür
Nə lazim idi ki, zülfində ixtifa qıldun.

Ləbinə düşdünü qan saldun, ey dəlü könül,
Bu dövr içində bu nöqtəyə iqtifa qıldun.

* * *

Ləbundə İsayi-Məryəm dəxi həyat ilədür,
Cəmalünün sədaqətindən ay zəkat ilədür.

Xəyali gözümə qaçan ki geç gələ tezcək
Könülüm ahin əyərlərü ana at ilədür.

Əgərçi təng dil olursa ağzı olmaya eyb,
Çü xətti hindu saçından ana bərat ilədür.

Könülüm odlara yandıvü söyinməgi yox,
Əgərçi hər gözüm üsdinə bin Fərat ilədür.

Necə ki şeş cəhəti bağlar isə könülə əql,
Nə faidə, gözi biruni-şeş cəhat ilədür.

* * *

Qomadı hicrün yürəgümdə rəməq,
Kiçi barmağun qılalı ayı şəq.

Həlli-yaqut ilə gözüm eşqini
Yazmaq içün saldı yüzə zər vərəq.

Göz yüzini yüzi nuriylə görür,
Ol hədiqə nuridür nuri-hədəq.

Həq eşitdi, gördi səndə göz, qulax,
Səndə xud nə olısardur qeyri-həq.

Hüsni xəttat olalı vardı könül,
Ki bir-iki hərf ala hər gün səbəq.

Sübh bu məktəbdə yanlış oxısa,
Hər səhər vacib olur ana fələq.

Xəttinə bağlandı könülüm bənüm,
Nişə zülfini qılur oldı qalaq.

Sübhdəm girdük gülistana məgər,
Ki həyadan qılmış idi gül ərəq.

Ağzı beli ol işarət bu sərih
Fani olmaxlığa qıldular yasaq.

* * *

Ağzunı anmağa, sənəma, çün məcal yox,
Yoxdur güman ki, qıl belünə ittisal yox.

Al etdi yanağun ki, yürəgümi qan edə,
Bundan lətif aləm içində xud al yox.

Ağzun qan etdi yürəgi, belün tənümi qıl,
Hüsnündə hiç xuba, bəgüm, qilü qal yox.

Çün xətti-istivadadurur hüsni günəşi
Eşqim ilə cəmalinə anun zəval yox.

Ağzundağı gümanuma hiç irməyə güman
Belündəki xəyalümə hərgiz xəyal yox.



Bənümlə bəndə sabit əgər qılmayam fəraq,
İkimüz ortasında, nigara, visal yox.

Qəmzəsi müşg ilə suvarur oxı dəmrənin,
Yürəkdəki yaralara hiç indimal yox.

Əqlün dimağı quruduru dil dili yanar,
Eyni-həyat çeşmədən özgə zülal yox.

* * *

Kim aşiq isə, geçsün noldı özindən,
İş toğru gərəkdür, nə qopısar bu uzından.

Gözümüzə qan irmağı oksükmi olısar,
Çün bağlamışuz bəndini biz əsli gözindən.

Yüzi suyı oldur gözümün k'axıda irmax,
Hər dəm dökə yüzi suyını suyı yüzindən.

Aşiq dili gərək ki, saça odı könüldən,
Sözi bəlürə necə ki söyləyə sözindən.

Bişdi yürəgüm, od dəxi olmazsa nə hacət,
Dilbər hərəkati səkənatiylə tuzından.

* * *

Zülfində neçün düşdi könül çinəmi dersin,
Ol Çinə irişməyə açinəmi dersin.

Ənqasın axır Qaf elinün seydinə cəhd et,
Bir daneyi-dama dəxi sən çinəmi dersin.

Şol yari tapar kim ki, taparsa qamu dində,
Kimi bütə tapar, kimi xaçınamı dersin.

Ol cəm qılur malı ki, hər yana tağıtmaz,
Xoca ola hər kişi ki, saçınamı dersin.

Leyli də tələb olmasa Məcnuna könüldən,
Yol bula idi gözləri köçinəmi dersin.

Dil zahirimisə ağızı yolına anun,
Taşına idi baini içinəmi dersin.

Göz yürəgi qan eylədivü oldı tolu qan,
Uğramaya insan dəxi suçınamı dersin.

Dil gözünə vardıvü anı dutdı oxına,
Rəhm edə xətayi gözi çü Çinəmi dersin.

Qurban dilədi canı qaşun bayramum oldur,
Dedüm ana bu nüqtəyi qoçınamı dersin.

* * *

Qopmadı sənciləyin adəm olalı, bəgüm,
Axmadı hiç gözdə qan bu dəm olalı, bəgüm.

Qəddünə toğru ikən oldı pərişan könül,
Böylə sücud etmədi bil xəm olalı, bəgüm.

Ah yaxardı oda varlığumı dəmbədəm,
Şükr ki, sakindürür göz nəm olalı, bəgüm.

Dilbər ilə dərhəməm, zülfi ilə vərhəməm,
Olmasa vərhəm gərək, dərhəm olalı, bəgüm.

Gisusına tolaşıp badi-həvaya turur,
Yüzdə həyası ilə şəbnəm olalı, bəgüm.

* * *

Dil oynayalum yar yolına canı dəgülmi,
Ol dil ki, canın oynamaya canı dəgülmi?

Ol güni ki, dilər idük əlümüzə girdi,
Yağmaya verəlüm qamu dükkanı, dəgülmi?

Zirə nişə Kirmana apara dili-aşiq,
Zirəyə dəxi saymaya kirmani dəgülmi?

Qoç ilə öküzü dəvənün qanına girmə,
Varlığı ki verdi sana qurbani dəgülmi?



Bir murçəyə gör nəzər edər isə şol göz,
Gözinə gətürməyə Süleymanı dəgülmi?

Lə'li-ləbünün nöqtəsini şərh edər isəm,
Oda yaxalar dəftərü divanı dəgülmi?

Zülfün qaranulığı içində gəzərəm bən,
Zülmətdə olur şərbəti-heyvanı dəgülmi?

Zülfinə tolaşıp, yüzi şəmsinə irişdük,
Təcdid qılalum yenə imanı dəgülmi?

Lə'li-ləbünə qarşu dizin çəküp içəlüm
Yedi dənizi ilə bu ümmanı dəgülmi?

Hər ləhzə təcəllisi ilə bir sənəmi-bikr
Necə ki qız isə, bizə ərzanı dəgülmi?

Əğyar ilə olur neçə mey saf isə dürdi
Biz saf edəlüm eynünə o'yanı dəgülmi?

Fəqr oldı səvadu ana yox kimsə məzidi,
Yekrəng edəlüm bu qamu əlvanı dəgülmi?

Tubi deyəlüm boyuna ki, xoşlığı vardur,
Dəprətməyəlüm sərvi-xuramanı dəgülmi?

* * *

Şəkkər ləbünün nüqli, şaha, pistə nədəndür?
Şol iki hilalün başı peyvəstə nədəndür?

Sərv qədünün fitnəsi bir xəstə neyiçin
Gözdə saçı sevdaları binəşəstə nədəndür?

Qəmzələri cəvşən dələrü yürəgi yarar,
Gözləri gəhi əsrükü xəstə nədəndür?

Zülfündə anun ənbəri tər oldı təmə' xam,
Yüzində qızıl gül olalı dəstə nədəndür?

Könülləri miskin edübən bəndinə salar,
Gösdərür ikən özini şikəstə nədəndür?

Sevda ilə gisusı dili çün dolū qıldı,
Bağlamağa şimdi anı dil bəstə nədəndür?

Şəstində anun bəstə nə ki canı var isə,
Bican ola damından anun cəstə nədəndür?

* * *

Lə'li meyiylə könül bixəbər olmışdurur,
Zülfi həvası ilə dərbədər olmışdurur.

Zülfi qədi-sərvinə çünki ayaxdaşdurur,
Sərvi-xuraman ilə sərbəsər olmışdurur.

Var şu'abi-hüsnünün tuli vəli cümləsi
Lə'li-ləbündə, şəha, müxtəsər olmışdurur.

Guşeyi-çeşməmdürür yar xəyali yeri,
Xeyli zəman qonmadı zira tər olmışdurur.

Gəldi bu üşşaqa ki, vərzişi-eşq edəlüm,
Ta belinə aləmə hər ki, ər olmışdurur.

Münkəsir olur saçun badi-həvadan, şəha,
Yel dəxi bari neçün hərfi-cər olmışdurur.

Yağması gözlərinün vəsfi dilə gəliməz,
Bixəbər edər dili bixəbər olmışdurur.

Əlinə sundum güli öpdivü verdi bana,
Pəs cigərümə dəva gülşəkər olmışdurur.

Gözləri dil elini aldıvü keçdi cana,
Rəhm gərək könülə rəhgüzar olmışdurur.

* * *

Sən sanma ki, bən dünyada bəs yarı sevərəm,
Yardan xəbəri var isə əğyarı sevərəm.

Əyyar idi könlümü gözüm könüli yendi,
Var gözdə yeri fitneyi-əyyarı sevərəm.



Qəddün görəli rəqsini tərk eyləmədi sərv,
Vəcd əhli çü oldı bu səbüksarı sevərəm.

Göz qanı ilə yüzümi yuram anun içün, –
Ki yar xəyali yolını arı sevərəm.

Çün bən ləbi-lə'li ilə imandan uram dəm,
Nişə səri-gisuyi-siyəhkarı sevərəm.

Gözüni imam edinibən qaşuna qarşu
Mehraba sücud etdümü zünnarı sevərəm.

Sevdayisiyəm gisularunnu müfərrəh,
Mətlubdurur lə'li-şəkərbarı sevərəm.

* * *

Canum isən noldı çün cani-cəhansın, bəgüm,
Bu dili-viranədə gənci-nihansın, bəgüm.

Sərvi-xuramanmıdur gözümə qarşu geçən
Ömrmisin, ey sənəm, ki güzəransın, bəgüm.

Bənd isə yılduzum, dutmağıl anı əcəb
Mah ilə, ey şəms, sən çün be qiransın, bəgüm.

Dirligi sənsüz, şəha, əhli-həva diləməz,
Canı apardux sana, çün nigəransın, bəgüm.

Baş nola ki, dil dəxi başdurur cümləsi,
Ayağun içün zira baş səransın, bəgüm.

Bən özümi tərk edüb eşq ilə bir olmışam
Mürvətə sığarmı ki, badi-giransın, bəgüm.

Eşq baharını sən qılmağıl axır be bad
Gərçi ki, eşq əhlinə badi-xəzansın, bəgüm.

* * *

Könül varın oda urdı, təalallah, təalallah,
Qaşun peyvəstə yay qurdı, təalallah, təalallah!

Fəna oldı bu xunin dil ki, qandur varlığı anun,
Ki lə'li dürcini gördi, təalallah, təalallah!

Gərək ki, sala odına özini ənbərasa ol,
Ki udı oduna urdı, təalallah, təalallah!

Ləbünə xud fənadan özgə yol yoxdur, əcəb budur,
Ki dil bu yola yol sordı, təalallah, təalallah!

Giriftarı dəgülmidür nə ki var isə varlıxda,
Saçıyla bir tuzax qurdı, təalallah, təalallah!

Cəhana saçdı bir toxmı ki, oldur mayeyi-qovğa,
Çü dərci xərcə olurdı təalallah, təalallah!

Buyurduğı olısardur baş açup isdəmək gərək,
Olacağını buyurdı təalallah, təalallah!

* * *

Gözi ilə könülümün səqamətinmi deyəm,
Ya qaməti ilə canun qiyamətinmi deyəm?

Qolunda Museyi-İmran mö'cizəsinimi,
Ləbündə İsiyi-Məryəm kəramətinmi deyəm?

Gözün səqamətinimi xumardan deyəyüm,
Ya inhiraf ilə qaşun səlamətinmi deyəm?

Cəmaatun yoluna canın oynaduğınmı,
Ya qoşa qaşuna gözün imamətinmi deyəm?

Tapuna irməyibən dönicək yenə tapuna,
Üduli-cövri rəqibün məlamətinmi deyəm?



Yürəgüm qanlu göziyçün qana gəlməz, nə deyüm?
Zülfi kafirdür anun imana gəlməz, nə deyüm?

Cana gəldi könülüm ta irişə ləblərinə
Təng-dil oldı ağızı cana gəlməz, nə deyüm?

Hindu çərisini hüsnün yasamış yidi bölük
Əql ilə canü könül çün sana gəlməz, nə deyüm?

Bildə könülümə, qaşda canuma yoxdur əsər
Çün alarun xəbəri bu xana gəlməz, nə deyüm?

Yürəgi qan edübən gözüni oxır könülüm,
Bu nə türlü çin olur ki, qana gəlməz, nə deyüm?

* * *

Nə sənə yardan özgə gözümə gəlməz,
Yil dəxi bu həvada tozumə gəlməz.

Qana girəm deyü xəyali gəlməz,
Qana ol dəm girür ki, gözümə gəlməz.

Dilərəm könüli saçından ayıram
Dəlü zənciri oldı sözümə gəlməz.

Rəngi yanağumun görəli yanağın
Çox zəmandur qaçarü yüzümə gəlməz.

Dür dökər gözlərüm nigara dişünçün,
Bu qədər eybi var ki, düzümə gəlməz.

Məstlikdür qılan qamu işi k'ansuz
Bir dikük tah dəxi özümə gəlməz.

Girü qalanın anla cəhdü cidd ilə
Ki ol mə'ani bənüm rümuzumə gəlməz.

* * *

Nə xəstədir gözi ki, canuma müalic olur,
Oxa dutar anı ki, ol həvada xaric olur.

Gecə firiştələri sanasın bu gisuları
Kimisi daric olurü kimisi aric olur.

Təriqi-silsilədən göz gərək idi ki, görə
Ki hüsnünə gecələrincə bin mə'aric olur.

Yüzinə lütfi dəlil olmayınca dil varımaz
Əgərçi saç sağışınca ana mənahic olur.

Nigar əlinə yeridür qılur isəm busə
Ki maliş edər əgər gisudan xəvaric olur.

Gözüm saçun kibi qan-yaş müsəlsəl edə gərək
Ki axıtmayan geyigün göbəyi nəvafic olur.

Könül ki düşdi saçına dəxi qaçan çıxısar
Mədaxil anlamayana necə məxaric olur.

* * *

Gösdərür isən, şəha, aç indi bana sinə
Qəmzən oxına dutam atğıl sinamasına.

Bəhram əgər görə qaşun yasını, şəha,
Hərgiz atımaya ox oldə yayı yasına.

Gözlərün axıncısı dildə qomadı taqət
Anı göribən axır mərdüm bunı basına.

Dün gecə xəyalinün izini basa vardum
Gisusı qoxusıylə yol buldum obasına.

Haşa ki, ola könlüm zülfün ilə şuridə
Mə'şuq ilə aşiqin qıl girməz arasına.

İrməyəli lə'lindən könlümə müfərrih hiç
Mərhəm yazımaz oldı dildəki yarasına.

Gözləri oxa dutub aldı dili zülfindən
Hiç kişi inanmasun çərisi qarasına.



* * *

Ey necə miskin könül olmış saçundan xaksar,
Vey necə sevdayi-canlar kandan olmış biqərar.

İxtiyarum çünki yox şol ixtiyara irməgə
İxtiyar oldur ki, qılam bunda tərki-ixtiyar.

Tarumar olduğumu dutma əcəb şol gisudan
Hər bölügü bir çəridür anunü hər tarimar.

Qanlu yaşı eşq əri necəsi gizləyi bilə
Baxıcax pəs bəllüdür gözdə ki, yüzündən axar.

Eşq əri bu xakiyə irdi suyın qıldı həva,
Bu həv oduna yandıvü duxan oldı buxar.

Ardan gəl arı olu namı namı qılmağıl
Əhli-dil qatında olur nam ilə namus, ar.

Gizləməgil xalüni, şəha ki, ol həm danədür
Dini-islamun içində cayiz olmaz ehtikar.

Ləblərün bini fəna qılmağa və'd etmiş idi
Zülf ilə işüm uzandı həddən aşdı intizar.

Şol belündən ki, yarar incəlik ilə yüz qılı
Dutayım ki, muşikafam necəsi bulam kənar.

* * *

Necə necə səri-zülfündə piçü tab olısar,
Yürək toluca şərabü cigər kəbab olısar.

Könülə gah cəmalün gəlürü gah xəyal
Dü padişah ilə bu il dəxi xərab olısar.

Gözüm yaşı ki, suyidi ləbünlə döndi qana
Əcəbləmə yürəgüm qanını ki, ab olısar.

Susamışuz ləb ilə yadına tolu içəlüm
Şərab dəxi gözümüzə çün şərab olısar.

Dəvayi-dil çü ləbindən soram təriqi-əql
Budur ki, söyləməz isə dəxi cəvab olısar.

Həzara dəftərü divana sığmaya eşqim,
Sanurmısan ki, anun şərhi bir kitab olısar.

Niqab dutma nigara ki, gözlərüm yüzünə
Baxamaduğı dəxi yinə həm niqab olısar.

* * *

Taqi-əbruda oturmış türki tir-əndazı gör,
Fitneyi gögə yetirmiş türrei-sərbazı gör.

Əqli yolundan azan toğru yola həm ol düşər,
Cəhd qıl əqlün var isə sən bu yoldan azı gör.

Gözlərün qəmmaz olıban halümi yara çaxar
Dilbərüm adil degildür xoş görür qəmmazı gör.

Sinəpərdaz olmaq içün yaxdı varlığın oda
Bu qəfəsdə bir nəzər qıl cani-atəşbazı gör.

Yüzi xod yandurdı bini şəşdi sinə bəndini,
Sinəmək içün bənimi işbu sinəbazı gör.

* * *

Güldür yüzün nigara ləbün xod şəkər durur,
Sevdayi könülümə əgər gül-şəkər durur.

Sözi mütəvvəl eyləyiməzəm saçun ilə
Ağzunda nəm ki, var isə xod müxtəsər durur.

Mərdümligi gözündən umaram, nigara, bən
Bən qul olam gözünə ki, sahibnəzər durur.



Eşqimi surətünə könülündə eylə nəqş
Ki, ana zəval yox, zira nəqşi-həcər durur.

Bini özindən ayru göribən cəfa qılur
Ol binəziri gör ki, nə mühməl nəzər durur.

* * *

Könülüm gisularun bağına divanə gedər,
Görmədin qılca cəfa noldı ki, divanə gedər.

Canı xoş saxla saçundan ki, gəlür arizuna
Kafiristanı qoyub sidq ilə imanə gedər.

Bağladun könüli saldun bu zənəxdan çahına
Gör ki, zindana, şəha, necəsi rindanə gedər.

Ləblərinə gözi can gətürürü bəndə könül
İşbu meyxanədə hər dəm bu hərifanə gedər.

Can ilə əqlü könül varlığı cananə fəda,
Neyi ki, isdər isə eşq ilə cananə gedər.

Gözünün zaviyəsində görəli mərdümi dil,
Xəstə olduxca həm ol guşəyə mehmanə gedər.

Sübhdəm xəstə gedər idi gisusına dedüm
Gör bu dərmandə ki, nə dərd ilə dərmanə gedər.

Dün hilali qaşunu göri dedi şiri-fələk
Ayağı tozıyilə qoç kibi qurbanə gedər.

Bu sənayilə Sənayi çün sən ayı görimez
Gər sözi farisidür söz hələ Səlmanə gedər.

* * *

Nə cansın sən, bəgüm, bu can içində,
Ki tövhid oldun uş iman içində.

Nə dərmansın ki, dərdün zəhri-qatil
Nə nuşin dərdsin dərman içində.

Bu əql cövhəri dil-təng düşdi
Çü gördi lö'löyi-mərcan içində.

Saçun çövkan, zənaxdanun durur guy,
Sən apardun topı meydan içində.

Gözümün aydını, şəha, yüzündür
Ki, nuri-eynsin insan içində.

Nə soruşmax durur şol ləblərində
Əgər buldum şəkər bən kan içində.

İki qardaş olamı ləblərün tək
Ki, ləb bər ləb dururlar qan içində.

Sözüm göyə yetə gər qəddüni bən,
Ögərsəm nəzm ilə övzan içində.

Nə zalim cadular şol xuni gözlər
Ki, gözlər canı bu mizan içində.

Tapundan mümtəni olmax nə vacib
Çü yox sinün kibi imkan içində.

Yüzün mahiyyətin sabit edəydik,
Çü yox eynün kibi əyan içində.

* * *

Mövc urur könlüm dənizi yenə heyrandur nədən,
Gözlərüm çün əbri-nisan oldı, rizandur nədən.

Gözlərüm qanlar dökərü ləblərün qan somurur,
Qaşlarun peyvəstə yə'ni toğru mizandur nədən.

Rəqs edər şərun sənün hər yilə bərbadi-həva
Fəthi-babi-şi'rdür bu nəzmi-övzandır nədən.



Dil saçunla ağuzundandur pərişan oldı təng
Hücrei-qəmdür könülüm beyti-ehzandur nədən.

Can belündə ki girandur yox durur ana mahal
Ağızunda necə ki, təng isə ərzandur nədən.

Bənizüm oldu saru eşqin xəzanından, bəgüm
Bu həvayilə vücudum cümlə lərzandur nədən.

Gözlərüm ceyhuni-xun olıb axarlar hər yüzə,
Bu yürək bir çeynəm et ortada suzandur nədən.

* * *

Saqi, sabaha dəkin ələ sun əyaqi sən,
Sayğıl qənimətə bu nəfəs ömri-baqi sən.

Gözlərünün meyliyilə əsir et bu canumı,
Qıl tatlu lə'li-ləblərün ilə məzaqi sən.

Peyvəstə göz durur sənəma qaşda gözlərün
Xali qaçan qodun, ey bəgüm, işbu taqi sən.

Bədri cəmalünün, sənəma, yox məhaqi heç
Bənzər məhaqə ki, gəmişirsin məhaqi sən.

Zülfüni qo ki, badi-həvayilə oynasın,
Bərkit, nigara, bizüm ilə ittifaqi sən.

Könlümə bin ki, hüsnüni göylərə irürə,
Cayizmidür bəgənməyəsin bu bəraqi sən.

Ol bindən ayrılursa, canum təndən ayrılur,
Dutma səbük yürəgümə işbu firaqi sən.

* * *

Necə bir eşqi odı bini yaxar,
Necə sevdayi zülfi başa qaxar.

Cani lütf ilə xod ləbi aparur
Gözləri qaşda göz durur ki, baxar.

Gözə ağzun xəyali gəlalidən
Lə'l ilə lö'lö irmax oldı axar.

Pərdə qıldum qanı sarı bənizə
Bu dəxi bədtər oldı eşqi çaxar.

Yürəgüm göynər oda ağızunı,
Ur ağızuma gör ki, necə qoxar.

* * *

Şəha, ləbünə olmış bu can ilə tən təşnə
Ol təşnə qanumavü ol təşnəyə bən təşnə.

Hər nəsnə ki bəndə var, sər cümləsi səndədür
Bilsəm kı, nədür ol ki, ana olasən təşnə.

Ey qanıma susamış qızardımaz eşqi
Qan sana susamışdur, ey bu qana sən təşnə.

Mərdanə dərəm bir söz mərdanə bu eşqimdən
Bən qulıyam ol camun k'ana nərü zən təşnə.

Lə'lünə nigarına bən təşnə yalunuzmu
Təşnə dəgül irməyən həm yenə irən təşnə.

* * *

Kimdür ol ki, ayağunda sər qomaz,
Gözdən incüvü yüzindən zər qomaz.

Şöylə ki, qəmzənə bən yürək qodum
Dünyada hiç kimsənə mərmər qomaz.

Eşqi ol yarun həqqin bünyadıdur
Kəndi bünyadını ol əbtər qomaz.

Bən qızartmax diləməzəm bu siri
İlla nedəm badei-əhmər qomaz.



Dərdün ilə zəhr içərəm dünü gün
Ölməyə lə'li-ləbi şəkkər qomaz.

Eşqi nə büt qodı, nə xod büttiraş
Büt şikən çün irdi hiç Azər qomaz.

Hər dəm ölüb dirilirsin, aç gözün
Bir nəfəs xod sini biç məhşər qomaz.

Eşqi kəşşaf oldı sevmüz örtülü
Kimsənün bilündə ol meyzər qomaz.

Eşq odına varlığundan kəs ümid
Qopıcax kimsədə xüşkü tər qomaz.

* * *

Sən qənisin, aşiqin dərvişmi,
Bidilü sevdayıvü dilrişmi?

Də'viyi-iman edərsin, ey könül,
Sevdügün mə'şuqə kafirkişmi?

Lasını illa sanır könlüm bənüm,
La ləbindən canumuza nişmi?

Yalquzaqdür yarü xişi yox anın,
Bizi dəxi isdər ol bixişmi?

Eşq əlindən dad dilər bu könül,
Bizə gərək özgələrə mişmi?

* * *

Ərz etmə bana dünya mətaını yox tanum,
Urdum saçun ilə eşq səmaını yox tanum.

Can eylə düşdi hüsninə şol bədr yüzünün,
Günəşdən edinürsə qına'ını yox tanum.

Bən səni sevərəm dəxi, nəsnəni sevməzəm,
Lə'lün şəkərdən asa fuqanı, yox tanum.

Zülfün bəni belinə çəkər, ləblərün qomaz,
Bain həme çəkər bu nizamı, yox tanum.

* * *

Ey kəmalin isdəyən nöqsan dəgülmidür sana,
Kamunu dildükləri ehsan dəgülmidür sana.

Gəlməyən imana halini sana didükləri
Ər isən insafa gəl iman dəgülmidür sana.

Ruhi ki, ülvi durur buraxmağil bir çaha sən
Səndə mürvət yoxmudur mehman dəgülmidür sana.

Xakiyi ərşi düzərsin dəxi nazlanurmusan
Böylə bazar, ey dəlü, ərzan dəgülmidür sana.

Dək hərimi-kə'bəi-iqbalə irürgil bəni
Virdügün varlıx, şəha, qurban dəgülmidür sana.

* * *

Yüz cəmali zülfinün vardur ki, şəmsün qılı yox
Şəkkərün sözün ilə xod hiç qalü qilü yox.

Sərvdə can qanı ki, həmsər qəddün ilə
Lə'lün ilə püstənün xəd ağı vardur, dili yox.

Gözünün tə'lili içdə taşa zahirdür, şəha
Nərgisün ol illəti var isə xod tə'lili yox.

Vəsmdən günəş cəmalində sual etdüm dedi,
Misri hüsnümi görənlər deməsün ki, nili yox.

Dəhr nətində cəmalün yek süvarə şahdur
Xublara rüx bər zəmindür, əsbi getmiş, fili yox.



* * *

Düşdi könül incə bilünə, ya qıla bari
Filcümlə nə sevda qıla ya nə qıla bari.

Badi-səhəri nəql qılur müşg qoxusın
Urma anı vərhəm nə qoyuna qıla bari.

Ud olur isə odına canum zihi dəmdür
Hiç olmasa yar micmərinə yaqıla bari.

Saqi, ətəgün çərməyinün ilə əyax dut
Sa'id ələ gər girməz isə saq ilə bari.

Dünyayilə bilməz ki, nəsin bin dəm urursın
Çünki dəm urursın şəhi-müştaq ilə bari.

Pərvanə kibi yanmağıdur carü cübbəsi
Hər nə ki qıla dil yinə yana qıla bari.

Ol xuni-cigərdən qanısar əvvəlü axır
Qanmaq içün ol cəhdini qana qıla bari.

* * *

Ləbündən busə apardum nigarına nə qan oldı
Ki cana cadu gözündən bu fitnə nagəhan oldı.

Qorux tək şəmsi odına əgər yanmaz olur isən,
Həlavət bulmayısarsın həzəran imtəhan oldı.

Könülüm təngdür dersəm düşər lə'lünə bir nöqtə
Tənüm qıldur deyəyüm çünki sözüm dərmiyan oldı.

Canum irəli sən cana sanasın cana irdi tən
Tənüm dəxi bu vəslətdən yəqin bildüm ki, can oldı.

Könüli ləblərün aldı dutarsam yoxmudur həqqim
Ki, ol sərgəştə heyrana zəmandur ki, zəman oldı.

Əcayib qəmzəsi vardur ki, uralı cigərdə ox
Qədüm ox kibi toğruykən qaşı kibi kəman oldı.

Canın canana tərk edən birini binə dogşürdi
Canını kim ki tartındı, yenə ana ziyan oldı.

Həva açdı hova sirrin gecə getdivü sübh oldı,
Dəxü şəkkünmi var sənün bu sir çünki əyan oldı.

* * *

Fəraqun odı ilə bən nəfir ayıdur isəm
Cəhan yigidi qamusı qərir ayıdur isəm.

Bu fülfüli bənünün dildəgi hərarətini
İki cəhanü fələklər oyir ayıdur isəm.

Nigar zülfi başını ki, məşrəbi birdür
Vücudi hər dü cəhan ola bir ayıdur isəm.

Könül oğrılığa vardı nigar arizinə
Saçında ola müəbbəd əsir ayıdur isəm.

Könül ki, düşdi işigündə toprağa şəha,
Qılalar anı qan ilə xəmir ayıdur isəm.

İçümdə yandı odu başda bişdi yüz sevda
Olamı eyb adunı nagüzir ayıdur isəm.

Tenüm ney oldı həva toldı anda qayətdə
Nola sifatuni bən bamü zir ayıdur isəm.

* * *

Qəmzən nişə bu aşiqə bir tiri əsirgər,
Zülfün nə içün dəlüyə zənciri əsirgər.

Yaxdı bəni odına işüm olmadı altun,
Eşqi nişə bu bəqirə iksiri əsirgər.



Məşşatə saçın gizlodi yüzi yörəsindən
Ol fitnə məgər ləşgəri-kəşmiri əsirgər.

Bən kəndü vücudumu fəda qılmışam ana
Türfə bu durur bana ki, şəmşiri əsirgər.

Öldürməgü diriltmək anun əlinə qaldı
Tə'cilə qədəm basmazü tə'xiri əsirgər.

Bən qul olayım lütfünə ol dilbərümün ki,
Məhbubi durur xalisü təzviri əsirgər.

* * *

Saqiya, yenə bizə bir toluca badə gərək,
Bu dəmə irməyibən baş verələr bada gərək.

Kim ki dilşadı sevərsə qıla şat gözi yaşın,
İrürə yaşları ayağını Bağdada gərək.

Pazişahı sevənün səbri gərək ki, çox ola,
Xoş təhəmmül qıla ol dad ilə bidada gərək.

Beli bağlu, yüzi bürqədəvü saçı pürbənd
Yalunuz sərv qədini sayam azadə gərək.

Şəh qulıyam, anı kim ki gərək isə bilür,
Bəni qul eyləməgə bir şəhü şəhzadə gərək.

* * *

Bimar isə gözün, könülüm xəstə dəgülmi,
Hər bir xəmi-zülfünə bu can bəstə dəgülmi?

Gül yüzünəvü sünbüli-zülfünə bənəfşə
Hüsnündə ol ikisi dəxi dəstə dəgülmi?

Başın gögə yetürdi qədü zülf ayağ öpdi,
Bər bəstə biri, birisi bər rəstə dəgülmi?

Məğzin çıxaram püstənün əgər ura finduq
Lə'lin ağızınun adı şəhpistə dəgülmi?

Hər qəmzə ki, atar cadu gözi yürəgümə,
Bir camdurur ki, duta bu məstə, dəgülmi?

* * *

Biliməz bəni ki, dilbər nə ilə yaxa oda,
Neyü dəfdən mədəd isdər ney ilə yaxa oda.

Meypərəstəm ləbini görəli həm kəndü bilür,
Tolu əyax biribir ki, mey ilə yaxa oda.

Təni gözləri qılur mürdə bu uzun gecədə,
Ki xumarın yazıban ta hey ilə yaxa oda.

Məsti-meyxanə yüzü qanı bizə ol dövlət
Ki meyü meyxorü meyxanə ilə yaxa oda.

Biz dəlüyüz, bizə ol gişi qıla bilə dəva
Ki, bu dəlüyi dəva xanə ilə yaxa oda.

* * *

Niçə gözümdən dökər qanı diləm bilməzəm,
Dökdügi gözüm nədür qanı diləm, bilməzəm.

Dil qılan işbu dili can idi axır, şəha,
Şimdi niyə yetürür canı diləm, bilməzəm.

Qəlb dilər ki, ola döyməyə yar odına,
Hiçmi dilər qıla k'anı diləm bilməzəm.

Gözə qomaz ki, gələ yüz qan ilə bir xəyal,
Göz qanınamı girür canı diləm bilməzəm.

Nəqş edimez nəqşini səfhəsi üsdində hiç,
Gözləri məstimidür Mani diləm, bilməzəm.



* * *

Həq çün irürür dilbəri kəmalə gərəkdür,
Bir badi-həva könüli kim alə gərəkdür.

Sərvün talıdur qəddi nola qondı isə dil
Hər bülbüli-şeyda qona bir talə gərəkdür.

Şol dam ilə danə nə quşa layiq olısar,
Can ilə dil ol gisu ilə xalə gərəkdür.

Öz sirrini yanında gişi ki, gözi görməz
Tapmağ içün ana səri-gusalə gərəkdür.

Can nola ki, hüsnünə bəha ola, nigara,
Yüz can ilə dil ortada dəllalə gərəkdür.

* * *

Kim dedi ki, gözün şəhi-badam dəgüldür,
Qara gisuların ağı badam dəgüldür.

Zülfünə tolaşdux dəxi, ayrılmağumuz yox,
Hər həlqəyi dutmax şəhi-sevdam dəgüldür.

Uzun gecələr anca könül yandı saçunçün,
Ənbər təmə'i könülümə xam dəgüldür.

Gündüz nola gər əsrüg isə şol cadu gözlər,
Divşür saçunı ki, görəlüm şam dəgüldür.

Könülümə kim dəlü derü kimisi əsrük,
Ləbləri qılur yüz qanü bədnam dəgüldür.

Bən xasiduğum bilürəm andan ki, cəfası
Aşiqlərə hiç bənciləyin ам dəgüldür.

Yar isdər isə, yarasına qatlana gişi,
Azar ilə bazar edə ilzam dəgüldür.

* * *

Tərk etməgə yolunda, bəgüm, cana qalmadum,
Dini saçuna oynadum imana qalmadum.

Məqsudi-afəriniş özündür həminü bəs
Əglənimədüm issisinə, yana qalmadum.

Kövneyn himmətümün iləyində çöpcə yox,
Kövneynə kim nəzər qıla imkana qalmadum.

Ta kim bu eşq dərdini bən vird etmişəm
La-həvlə əglənimədümü cana qalmadum.

Bu xaki cismi eşqinin odında yaxduğum
Budur ki, yə'ni kövn ilə bən kana qalmadum.

Çərxün cəhanda göribənün bivəfalığın,
Eşq odına yaxub anı fücanə qalmadum.

Düşdüm bu küncə gəncini Qarunun anmadum
Divü pəri nə ola Süleymana qalmadum.

* * *

Dilə dil gərək ki, deyə dilümün nə dili vardur,
Saçunun belünə qarşu, sonəma, nə qili vardur.

Könülümdə eşqin odı qəvi saxlamış, sanasın,
Ki oda yaxar könüli, sanasın, fitili vardur.

Dil əgər yoğ isə dili sənün ilə olmasun hiç
Neçə k'anı yox edr isəm, yenə baxsa dili vardur.

Nə qəm ana gər ölürsəm yolına ki, bənciləyin
Gözi qəmzəsiylə hər dəm iki bin qatili vardur.

Canı gər səbil edərsəm, yolına yolı var anun
Ki qamu dil ilə canun ana bir səbili vardur.



* * *

Eşqin vilayətinə necə ki səfər düşər,
Divanə başuma həvəsi-tərki-sər düşər.

Zülfün qatında qısadurur ömr qissəsi,
Ağzun qatında can ilə dil müxtəsər düşər.

Ayağunun tozı ilə zülfündürür, şəha,
Ki eşqinə yananlara tacü kəmər düşər.

Göz guşəsinə çünki xəyalün qədəm basa,
Yürək kəbabı eşq ərinə mahəzər düşər.

Könül evində gözi imarət qomadı hiç
Mə'mur qaçan ola şol ev ki, tatar düşər.

* * *

Şol lə'li-ləb ki, göz gəlicək şəkər dökər,
Sorsam nə eyb ola ki, nədən bu hünər dökər.

Qan dökər isə lə'li-ləbi anadur fəda,
Şirin söz ilə gör ki, nə dürrü gühər dökər.

Layiq dəgül ki, söhbətinə şəm ola günəş,
Ol nuri-rövnəqi nola k'anı qəmər dökər.

Mə'şuqə biniyazdurur muşdulıx bizə,
Ən'amin əhli-eşqinə zirü zəbər dökər.

Gözüm aduna altuna nəqş etdi sikkəsin,
Şimdi xəyalün ayağına uşda zər dökər.

* * *

Sən paydar ol ki, bu aləm gəlür, gedər,
Eşqin irilməsün ki, bu adəm gəlür, gedər.

Sən sanma ki, dəvamı ola bu vücudunun,
Zira vücud zatuna dəm-dəm gəlür, gedər.

Bu dünya varlığını şuna bəzədür könül,
Ki sübhgəh vəqtinə şəbnəm gəlür, gedər.

Hər bir nəfəs can gəlürü yenə həm çıxar,
Dəm-dəm gözümdən işbu yola dəm gəlür, gedər.

Hiç kimsənün bu dünyada yoxdur səlaməti
İlla, xəyali-yar müsəlləm gəlür, gedər.

* * *

Şəha, belünə bağlandum ki, qıldan dəxi narindür,
Ləbün qatında şəkkərdəq sözüm qayətdə şirindür.

Sənubər qəddüni gördi, sənubər şəkl könülüm
Anunçün hər dəmüm hər dəm bu övsafunda narindür.

Xəyalün gözümə gəlsə, vüsalə sayaram anı,
Gözüm tə'biri öгrəndi, sanasın ibni-Şirindür.

Miyanun qılmayam bən ki, miyanundan xəbərdaram,
Saçun qılı dəgüləm ki, miyanundan kənarindür.

Gözi qəmzələri yırmaz gözümi yüzi gülindən,
Ki mərdümdən eşitmişüz ki, güllər cümlə xarindür.

* * *

Varlığun varlıx dəgüldür, sayədür,
Bir-bir əhvalün deyəyüm saya dur.

Hər zaman yox sanuları özünə
Var sanuban səd həzaran vayədür.

Varlığunı qılma yox yoxlıxda sən
Ki, iki aləmdə sana sərmayədür.

Özüni bil andan özün-özini
Zira bilmək dəxi payə payədür.

Eşq odın dildən gidermə, ey həbib,
Aşiqə suzi-cigər pirayədür.



* * *

Sən də bir seyr eyləgil zira ki, kuhi-qafsın
Var, bizə hərf eyləməgil eynü şinü qafsın.

Dürdeyi-dərdüni toldur sun bizə, saqi, tolu
Bizə yetər bu qədər dəxi ki, eyni-safsın.

Səndə, ey dilbər, görimez gözlərümüz qeyriyet,
Ey nigarın qanı ol mövsuf əgər övsafsın.

Cövhərisin lə'lün ilə qəlbə arifsin qatı,
Bel ilə naziklük içrə şöhrəmü şikafsın.

Ey könül, gər aşiq isən, yan yolına dilbərün
Külli kül olğil ki, cüzü cüz olursan, lafsın.

* * *

Bir dil qanı ki, yana odına bu nigarun,
Bir mey qanı ki, ola dəva işbu xumarun.

Əhd etdün zülfün ilə badi-həvaya,
Düşdi könülüm zülfünə, sor qanı qərarun.

Bən belün ilə ortaya düşdümü qıl oldum,
Ey beli qıl, axır bana de, qanı kənarun?

Fərşiyəm ayağunda çi gər ərşi idüm bən,
Tərk eyləmişəm sənün içün darü diyarun.

* * *

Nigara, eşqinə qarşu nə canı var könülün,
Sanurmısın ki, ol odda məkanı var könülün.

Həzar könüli bir dəmdə eşqin oda yaxar,
Məgər ki, lə'li-ləbünüzdə kanı var könülün.

Həzar can səri-zülfündə xaksar olmış,
Ol ortada nə sanursın, nə sanı var könülün.

Ləbi girürsə əlümə, dutısaram anı bən
Ki, girmə xuni-dilə, zira qanı var könülün.

Xəyali könlümə binmiş gətürdi gözlərümə
Qul olayım bu dəmə ki, yamanı var könülün.

Nə canü nə dilü nə əqlü nə tənü varlıx
Ki, canı verməgə gəlsə, cəhanı var könülün.

Könül nə şərt qılursa, anı qəbul eylə
Ki, qullığında sənün yüz zamanı var könülün.

* * *

Sən bəni ki bəndən aparursın, nə qılursın?
Eşqini ki bəndən qoparursın, nə qılursın?

Varlıx qomadun bəndə qamusını apardun,
Bu eşq evini ki, süpürürsin, nə qılursın?

Toymadı məgər məst gözün dil qanına ki,
Hər qılda sücidən küp urursın, nə qılursın?

Gözümdə xəyalün kibi oturmışam uş bən
Ey qəddi ki, bər pay turursın nə qılursın?

Bən ki belünün qılını qılca görimezəm,
Qıl olmışam, uş sən ki görürsin, nə qılursın?

* * *

Bu hüsnü cəmalü bu məlahət nerədəndür,
Bu zövqü kəmalü bu lətafət nerədəndür?

Buncavü şərü şurivü pərişanı könüldə
Ki qıldı həva badi-hekayət nerədəndür?

Könlüm qapusını qaxıban peyki-səbahi,
Şol sözi ki eylədi rəvayət, nerədəndür?



Qurandağı ayətləri dersin ki, anundur
Hər guşədə yetmiş neçə ayət nerədəndür?

Dirilik ilə bilməkü eşitməkü görmək
Ey xak, sana qıldı sirayət nerədəndür?

Hər ləhzə fənasını fəna edərü varlıx
Dedüm sana irər bu himayət nerədəndür?

Gər lövhə qələm cari dəgülmisə nigara,
Könüldə bu xəttü bu kinayət nerədəndür?

* * *

Bağa qiyamət qopar bu sərv qədindən,
Lərzə düşər tubiyə dəxi həsədindən.

Əhli-dilün könülin tapundan ayırma,
Yoxsa gərək ayrıla canı cəsədindən.

Şəms yüzün bürci şiri-dil könülidür,
Şəmsi ayırma, nigara, bu əsədindən.

Ey əhadiyyü'l-cəmal, əvhədi-eşqəm,
Cəhd edü ayırma əvhədi əhədindən.

Nikü bədin görmişüz bu vəsl ilə hicrün,
Lə'l əyağun sunü keç bu nikü bədindən.

Kirpüginün neştəri qan ala cigərdən,
Şol ki, qan alına yağlığ ilə xədindən.

Zülfi qədi-sərvi ilə qıldı tətavül,
Yüzi dəpildi yerə çü çıxdı hədindən.

* * *

Nə günəşsin, ey dilbər, simək ilə səməkdən
Ki, toğımadı bir ay sənün kibi fələkdən.

Nə insansın, ey canum, gözi insani yüzi
Ki, gəlmədi sənün tək pəri ilə mələkdən.

Dəvə qəlbirə geçər nigarun gisusında
Keçəmi dəlü könül əcəb şə'r ələkdən.

Diləgün bu isə ki, dilək olmaya dildə,
Müti'üz bu diləgə geçərüz bu diləkdən.

Könül quşı ucından gözi bəni yaralar,
Ki quşa toxınan ox ola yenə yeləkdən.

Əyağı tolu sunğil bənə saqi əlündən,
Ki görəm yədi-beyza bu canumda biləkdən.

Sənün hüsnünə eşqüm dilü can aparurdı,
Saçun beldə taladı ki, nə ki vardı bələkdən.

* * *

Könül nə quş ola saçuna ilməyə, bəgüm,
Şəhdanə bənlərini məgər bilməyə, bəgüm.

Laçin gözün ki, necə baxırsa dili silər,
Layiqmidür ki, qanlu gözi silməyə, bəgüm.

Dildə neçə ki, artuğ ola eşq odı közi
Gözlərümün yaşı közi əksilməyə, bəgüm.

Saildürür gözüm yaşı lə'li-ləbün içün
Heçə bu sailün yaşı sayilməyə, bəgüm.

Ol əyağ içdi dil, sənəma, lə'l cam ilə,
Ki ömri neçə var isə ayilməyə, bəgüm.

Əhd etdi ayrulığ ilə bu dəlü könülüm,
Ki neçə ömri var isə, ayrılmaya, bəgüm.

Dar etdi sərvinivü kəmənd etdi zülfini,
Mənsur nə qıla idi k'asılmaya, bəgüm.



* * *

Ləbün həyata irişdürmədük cəmad qomaz,
Cəhan ilə bilişür ortalıxda yad qomaz.

Sun imdi cami-Cəmi toptolu sən əlümüzə,
Ki sərxoş eyləmədük Xosrovu Qubad qomaz.

Bu xaki qüsl edübən göz yaşına kəndüzümi,
Salaram oduna ki, başda dəxi bad qomaz.

Qaşun ilə gözünü zülfünün əsiri olam,
Ki səndən özgəyə dilrihür e'tiqad qomaz.

Qaşun çü əgriligə bitdi eşq əhli ilə,
Gözünlə mərdüm arasında ittihad qomaz.

Cəmali şöylə qılur kəndüzinə müstəğrəq
Vücudumı ki, ana dünyada bir ad qomaz.

Fənadurur bu cəhan vermə ana kəndüzüni
Ki ol gişi qucağında, bəgüm, murad qomaz.

* * *

Nə lətif dərdi vardur ki, bəni dəvaya yiltər,
Yüzi suyi ol xakün ki, bəni həvaya yiltər.

Gözüm ilə qulağumdan nələri görüp eşitdüm,
İkisi dəxi könüli yenə masivaya yiltər.

Könüli ayax tozında salar odına nigarın
Məgər oldurur dəva ki, anı kimyaya yiltər.

Şəhi silsilə saçun gər bana gösdərür kəməndi
Qaşuna, gözünə qulam ki, ox ilə yaya yiltər.

Gözünün bir oxı yegdür könülümə nəqd andan,
Ki qaşun yüzünlə nisyə bir, iki, üç aya yiltər.

Könülüm quşı ki, sərçə ana görədür, çü onqa
Nişə düşməyə ləbünə ki, anı hümaya yiltər.

Qaşuna de kirpük oxın bu yürəgə bunca atma,
Ki səni bu iki əsrük bəmişə xətaya yiltər.

* * *

Nə sayru can ola ki, lə'li-ləbi qəndi dəgül,
Zəhi dəlü ki, anun gisusı kəməndi dəgül.

Nə tatlulıx bula ömrində ol dəlü ki, anun
Dimağına irişə tatlulıx ki, qəndi dəgül.

Nəcəsi mö'min ola ki, sücud qılmaz ana,
Nə mövləvi ola ki, gisuları bəndi dəgül.

Kişi ki, təziyəsin canınun tamam etdi,
Nə gişi ola cəhanda ki, rişxəndi dəgül.

Həzar canü həzaran dilü həzaran əql
Hənuz layiqi-nə'li-sümi-səməndi dəgül.

* * *

Sayəsiyəm, leyk bən ol sayəbanun qulıyam,
Barmağı atduğı oxam, ol kəmanun qulıyam.

Bəni ayırdı özindən ki, dəxi yaxın qıla,
Sudum oldur bu cəhanda ol ziyanun qulıyam.

Gözdə belün yüz xəyal edər anun bən qulıyam
Dildə ağzunçün güman edər gümanun qulıyam.

Bəhri-eşqindür gətürür kan ağızun lə'llər,
Çünki məqsudum buluram bəhrü kanun qulıyam.

Bu tənü candağı ləzzət ləzzəti-mə'şuqədür,
Bən anı bilməz dəgüləm cismü canun qulıyam.



Ləblərün qanlumdurur dutaram anı lütf ilə
Nazikü şirinü tər düşdi, bu qanun qulıyam.

Bu əmiri-nəfsü valiyi-həvadan nə qayu,
Gər bana təhqiq isə işbu ki, xanun qulıyam.

Gözümü qulağumü dilüm qamu sənsin, şəha,
Bən bu qulağ ilə bu gözü zəbanun qulıyam.

* * *

Qoymadı canü könül mahi-dü bəftə neçün,
Qalmadı lə'li ilə sirri-nühüftə neçün.

Qaşı göziylə ləbi taq ilə cüft oynadı,
Düşdi bu divanə dil taq ilə cüftə neçün.

Gözi ilə könülüm içdilər əyax bilə
Bu nişədür dər qalaq ol yata xüftə neçün.

Bən ağızun sirrini cümləyə faş edərəm,
Söyləyə bənüm dilüm razı nəgüftə neçün.

Cövhəri fərd ağızun xuni könül cövhəri,
Dökə anun yolına dürri-nəsüftə neçün.

* * *

Səri-zülfinə baxun, müşgi-səmənsayı görün,
İşbu başumda bənüm bu sərü sevdayı görün.

Dü cəhan səndədürür cəmü könülümdə tapun,
Xəlvəti təngün içində qamu qovğayı görün.

Bürqə altında gözi qəmzəsini urdı dilə,
Atıban oxlarını gizləmiş ol yayı görün.

Gəhi boynuma tolaşur saçı, gah ayağ olur,
Bisərü pay ilə oynaduğı sərpayı görün.

Bəhri-eşqin dilər isə ləbinün bu dili-təng
Müxtəsərliğ ilə billah bu dəvayı görün.

Çürimiş sünügümüz dirilәsin söyləyicək
Məryəmi-İsa dəmiylə dəmi-ehyayı görün.

Yedi dəniz könülümdəvü ləbündür qədəhi,
Nöqtədə necə sığar bu yedi dəryayı görün.

Könülüm zülfünə düşəli düşər qıl belünə,
Qılı qıldan seçəməz bu dili-hərcayı görün.

Qanı göz ki, dili qurban edibən görə anı,
Qaşı taq üsdinə turmış ki, gəlün, ayı görün.

* * *

Dil həbsdədür zülf ilə şol xal arasında,
Al qanı dökər gözlərüm ol al arasında.

Sözün şəkərü gisularun ənbəri-tərdür,
Can qədri nədür qil ilə bu qal arasında.

Ələmə şəhün eşqi girüpdür bana yetər,
Aldı diləgin hər kişi al al arasında.

Bən gözlərinün xəstəsiyəm, nə ola təsrif,
Lə'li-ləbidür tibb ilə ə'lal arasında.

Gisusı nigarun ayağı tozın ələrdi,
Bəgəndi bizi dəxi bu qərbal arasında.

* * *

Can toludur ləbləründə zi hədisi-müxtəsər,
Dəxi söz deyiməzüz ki, külli şirbin müxtəsər.

Şükr qılğil k'ol nigarın yaxşı bilməz hüsnini,
Ey özindən bixəbər, bütdən özindən bixəbər.



Eynun olaydum və leykin gözləründə görürəm,
Göz özinə qılmamışdur ömr içində bir nəzər.

Zülfi tək yüzi yerə sürüp gərək pamal ola,
Ta dili-miskin ola bilə qədiylə sərbəsər.

Sormağa üşənürəm lə'li-ləbindən bunı ki,
Zülfi sevdayisinə nə işə verməz gülşəkər.

Həlqeyi-zülfünə çünki irməz əlüm fitnədür,
Həlqeyi-dər qaxaram hər bir qapuya dərbədər.

Eyn gözi ilə nun qaşı apardı könlümi,
Sorunuz şol nəhviyə ki, an dəgülmi hərfi-cər?

* * *

Nigara, lə'li-ləbün badeyi-çəkidəmidür,
Gözün kibi, əcəba, gözi didə didəmidür?

Yolunda badeyi-sərməst nişə dilxundur,
Tapunda şəmi-cigərsuz sərbüridəmidür?

Bu xəlvət içrə könül sidqdən qılur də'vi,
Aran yaxasını ki, pirəhən dəridəmidür?

Yüzümi zər qılıban sikkə urmışam yaş ilə,
Nigar eşqi bu könülə zərxəridəmidür?

Gisusı bəndi içində uzun gecələrdə
Ömür be badi-həva getdi şol səpidəmidür?

* * *

Bu adam ayinəsində gəlün fərіştə görün,
Həvası odını bu gildə həm siriştə görün.

Xumar gözləri içün ki, xabnakdurur,
Gözümdə həbbeyi-rümman, yürəkdə riştə görün.

Görün ki, ənbəri-xami nə yay düzər sani,
Nə sənət işə aparmış, anı qurışta görün.

Dəlü dili dəxi özin bir iştəyəm deyübən,
Cəfaları odına girübən biriştə görün.

Ləbünə dərdə dəva sormağa könül vardı,
Qana bulaşıban uş gəldi bir sorıştə görün.

Yüzünə yüz uralı canü dil yaralandı,
Bu vaqiə dəxi gəlmədi hiç urıştə görün.

Ayağunun tozına yüz urur saçun, şaha,
Fədadurur ömürümüz bu yüz süriştə görün.

* * *

Getmişəm bən öz-özümdən, aparun yara bəni,
Yüzi getməz bu gözümdən, aparun yara bəni.

Ləbləri şirinligini gərçi kişi tatmadı,
Bəllüdür axir sözümdən, aparun yara bəni.

Eşqə tanuxlıx gərəkməz kimdə insaf var isə,
Göz yaşum ilə yüzümdən aparun yara bəni.

Gözlərüm ümman isə, axar əsirgənüz anı,
Gör nə dökər hər dürindən, aparun yara bəni.

Günəşəm, çün bana baxmaz; halümi bən bilmişəm,
Nə görəyim yılduzumdan, aparun yara bəni.

* * *

Bu yürəgüm hicr odından tağludur,
Dərdi-dərmanı ilə həm çağludur.

De xəyalinə gözümdən, ey səba,
Ki yerün dəgşürmə odan yağludur.



Dün gecə gördüm belində yüz bölük,
Var həramilər, vəleykin bağludur.

Müddəi çəp-rastdur bizüm ilə,
Qayğu yox, bu xalq sollu-sağludur.

Can balıx kibi talabır zülfinə,
Dedüm ana tozına bax, ağludur.

* * *

Namü nəngün var isə, geç nam ilə namusdan,
Zövqi can hissinə bağla, geç qamu məhsusdan.

Nəfsüni islama gətür, qılma şeytandan gilə,
Yağı uş mülkün içində, nə qayu casusdan.

Padişəhsin məmləkət viranü düşməndür qəvi,
Necə bir qissə sorarsın Xosrovü Kavusdan.

Din sorarsan, toğrulıxdur, toğrulıx sorğil anı,
Müslimü müşrik, firəngü hindü türkü rusdan.

Cövhəri balçığa basurdun gidərdün rövnəqin,
Abi-heyvanmı umarsın şimdi bir məhbusdan?

Aç bu şəhbazun gözini ki, görəsin uçmağı,
Billah, uçmaxını umarsın xizməti-tavusdan?

Gər yüzin suyı var isə, dökmə yüzün suyını,
Fərq ed, axır şol imami-dini Fasilyusdan[1].

* * *

Gözün anca urur yürəgə qəmzə,
Ki ən kəminə döyiməyə həmzə.

Bu kəj zülfündədür toğru canum dərc,
Zira surətdürür əlifə həmzə.

[1] İncil təfsirçilərindən biri olmuşdur

Kəmənd ilə kəmanū tir görən
Bu uçmax yüzdə gərək düşə rəmzə.

Könülüm micmərinə saqi, su dök
Səba peyki belin quşandı qəmzə.

Gözündən nim işarət cana bəsdür,
Nə hacətdür əcəb işbunca qəmzə.

Dünyada tolmışdurur qovğayi-eşq,
Qanı şol ki, olmadı rüsvayi-eşq.

Eşqə söz yoxdur, bən ol göz qulıyam,
Ki baxıcax ol olur binayi-eşq.

Eşq vardur, leyk eşqə aşiqəm,
Zira ki, var bəndə istisqayi-eşq.

Vəchi simini zər etmişdür yüzüm,
Vəchümüzdə budurur simayi-eşq.

Zahirümdə xara qılmanuz nəzər,
Batinümdə toludur xurmayi-eşq.

İrmağa cəhd etməgil, ey cuyi-cuy,
Bil aşurudur yaxın dəryayi-eşq.

Əvvəl-axır eşqdür nerdə ola,
Nəsnə ki, olmış ola həmtayi-eşq.

* * *

Qaçan ki, görə gözüm yüzündə xət ay ilə,
Gecə ilə gündüzə bənzədə xəta ilə.

Seyl axıda nərgislər şol gül yanağun içün
K'axıdmaya bulıd ol seyli həya ilə.

Lə'lün ilə belündə bu sir ola vazeh ki,
Kimsəyə bəqa yoxdur bu dari-fona ilə.



Şol pərdeyi-ənbərdə küpəsi sitarədür,
Qədri nə sanasınun yüzündə sən ay ilə.

Zülfi başı yerdəvü qəddi başı gökdədür,
Fərq ortada olısar ərz ilə, səma ilə.

Gözün könül əsrügi, könül gözün əsrügi,
Pəs çarə yoğ imiş ki, bu ikisi ayılə.

Zülfünə kişi bin can verür isə səhl ola,
Bir qılca bilür isə ki, sağışa sayılə.

Gözüm yaşı ümmana irürər idi özin
Gər bilsə ki, gözündən bir rəhm ola sayilə.

Səndə yetürən özin özini səni bulmaz,
Pəs qanda bulısardur kendüyi sivay ilə.

Bu dərdə dəva könlüm isdəməz anunçün ki,
Bulmışdur anun dərdin yüz dürlü dəva ilə.

* * *

Gözün avıyam, leyk bazam dəxi,
Saçunla be rahi-dirazam dəxi.

Belün ilə yüzüni görəlidən
Əlif çi nədarəd deməzəm dəxi.

Od ilə yanaram, qan ilə qanaram
Saçun qılına can güdazam dəxi.

Ləbündən içərəm, yaşumdan saçaram
Qaşun ilə əndər-nəmazam dəxi.

Səni görəli yox nə zadum, nə adum,
Qamusıyla əndər-hicazam dəxi.

Cəfa naz edərsin, vəfa nə az edərsin
Sənün nazun ilə bən azam dəxi.

Gərək ola Mahmud Xosrov olursam
Çü şirin ləbünə Ayazam dəxi.

Saçunı dutıban irəm yüzünə,
Və leykin dün içində azam dəxi.

Cəmalüni zəbt eyləyiməz könül,
Əgərçi can içində yazam dəxi.

Səni gəzdürürəm könül rüq'əsində,
Piyadə vəli şahbazam dəxi.

Yaxar eşqin odı bəni suz ilə,
Anun suzına karsazam dəxi.

* * *

Bu əşki-xun arasında yüzüm sarara yatur,
Görəli ənbəri ax güldə ki, qarara yatur.

Özini xüftəyə urup gözi könül avlar,
Nətə ki, imrənicək baz bir şikara yatur.

Könül yüzünə zənəxdan varursa, çaha düşər,
Dəxi nə yol var isə bir siyəhkara düşər.

Yüzinə qarşu özin görmiş ol güli-səd bərg,
Ki məclisində anun səd həzar parə yatur.

Nigara, təngdil olma əgər sorar isəm,
Ki lə'li-dürci yanında nə zəngi qara yatur.

Şol iki yalğuzuna qalmışam təəccübə ki,
Günəş yüzində nə lazim ki, bu sitarə yatur.

Tənündə ki, ola güldən nigara, nazik tər
Rəvamıdur ki, dilün fəhyəqə'l-hicara yatur.

* * *

Aldı yenə könüli bu çeşmi-mükəhhəl,
Gisusi sevdasın etdi boynuma heykəl.



Nöqteyi-yaqut hünə mö'cizə yetər,
Xassə, zülfeynidür tivali-müfəssəl.

Mö'cizə yetməzmi bu ki, yüzi günəşi
Ənbəri-tər çətri ilə oldı müzəlləl.

Zülfün ilə kim ki qüssə çəkə uzun,
Ağzun ilə çün fəna ola, ola əkməl.

Dürci-gühərdən, bəgüm, əgər düri-güftar
Çıxar olur isə, fəth olur bu müqəffəl.

Saqi, tolu ver əyax ki, mahi-məhərrəm
Mahi-rəbi iricəgəz ola mühəlləl.

* * *

Bir vəch ilə aldı dili ol gözi-mükəhhəl,
Ki qissəsi gisusi kibi ola müsəlsəl.

Göz sənciləyin qanda görə bilə nigara,
Məgər səni səndə yenə didəyi-əhvəl.

Gözüni görən bilə ki, bən xəst nəçünəm,
Şükr ana ki, dərdi könülün oldı mü'əlləl.

Ağzunda məcali sözümün təng olalıdan
Oldı könülüm qissəsi zülfündə mütəvvəl.

Kirpükdə düzər incü düzər lə'li bu gözüm
Olma təəccüb biri oldıysa mükəlləl.

* * *

Könüldə şəha, səfheyi-eşqini dürəldən,
Şol qoşa qaşun ıxladı yayını quraldan.

Qalmadı gümanı qana hərgiz könülümün
Lə'li-ləbünün qanını fi'l-cümlə görəldən.

Vəslün yüzini görmədi göz görəli səni,
Hicrünə ulaşalı nə yetürdi gör oldən.

Sərvün qədünə nisbəti xud qaçan olısar,
Aşüftədürür ənbər ayağuna irəldən.

Göz görmədi gözüm kibi ki, gördi gözüni
Üşşaqi göz oxı ilə mə'şuqə irəldən.

Ümmidi nədür bu könülün gözlərün ilə
Baz alıcağaz kim ala kəkligi der əldən.

* * *

Nigara, lə'li-ləbün eşqi cana kafiyədür,
Ləbün kirişməsi bu sayru cana şafiyədür.

Boyun əlifdürü qaşundurur nigara nun,
Necəsi müsbit olam bən anı çü nafiyədür.

Əgərçi hüsni anun vazeh oldı aləmdə,
Bu lə'li-ləblərinün lütfi dəxi xafiyədür.

Səfayilə bu könüldə vəfadurur sabit,
Və leyk eşq ərinə qəmzələri cafiyədür.

Ə'valimün dili ilə nə şe'r dersə dilüm,
Cəmali sevdügümün axırında qafiyədür.

Gözünlə sayru olanun nə baki var, sənəma,
Əgərçi baki ola xəstəliği afiyədür.

Çü sən qiyam edəsinü qopa qiyamət, bən
Qaçan irəm qədəmünə ayax çü hafiyədür.

* * *

Nigarına nə halətdür ki, bilməzüz özümüzi,
Gözümüz şöylə qərq oldı ki, bulmazuz gözümüzi.

Yüzüni Kə'bə sanuban qaşun mehrab bilürüz,
Anun içün ana qarşu yerə urdux yüzümüzi.

Saçun qılma irməzüz səbaya halümüz dedük,
Ki bir fürsətdə ərz edə qulağına sözümüzi.



Xumaruz gözlərün ilə ləbün meyindən ayax sun,
Ki başəd ki, anun ilə biləvüz öz-özümüzi.

Şəha, bir köhnə can varur dili divanə, əqli pir
Birümüzçün nigarına utandurma yüzümüzi.

Nigara, gisun içində dilü can taldıvü gitdi,
Nə bizi bulurız, nə xud çıxaram izümüzi.

Pərişan söylərüz zira ki, zülfeynün pərişandur,
Çü zülfünçündürür bu söz çoğa sayğıl azumuzi.

* * *

Laçın gözi tək dünyada bir baz ələ girsə,
Ya hər yelə zülfi kibi sərbaz ələ girsə.

Cadu gözi çeşminə könül uğrar olıcax
Şəkər ləbi işvəsi ilə naz ələ girsə.

Baş oynamağa nə gərəg idi ləbi içün,
Ağız-ağız andan bizə bir raz elə girsə.

Gisusı ki, kafirdürür, islama tolaşdı
Qılmağa qəza gürcivü abxaz ələ girsə.

Sərbazdurur gisuları xud anun içün
Can oynamağa aşiqi-canbaz ələ girsə.

* * *

Gülşənün içində sallan, gəl qiyamət şimdi gör,
Bu uzun ömrə ki, geçdi, gəl nədamət şimdi gör.

Məsti-eşq isən nola, dil fitnə gözlərinə uy,
Məscidü mehraba şimdi bax, imamət şimdi gör.

Gözləri bimar olmış, sən anun yolına öl,
Lə'li ehyadan dəm urur, gəl kəramət şimdi gör.

Varlığun təslim qılğıl dilbərün varlığına,
Əmin ol seydi-hərəm oldun, səlamət şimdi gör.

Bir dəm öldüm yar yolına bunca dirlik bulmışam,
Baş gerək oynaya başını zə'amət şimdi gör.

Gözlərindən ayruyam deyü səqamət çəkmişəm,
Şimdi ki irmişəm cana, səqamət şimdi gör.

Bin məlamət qılur idüm eşq ilə könülümi,
Bir nəfəs təqsir edər isə, məlamət şimdi gör.

* * *

Ənbərünlə necə könlümi pərişan edəsin,
Gözümün lö'lölərini necə mərcan edəsin.

Düşmənü dostı sən bərq ilə yaz bulıdı tək
Kimi xondan, kimini dərd ilə giryan edəsin.

Bülbülün ağladuğı vəchə gərək ki, otura,
Çünki gül üsdinə sən sünbülü reyhan edəsin.

Gözlərün dərdümə dərman dedi, dərmanı qanı,
Sən yenə qan ilə məgər ana dərman edəsin.

Gözünə yüz qan ilə dil bir əyax içürəməz,
Pəs nə lazım ki, xumara, anı biryan edəsin.

* * *

İrdi Qara dənizə bu göz qanı,
Görməgə günəş yüzüni göz qanı?

Baxdum idi baxtum ayağun tozı,
İrməgə bu tale'ə yıldız qanı?

Gisularun gecəsinün qərqiyəm,
Görməgə bu gecəyi gündüz qanı?

Könül ilə göz ləbünə düşdilər
Bu yenə hər birisinün öz qanı.

Qan ilə irmağ olup axar gözüm,
Buncılayın dünyada bir göz qanı?



Tuzlar əgər yarama lə'li-ləbün,
Qanda ola buncılayın tuz qanı?

Varmağa yüzünə, ey yüzi günəş,
Bənciləyin aşiqə bir yüz qanı?

* * *

Gözlərüm gözləri irmağ olup axar nedəyüm,
Cigərüm odları yürəgümi yaxar nedəyüm.

Həlqə qaxdum sənəmün zülfi həvasına, vəli
Hər həva anı bənüm başuma qaxar nedəyüm.

Ləblərün işvəsi ilə dili qan eyləmişəm,
Gözlərüm qanuma girür anı çaxar nedəyüm.

Gözə-göz oxa dutar yürəgümi cadu gözün,
Mərdümi hər gözünün bu işə baxar nedəyüm.

Zülfinün qəvlü qərarı yoğu anı bana der,
Bu adı dəxi bənüm boynuma taxar nedəyüm.

* * *

Ruhi gördün, ruh ruhin isdəgil,
Qamu canlarun futuhin isdəgil.

Badeyi-hirs ilə olmışsın xumar,
Eşqi camından səbuhin isdəgil.

Qərqə olmışsın fəna tufanına,
Gəmiyə cəhd eylə Nuhin isdəgil.

Yaraludur yürəgüm içərüdən,
Yar, inanmazsan, cüruhin isdəgil.

Səndə, ey büt, bən özü sevərəm,
Var bu rəmzün sən şüruhin isdəgil.

Xoca əqlün bunca yildür yol yürir,
Nə qazanmış bir fütuhin isdəgil.

Tövbə qılmaxdur sana eyni-günah
Tövbədən tövbə nəsuhin isdəgil.

* * *

Gözlərüm yaşı irisərdür başa
Kim anun ilə çıxısardur başa.

Yürəgüm baş oldı hicrani ilə,
Qəmzələri ox urısardur başa.

Çərxə tirinə anun döyməz cəbə
Canı gizlərsəm qaxısardur başa.

Necə bir gizləyə can eşqi odın
Bir gün ol odı yaxısardur başa.

Zülfi könül elinə saldı axın,
Bir gün ol cəri axısardur başa.

* * *

Gözümün yaşı gərək bir gün
Sığmaya yazılara tağa, taşa.

Çeşmeyi-xun içdi dildə gözlərün,
Lacərəm pindam ura taşdan-taşa.

Könül işi başdan aşdı noldı gər
Gözlərümün yaşı həm başdan aşa.

Bir yol oldı baş yürəkdən gözümə,
Aralıxda qan yürir başdan-başa.

Belə salmış yüz bölük zəngi çəri
Bir qaraxçı birbimiş hər bir qaşa.



* * *

Ey saçı zəncir, məcnundur könül,
Fitnəəngiz olma, məftundur könül.

Girmə qana, var gözümə, ey xəyal,
Uymağil könlümə, pürxundur könül.

Nişə Xorəzm əyləmişdür gözlərün,
Zəxmi ilə çünki Ceyhundur könül.

Xəstə gözündən nə tuydı bilməzəm,
Xeyli müddətdür ki, biçundur könül.

Gecə-gündüzdür mülazim hüsnünə,
Eşigündə əbdi-mə'zundur könül.

Könlümün dut əlin, ey simin zaq
Xakdanda mali-Qarundur könül.

Gah ərşi, gah fərşi görəsin
Bü'l-əcəbdür türfə mə'cundur könül.

* * *

Eşq qalamı dilə ya canamı,
Eşq əri can verməgə yacanamı?

Usanamı şol sənəma, dil verən
Ya xu dəxi sanuları sanamı?

Çeşmeyi-xun oldı bənüm hər gözüm
Təşnə gözi gözlərümə qanamı?

Müşkilüm oldur ki, çü üryan olam,
Saçı dəgüldügümə inanamı?

Eyşümüz ağızı ilə oldı təng
Zülfi ilə dərdümüz uzanamı?

Gözlərünün mərdümi gizlənmiş ox,
Qılmağ içün həmləyi mərdanamı?

Daneyi-xalünə canın verməyən
Adəmi bu dünyada adanamı?

* * *

Şol nöqteyi-yaqut ki, vəhdətdən urur dəm,
Bir camdurur ki, dəxi görmədi anı Cəm.

Təngi şəkər ol şəkkəri təng içinə müzmər,
Bari gühər ol lə'li-gühər barinə müdğəm.

Dil dəm urımaz bir nəfəs ol dərd ilə, zira
Casusı səba irürür anı ana dər dəm.

Sərkəşligi sərvün nə səri-ruy ilədür ki,
Qəddi qədəminə beli əflakün olur xəm.

Belündə təzəlzül var idi inceligindən
Barı biribidi ana həm ayəti-möhkəm.

Gəndüm bilürəm ki, yanağundağı qara bən
Şol danədürür ki, verə canın ana Adəm.

Lə'lün yürəgə bir nəm içün canum apardı,
Can verəyim ana der isə, necə inanam?

* * *

Cananəyi gərək sevə, kim canı var isə,
Eşqini yarun din duta, imanı var isə.

Günəş ki cəmalini qılur ərzə cəhana,
Rövşən ola də'viləri, bürhanı var isə.

Ağzun ki gümandur ana can aparaydux,
Güncayişə ol arada imkanı var isə.



Gisusına miskinüzü ləblərinə möhtac,
Vacib bizədür lütf ilə ehsanı var isə.

Gözi könüli oxladıvü lə'li-ləbindən,
Bir şübhə düşər anda əgər qanı var isə.

* * *

Lə'linə könül türrə zülf ilə gözəldə,
Çarə nədürür, çünki dəgüldür bu göz əldə.

Bir xızr görüp çeşmei-heyvan yörəsində,
Dedüm nə əcəb arunun ayağı əsəldə.

Hər sirkəfüruşun sözini dutma hesaba,
Var isdəməgil xasiyeyi-şəkkəri xəldə.

Aləm tolu huri, qanı göz ki, görə anı,
Məhsur dəgül görməgil əsbabı səbəldə.

Dırdırcı dərəın ağzına qaçan ki, söz ola
Belinə nə söz, qılca çü söz yox bu məhəldə.

* * *

Qanı bənüm ilə sənün əhdi-vəfalarun, bəgüm,
Neçə-neçə bu canuma cövrü cəfalarun, bəgüm!

Ləblərüni şəfa deyip, dərdünə bağladun bəni,
Dilədügün çü eylədün, qanı dəvalarun, bəgüm!

Zülfünə döndi könülüm, hiç qərar bulmadı,
Gör ki, bu qılca canuma netdi həvalarun, bəgüm!

Qəddünə rast deyəyüın, ola muhəyyər işbu dil
Vəqtidürür ki, irişə cana nəvalarun, bəgüm!

Qodun əzəl bəlasını bizüm ilə, ey aşina,
Şimdi nədür bu canuma bunca bəlalarun, bəgüm!

* * *

Yüzün xəyali, nigara, qaçan ki, gözə düşər,
Dəmin dəminə qomaz, könül oda, közə düşər.

Bənümlə anun arasında qılca qaldı könül,
Qaçan ki çəkinə bəndən, bu qılı üzə düşər.

Könül yüzi tolu qandur, yüzüm yüzi tolu su,
Nə nəsnə ki könülə-yüzə düşə, yüzə düşər.

Gözinün ayinəsində çü nəqş olur əğyar,
Neçün qaçan ki, gələm qarşusına, sözə düşər.

Gözüm nə qanlar axıdur, yürəkdə görgil anı,
Qaçan ki seyl qopa yucələrdə, düzə düşər.

Bən ol nigarı sevərəm ki, görməgə can alur,
Xəsisi-dil ola ol gişi ki, ucuza düşər.

Bu gözdə, qaşda, ağızda, şəha, sənəm görürəm,
Bənüm kibi qanı buncılayın rümuza düşər.

Şol iki hacibi ayırdı qeyrdən könüli,
Zira hilal görən öhdəsinə ruzə düşər.

Cəhanda eşq odına girməyən fərağatdur,
Könül ki sözə düşə, oldurur ki, suza düşər.

* * *

Məhrəmi-raz olamı ud ki, biperdədür,
Eşqinə cəhd edəlüm, çünki dəva dərdədür.

Yar yolına sidq ilə can ki, girür yazuğı,
Bən ana zamin k'anun kərdəsi nakərdədür.

Göz yaşıdur çarəsi şol ki, yarı yolına
Tazə dəgüldür, güli-çiçəgi pəjmürdədür.

Sim tənünün aşiqi vəcbi zər olsa, gərək
Pəncə dutan sa'idi sim ilə azürdədür.

Çək rəqəmi-mövti sən aşiqün olmayana
Tən ki canı sevməyə, lacərəm ol mürdədür.



* * *

Baxmağa gözünə gözümün yüzi siyəhdür,
Hacibləri yüzün günəşinün dəxi məhdür.

Kim ki yüzini isdəyə, gərək gələ safi,
Gər anda səvabı dilə gətürsə, günəhdür.

Bilünə xəyal ola, nigara, əlüm irmək
Gisuna tolaşmax dəxi sevdayi-siyəhdür.

Can Yusufi düşdiysə zənaxdanuna, nola,
Harut ilə Maruta dəxi ol ara çəhdür.

Baxarsa gözüm özgəyə, qanı sənün olsun,
Qeyrinə nəzər çünki, şəha, eyni səfehdür.

* * *

Gözünə tiri-xətayi dedilər, çinmi, əcəb?!
Yüzünə lütfi-xüdayi dedilər, çinmi, əcəb?!

Zülfi-pürçinünə ki, yaxdı bəni çün ənbər,
Əhli-dil müşgi-həvayi dedilər, çinmi, əcəb?!

Kim hilal aydur isə, qaşlaruna əgri demiş,
Qəmzənə tiri-səmayi dedilər, çinmi, əcəb?!

Ruhi-qüdsə ləbüni nisbət edər əhli-nəzər,
Gözümə Hatəmi-Tayi dedilər, çinmi, əcəb?!

Cövrədür əhd dedilər, əcəba, sadiqmi?
Lütfini bizə riyayi dedilər, çinmi, əcəb?!

Hər qılı adəminün gər ola bir can ləbinə,
Yetüriməyə bəhayi dedilər, çinmi, əcəb?!

Anca gəzdüm gecələr zülfi içində əm içün
Sor ləbindən bu dəvayi dedilər, çinmi, əcəb?!

Talc'i sə'di dəgül ol kişi ki, gök ayına
Nisbət cyləyə sən ayı dedilər, çinmi, əcəba?!

Ol bəlayi ki, əzəldə demiş idi könülüm,
Ol cdər cana bəlayi dedilər, çinmi, əcəb?!

* * *

Can irişicək gisusının qılına bari,
Tolaşmayıban ncyləyə nə qılına bari.

Sən qara ağunı gərə gör ki, bu cəhanda,
Hər quş ki anunu canı ola elinə bari.

Bir həftə yüzün ayı günindən olan ayru,
Rövşən budurur k'irişiməz yılına bari.

Fürqanını vəllcyl saçunun görəlidən
Meyl etmədi kafir dəxi incilinə bari.

Saçunı qaçan kim çözəsin qılca belüni,
Gör ki, necəsi qılına hər qılına bari.

* * *

Saçı gecəsi içində cəmali bədri-münir,
Bu günəş ilə yürək yağı hər nəfəsdə ərir.

Bu yüz-gözi yüzi nola k'anun gözinə baxa,
Bəsirət olmayıcax birdürür bəsirü zərir.

Cəmali gecələri gündüzə uladı məgər,
Ki qıldı zülfi kəməndində bidilini əsir?

Bunun kibi tənə iş böylə can ulaşımadı,
Olalı adəmi xaki təni fələkdə xəmir.

Çü hurinün saçı ənbər, təni olur kafur,
Əcəbmi toprağı uçmağun olur isə əbir?

Məgər ki, qıl qələm ilə təravətin saçunun
Yenə səhifeyi-güldə cəmal edə təhrir.

Ləbüni ağzuma verdün düşümdə işbu gecə,
Məgər ki, Yusif edə bilə bu düşi tə'bir.



* * *

Gəl qənimət görəlüm bu çəmənün nüzhətini,
Fayit eyləməyəlüm eyşü tərəb fürsətini.

Vüsləti ləzzətini xoş görəlüm şimdiligə,
Çü çəkisər canumuz fürqətinün vəhşətini.

Mədhi-mə'şuqəyi həm gəndüyə qarşu qılalum,
Nctə ki, bülbül edər çün bula gül qürbətini.

Zahidi-sövmə'ə gər tövbəsini sıdı, nola,
Kafir imana gəlip, tərk qılur millətini.

Tanrınun rəhməti-asarına gəl bir nəzər et,
Ta səvabı gidərə işrətünün zillətini.

* * *

Mətlə'i-hüsni-cəmalün hüsni-mətlə'dür, bəgüm,
Gisularun türrələri hüsni-məqtə'dür, bəgüm.

Aşiqü mə'şuqü şahid saqivü şəmü şərab
Hüsnün içində, nigara, görinə məcmə'dür, bəgüm.

Gözlərümün yaşı seyl olup qanın axar, vəli
Şəhdi-nişi var isə yüzüm müşəmmədür, bəgüm.

Gözlərüm yaşı qanındur zə'fəranıdur yüzüm
Yaşum ilə rəngi yüzümün müləmmədür, bəgüm.

Gərçi ki, düşmişdür ayru varlığum səndən bu gün,
Varlığum səndən olmaz ayru mə'mə'dür, bəgüm.

* * *

Ağzun olalıdan borü bir şəkkəri püstə
Oldı şəkəri püstələrün nərxi şikəstə.

Qılalı həva zülfüni hüsnündə pərişan,
Başladı ki, gülşəndə qıla sünbüli dəstə.

Gər qulı olam badi-səbanun hənuz azdur,
K'ol gösdərə hər sübh bizə fali-xücəstə.

Bir qılca canum var saçı qılma fədadur,
Gər qılca aça dəlü könülə zəhi bəstə.

Əl-cinsü ilə'cinsi yemil avlamağ içün
Gözün dəxi xəstədürü könlüm dəxi xəstə.

Paludə qılur gözlərüm abi-eynabidən,
Olalı xəyalün gözüm içində nişəstə.

Bən mükhüləvü meylə nəzər qıldum anunçün
Kim nişə qələm çəkdi bu yüziqara məstə.

Ləbləri fənasına necəsi döyə varlıx
Varlıx nola ki, sayıla ol nöqtədə həstə.

Ol mahi ki mahi dəxi qul bilürəm ana
Düşmiş gisusı üqdəsi arasına şəstə.

* * *

Bir odum var nigarına dərunı,
Əgərçi ki, sayıluram birunı.

Bəni çəkəlidən zəncirə saçun
Cünunum kamil eylədi fünunı.

Nə sadü nunü mimdür şol yüzündə,
Ki tapdurdı özinə kafü nunı.

Ləbün girmişdürür yürək qanına
Nola, əgər dutılur isə xunı.

Fənayi-eşq olan derlər bəqadur,
Hələ uş canumuzdur azınunı.

* * *

Gözün sərfitneyi-ruyi-zəmindür,
Çü şol sahibqıran ilə qərindür.

Xəyalündən könül umar mürüvvət,
Ki yari-mərdümi-guşənişindür.



Sənün hüsnünə gögdən yüz bin əhsənt,
Bənüm eşqümə yüz bin afərindür.

Baha olmaz ləbünə cüz ki, nəzmüm
Ki hər lütfi anun dürri-səmindür.

Ağızundur, nigara, şöylə yaqut,
Ki binüm könülümə ol nigindür.

* * *

Könül ki düşdi bu bəndə zi xubdur qayət,
Çü dəlü düşdi bu bəndə, zi xubdur qayət.

Fütadə idi könül saçun iləvü pamal,
Ki düşdi müşkilə bəndə zi xubdur qayət.

Ləbün ki qənd ilə irürdi qan dilə, ey bəgüm,
Çü qanda irürə qəndə zi xubdur qayət.

Bu hindu səfheyi-kafurda nə ənbərdür,
Bu xali bərgi-səməndə zi xubdur qayət.

Be cüz ki, sərv qədünə qərar qılmadı dil,
Çü himmət irdi büləndə, zi xubdur qayət.

* * *

Biz dərdin isdərüz, zira dərman zəmanıdur,
Biz küfrin isdərüz, zira iman zəmanıdur.

Eydin qılmağa qoşa qaşını gözlərüz,
Mehraba qarşı zira ki, qurban zəmanıdur.

Ləbləri camını içübən əsrük oluruz,
Gözləri dəvridür, zira məstan zəmanıdur.

Bcyza qolı həvası ki, sevdadurur başa,
Mö'cizdürür çü Rüstəmi-dəstan zəmanıdur.

Şol yüzə canı verməməgün vəchi nə ola,
Canənə dəvridür bu günü can zəmanıdur.

Cadu gözivü xuni ləbi, hindu gisusi,
Bilməz məgər ki, lütf ilə ehsan zəmanıdur.

Vacibmidür ki, vəslin edə mümtəni' bizə,
Bu, nəş'əti-vücuddur, imkan zəmanıdur.

* * *

Kim ola, şaha, kəmali-sərv qədünə irə,
Gisuyi-miskin məgər başı qoyıban yerə.

Bədr yüzündə əgər nöqtə dedüm lə'lünə,
Qan olamı nöqtədür mərkəzi-hər dairə.

Qara saçun gecəsi sübhə qarışmış, bəgüm,
Sehr edə məşşata gər fərq edibən ayıra.

Xətti bəratə eyləmiş könülümün elinə
Nəsx ana vacibdürür vəchi yazar bayıra.

Gözləri ə'yani-hüsn, iki yanağı vücuh
Qəddi ilə gisusi türrələri sayirə.

* * *

Qəmzələrünə hey de ki, çün tiri-qədərdür,
Sehr oxıdurur hər biri ki, tiri-səhərdür.

Dil nuri gərək hüsnüni anlamağa, şaha,
Göz nə qədər anlayı bilə fihi-nəzərdür.

Dökmə gözümün yaşını hicran ilə yerə,
Hər qətrəsi pərvərdə bc səd xuni-cigərdür.

Dil çün ləbüni söyləyə sözi ola rəngin,
Ol kamı şəkərdən sanasın kami-şəkərdür.

Könül neçə ki təng isə geçməz ağızundan,
Mədxal qılmaz incə belünə ki, xətərdür.



Eşqin gümişi altun sikkə urur yaş,
Targözlülərin məqsudı dünyada çü zərdür.

Bir ləhzə xəyalün tozımaz gözüm içində,
Qayətdə lətif olü gözüm seyli güzərdür.

* * *

Əhli-dil ləblərünə can dedilər,
Dəxi nazikdürür yacan dedilər.

Gördilər gözləründə fitnələri,
İnnə həzan ləsahiran dedilər.

Pisteyi-ləblərün ilə saydılar
Şəkərün nırxını giran dedilər.

İki yaqutı tatlu qardaş imiş
Düşmən aralarına qan dedilər.

Ayağında sərə nədür saman,
Dəgməyə anda baş zaman dedilər.

Beli qıldur, xəyalə mədxal yox,
Ağızı nöqtə bigüman dedilər.

Günəşü ayü tir ilə zöhrə
Etmiş uş qövsdə qiran dedilər.

* * *

Vermişüz canı biz nigara sələf,
Ta ki olmaya dəxi yola tələf.

Bədrə yüzin görəli irdi muhəq
Qüssədən düşdi ay yüzinə küləf.

Nöqtəyə bənzədür xurd ağızın,
Xoş güman eyləmiş bu piri-xərəf.

Xaki-payin gözinə sürmə çəkə,
Hər ki dilər ki, gözi görə şərəf.

Hüsni ilə könüldən oldı bu eşq,
Yaşı uzun zəhi cüvanı-xələf.

* * *

Dil yaxasından toğan ay nə əcayib ay idi,
Boynuma gisusı zənciri əceb sevday idi.

Hər zaman qaşı yayından bir işarət canuma
Hər nəfəs geyik gözindən könülə imayidi.

Gedəli könlüm, xəyalün sakin oldı yerinə,
Pəs yerindən getdügi könülümün bər cay idi.

Zülfün ilə sərv qəddün gərçi həmsərlərdürür,
Ol buna sərbər zəminü bu ona bər pay idi.

Dürrü lə'lünçün əgər nəzmüm gühər dökdi, nola,
Çün alardan qan ilə bu yürəgüm dəryay idi.

Qaşları ilə yanaxlarını bən görməyəli
Dün hesabın rövşən etdüm, zahira, dörd ay idi.

Can dutıban ətəgin yaxaya getmədügi ol,
Ki dutıban yaxasını odına yaxay idi.

Bən günəşdən rövşən etdüm anı gördüm bilmədüm,
Bədr simamıydı ol büt, yoxsa ol sim ay idi.

* * *

Ey bəsa, sir k'ağızından açamadun dün gecə,
Ey bəsa, dürrü gühər ki, saçamadum dün gecə.

Bən ki qılı qıldan ayırmaxda qıl yaram derəm
Belüni saçun qılından seçəmədüm dün gecə.

Yol belünə qıldan incədürü qılıcdan yiti,
Ol sirati-müstəqimi geçəmədüm dün gecə.

Var idi yüz üqdə saçundan könüldə ömrlər
Bunca cəhd ilə birini açamadum dün gecə.

Zülfünün zülmətinə talib irişdüm lə'lünə,
Leykin ol abi-həyatı içəmədüm dün gecə.



Yüzinün nuri şüai odına düşdüm bu gün,
Zülfi dami tuzağından uçamadum dün gecə.

Bəndə bir tən qaldı bican bu gün uş yaxdum oda,
Çünki anı yaxmağ içün keçəmədüm dün gecə.

* * *

Hər ki, dərmanı nigarınün yolunda dərd ola,
Eşq içində ol fəridü yar yolında fərd ola.

Bir nəzər məstanə gözinə həzaran can dəgir,
Mərdümə mərdanə baxmayan kişi namərd ola.

Sünbüli-xakiyə dilər bənzədə zülfin könül,
Qorxaram ki, daməni namusına bir gərd ola.

Zülfünə bənzərsə gecə aşiqi miskin edər,
Sübh gər dəm urmaz isə, arizundan sərd ola.

Ləblərün dəndanı tiz etmişdürür yürəgümə,
Təngdil olmağa yaramaz əgər dər xurd ola.

Vəslini bən, hicrümi ol canü dildən sevərüz,
Canumı odlara yaxan işbu əksü tərd ola.

Hüsni-rəngin eşqi çünki dutına könli vətən,
Nə bədi' ola, yaşı gər qanü yüzi zərd ola.

* * *

Qaçan ki, dərdümi soram, gərək ləbin isıra,
Əcəb lətifədürür bu, irəmədük bu sıra[1].

Çü dildə eylədi yerini, gögə çıxdı ah,
Yaşum xu düşdi nəzərdən gərək ki, yerə girə.

Çü fürsətün dəmi irə dəmin dəminə qoma,
Ki dəhr işi budurur ki, yarənləri ayıra.

[1] "Sirr" deməkdir

Tur imdi, saqi, əyax dut ki, tolu cam içəlüm,
Ki qaçan isə bizə dəxi gəlisər bu sıra.

Xuday birdürü yar bir gərəkü eşqi bir,
Ki ikilik yaramazdur iki cəhanda birə.

* * *

Bəndə nə qaldı dəxi, bəgüm ki, aparasın,
Sondən xu sənligüni necesi qoparasın.

Nisan bulıdı yağmurı dökdi bənəfşəyə,
Zülfün qatında yuyımadı yüzi qarasın.

Günəş gərək ki, məğrib elindən toğa, əgər
Yüzindən ol nigar götürə sitarəsin.

Sehr edə gözləri ki, bəni qıldı natəvan,
Biçarə könülün gər edər isə çarəsin.

Can parəsinə canü dilü əqli vermişəm,
Məcmu'ın oynadum ki, görəm əldə parəsin.

* * *

Cigərüm qanı suvü yaşum xun,
İkisindən dəxi axar Ceyhun.

Leyli saçunı görür olursa,
Bigüman dəlü olısar Məcnun.

Kəmü keyfün məcali qanda ola,
Çünki bən sevərəm səni biçün.

Canü əqlü dilü səfavü vəfa,
Cəm edüb qılmışam sana mə'cun.

İstimalət bəni diri dutar,
Bir ümid ilə baqidür kəmmun.

* * *

Yaşlarum xunü bağrum ab nədən,
Meyi-lə'lünə dil kəbab nədən.



Dəmbədəm şol xumar gözlərünə,
Qədəhi-dil tolu şərab nədən.

Eşq ilə dil əzəldə belə idi
Biri amir, biri xərab nədən.

Bir həva irdi isə gisusına,
Bunca vərhəmlik iztirab nədən.

Nə səni buluram, nə xudbini,
Olalı bənligüm hicab nədən.

Yüz-gözi baxarmaz günəş yüzinə,
Pəs cəmalünə bu niqab nədən.

Gül əgər görmədi yüzün dərini,
Bəs cəmə givdi pəs gülab nədən.

Könlüm odına gözlərüm yaşına
Gülə bərq, ağlaya səhab nədən.

Könlümə dəva sora vardum,
Ləbinə vermədi cəvab nədən.

Xəstə gözini xüftə görəlidən,
Gəlmədi xəstə gözə xab nədən.

Gözlərümdür sərabü abi-vüsal
Ana olmışdurur sərab nədən.

* * *

Qul ana deyələr ki, xanı bilə,
Ləbinün sirrini əyanı bilə.

Anlaya nə xəyali var belinün
Lə'li içindəgi gümanı bilə.

Könül oldur ki, gisusı çərisi,
Yasanınca özi yasanı bilə.

Ləbi şəkkərdürür dil pür şur,
Arada milhi-əndəranı bilə.

Təni candur anun ki, öz canını
Yardan özgəyə versə canı bilə.

Eşqdir bir mühitü anda uran
Mümkin olmaya ki, kəranı bilə.

Səndə qıla nəzər bahara qərib
Yüzümə baxavü xəzanı bilə.

Mərdümi-çeşm qılmadı kim qan,
Kişi oldur ki, ol qəzanı bilə.

Nəqşdür binəzirü bəs ziba
Bəs anun qulı ki, yazanı bilə.

* * *

Pənc hissümüz bizüm pəncərədür hüsninə,
Zülfi qılına qolum dairədür hüsninə.

Gözlərüm irmağını irmağa bilməz kişi,
İlla, gülistan içün gül iradür hüsninə.

Gözü qaşü zülfü xal əslidür yüzinün
İşəvü qəmzə dəxi sa'irədür hüsninə.

Sirri ləbi-lə'linün bir sıra ərzandurur,
Qalmadı şimdi güman sər sərədür hüsninə.

Gözinə könlüm hədəf, lə'linə bu əql məst
Ondavü bizdə varı bir bərədür hüsninə.

* * *

Ləblərün içün dökməgə qanı bir ər olsa,
Belində sənün zülfün içün yüz kəmər olsa.

Hər ləhzə nədür bir dilü can lə'li-ləbünçün,
Bu aşiqi-divanədə andan əsər olsa.

Zülfün ki qılur nəsx qamu xətti mühəqqəq,
Oxımağa yarar idi, zirü zəbər olsa.



Ləblərün içün sözləri deyə təb'üm
Şirintər olaydı, ağızumda şəkər olsa.

Günəş gözini hiç gidərməzdi yüzündən,
Gözində anun bizciləyin bir nəzər olsa.

* * *

Əlümə sun tolu cami-rəvaqi,
Ki tolu versə yegdür sağí saqi.

Yüzün bədrü saçun bürimiş anı
İrağ eylə, bəgüm, aydan məhaqi.

Ləbündən özgədən ırmazuz dəm,
Bu iki dəm ki, vardur bizdə baqi.

Əyax sun çünki yürüməz bu məclis,
Gəl ey ruhum, rəvan etgil əyaqi.

Ləbi-lə'lün yasaqı çün fənadur,
Digər guno qılımazuz yasaqi.

Dilərsən cəmümüzdə şəm olasın,
Başun oyna, oda yandur nifaqi.

Xətadan Çinə düşmişdür könülüm,
Həvayi-dil yaxın edər iraqi.

Tur, ey kahil, quşan bir özüni dir,
Ki can əyərləmiş dıtmış Buraqi.

Gəmini bəhri-eşq ortasına sür,
Ki qərq olur gözədənlər qıraqi.

* * *

Bizüm ilə şol xuni gözün alamı, billah,
Aldı könül, canı dəxi alamı, billah.

Bir busə təvəqqe qılıruz, yüzinə salar,
Ən'amını ol aydan-aya salamı, billah.

Suziylə yaxar eşqi odına könülümi,
Qəlbümüzi dilər ki, duta qalamı, billah.

Gisusı tənabı könüli hər yana çəkər,
Ortadadurur hər biri abdalamı, billah.

Zülfeyni kəmənd ilə çəkər bəni miyana,
Bağlandı bu sevdayı yenə alamı, billah.

Adəm düşicək kəndüm içün sünbüləyə pəs
Evladı düşər gisu ilə xalamı, billah.

Bəndən necəsi dilbərümi ayru görürlər,
Əhval nəzəri-kəc qılur əhvalamı, billah.

Güstax dökər ənbəri gülbərg üzərinə
Xəttün ki qılur bu işi o lalamı, billah.

* * *

Şəmsdürür ay yüzi sərvi-rəvan üsdinə,
Eşqi səadətdürür ruhi-rəvan üsdinə.

Can veribən almışuz eşqini ol dilbərün,
Baş dəxi sərbazdur sudü ziyan üsdinə.

Ağızı gər nöqtədür, sözə məcal anda var,
Qalmadı bir qılca söz bari-miyan üsdinə.

Eşqi cəvan, əqli pir, hüsni ki növbavədür,
Hakim olur dəmbədəm pirü cəvan üsdinə.

Dökə gözüm qan-yaşı hikməti-ayn ola bu,
Ki dökə qan, əlini boyara qan üsdinə.

Ömür su kibi geçər, ey canı qədrin bilən,
Yar ilə eyş edə gər abi-rəvan üsdinə.

Can verürəm müntəzir ta ki xəyalün gələ
Bir nəzər etsən nola bu nigəran üsdinə.

Saqi, əyax dutıcax noldı sana, mütriba,
Bəhri-xəfifi düzət rətli-giran üsdinə.

Ləblərünün şəkkəri gərçi ki rizandurur,
Nöqlümüz oldur bizim abi-rəvan üsdinə.



* * *

Zülfi nigarun əcəb ki şəbi-yeldamıdur,
Ol yola baş oynayan aşiqi-şeydamıdur?

Sübh yüzində anun gisusı leyli isə,
Bən dəlüsiyəm anun, ol bana Leylamıdur?

Hər şəhə nə ki dedüm, ol bana la demədi
Gözləri ki aladur ol bana şəlamıdur?

Tihdə biz qalmışuz səndən irax, ey nigar,
İşbu cəfalar bizə mənn ilə səlvamıdur?

Başı gərək ki, kişi yar yolına oynaya,
Eşq dedükləri pəs hiç yerə də'vamıdur?

Biz əzəl əsrügiyüz, illa, münəbbih gərək
Dəlü qılan bizləri badeyi-həmramıdur?

Gisusı sevdasına qan axıdur gözlərüm,
Hasilümüz ortada yüzdə bu səframıdur?

* * *

Nəsimi-zülf miskin oldı, andan bir hekayət yox,
Dəmi dutıldı bu dəmdə könülümdən şikayət yox.

Bu ki canü dili apardı gisusı becan,
Mütəvvəllərdə baxmışam bu mə'niyə rəvayət yox.

Beli incəvü bən incə saçı aşüftəvü pürşür,
İnanayummı bu sözə ki, bu dində sirayət yox?

Cəhanda hər nə ki vardur, dəmi vəhdətdən urmışlar,
Ağızun tək nigarına bu mə'nidə bir ayət yox.

Şəha, canü dilü əqlüm saçunda olmışdur,
Dəlalət küfrə irürlər, çü yüzündən hidayət yox.

* * *

Zülf ilə aşüftəyüz, badi-həvadan değül,
Aşiqi-divanənün işi riyadan değül.

Könlək edindi sənün eşqin odını könül,
Eşqi dərunidürür dərdi yaxadan dəgül.

Badi-səba gəldi dün, qıldı pərişan bizi,
Gisusı üzri bu ki, bizüm obadan dəgül.

Ol ki, dəva dordidür, to'nə ilə möhtacı var,
Ol ki, dəgül böylə, pəs dərdi dəvadan dəgül.

Eşq yemişi, şəha, canü dilü əqldür,
Eşq ağacı yemişi bərgü nəvadan dogül.

Ağızunun nöqtəsi hər qıla qismət anı,
Dəm ki urur görmişəm qeyri-fənadan dəgül.

Gər çəkərəm yüz cəfa, ol banadur bin vəfa,
Çün bilürəm ki, nə ki gəldi, sivadan dogül.

Müxtəsər aydur könül ağzuna öz halini,
Gisularun kibi ol fitnə uzadan dəgül.

Gözünə qul olayım ki, tolu əyaxları
Xuni-cigərdən bana verdi şıradan dəgül.

Başa yetürmək gərək rəhrəvi-rahi-həva,
Saliki-rəh yoldaş ol bir-iki adan dəgül.

Belün ilə könülüm yürir idi incə yol,
Eşq ticarətləri bey'ü şiradan dəgül.

Lazim olur eşqə ki, gətürə ol ikilik,
Ortada vardur dilək, leyk rizadan dəgül.

* * *

Ay qürrəsi bənzəyiməyə qaşına, derəm,
Görürsə günəş yanağını yaşına, derəm.

Lə'li-ləbinə zülfi-siyahpuşi qılur qəsd,
Bağlan anı ki, qəsd edə yoldaşına, derəm.

Başını gərək yelə verə hər ki saçı tək
Diləyə ki, bir iş qıla öz başına, derəm.



Ağzıyla beliyçün dili təngü tənümi qıl,
Qıldum ki, məgər meyl edə oxşaşına, derəm.

Zər haldə nə ki nəqş edə göz qıl qələmiylə,
Anca dökə qan seylini ki, aşına, derəm.

Qəddündə qələm qılı iki yardı belünçün,
Nə qıldı isə, gəldi yenə başına, derəm.

Dutmazsa, şəha, can əlini ənbəri-zülfün,
Kafur irürə əlini padaşına, derəm.

Şol nəsənə sirr oldı ağızında bilimoz,
Hiç kimsə dəxi düşməyəsi faşına, derəm.

Hər kim ki içinə ləbi camı ilə əyax,
İçində anun içinə taşına, derəm.

* * *

Gisunı dilər zəncir divanə ki, aqildür,
Gisun pəri-əbabil ənək çəhi-Babildür.

Lə'linə əlüm sundum dedi ki, həlahil hey,
Tiryəko əl uzatdum, nə zəhri-həlahildür.

Bən varlığumı verdüm varlığına ol yarun,
Əksük qomadum ol xud qəmaz zira kamildür.

Yüzünə sənün, şaha, şəms ayinədür zira,
Nuri bəlürür anun ol dəm ki, müqabildür.

Varlıx qamusı yarun yolına fəda olur,
Minnət urmaz xacə zira qatı qafildür.

* * *

Gözdən səni irmağ edəm adam ki, görəsin,
Ta bu yön bir adım adam ki, görəsin.

Şol xali-zənaxdana bənəm ki, gözə layix
Uçmağı nə gördi qodı adəm ki, görəsin.

Bax məş'əleyi-eşqdən özgə nə görürsin,
Bu varlığum içində bir adəm ki, görəsin.

Bu cüzvicə ad ilə bulur eşq kəmalin,
Fikr et ki, necə oldı bu adəm ki, görəsin.

Bir dəm dəmi-vəsli ətəgi olə girürsə,
Can oyunayam yoluna adam ki, görəsin.

* * *

Lə'lün dökər dildən qanı-qanı görimezəm,
Bir dəm qanı-qanı deyüp, ol qanı bən sormazam.

Bir görməgə əql ilə can yüz könül ilə vermişəm,
Varlıx çü budur, bən bəha hiç dəxi arturmazam.

Yar yolına can oynamaxdur dünyada ər diləgi,
Düşürməyincə can ada dünyada dəgşürimezəm.

Tağıldı canü əqlü dil hər qılına gisusınun
Dəvşürməyincə cilvəsin, bunları dəvşürimezəm.

Gözi əcəb ınam olur ki, bən anun əsrügiyəm,
Oyanmayınca ölümi mehraba qavşurmazam.

Həddən aşurdı cövrini, həddüm dəgüldür bu bənüm
Halümcə söylərəm sözi, həddindən aşurmazam.

Bir quşdurur anın içün can bu qəfəsdə saxlaram,
Anun içün bən hər yola ol qışu uçurmazam.

* * *

Bu gün xəzan yenə bağun zərivü zivəridür,
Büt eyləmiş hər ağacı olamı azəridür.

Yüzümi dəxi saru qıldı eşq axıtdı yaş,
Ki bənzəməz bu ana zira zəri-cə'fəridür.

Behişti şimdi təvərrüc qıl, ey güşadə bəsir,
Ki altun oldı ağacıvü yeri ənbəridür.

Xəzan ki, hər nəfəs övraqi-eşqdən dəm urur,
Hekayətini anun sanma sən ki, sərsəridür.

Yazın əgər hər ağac bir nigar mənzər idi,
Xəzanda hər biri bir aşiqin müsəvvəridür.



Varaqların salıban ayağuna dutma xor,
Key anla anlar isən ki, vücud dəftəridür.

Nə qanundan ki girürsən çıxarsın andan sən,
Bu fani dünyayi-dun dari gərçi şeşdəridür.

* * *

Xəzan ki qıldı altunları məhzun,
Girisərdür yerə çün mali-Qarun.

Yaz özgəyün dürişdi oldı xürrəm,
Xəzan yağdı öziyçün oldı məğbun.

Həyata irdi məhsuli baharun
Xəzanun hasili saçına məscun.

Baharunda ikən sən qayğunı ye,
Ki irişər xəzanun yeli tarun.

Bu dünyəlik dedükləri yilandır,
Ana tərk etməgilə oxı əfsun.

Eşit nə der xəzan, aydur geçərüz
Kimün bənzi saru, kimün dili xun.

Çərəvü çun qaçan sığa bu işdə,
Çü böylə diləmiş xəllaqi biçun.

* * *

Sun tolu qədəh, rəzan cümlə xəzandur,
Çün badi-fəna aqibətül-əmr vəzandur.

Lütf eylə, təmuzun dəmi-gəminə inanma
Dəm verdügi anun nəfəsi mivə pəzandur.

Aməd şud ilədür çiçəkü mivəvü yaprax,
Kimində fəna zinü kimisində əzandur.

Əfsunını gər bilməz isən, sunma bu mala,
Bu əf'iyi-pürzəhrə ki, qayətdə gəzandur.

Yeyüp, içüp, ölməkmidürür hikməti-ehya,
Ölü dəgül isən, bu qədər bil ki, cüz andur.

* * *

Mövc urur könlüm dənizi, yenə xəzandur nədən,
Gözlərüm çün əbri-nisan oldı rizandur nədən.

* * *

Noldı sana gər yol ola divanə könüldən,
Yol olmış ola dünyada bir cana könüldən.

Bin qanmış ola yürəgümün qanına lə'lün,
Bir dəm nola gər can ləbünə qana könüldən.

Təşbih qaçan qıla bilə məş'aləyi çərx
Bu şəmə ki, şol günəş içün yana könüldən.

Gözüm ki, dökər lə'li-ləbünçün nə əcəbdür,
Gör nə dökilür dişünə dürdanə könüldən.

Adəm gözi mərdanə baxar dilbərə, zira
Yol var ki, xəbər irişə insana könüldən.

Bən can ilə əqlü dilü tən oynayüm ana,
Ki yar bən idügümə inana könüldən.

Kondüni fəna dənizinə qərq edü qurtıl,
Meylün var isə, şərbəti-heyvana könüldən.

Gər dilər isən, Misrə əziz olasın, ey yar,
Gəl ki, salalum usifi zindana könüldən.

Gər əbri-bahari gibi giryan olur isən,
İrməgə yararsın güli-xəndana könüldən.

Kə'bə sana qarşu gotüri verə səfayı
Sımarlar isən özüni qurbana könüldən.

Gözdə yeri var kim ki gözi qanını yığmaz,
Mərdümlik edüb axıda mərdanə könüldən.

* * *

Hüsni ağzunda ki, cəm etdüm nə icmal olısar,
Gisunı təfsil qıldun, yə'ni ikmal olısar.

Şol əlif qəddün içün qəddümi eylədün düta,
Yə'ni kı, eşqinə bu halət anun dal olısar.



Yüzünün günəşi qıldı yürəgümi mühtərəq
Bildüm ol danə ki, yüzündə bəgüm xal olısar.

Bən verürəm ruhı cismünün təcəllisi içün,
Xalis olısar vücudum kül oda qal olısar.

Ol nəfəs ki, zülfünə tolaşdı könlüm anladum
Ki, kimə sevdayi xam uyarsa pamal olısar.

* * *

Əzəldə ayru dəgül idi hiç budü nəbud,
Ki meyl qıldı idi buduna bu budü vücud.

Anun içün bu həbibə xəlayiq oldı mühib,
Ki gəlmədin dəxi həq ana oldı idi vədud.

Qaşında savvə ruhum düzmədin iki mehrab
Yüzün dəgülmidi üşşaqa, ey sənəm, məscud.

Qaşun kirişməsi qıldı bir neçəsin məqbul,
Gözün itişməsi etdi bir neçəsin mərdud.

Həva bc hükmi əzəl qıldı könlümə anı ki,
Qıla bc hükmi əbəd kəbrə atəşi-uxdud.

Əcayib atəş olur eşq əhli atəşi ki,
Yaxar oda nəsini var isə bilür məzdud.

Əlümdə sən yoğ idün varlığumı yaxdum oda,
Ki cud olmaya illa, məgər ki, bi'l-məvcud.

Cəmali kisvəti içrə təcəlli eyləməsən,
Cəlali sətr qıla idi abidü mə'bud.

Yanaxlarumı səninçün qıluram uş dinar,
Nola çü Yusufa oldı dərahimi-mə'dud.

* * *

Ağızun anar olur isəm, ağızum sulanur,
Ləbünlə dişlərün içün dəxi gözüm sulanur.

Əgərçi mərdümə uymax xəyali-batildur,
Gözümə sini gələ deyü uş yüzüm sulanur.

Könül ilə göz arasında oda, suya düşip,
Çoğum yanar oda əgərçi ki, azum sulanur.

Qübar gözümə girür varurkən eşigünə,
Əgərçi göz yaşı ilə bəgüm izüm sulanur.

Düzüm-düzüm dişün içün dökər gözüm yaşını
Anun içün dökilicək düzüm-düzüm sulanur.

Oda yanar könülüm gər zəmirə eşqi geçə,
Çü şe'ri-ləbləri içün deyim sözüm sulanur.

Xəyali gözdə balıx kibidür su içində
Bu bürcə çünki qədəm basa, yılduzum sulanur.

* * *

Ləbləriinün suyı sülafmıdur,
Mey doxi yə'ni böylə safmıdur?

Sərv qəddünə qarşu nə sallanur,
Qəsdi yə'ni ana xilafmıdur?

Yox nəzirün əgər der isəm bən
Bu sözüm əz səri-güzafmıdur?

Ya bənüm kibi aşiqin yoxdur,
Der isəm fikrünüzdə lafmıdur?

Könülümdəkiyi bilür könülün
Bu könüldən ana şikafmıdur?

Arizindağı bəni Kə'bəmidür,
Gisusı gəzdügi təvafmıdur?

Türki gözün həzar dil yaralar
Bu məmalikdə ol müafmıdur?

Guşədən baxduğına xəstə gözün
Səbəbi ancaq inhirafmıdur?

Əsvəd olduğı əf'i gisularun
İlləti mən'i-insirafmıdur?



* * *

Tən gəmidür bu cəhanda ömr qurmış badban,
Bu dənizdə aşina bilməyənə yoxdur aman.

Can ki ərşidür bu fərqin təndə qılmışdur qərar,
Gərçi var fərq aralıxda əz zəmin ta asınan.

Canmıdur ol can ki, ol cananəyə tən olmaya,
Xassa, ol cananəyə k'anun tənidür həmçü can.

Lə'l ağızun lö'lü dişünçün neçə ki ağlaram,
Gözlərümə irişür hər dəm mədəd əz bəhrü kan.

Varlığı tərk edibən yolunda canlar oynamax
Eşq əri zə'mində billah zi xəyati-raygan.

Qəmzən oxı qan yayından çün toxındı yürəgə,
Çarə nə şol tirə ki, ol oldı cəstə əz kəman.

Canı bir lə'linə verdümü könüli birinə,
Düşdi fi'l-cümlə yenə alarun arasına qan.

* * *

Yanaxlarunda, nigara, nə aldur nazik
Nə aldur k'anun içində xaldur nazik.

Bu tar könülümə yoxdur təriq ağızuna,
Qaçan ki sözə gələsin məcaldur nazik.

Güman ki, qıldum ağızunda qatı şirindür,
Belündə qıl ki, yararam, xəyaldur nazik.

Belüni qucağa almax haramdur mövzun,
Belün içün qıla dönmək həlaldur nazik.

Qədün əlif, ağızun mimü qaşlarun nundur,
Bu nam içün qədümə bax, nə daldur nazik.

Bu gecə ayı ki gördüm yüzündə, ay günəşüm,
Günüm mübarək, ayum qutlu, saldur nazik.

Saçun tivali-müfəssəldür, əl urayım ana,
Ki yedi bölügi səbi-tivaldur nazik.

* * *

Cövri çoxü lütfi azü azı nazikdür anun,
Azımuz çoxdur, azına azı nazikdür anun.

Can ilə əqlü könülüm gözlərinə bəvlidür,
Zira ki, hər xüftə gözi nazikdür anun.

Bağlamışam ağızınun sirrini könüldə təng,
Saxlamax vacibdürür, çün razı nazikdür anun.

Eşqi çəngində anun bən söz içün saz etmişəm,
Neydən əksük yanmağ olmaz sazı nazikdür anun.

Nazıdur bənüm niyazüm, leyk ana taqət gərək,
Bəndə yoxdur hiç təhəmmül, nazı nazikdür anun.

* * *

Camı tolu lə'l edibən billah, saqi, al bərü,
Ey oyağı altunü ey sim, saqi, al bərü.

Yaşı uzun gözümün ki, verdi badə ömrümi,
Badədən bulur mədəd həm ömri-baqi, al bərü.

Eşq əyağın içməkü varlığı qılmaxlıx fəna,
Bir yasaqdurur qədimi, dut yasaqi, al bərü.

Taqi-hüsnündə ki, göz qomışsın, ol fitnə gözi
Ol imamumdurü mehrab oldı, taqi al bərü.

Yaxına-yaxına irdüm qılmağıl bəni iraq,
Ol könüldə yaxınü gözdə iraqı al bərü.



* * *

Könülümə nə gəldi sevdayidür, olamı,
Hər bir qıla tolaşmış hərcayidür, olamı?

Salıb dənizə özin hər bir qıla tolaşur,
Hərgiz sözümə girməz xudrayidür olamı?

Zülfi kibi sərvinə dayim tolaşa dilər,
Yarəb könülüm eşqi balayıdur, olamı?

Hər qəmzəsi gözinün turmaz yürəgümdə hiç,
Aşiq yürəgi tonı yektayidür olamı?

Gözüm sudanü könlüm oddan dəm urur dayim,
Bu narıdururü ol dəryayidür, olamı?

* * *

Çün müşg saçun duşbəduş irdi, nigara,
Avazei-və'l-leyl be guş irdi, nigara.

Məxmur idi dil lə'li-ləbünün meyi ilə,
Nişi dəxi bu cana çü nuş irdi, nigara.

Əbr ağlamağa başladı, olamı ki, gögə
Hicran gecələrində xuruş irdi, nigara.

Şol dəm ki, tolu verdi xəyali gög mey
Nəql eyləməgə püstə füruş irdi, nigara.

Gər lə'l ilə dürdünə nola gözümü ağzum
Ümmani-mə'aniyə çü cuş irdi, nigara.

* * *

Könüldə qopalı, sənəma, bir səfayi-eşq,
Toldı bu aləmə yenə bizdən nidayi-eşq.

Bu dərdümün dəvasına əql idiməz əlac,
Bənzər bu dərdə ki, gərək olur dəvayi-eşq.

Qanı könüldə suvü gözümün yaşını qan,
Bənzüm gümişin altun edər kimiyayi-eşq.

Ənbər saçı çiynində canum müşki çin edər,
Olmadı bindən özgəyə hərgiz xətayi-eşq.

Zülfi nihayətinə bu eşqüm irəmədi,
Gərçi yüriyiməz kişi hərgiz bəlayi-eşq.

Çün gəldi eşq mülkini anə səmərlədüm,
Tədbiri-məmləkət hələ qaldı bərayi-eşq.

Qan ilə dəstəmaz aluram ləblərin içün
Ta bir düganə rast qılam az bərayi-eşq.

Eşqün axıtdı qanumı vü lə'li-ləblərün,
Ərz edər özüni ki, bənəm xunbəhayi-eşq.

Yürək dəlük-dəlük olıban nalələr qılur,
Də'visi buna yə'ni bənəm şimdi nayi-eşq.

Tardır könül bəğayətü eşqün dənizi od,
Can necə qatlanıblə pəs dər həvayi-eşq.

Bin yar eşqi ilə tağıbən böyimişəm
Məhrum olmaya kişi əndər sərayi-eşq.

* * *

Can olur isə bari cənanəyi-eşq olsa,
Məst olur isə kişi məstanəyi-eşq olsa.





* * *

Dedüm ləbüni sorsamü əmsəm olamı,
Bu dərdümə bənüm əcəb əm-səm olamı?
Çün irməz əlüm vəslünə, düşmişəm irax,
Düşdə xəyalünün ləbin əmsəm olamı?

* * *

Şad olur isəm, vəslün ilə, qəm olamı,
Bən irməz isəm, nəsnə sizə kəm olamı?
Səd parəvü məcruh edər idüm cigəri,
Lə'lün ilə bilsəm ana mərhəm olamı?!

* * *

Şaha, yüzünün gülini dərsəm, olamı,
Nə çəkdügümi yüzünə dersəm, olamı?
Püstə ləbinün diləgi bəndən candur,
Rədd eyləyübən sözüni sırsam, olamı?

* * *

Məstanə gözün daneyi-badam olamı,
Xal ilə saçun daneyi-ba dam olamı?
Şirin totağun baxdum idi baxtumdır,
İşbu azacux dünyada bir kam olamı?

* * *

Sərvün ki rəvan oldı, rəvana verələrmi?
Lə'lüni bu dünya tolu cana verələrmi?
Bən canı fəda qılur isəm, baxmağa bir gəz
Hüsnünə sənün şər' ilə qana verələrmi?

* * *

Könlüm yenə ol Leyliyə Məcnun olmış,
Yaşum yenə yar yolına Ceyhun olmış.
Ləbləri çəkişmiş könülümi olamı
Baxdum aralarında məgər xun olmış.

* * *

Şükr ana ki, bən dilbəri-narin sevərəm,
Könülümi yar yolına narin sevərəm.
Bu gün sevərəm ağzını ki, öləm anunçün,
Ta yenə diriləm deyü yarin sevərəm.

* * *

Lə'lün, sənəma, dərdümə əm-səm olur isə,
Bir sınamağ içün, nola, əmsəm olur isə.
Dəm qıldı ləbün yürəgümi nuşdur ana,
Can dəxi fədadur nola dəm-dəm olur isə.

* * *

Xəttün ki xəta eylədi, şaha, nə qılam bən,
Ol ortada barı, sənəma, bən nə qılam bən.
Könlüm quşı içün əgər anı tuzağ etdi,
Hacət dəgül ansuz dəxi zira ki, iləm bən.

* * *

Dərviş ki, dil riş ola, bizüm kibi olsun,
Şol yar ki, bixiş ola, bizüm kibi olsun.
Gər dilər isə ki, ola bu aləmə təşviş,
Ol cana ki, təşviş ola, bizüm kibi olsun.

* * *

Ol göz ki, yüzün görməyə, göz demə ana,
Şol yüz ki, tozun silməyə, yüz demə ana.
Şol söz ki, içində, sənəma, vəsfün yox,
Sən badi-həva tut anı, söz demə ana.

* * *

Şəm oda yanar bənzi sararuru dökər yaş,
Qaçan ki, dökər qarşuna fərraş, əfəndi.
Qan etdi gözüm lə'lün ilə yürəgi şimdi,
Tapdı yenə qan-yaş ilə padaş, əfəndi.



* * *

Dedüm ki, ləbün, dedi nə şirin söylər,
Dedüm ki, belün, dedi nə narın söylər.
Dedüm ki, canum cümlə fədadur saçuna,
Dedi ki, bu miskin hələ varın söylər.

* * *

Dedi ki, neçün gözüni pürnəm görürəm,
Ya könülüni bən nişə pür qəm görürəm.
Dedüm, sənəma, anun içün ki, ləbüni
Dayim görimməzəm, vəli dəm-dəm görürəm.

* * *

Bən ləblərüni canuma əm-səm görürəm,
Gözün yarasın könülə mərhəm görürəm.
Eşqün odını ki, yaxa iki cəhanı,
Bən kəndü canuma yalunuz kəm görürəm.

* * *

Eşq əhli yar yolına məstanə gərəkdür.
Sevdüginün eşigini yastana gərəkdür.
Cananə içün oynaya ol canını şöylə,
Ki tə'nə ura Rüstəmi-dəstana gərəkdür.

* * *

Yürək gözünün yolına səd parə gərəkdür,
Gisularun içində dil avarə gərəkdür.
Biçarəyə ki, qaldı bu gisun ilə miskin,
Şol lə'li-ləbündən, sənəma, çarə gərəkdür.

* * *

Cananəyə can verməgə üşşaqa saladur,
Can verməzü cananə dilər bu nə bəladur.
Aləm qamusı gər ərəsata ola hazır,
Bən sana əgər irər isəm, anda xaladur.

* * *

Unıtma bəni, şaha ki, dərvişəm, əfəndi,
Qəmzələrün oxı idə dilrişəm, əfəndi.
Tağıdalı zülfeynüni şol badi-şimali,
Cəm olımazam hiç, be təşvişəm, əfəndi.

* * *

Can gəldivü bən dedüm ana qəmzədəsin,
Tən gəldivü bən dedüm ana dilşüdəsin.
Göz gəldi ki, qıla gilə saçından anun,
Dedüm ki, aşıxma, nola, sevdazədəsin.





* * *

Əzəldə həq nə yazmış isə bolur,
Göz nəni ki, görəcək isə görür.
İki aləmdə həqə sığınmışuz,
Toxtamış nə ola, ya Axsax Teymur.

* * *

Həqqə şükür, qoçlarun dövranıdur,
Cümlə aləm bu dəmün heyranıdur.
Günbatardan güntoğan yerə dəgin
Eşq ərinün bir nəfəs seyranıdur.

* * *

Yaxşı anladum cəhanda vayə yox,
Yardan özgə bu xumarum aya yox.
İki aləmdə ümid sərvər durur,
Andan ayru dəxi hiç sərmayə yox.

* * *

Sənciləyin dünyada xub az imiş,
Nəğməni rast anladum, şəhnaz imiş.
Könüllər kəkligine bu dünyada
İlla, şahin gözlərün şəhbaz imiş.

* * *

Könüldə gizlü bolsa bir tasadür,
Ömür ilə əcəl dəxi həmkasədür.
Dünya bəzmində iki aləm dəxi,
Eşq əri qatında həm bir kasədür.

* * *

Bəllüdür hər qatında girdarumuz,
Eylə kim var mismilü murdarumuz.
Saqi, vergil əlümə tolu əyax,
Kim gedə bu könüldən jəngarumuz.

* * *

Söz deyəm sana əgər inanasın
Yar gözündür gözünə, nə sanasın.
Yarını anda biləsin nə durur,
Gər qərimə qarşu sən yasanasın.

* * *

Görmədüm sən tək lətif, nazik cəvan,
Tapuna olsun fəda canü cəhan.
Qətrəcə lütfün bizə irər bolsa,
Qətrə tək ola qatımda bin uman.

* * *

Könlümni qaraxladı göz qarası,
Gör məni nonə saldı göz qarası.
Dirilmək yeg tağıngan imkanı var,
Necəsi dirilə eşq avarası.

* * *

Söhbət etdük bu gecə şol yar ilə,
Şol qaraxcı gözləri əyyar ilə.
Anı qılınalum anunla bu dəm,
Kim qılınmadux dəxi dəyyar ilə.

* * *

Tutmağıl bizgə, ey can, sən dəq dəxi,
Tutmağay köp mücrimə dəq həq dəxi.
Adəm olduğ isə tapunda, nola,
Bülbül olmışdur hələ ləqləq dəxi.

* * *

Həmişə aşiq könli biryan bolur,
Hər nəfəs qərib gözi giryan bolur.
Sufilərün diləgi mehrab, nəmaz
Ər kişinün arzusı meydan bolur.



* * *

Yenə can bir ümmana talısardur,
Talıban köp gühərlər alısardur.
Otanuzdan çıxıban qara qılıc,
Düşməndən köp illəri alısardur.

* * *

Dövlətindən qaçan olur xaksar,
Aşiq olur mə'şuqından şərmsar.
Himmətümüz iki aləmdə gəzər,
Nolısar Amasiyə ya Nikisar.

* * *

Can bu meydan içrə agah ola gah,
Eşq ərinün varlığı ah ola, ah.
Kim bu yolda toğru gər varur isə,
Ərligün əvrənində şah ola, şah.

* * *

Bu dünya bu nəfs içün olmış yalax,
Dibi yaxındur anun dəgül irax.
Zülfüni tağıtma cəm eylə, bəgüm,
Yoxsa olur bu cəhan alax-bulax.

* * *

Tənəmi hökm edə yar ya canamı?
Eşq əri tənə cana yacanamı?
Yar yolına canü tən oynamayan
Ərənlər yasaqına yasanamı?

* * *

Məclisi kim xoş tutar ənbər, ənbər,
Könüli kim aparur dilbə, dilbər.
Dünya əhlinün başını kim çətər,
İşini toğru qılan sərvər, sərvər.

* * *

Gülşəndə dinlə nə der bülbül, bülbül,
Ertə-gecə edicək ğülğül, ğülğül.
Yaxşı gəldi könlinə sürahinün,
Anun içün başladı qülqül, qülqül.

* * *

Gözlərün dərdlülərün dərmanıdur,
Canü dil ol ikinün qurbanıdur.
Canuma sevmək səni irağ işdürür,
Netsə olur, ol çələp fərmanıdur.

* * *

Zülfün açsan, dünyada təşviş olur,
Qatı baxarsan cigərlər riş olur.
Gözlərün qan dökməgə quşanursa,
Dünyada çox kişilər dərviş olur.

* * *

Sərv qəddün ilə çəndan olmaya,
Gül xu yüzün kibi xəndan olmaya.
Lə'l ilə incüdürür şol, olamı,
Buncılayın ləbü dəndan olmaya.

* * *

Səni sevməyən, bəgüm, adəm dəgül,
Nə dəmi var kim ki, bağrı dəm dəgül.
Sən gözün qəmzəsini atma şuna,
Girməyə gər yarunuz, mərhəm dəgül.

* * *

Bən sevən xublar içində şah imiş,
Sanasın yılduz içində mah imiş.
Bən dənizə salmışam bir canumı,
Qamu işi başaran Allah imiş.



* * *

Gül ol ola, bülbülini gözləyə,
Şah ol ola, bir qulını gözləyə.
Xub ana deyəm ki, hər dəm içində
Bülbülinün ğülğülini gözləyə.

* * *

Zülfi əqlümi yabana yayamı,
Gözləri qəmzəsi bəni ayamı.
Görməyicək səni gözüm dünyayı
Bir kəminə çöpcügəzə sayamı.

* * *

Gisunuzda könülüm avarədür,
Bən xu yaram, qorxunuz ağyaradur.
Gərçi can zarü nizar ola tənüm,
Könülün nedəm ki, səngi-xarədür.

* * *

Sənciləyin bən yara irməmişmən,
Mən yazıya atduğum dərməmişmən.
Ta dikən tolmayınca bağçada
Bən anı balta ilə qırmamışmən.

* * *

Sən Xəlilullah xunini yaya dur,
Eşqi odından can ilə qaya dur.
Hələ, ey nər, kükrəvü meydanı al,
Çevrə yanundağı qamu mayədür.

* * *

Nət'ünün yüzündə bin ayat olur,
Kim ki olur anda, filü at olur.
Şəh rüxüni kim görürsə həq tanux,
Şəh demədin ol yüzündə mat olur.

* * *

Qanumı içdügünə fitva gərək,
Ey bəgüm, tihündə mən səlva gərək.
Sən deməzmiydün ki, bən sənün olam,
İşbu də'viyə bizə mə'na gərək.

* * *

Dilbərün işi itabü naz olur,
Çeşmi cadu, qəmzəsi qəmmaz olur.
Ey könül, səbr et, təhəmmül qıl ana,
Yara irişmək işi az-az olur.

* * *

Dil xud anundur, vəli can aparur,
Dini qoymaz əqlü iman aparur.
Könlümə girdi xəyalı dün gecə
Zülmət içrə abi-heyvan aparur.

* * *

Ağız-ağız yardan raz olsa xoş,
Dəmbədəm işvə ilə naz olsa xoş.
Yaxşı-yaman nə gəlürsə səhl ola,
Dilbəri yar ilə dəmsaz olsa xoş.

* * *

Bayramda gözəl qoçlar qurban bolur,
Aslanlar qayda bolsa, ğərran bolur.
Ərənlər cərgəsində söz söyləmək
Fi'l-məsəl, çün zirəvü Kirman bolur.

* * *

Şol quş ki, tutğan quşnı azad qılur,
Sanma ki, dünyada ol az ad qılur.
Bağdadı kim viran qıla bilür,
Ol yenə bu viranı Bağdad qılur.



* * *

Gözi can esritməgə xəmmar imiş,
Qaşı könül yıxmağa me'mar imiş.
Dilədüm halüm ki, gözinə deyəm,
Türfə budur gözləri bimar imiş.

* * *

Dünyayı çox sınadux, bir buy imiş,
Qamu aləm varlığı bir huy imiş.
Qaplan, aslan, əjdahalar cümləsi
Əcəlün qaynağında ahuy imiş.

* * *

Keçdi keçən var isə, dəvran budur,
Şimdi qopan canlara cəvlan budur.
Kimdə ki var isə gəlsün ortaya,
Gizləmək pəs nə içün, meydan budur.

* * *

Yar əgər biz qulı bilə yar isə,
Qulıyuz ancaq olur iqrar isə.
Biz ana verdük canı, özi bilsün,
Gər yar isə, yoğ isə, əğyar isə.

* * *

Cadu gözi canumı şikar edər,
Bən qulıyam, ol anı inkar edər.
Totağı içün şəkər dedüm idi,
Könülinə gəldi təkrar edər.

* * *

Eşq əri bu dünyədə dilriş imiş,
Rəncün içində bu gün dərviş imiş.
Geyməkü yeməkdən artux istəmək
Ər kişinün canına təşviş imiş.

* * *

Hər zəman suya varub gəlməz sənək,
Qayda geçər ər yerinə hər zənək?
Təngridən bolsa inayət bir qula,
Laçini dəxi qapar yer kükənək.

* * *

Ərənlər düşmənləri avlaşurlar,
Qəmzələr bir-birini qovlaşurlar.
Bən qulıyam dünyada ol nərlərün,
Ki, bu dəm meydanumda kükrəşürlər.

* * *

Könül alan dünyada dilbər, dilbər,
Ki oxıruz hüsnini əzbər, əzbər.
Aləmdə bin qarğaya bir sapan pəs,
Dünyada sərvər gərək sərvər, sərvər.

* * *

Oturub cəm' içən yarənlərdür,
Kim bunı bilür isə, ərənlərdür.
Kimə kim baxar isən, təhi baxma,
Qancaru baxar isən, ərənlərdür.

* * *

Binmişüz atumuza heyran, heyran,
Qılsa yar bizdən saru seyran, seyran.
Çox zaman gələvü ömür çox keçə,
İlla qanı bu nəfəs qayran, qayran.

* * *

Dünyada qoçlar başı sərvər bolsa,
Qoçları bir-birindən sıçrar bolsa.
Nə gərək anda gişi can oynamax,
Canü dil sərvərinə yarar bolsa.



* * *

Eşq əri oldur ki, ol məst ola, məst,
Neçə ki, nist ola, ol həst ola, həst.
Neçə ki başı göğə yetər isə,
Yarənlər arasında pəst ola, pəst.

* * *

Könülüm tək görmədüm bir çin könül,
Qamu könül könlümə pərçin könül.
Tolaşub zülfünə yetürmiş özin,
Ey könül, qara könül, miskin könül!

* * *

Ərənlər meydanlarda cövlan edər,
Düşmənün eli saru seyran edər.
Yaxşı-yaman, xeyr az, şərri qamu
Dutam qamu kimsədən dövran edər.

* * *

Sərv qəddüm yoluna xəm durur, xəm,
Gözlərüm eşqün içün nəm durur, nəm.
Zəhr içərəm eşqün içün dəmbədəm,
Yeməgüm ol ortada qəm durur, qəm.

* * *

Zülfünə de qılmasun bana təşviş,
Qəmzələrün qılmasun, şəha, dilriş.
Bən zənaxdanun çahında düşmişəm,
Nola gər bir guşədə dura dərviş.

* * *

Hər nəfəs qəmdən könül azad oldı,
Könüllər bu arada dilşad oldı.
Dünya müşərrəf durur adum ilə,
Bu ara şimdi hələ Bağdad oldı.

* * *

Dünyada gerçək aşiq qanı, qanı,
Aşiq isən, gözünün qanı qanı?
Hər aşiq-mə'şuq içün baş oynarsa,
Bən aşiqün yoluna canı, canı!

* * *

Ər yigit qayda ürkər ürkülərdən?
Yaxşı at bəlinləməz ilkülərdən.
Düşmənlər bizdə bolsa ditrəşsünlər,
Qağan aslan qaypınmaz dilkülərdən.

* * *

Yoluna canın verən canbaz imiş,
Eşq əri mə'şuqına dəmsaz imiş.
Gizləyəm der idi aşiq razını,
Göz yaşı, yüz sarusı qəmmaz imiş.

* * *

Rə'iyyət gileyləri şol şahadur,
Gecəyi gündüz qılmax şol mahadur.
Qorqmazam bu dünyada hiç kişidən,
Canumun əmanəti Allahadur.

* * *

Ərənlərün hər işi əranədür,
Qaplanlar tutduğı iş şiranədür.
Mayələr mayalığın etsə nola,
Buğralıxın qılsa iş nəzalədür.

* * *

Bun günində qoçlara bən işəm, uş,
Bəg isəm, hələ bu dəm dərvişəm uş.
Dostlaruma dinclik isəm, nə əcəb,
Düşmənümün canına təşvişəm uş.



* * *

Dünya deyən kişiyə bir vayədür,
Yemək-içmək bu cana bir dayədür.
Dünya bir geçütdürür, gələn geçər,
İlla, sərvər yigidə sərmayədür.

* * *

Yar oldur ki, yar ilə həmdərd ola,
Yarından yüz qaytaran yar sərd ola.
Yemək-içmək yaxşılıx günin görən,
Ər günində gər dönə namərd ola.

* * *

Dərdümüzün həq bilür dəvasını,
Tabaqda gördi düşmən bəhasını.
Sidq ilə oxu qılıc ururısax,
Qoparalum Misr eli qayasını!

* * *

Yola gedər olanı şol nər buğur,
Yolı uğradı hələ olsun uğur.
Təngri saxlasun anı yaman gözdən,
Meydanda kükrəyicək günür-günür.

* * *

Qışladan başladı dəprəndi oba,
Qöncə yenə könləgin qıldı əba.
Nilufər yatdı, başın taldı suya,
Neyləsün qəmmaz durur badi-səba.

* * *

Özini əş-şeyx görən sərdar bolur,
Ənəlhəq də'vi qılan bərdar bolur.
Ər oldur həq yolına baş oynaya,
Döşəkdə ölən yigit murdar bolur.

* * *

Nazik olur xubların bir neçəsi,
Ağzı püstə, boy uzun, beli incəsi.

* * *

Seyl axar hələ bu dəm yaşum bənüm,
Yürəgüm qanıyladur aşum bənüm.
Qeyrət içün bir quşax quşanalum,
Anun içün gedisər başum bənüm.

* * *

Ərənlər öz yolunda ər tək gərək,
Meydanda ərkək kişi nər tək gərək.
Yaxşı-yaman, qatı-yumşax olsa xoş,
Sərvərəm deyən kişi ərkək gərək.

* * *

Yar yüzində incüdür, dürdanədür,
Zülfi damü qara xalı danədür.
Yolına ölür isəm, tutma əcəb
Yar içün can oynamax mərdanədür.

* * *

Dünyada ər varlığı dildar imiş,
Eyşü işrət rövnəqi didar imiş.
Yüzi gül, sünbül saçı, ənbər xəti
Pos cəmalı külbeyi-əttar imiş.

* * *

Önümüzdə şəm'əlar yana durur,
Yigitlər qızıl süci qana durur.
Bu dəmi gəlün qənimət görəlüm,
Ki dünya, ey yarənlər, fəna durur.

* * *

Hər zəmanun bir nigarü şahi var,
Hər günün günəş, gecənün mahi var.



Oduna düşənə qalmadı qərar,
Yola çıxan kişinün Allahi var.
Zarü zərd olan nizar olsa ola,
Çünki bu yolda anun bir ahi var.
Kim ki həmdəmdür cəfavü cövr ilə,
Lacərəm hicr ilə bir həmrahı var.
Köhnopuş oldı bu dəm yolunda can,
Haliya nə isə şey-lillahi var.

* * *

Gözəl çox, arasında dilbər qanı,
Taşlar köp, orta yerdə cövhər qanı?
Qoçü buğra, ayğırı çox görmişüz,
Adəmilər içində sərvər qanı?

* * *

Qarşudan çıxıp gələn həbib imiş,
Yanağında qara bən qərib imiş.
Lütf ilə dərdümüzə qıldı dəva,
Bolğaymı ol yeganə təbib imiş.

* * *

Qanqı canda od varını ah bilür,
Başda nə yazılmışın ol şah bilür.
Can giripdür eşqi yolına anun,
Yola çıxanun işin Allah bilür.

* * *

Şöylə ki, ənbər saçı miskin olur,
Nə əcəb gər can ana miskin olur.
Neçə ki canda köz olursa odı,
Ahü zar birəz təskin olur.

* * *

Cana can verməyənün nə canı var,
Can verənün adı ilə sanı var.
Ər kişinün mətaı ərlik olur,
Cövhərinün lə'l ilə mərcanı var.

* * *

Ərənlər bu dünyaya qılmaz nəzər,
Bunda əqli var kişi qılmaz qərar.
Bu dünya kölgədürür, qovar qaçsan,
Bir kişi ki qaçar andan, ol qovar.

* * *

Gün neçə ki seyr edər cövlanında,
Görməmiş siz tək cəvan dövranında.
Ərənlər cərgəsində deyilən söz
Yerinə yetmək gərək meydanında.

* * *

Yoluna can verməyən təqsir edər,
Gördügi düşini kəj tə'bir edər.
Hər kişiyə nəyazılğanın görür,
Anı bilməyən dəxi tədbir edər.

* * *

Bülbül özini bu dəm tə'rif edər,
Növbaharı görənlər təşrif edər.
Tuti gör bünyad edə qövlü əməl
Muna ləqləq musiqi təsnif edər.

* * *

Gözümdən axıduram cigər qanı,
Göz qanına döyməgə cigər qanı?
Qaşı yay, kirpükləri səhərdürür,
Ol səhərə dünyada sipər qanı?

* * *

Ər kişi ər aybından kor ola gər,
Dünyada adəmilər bolar bəşər.
Məhəgə tutmayınca kim nə bilə,
Safimidür, yaxu qatıxlumı zər?



* * *

Neçə ki gögdə günəş seyranıdur,
Bu cəhan ərənlərün meydanıdur.
Yevü yedürgil, alü bağışlağil,
Hər zəman bir yigidün dövranıdur.

* * *

Gözlərün Bağdad eli əyyarıdur,
Ləblərün Rum elinün xəmmarıdur.
İşvələrün ilə kimün sözi var,
Hər şivən bu dünyanun me'marıdur.

* * *

Sultandan biz qullara fərman bolsa,
Yar ləbindən dərdə bir dərman bolsa.
Şol hilali qaşını çün gördi göz,
Varlığumuz yolına qurban bolsa.

* * *

Rüxüni görür bolsa şamü şamat,
Atını salıb yayax bolısar mat.
Bu sözi dedüm sana inanmazsan,
Üsdümə yaz hüccəti, işdə dəvat.

* * *

Hər zamanda təngiri yaxar bir çırax,
Ana yaman sağınan qalur irax.
Düşməni həqə sığınub basaruz,
Saqi, tez tut, sun bizə tolu əyax.

* * *

Yar gərək yarı ilə həmrəng ola,
Gər nişatü eyşü sülhü cəng ola.
Ol iki yarun ki uyışmaz bilə,
İşləri ortada şişə-səng ola.

* * *

Yarənlər fəraqından ahü bin ah,
Yar içün ölməkligə çoxdur günah.
Şol gün içün ki, yigitlər günidür,
Cümlənüzdən dilərüz bir gəz Allah.

* * *

Tutalum, süci vardur, hərif qanı?
Ortada söz çox geçər, arfi qanı?
Səbzəvü cuyü çağır xatırdürür,
Yari-nazik, dilbəri-zərif qanı?

* * *

Cana qalma, gər yara irəm dersən,
Bağa düşgil, şəftalu dərəm dersən.
Başa-cana dünyəligə qalmağıl,
Ərənlər meydanına girəm dersən.

* * *

Sabaha çıxarmışdur məxmur gözlər,
Yayını qurıb aşiq könlin gözlər.
Mən anı cəfasıyçün yüzləmədüm,
Ol məni eşqim içün bin gəz yüzlər.

* * *

Mə'şuqun hiç aşiqə yanmaz bağrı,
Bin aşiq yar qatında bir çöp ağrı.
Hələ yarun yolına varlıx fəda,
Düşmənə bir gəz dəxi Allah-Tanqrı.

* * *

Saçun tək bu dünyada ənbər varmı,
Gözün tək bağ içində əbhər varmı?
Cənnət içrə hurilər cəm olıcax
Xublara sənciləyin sərvər varmı?



* * *

Gözi əsridüb özi ayasıdur,
Vəsfümüzni dünyaya yayasıdur.
İvməgil bir dəm ki yetə atlusı,
Bu hənuz eşqümüzün yayasıdur.

* * *

Yarı əğyara qor isəm, cəhl ola,
Cəfa yardan çəkər isəm, səhl ola.
Yar ölür isə yarıyçün qəm dəgül,
Səhl ola iş, çünki dilbər əhl ola.

* * *

Yalunuz yarıcısı bir Allahdur,
Qəribün naləvü zar ilə ahdur,
Yüz urıban ərənlər həzrətindən,
Biz günəhlü qullarun şey-lillahdur.

* * *

Eşq qatında zahida bir dəng imiş,
Dilbərlər könülləri çün səng imiş.
Bu nəfəs ki, məqsudlar buldı xasil,
Çevrəgi yaranlarun gülbəng imiş.

* * *

Kim bilürlər bir nəfəsə bəhanədür,
Ol işlər ortada qul bəhanədür.
Kişi öz əksükligin bilicəgəz,
Dünyada anun işi şəhanədür.

* * *

Badə olmasa, ömür bərbadədür,
Cana yarun söhbəti zəvadədür.
Qəddünə sərvi-səhi quldur, bəgüm,
Necə kim anun adı azadədür.

* * *

Cənnətdə yüzün kibi hur olmağay,
Məst gözün kibi məstur olmağay.
Yoluna can oynamağı dilərəm,
Qorxum oldur k'ana dəstur olmağay.

* * *

Canum ol ki, cümlə aləm canıdur,
Ləl'i anun cümlə cövhər kanıdur.
Şükr ana ki, bir nəfəsdə gəlmişüz,
Kim bu dəm ərənlərün dövranıdur.

* * *

Dünyada bir cana bənzər can gətür,
Kafir isən, dəxi gəl iman gətür.
Hələ bu dərdə düşibən yanaram,
Buldun isə, dərdümə dərman gətür.

* * *

Qağan aslanlar əgər anrar isə,
Anlaya hər kim ana uğrar isə.
Qanda əgri var isə tutmağıl dəq,
Sa'iqə, qoç qılıcı toğrar isə.

* * *

Eşq əri necə yanısar naz ilə,
Neyləyə, görün, könül şəbbaz ilə.
Tutalum, aşiq ki razın saxlaya,
Neyləyə gözi kibi qəmmaz ilə.

* * *

Hiç onılmaz gözlərinün yarəsi,
Qıydı yavlax bana canum parəsi.
Tağıdur zülfini ki, bən tağılam
Xud necə cəm ola eşq avarəsi.



* * *

Üsdündə dəvlət bu gün seyvan olsun,
Səadət yenə bizgə eyvan olsun.
Neçə ki bən sağamü qayğurmanuz,
Var canum yigitlərə qurban olsun.

* * *

Şol kişinün ki canında dərdi var,
Əşki-sürxü rəngi-ruyi-zərdi var.
Əldə beş barmağı düz kim görmişdür,
Mərd olan yerdə labüd namərdi var.

* * *

Bulmayam sən tək necə arar isəm,
İki aləm xalqını arar isəm.
Yürəgümdə həm yenə nəqşün bulam,
Bıçağ alıban anı yarar isəm.

* * *

Yar əgər yürəgümni yarar isə,
Mən anı tartınmayam yarar isə.
Mən özümni yolına qıldum fəda,
Nola çün insaf ana gər yar isə.

* * *

Ərmidür sərbazü zərbaz olmayan,
Alaca ördəglərə olmayan?
Yemək, içmək, gülmək, oynamax haram,
Ər günində yara dəmsaz olmayan.

* * *

Oldı müsəxxər bizə çü Şam ilə Rum,
Düşmənə dəmür boldux, dostlara mum!
Nər kişilər yürisün yollarına,
Çün dosta mübarəküz, düşmənə şum.

* * *

Basıcax dünyaya sən düşdi xaçlar,
Başladı həq batilləri başın suçlar.
Dünyaya hər qoç ki gəldi, şükr ana,
Tayandı anan birlə cümlə qoçlar.

* * *

Görəli saçunı bulmadum qərar,
Yüzünə bolsun fəda gül, ey nigar!
Turıcax qarşunuza mən dərlərmən,
Sanasın dökmiş gülgə əbri-bahar.

* * *

Tapuna olsun fəda tənü canum,
Yoluna qıldum qurban itü xanum.
Arü namusı əgər tərk etdi yar,
Qoymazam bən dünyada adü sanum.

* * *

Qoşunlar bir-birinə qaxşaşmaşda,
İki aləm çərisi çaxşaşmaşda.
Topumuz bolmısar xalqa ümid,
Bu cəhan xalqı işi oxşaşmaşda.



# LÜĞƏT

## A

*Abi-bəqa* – əfsanəyə görə, guya zülmətdə olan bir çeşmənin suyudur ki, bunu içən ölməzmiş
*Abi-neysan* – neysan, aprel ayında yağan yağış, bahar yağışı; çox axan göz yaşı
*Adab* – ədəblər, qayda-qanun, üsul
*Afiyət* – cansağlığı
*Ahən* – dəmir
*Aid* – qayıdan, dönən
*Al* – hiylə; tünd-qırmızı
*Alşax* – alçaq, aşağı
*Alud* – bulaşıq
*Amm* – kütlə, xalq
*Ariyət* – müvəqqəti alınan şey, borc
*Ariz* – yanaq
*Assı* – fayda, qazanc
*Aşiyanə* – sığınacaq, məskən, yuva
*Aşub* – qalmaqal, çaxnaşma, fitnə
*Aşüftə* – həyəcanlı, dəlicəsinə aşiq, vurğun
*Avəng* – asqı
*Ayax* – qədəh, piyalə
*Ayat* – ayələr
*Azürdə* – incimiş, qəmli

## B

*Bab* – qapı; layiq, tay; haqq
*Badban* – yelkən
*Bahir* – üstün, gözəl, aşkar
*Baqi* – daimi, əbədi; axirət, o biri dünya
*Barə* – dəfə, kərə; səngər, sədd
*Bari* – yaradan, Allah; yükə məxsus
*Basir* – görən
*Başaq* – ataş, ox ucu, bıçağın ağzı
*Bey'* – alğı-satqı
*Bəcüz* – başqa, əlavə
*Bə'dən* – nəticədə
*Bədənə* – qırğı

*Bəid* – uzaq, yad, qəribə
*Bəğayət* – olduqca, son dərəcə
*Bəhəm* – toplamaq
*Bəhram* – bax: Mərrix
*Bərca* – münasib
*Bən* – xal
*Bənat* – qızlar
*Bənatünnə'ş* – Böyük Ayı bürcü
*Bənciləyin* – mənim kimi
*Bərat* – qiymətli şey; islam dininə görə, Məhəmmədə peyğəmbərlik xəbərinin verilməsi, Məhəmmədin qızı Fatimənin toyu, şiələrin XII imamı Mehdinin anadan olan günü və gecəsi
*Bərcis* – Yupiter
*Bərdar* – dara çəkilmiş
*Bərgü nəva* – sərvət, var-dövlət
*Bərhəm* – qarmaqarışıq, dağınıq
*Bəri* – pak, təmiz, günahsız
*Bərid* – qasid
*Bəs* – kifayət
*Bəsa* – çox, xeyli
*Bəsit* – düz, hamar
*Bəstə* – hər cür musiqi əsəri; bağlı
*Bəşarət* – şad xəbər, gözaydınlığı, muştuluq
*Bət* – şərab kuzəsi
*Bəti* – qarın, sirr
*Bəyza* – ağ
*Bibak* – qorxusuz, qoçaq, igid
*Bidad* – ədalətsiz
*Biğü şəra* – satış və alış, ticarət
*Biliş* – bilik, təfəkkür
*Bilü* – şar, şar ilə uşaq oyunu
*Bimahaba* – qorxusuz
*Binaguş* – lap yaxın
*Binəzir* – misilsiz
*Biriya* – səmimi
*Bisərü saman* – kasıb; yöndəmsiz
*Biş* – çox
*Bişə* – meşə
*Bişümar* – saysız-hesabsız
*Bitik* – məktub



*Bu (y)* – iy, qoxu
*Bud* – varlıq, həyat
*Buğur* – ikihürgüclü dəvə
*Bun* – sıx, cansıxıcı
*Butə* – zərgərlərin qızıl və gümüş əritdikləri üçkünc qab
*Büka* – ağlama, iztirab
*Bün* – ehtiyac, sıxıntı
*Bünyad* – özül, təməl
*Büraq* – islam əsatirinə görə, Məhəmməd peyğəmbərin əfsanəvi atının adı
*Bürci-həməl* – on iki bürcün birincisi, Quzu bürcü
*Bürhan* – dəlil, sübut
*Büridə* – kəsilmiş, kəsik
*Bürqə* – üz örtüyü, rübənd
*Büryan* – yanan, yanmış
*Bütşikən* – bütdağıdan
*Büttiraş* – büt qayırıb satan, büt yonan (düzəldən) adam

## C

*Cafiyə* – ürəksiz, kobud, zalım
*Cah* – yer, mənsəb, hörmət
*Came* – tam, bütün, toplanma yeri
*Cami-cəm* – Cəmşidin camı (əfsanəyə görə İran şahı Cəmşidin dünyadakı bütün şey və hadisələri göstərən qədəhi)
*Canbaz* – yaxşı, minici, hiyləgər
*Cangüdaz* – can yandıran, böyük kədər törədən
*Cari* – axan, rəvan; indiki, hazır
*Caru* – süpürgə
*Ceyş* – qoşun, ordu
*Cə'd* – qıvrımsaç
*Cə'fəri* – kiçik çay, kişmişə bənzər dadlı və ətirli bitki
*Cəhim* – cəhənnəm
*Cəhr* – səsini ucaltma
*Cəhrən* – ucadan, bərkdən
*Cəm* – hökmdar, şah
*Cəmad* – qeyri-üzvi maddə
*Cəməl* – dəvə
*Cənan* – ürək, qəlb
*Cənin* – döl, rüşeym
Cərəs – zəng, zınqırov

*Cəri* – cürətli, qorxmaz
*Cərrar* – sürüyən, çox
*Cəstə* – sıçrama
*Cəvad* – əliaçıq, səxavətli
*Cəvsəq* –saray
*Cəzm* – kəsmə, qət etmə, qəti surətdə, qərarlaşdırma
*Cəzr* – kök, əsil
*Cibillət* – yaradılmış, təbiət
*Cilvə* – parıltı, işıltı; naz, qəmzə
*Cinan* – cənnətlər, behiştlər
*Cövşən* – zireh
*Cud* – əliaçıqlıq
*Cuy* – axar su, arx
*Cüft* – cüt, qoşa
*Cülab* – gülab, gül suyu
*Cür'ə* – bir qurtum içki
*Cürm* – günah, fağır
*Cürmi-ərz* – Yer kürəsi
*Cüruh* – yaralar
*Cüstü cu* – axtarma, araşdırma
*Cüz'i* – qisim, parça, Quranın otuzda bir hissəsi

## Ç

*Çah* – quyu, çənə çuxuru
*Çakər* – nökər
*Çalak* – cəld, çevik
*Çar* – dörd, fəlsəfədə dörd ünsür (torpaq, su, hava və od)
*Çarsu* – dörd yan
*Çav* – şan-şöhrət
*Çələbi* – ağa, əfəndi
*Çənbər* – əyri, halqavarı
*Çəndan* – o qədər, o dərəcədə
*Çəng* – pəncə, arfaya bənzər musiqi aləti
*Çəngi* – dəf çalıb nəğmə oxuya-oxuya oynayan rəqqasə, çəng çalan
*Çərx* – tale, bəxt, fələk
*Çinə* – qıvrım, bürünmə
*Çini-əbru* – qaşqabaq
*Çü* – indi ki, kimi, tək, sanki
*Çün* – necə ki, elə ki
*Çünü çəra* – niyə və necə, boş danışıq



## D

*Dad* – ədalət, insaf, yardıma çağırma
*Dam* – tor, tələ, həbsxana; ov quşu
*Damad* – kürəkən
*Dar* – ev, məkan
*Daru* – dərman
*Deh* – kənd
*Deyr* – kilsə
*Dəbəran* – qırmızı rəngli ulduz adı
*Dəbur* – ayrılıq
*Dəfatir* – dəftərlər
*Dəgəl* – cavan oğlan; hiylə; yelkən
*Dəhr* – zaman, dünya; tale
*Dəhri* – axirətə inanmayan
*Dəqq* – çalma, döymə
*Dəlal* – naz, işvə
*Dəm-dəm* – dəqiqəbədəqiqə; dindarlara görə xoşnəfəs, nəfəsi təsirli olan
*Dəmsaz* – uyuşan, yoldaş
*Dəmsərd* – laqeyd
*Dəndanə* – diş-diş
*Dəng* – huşunu itirmiş
*Dəni* – alçaq, rəzil
*Dərbədər* – dar keçid, boğaz, cəftə, darvaza
*Dərhəm* – qarmaqarışıq, kədərli
*Dərxəfa* – gizlidə, xəlvətdə
*Dəridə* – yırtılmış
*Dərmiyan* – aralıqda
*Dəstar* – əmmamə
*Dəstur* – əmr, göstəriş
*Dəvəran* – dolanma, hərlənmə; mərasim
*Də'vi* – iddia, tələb
*Dəvvar* – dövr edən
*Dəycur* – çox qaranlıq
*Dibac* – bəzəkli, çiçəkli
*Didar* – üz, camal
*Dilbənd* – əziz, sevimli
*Diləfruz* – sevindirən
*Dilpəzür* – könülə yatan
*Dilriş* – könlü yaralı, qəmli

*Dilsaz* – gözəl rəftarlı
*Diriğ* – əfsus, əsirgəmə
*Diyə* – qanbahası
*Dud* – tüstü
*Düxan* – tüstü; həmin sözlə başlayan Quran surələrindən birinin adı
*Dürd* – şərabın çöküntüsü
*Dürərbar* – dürr saçan
*Düş* – yuxu, röya
*Düta* – ikiqat, qıvrım, iki yerə bölünmə
*Düzd* – oğru

E

*Ebriq* – şərab kuzəsi
*E'caz* – qəribə, möcüzə
*Ehmirar* – eritema (dərinin qızarması)
*Ehtiraq* – yanma, alışma, bir səyyarənin günəşə yaxınlaşması, günəş ilə bir bürcdə olması
*E'raz* – təsadüfi hadisə
*Eyd* – bayram
*Eydi-əzha* – qurban bayramı

Ə

*Əbabil* – dağ qaranquşu
*Əbd* – qul, kölə
*Əbdan* – bədənlər
*Əbəd* – sonu olmayan zaman, həmişəlik
*Əbhər* – nərgiz çiçəyi; göz, gözəl adam
*Əbir* – xoş qoxu
*Əbləq* – alaca, ala-bula, ayağı ala (heyvan)
*Əbr* – bulud
*Əbtər* – övladsız, sonsuz; faydasız
*Əcvəf* – içiboş; açıq, örtülməmiş
*Ədani* – alçaqlar
*Ədu* – düşmən
*Ədvar* – dövrlər
*Əfaf* – bax: iffət
*Əflak* – fələklər
*Əfvac* – dəstələr, bölüklər



*Əfvah* – şayiə, söz-söhbət
*Əhbab* – dostlar, istəkli
*Əhəd* – vahid, tək
*Əhliyyət* – ləyaqət, layiqlik
*Əhmər* – qırmızı
*Əhsəntə* – çox gözəl, afərin
*Əhsənülvəch* – çox gözəl sifət, əlverişli yol
*Əhvəl* – çəpgöz
*Əhya* – dirilmə, yeniləşmə
*Əhzan* – kədərlər
*Əxtər* – ulduz, bəxt
*Əqd* – bağlama, nikah
*Əqdah* – qədəhlər
*Əqəbə* – dağ cığırı, yoxuş, təhlükə
*Əqiq* – qiymətli qırmızı daş
*Əqsa* – ucqar, uzaqda olan
*Əqval* – danışıqlar
*Ə'lal* – döndərmə, çevirmə
*Ələddəvam* – daimi olaraq, ardıcıl
*Əlf* – min
*Əlhəqq* – doğrusu, doğrudan
*Əlifiraq* – ayrılıq, hicran
*Əməl* – qüvvətli arzu
*Əmvac* – ləpələr, dalğalar
*Ə'na* – yorğunluq
*Ənbaz* – ortaq, şərik
*Ənbər* – gözəl ətir
*Əncüm* – ulduzlar
*Əndəlib* – bülbül
*Əndişə* – düşüncə, dərd, qayğı, maraq, həyəcan
*Ənəg* – yanaq
*Əngiz* – qızışdıran, hərəkətə gətirən
*Ənqa* – Qaf dağında yaşayan əfsanəvi bir quş
*Ənnuru fi's-səvad* – qaranlıqda işıq
*Ərəfat* – Məkkədə ərəfə günü hacıların durduqları yer
*Ər'ər* – sərv, sərv ağacı
*Ərəsat* – meydan, qiyamətdə dirilən ölülərin toplanacağı yer
*Ərş* – qübbə, taxt-tac, səma
*Ərvah* – ruhlar
*Ərzan* – ucuz

*Əsas* – gecə qarovulçusu
*Əsəd* – qədim astronomiyada 12 bürcün beşincisi
*Əsəl* – bal
*Əsən* – sağ
*Əsfər* – sarı
*Əshab* – tərəfdarlar, müsahiblər
*Əsritmək* – sərxoş etmək
*Əsvəd* – qara
*Əşhab* – oxşarlıq, eyni, qaralma, qırmızı mis
*Əşhur* – aylar
*Əşk* – göz yaşı
*Ətlal* – xarabalıqlar
*Ətnab* – uzunçuluq, sözçülük
*Əttar* – ətir satan
*Əvaqib* – aqibətlər
*Əvalim* – aləmlər, dünyalar
*Əvlək* – üzdə qırışıq; səngər, oyuq
*Əvsaf* – vəsflər, keyfiyyət
*Ə'yad* – bayramlar
*Əyar* – düzgünlük, dəqiqlik
*Əyyar* – hiyləgər, kələkbaz, avara
*Əza* – üzvlər; incimə; təsəlli, səbr
*Əzb* – dadlı, gözəl
*Əzha* – qurban
*Əzm* – qəti məqsəd, niyyət
*Əzrəq* – göy rəng, mavi

## F

*Faxtə* – qumru
*Fakir* – yoxsul, kasıb
*Faliq* – yaran, parçalayan
*Fanus* – fənər
*Faris* – atlı, minici
*Fasilyis* – Vasili, İncili ilk şərh edən
*Fəmm* – ağız
*Fəna'* – yoxluq, fanilik, təsəvvüfdə mənəvi təkamülün yeddinci mərtəbəsi
*Fərağət* – vaz keçmə, boş vaxt
*Fərda* – sabah, gələcək zaman
*Fərəs* – madyan, at
*Fərxəndə* – uğurlu, xoşbəxt



*Fərid* – tək, misilsiz
*Fərizə* – dincə yerinə yetirilməli iş, miras
*Fərrix* – mübarək, uğurlu, xoşbəxt
*Fətilə* – piltə, qıvrım, bükük
*Fətva* – bir məsələ haqqında müfti və ya qazi tərəfindən şəriətə müvafiq verilən hökm, qərar
*Filfil* – istiot
*Firdövs* – cənnət, behişt
*Firiştə* – mələk, çox gözəl və mülayim təbiətli
*Fitrak* – yəhərin arxasında şey bağlamağa məxsus qayışlar
*Fövt* – ölüm, yoxluq
*Futə* – fitə
*Fücə'* – birdən-birə alma, gözlənilməzlik
*Fünun* – fənlər
*Füruş* – satan, satış
*Fütuh* – qələbələr

## G

*Gəbr* – atəşpərəst
*Gəhvarə* – beşik
*Gənc* – xəzinə
*Gəncur* – xəzinədar
*Gərd* – toz, torpaq; dərd, hüzn; gəzən, dolanan
*Gərm* – isti, qaynar; alveri yaxşı olan
*Giran* – ağır, dözülməz; bahalı
*Giranbar* – hamilə, ikicanlı
*Gireh* — düyün
*Giyah* – ot
*Giysu* – saç
*Guşadə* – açıq-aydın
*Guşmal* – qulaqburması, töhmət
*Guy* – top, kos
*Gülbang* – bir ağızdan hava ilə oxunan nəğmə, bülbül cəh-cəhi
*Gülçin* – güldərən, hər şeyin ələsı, bağban
*Güləf* – qızılgülə bənzər gülləri olan ot
*Gülşəker* – gül mürəbbəsi
*Gümrah* – yol azmış, doğru yoldan çıxmış
*Günbəd* – göy qübbəsi
*Günbədi-dəvvar* – dolanan günbəz, səma
*Güzin* – seçən, bəyənən

## H

*Hacib* – orta əsrlərdə Şərq hökmdarlarının baş vəziri; örtük, pərdə
*Hadis* – yeni zühur edən, baş verən
*Hamil* – yüklü, daşıyan, götürən; sahib
*Haris* – saxlayan, keşikçi
*Haşəllah* – Allah göstərməsin
*Hatəm* – qət edən, əmr edən; ərəb əsatirində çox səxavətli bir adamın adı; comərd, əliaçıq
*Hayil* – dəyişmiş, maneə, çəpər, əngəl; qorxunc, nəhəng
*Həbəzza* – necə, gözəl, əla
*Həcamət* – keçmişdə qanalma əməliyyatı və alətin adı
*Həcər* – daş
*Həcərüləsvəd* – Kəbədə ziyarətçilərin müqəddəs sayaraq öpdükləri qara daş
*Həqiq* – haqlı, müstəhəq
*Həlahil* – çox təsirli və öldürücü zəhər
*Həlavət* – şirinlik, dad, ləzzət
*Həllac* – pambıqdarayan
*Həkkak* – oymaçı
*Həm çu* – kimi, oxşar, tək (in)
*Həmra* – qırmızı, qızıl
*Həmsər* – yoldaş
*Həmta* – tay, tay-tuş
*Həmul* – dözümlü, səbirli
*Həmvarə* – həmişə, hər zaman
*Hənnanə* – başqa kişiyə meyl göstərən ərli qadın
*Hərcayi* – sərsəri, dərbədər
*Hərgiz* – heç vaxt, heç zaman
*Hərim* – məhrəm yer, müqəddəs yer
*Hərir* – ipək
*Həsən* – gözəl, göyçək
*Həşr* – qiyamət günü, qiyamət
*Həvan* – alçaqlıq
*Həyy* – diri, canlı
*Həzar* – bülbül; min
*Həzər* – saqınma, çəkinmə; oturaqlıq, şəhər əhalisi
*Həziran* – suyun adı
*Hicab* – pərdə; utanma
*Hidayət* – doğru yola çağırma, rəhbərlik etmə
*Himmət* – comərdlik, yüksək fikirlər



*Hirfət* – sənət, peşə
*Hisar* – hasar
*Hübab* – köpük
*Hüccac* – hacılar, Məkkə ziyarətinə gedənlər
*Hüllə* – bəzəkli paltar
*Hülul* – daxil olma, yetişmə
*Hüma* – cənnət quşu, dövlət quşu; uğurluluq, xoşbəxtlik
*Hürr* – azad

## X

*Xahi* – istər (sə)
*Xaki* – torpağa məxsus, dünyəvi, bəşər
*Xakpay* – ayaq basılan yer, astana
*Xaksar* – zəlil, xar, həqir
*Xali* – sərbəst, boş
*Xamə* – üslub, qələm
*Xar* – tikan
*Xara* – çaxmaq daşı, ipək parça növlərindən biri
*Xassü am* – camaat
*Xaşak* – çör-çöp, zir-zibil
*Xeyl* – at, ilxı, süvari dəstəsi
*Xəd* – yanaq
*Xədəng* – ağcaqovaq, ox
*Xəfa* – gizlilik, sirr
*Xəllaq* – yaradıcı, Allah
*Xəlvətsəra* – xəlvət yer
*Xəm* – bükülmüş, əyilmiş
*Xəmmar* – şərab satan
*Xəmr* – şərab, badə
*Xərf* – az ağıllı
*Xərq* – yarıq, dəlik
*Xilaf* – ixtilaf, ziddiyyət
*Xilqət* – yaradılış, təbiət
*Xiş* – özü, qohum-əqraba
*Xişm* – qəzəb, hiddət
*Xittə* – ərazi, yer
*Xizab* – tünd-qırmızı boyaq
*Xizan* – ayağa duran
*Xocəstə* – xoşbəxt

*Xor, xur* – günəş
*Xoşab* – kompot
*Xu* – xasiyyət, qılıq
*Xunab* – qanlı göz yaşı
*Xunalud* — qanlı
*Xunbəha* – qanbahası
*Xunxar* – qaniçən, qəddar
*Xunriz* – qantökən, zalım
*Xuriş* – yemə, içmə
*Xüftə* – yatmış
*Xülq* – xasiyyət, təbiət
*Xürəm* – nazlı-nazlı yerimə; sevinc
*Xürd* – xırda, narın
*Xüruş* – bağırma, fəryad
*Xüsuf* – Ayın tutulması

## İ

*İbad* – bəndələr, qullar
*İbarət* – mütəşəkkil
*İbra* – qurtarma, bəraət qazanma
*İddə* – möhlət; ərindən ayrılan və ya əri ölən qadının təzədən ərə getmək üçün gözləməyə məcbur olduğu müəyyən bir müddət
*İdrar* – yardım, təqaüd
*İffət* – namus
*İxvan* – qardaşlar
*İk* – əsmək
*İkmal* – kamala çatdırma, bitirmə
*İksir* – keçmişdə yalançı kimyagərlərin xariqüladə bir qüvvə və təsirə malik olduğunu iddia etdikləri bir maddə, içki
*İktifa* – kifayətlənmə
*İqab* – əzab, cəzalandırma
*İqd* – boyunbağı, tər damcıları
*İqrar* – təsdiq etmə, ifadə etmə
*İl* – ölkə, vilayət
*İlətmək* – göndərmək, aparmaq
*İlzam* – məcbur etmə
*İmrənmək* – sevinmək
*İnab* – tünd-qırmızı rəngdə olan iydə növündə meyvə
*İnan* – cilov



*İnayət* – qayğı, kömək
*İnəb* – üzüm
*İnfial* – utanma, xəcalət çəkmə
*İnhiraf* – dönmə, doğru yoldan çıxma
*İnqiyad* – boyun əymə
*İnşirah* – şənlik, məmnunluq
*İrmək* – yetmək, çatmaq
*İrsad* – müşahidə
*İrşad* – doğru yola çəkmə
*İrz* – namus; tərəf; yaxşı ad
*İsar* – bəxşiş
*İsırmaq* – dişləmək
*İstiftah* – açıq, başlanğıc
*İstimalət* – cəlb etmə, çəkmə
*İstisqa* – dua ilə yağış istəmə; sulu şiş
*İştiyaq* – arzu etmə
*İtab* – danlama, məzəmmət etmə
*İttisal* – yapışma, bitişmə
*İyadət* – xəstəyə baş çəkmə
*İzar* – yanaq, həya
*İzdiyad* – çoxalma

## K

*Kabil* – mümkün, mümkün ola bilən, imkan
*Kabin* – kəbin
*Kafünun* – "künfəyəkün" sözünün ilk və son hərflərinin adı olub məcazi mənada "xaraba, alt-üst, darmadağın" yerində işlənir
*Kah* – qəsr, saray
*Kahil* – tənbəl, key
*Kan* – mədən, mənbə
*Kar-bar* – iş-güc
*Karsaz* – iş görən, bacarıqlı
*Karzar* – dava, vuruş, müharibə meydanı
*Key* – şah, qəhrəman
*Keyl* – dən ölçmək üçün ölçü
*Keyvan* – Zühəl planeti, yüksəklik
*Kəbəteyn* – Kəbə və Qüdsdəki ibadətgahların birgə adı; nərdin iki zəri
*Kəfi* – kəfənə salma
*Kəhl* – gözə sürmə çəkmə

*Kəj* – əyri, əyilmiş, səhv, tərs
*Kə'lal* – usanma, bezikmə
*Kəlalət* – usanma
*Kələcu* – piyalə
*Kəlim* – müsahib, söhbət edən
*Kəmin* – gizlənən adam; pusqu
*Kəmtərin* – çox kiçik
*Kəmyab* – az tapılan
*Kəramət* – əzizləmə, hörmət, xariqüladə hal
*Kərrar* – qoçaq, qorxmaz
*Kə's* – kasa, qədəh, piyalə
*Kəşakəş* – çəkişmə
*Kəşşaf* – kəşf edən
*Kibr* – lovğalanma, böyük olma
*Kifaf* – bəs olma
*Kisvət* – qiyafə, zahiri görkəm
*Kişt* – əkin
*Kövn* – var olma
*Kövneyn* – iki dünya, maddi və mənəvi, dünya və axirət
*Kövnü fəsad* – aləm, təbiət
*Kükənək* – bayquş
*Küməyət* – at növü, tünd rəngli at
*Küstax* – arsız, utanmaz
*Küsuf* – günəşin tutulması

## Q

*Qab* – qab-qacaq, məsafə
*Qabiz* – tutan, sıxan
*Qabüqövseyn* – yayın ortası ilə ucu arası məsafə
*Qağan* – kükrəmiş; qızmış, qəzəbli
*Qaim* – dik duran, namaz qılan; mətanətli, möhkəm
*Qaqum* – sincab
*Qancarı* – haraya
*Qar* – mağara
*Qarun* – (Bəni-İsraildə var-dövləti ilə məşhur bir adamın adından) varlı-dövlətli
*Qasim* – bədbəxtlik
*Qayət* – son, nəhayət, nəticə, hədd; çoxlu
*Qayi* – son
*Qazi* – icra edən, qazı; din yolunda müharibəyə gedən, qalib



*Qəba* – qaba (üst paltarı)
*Qəbalə* – qəbz, bir şeyin bütöv alınması
*Qəbanə* – dərvişlərin geydiyi üst paltar
*Qərqab* – girdab, su burulğanı
*Qərra* – parlaq, işıqlı
*Qillət* – azlıq
*Qina* – varlılıq
*Qiyas* – müqayisə, bənzətmə
*Qulam* – qul, kölə
*Qunc* – naz, naz-qəmzə
*Quşax* – qurşaq
*Quşanmaq* – qurşanmaq, bağlanmaq
*Qutə* – batma
*Quyux* – qatı
*Qübh* – çirkinlik, qəbahət
*Qül* – de, danış
*Qürrə* – yeni başlayan ay, hilal; qaşqa; zülf, gözəl
*Qürrət* – göz işığı
*Qüsva* – ən uzaq, sonuncu
*Qüsl* – dinin tələb etdiyi hallarda bədəni yuma
*Qüzəh* – buludları idarə edən mələk

## L

*Lacərəm* – şübhəsiz, əlbəttə
*Lağər* – arıq, ətsiz-cansız
*Lahövl* – qüvvət yoxdur
*Laqlaq* – hacıleylək, boş danışan
*Las* – eşqbazlıq
*Leylac* – hiyləgər, oyunbaz
*Leylü nəhar* – gecə-gündüz
*Ləala* – incilər, dürlər, ləllər
*Ləbbeyk* – "bəli", "əmr sizindir", "hazıram" mənalarını ifadə edən çağırışa cavab sözüdür
*Ləffü nəşr* – yığma və yayma
*Ləhv* – əyyaşlıqla vaxt keçirmə; oyun-oyuncaq
*Ləhzə* – bir nəzər, qısa vaxt
*Ləm'ə* – parıltı
*Ləvhəşəllah* – dindarların "Allah uzaq eləsin" mənasında işlətdikləri ifadə
*Luli* – qaraçı

*Madih* – məddah, tərif edən
*Mahəzər* – hazır olan, hazırda nə varsa
*Malik* – cəhənnəmi qoruyan mələk (dini)
*Maliş* – sürtmə
*Marut-Harut* – dünyəvi bir qadına bəslədikləri sevgi üçün cənnətdən qovulmuş Marut və Harut adlı mələikələr
*Masiva* – başqa, özgə, savayı
*Mayə* – səbəb, təməl
*Mehrab* – məscidlərdə qiblə cəhətdəki divanda qayrılmış və pişnamazın önündə durub namaz qıldığı oyuq; üz çevriləcək yer; sevgilinin qaşı
*Məcmər* – manqal
*Məcruh* – yaralı; biabır edilmiş
*Mə'cun* – dadlı, ləzzətli
*Mədhuş* – məst, bihuş, dəhşətə gəlmiş
*Mədxəd* – giriş, başlanğıc
*Mədid* – uzun
*Mə'dud* – məhdud
*Mə'dum* – mövcud olmayan, yox olan
*Mədyun* – minnətdar, borclu
*Məfruq* – ayrı
*Məftuh* – açıq, açılmış
*Məhaq* – ayın son gecəsi, yeni və köhnə ay arasındakı aysız müddət
*Məhal* – çətin
*Məhcub* – örtülü, utancaq
*Məhcur* – yaddan çıxmış, unudulmuş
*Məhsud* – həsəd olunan
*Məhsus* – hiss olunan, 5 duyğudan biri
*Məhvəş* – ay kimi
*Məxdum* – başçı, iş buyuran
*Məxmur* – məst, sərxoş, süzgün baxan göz, xumar
*Mə'kəs* – surətin əks etdiyi yer
*Məksur* – sınmış
*Məqam* – duracaq yer, mənsəb, muğam
*Məqrun* – yaxın, bitişik
*Məqta'* – kəsilən yer, sonluq
*Mə'qud* – bağlanmış
*Məlalət* – usanma, sıxılma
*Məlamət* – danlaq, qınama



*Məmalik* – məmləkətlər, ölkələr
*Məmduh* – tərif edilmiş
*Mə'mur* – əmr alan; abab
*Mən'* – qadağan etmə
*Mənahi* – qadağan edilmiş şeylər
*Məni'* – möhkəm, mətin
*Mənnan* – mərhəmətli, səxavətli
*Mənsur* – dağınıq
*Mə'nus* – alışmış, öyrəncəli
*Mənzur* – nəzər salınan; məqsəd, niyyət
*Mərdud* – səfil, hüquqsuz
*Mərdüm* – göz bəbəyi
*Mərdümi* – insanlıq
*Mərkəb* – minik heyvanı
*Mərrix* – Mars, qədim zamanlarda "müharibə ilahəsi" mənasında işlədilmişdir
*Mərsum* – rəsmli, adət olunmuş
*Məsaf* – müharibə meydanı, döyüş
*Məscud* – səcdə olunan (Allah, büt və s.)
*Məscud* – səcdə olunan
*Məsdud* – qapanmış, bağlı, sədd çəkilmiş
*Məsmum* – zəhərlənmiş
*Məstur* – örtülü, gizli, bakirə
*Məşail* – məşəllər
*Məşam* – qoxu orqanı, burun
*Məşk* – tuluq
*Məşrəb* – içki qabı; xasiyyət, həvəs
*Məşruh* – izah edilmiş, şərh olunmuş
*Məşşatə* – gəlin və qızları bəzəyən, bəzəkçi
*Mətlə'* – günəşin və ulduzun doğulduğu yer; qəzəlin ilk beyti
*Mətlub* – istənilən, arzu olunan
*Mətruh* – atılmış, qurulmuş
*Məv'ud* – və'd edilmiş
*Mə'vid* – möhlət
*Məvzun* – düzgün, ahəngli, səlis, ritmli
*Məzad* – hərrac, yüksək qiymət təklif edib alma
*Məzəllət* – alçaqlıq, zəlillik
*Məzərrət* – zərər vermə
*Məzid* – artma, çoxalma
*Məzrub* – vurulan, döyülən, damğalanmış
*Miad* – qayıtma

*Midad* – karandaş
*Miftah* – açar
*Milh* – duz
*Minhac* – qayda, böyük yol
*Misbah* – çıraq, fənər
*Miyan* – bel, ara, orta
*Mizac* – təbiət, xasiyyət, həvəs
*Mizan* – ölçü
*Möhtəmil* – ehtimal edən, dözən
*Möhtəriq* – yanmış, yanan
*Mövt* – ölüm
*Mucib* – səbəb, bais
*Muqir* – başa düşən, etiraf edən
*Muşikaf* – tədqiqatçı, tənqidçi
*Müaf* – bağışlanmış
*Mübah* – şəriətcə haram olmayan şey
*Mübərqə'* – qədim musiqi ahəngi
*Mübərra* – saf, təmiz
*Mübəttər* – nöqsanlı
*Mübin* – aydın, aşkar
*Mücanis* – həmcins
*Müdam* – şərab, daima
*Müdğəm* – gizlədilmiş, bənzədilmiş
*Müəbbəd* – sonsuz, əbədi
*Müəlləl* – səbəbli
*Müərra* – sərbəst, soyunmuş
*Müfərrəh* – fərəhlənən, sevinən
*Müfərrih* – ürəkaçan, sevindirən
*Mühəqqəq* – doğru, gerçək, yəqin
*Mühəqqiq* – tədqiqatçı
*Mühərrəm* – haram edilmiş, qadağan olunmuş
*Mühərrər* – yazılı
*Mühəyyir* – maraqlı
*Mühib* – qorxulu, təhlükəli
*Mühibb* – sevən, məhəbbət bəsləyən
*Mühyi* – dirildən, həyat verən
*Müxalif* – zidd; klassik muğamlardan biri
*Müxəyyər* – seçməkdə sərbəst olan
*Müxəyyilə* – xəyal
*Mükəhhəl* – sürməli (göz)



*Mükəlləl* — uğurlu nəticə
*Mükərrər* – təkrar, dəfələrlə
*Müqəddər* – alın yazısı, anlaşılan
*Müqəffəl* – qıfıllanmış
*Müqərrər* – hazır, qərar verilmiş
*Müqəttər* – damcılandırılmış
*Müqəyyəd* – muğayat olan, qayğısına qalan; bağlı
*Müqim* – daimi, oturan
*Müqtəda* – rəhbər, başçı; təqlidçi
*Mül* – şərab
*Mülazim* – ayrılmayan; yavər
*Müləmmə'* – ala-bula, parlaq
*Müməssil* – təmsil edən, nümayəndə; müqayisə edilən şey
*Mümtəni'* – imtina edən, mümkün ola bilməyən
*Münadi* – carçı
*Münir* – nurlandıran
*Münkəsir* – tutqun, qəmli
*Münkir* – inkar edən, danan, inamsız
*Münşi* – katib, tərtibçi
*Müraat* – gözləmə, riayət etmə
*Müsaid* – kömək edən, əlverişli
*Müsəxxər* – zəbt olunmuş, alınmış
*Müsəlləm* – şübhəsiz, etirazsız
*Müsəlsəl* – silsiləli, silsilə
*Müsəmma* – adlanan, adlandırılmış
*Müsənna* – ikilik
*Müsərrəh* – aydın söylənmiş
*Müsəvvir* – rəssam
*Müshəf* – Quran
*Müstəğrəq* – dalmış, qərq olmuş
*Müstəmənd* – yazıq, biçarə, dərdli
*Müşəqqəq* – yarılmış, parçalanmış
*Müşəvvəş* – iztirablı, dolaşıq
*Müşrik* – bütpərəst
*Müştəri* – Yupiter planeti
*Mütərra* – təptəzə, təravətli
*Mütəvvəl* – uzadılmış, uzun
*Müttəsil* – bitişik, yapışıq; daimi, həmişəlik
*Müzəxrəf* – mənasız, boş, ağılsız
*Müzmər* – gizli, örtülü

N

*Nab* – saf, təmiz
*Nabəkar* – yaramaz, mərdimazar
*Nafə* – xüsusi cinsdən olan ahunun göbəyindəki müşk vəzi
*Naim* – yatan
*Nam-nəng* – şöhrət və ya biabırçılığa səbəb olan iş
*Namütənahi* – sonsuz, ucsuz-bucaqsız
*Napeyda* – gizli, gözə görünməyən
*Nar* – od, cəhənnəm, dərd, qəm
*Navək* – ox
*Neəm* – nemətlər
*Neysan* – aprel ayı, həmin ayda yağan yağış
*Nədamət* – peşmançılıq
*Nədəm* – peşman olma
*Nədidə* – görünməmiş
*Nəfx* – üfürmə, şişirmə
*Nəfir* – şeypur, şayiə buraxma
*Nəh* (*nih*) – qədim astronomlara görə, göyün doqquz qatı
*Nəhb* – qarət, soyğunçuluq
*Nəxcir* – ov, şikar
*Nəim* – nemət, bolluq
*Nəqd* – qızıldan və ya gümüşdən kəsilmiş pul
*Nəqi* – saf, təmiz
*Nəmrud* – qədim Babilistanın əfsanəvi hökmdarının adı
*Nəng* – ar, eyib
*Nəsx* – ərəb əlifbası ilə kiçik və incə xətt növü (Quran bu xətt ilə yazılır)
*Nəsk* – dindarlıq
*Nəssac* – toxucu
*Nəsuh* – səmimi, təmiz qəlblə
*Nəşat* – sevinc, kef
*Nəva* – avaz; muğam, pərdənin adı; var-dövlət
*Nəz'* – qoparma, can vermə
*Nik* – yaxşı, xoş
*Nim* – yarıya bölünmüş
*Nisar* – saçma, səpmə
*Niş* – neştər
*Nitə* – necə, kimi
*Niyam* – qın, qılaf
*Niza'* – çəkişmə, qovğa
*Hühüft* – qədim muğam adı



*Hühüftə* – gizli
*Nüktə* – incə məna
*Nüsh* – öyüd, nəsihət
*Nüşur* – dini etiqada görə, qiyamətdə ölülərin dirilməsi
*Nüzhət* – ürəyi açılma, könül şadlığı

O

*Oxcar* – paltar növü, boyuna geyilən şərf

Ö

*Ögüş* – çox

P

*Pabus* – yaltaq
*Paçə* – baş-ayaq
*Padaş* – əvəz, cəza
*Paludə* – nişasta və şəkərdən bişirilən, soyuq halda yeyilən yemək
*Paydar* – daimi, həmişəlik
*Payəbəpayə* – pillə-pillə, tədriclə
*Payəndə* – sürəkli, həmişəlik
*Payi-məlax* – çəyirtkə ayağı
*Paymal* – ayağaltı, məhv olan
*Peyapey* – dalbadal
*Peyğam* – xəbər, sifariş
*Peyvəstə* – həmişə, daimi; çatma (qaş)
*Pərdaz* – tərtibçi, düzəldən
*Pəridə* – uçmuş, qanadlanmış
*Pərran* – uçan
*Pərvər* – bəsləyən, tərbiyə edən
*Pərvərdə* – bəslənmiş, yetişdirilmiş
*Pərvəri* – bəslənmiş, becərilmiş
*Pərvin* – Ülkər ulduzu
*Pəs* – geri, arxa
*Pəyam* – sifariş, xəbər
*Pərva* – qorxu, taqət, səbr
*Piç* – buruq, qıvrım, dolanmış
*Piçapiç* – çox dolaşıq, qarmaqarışıq
*Piçü tab* – pərişanlıq, qıvrımlıq

*Pirahən* – köynək
*Pirayə* – bəzək, ziynət
*Puş* – geyilən, örtülən
*Pür* – dolu, dolğun, çox
*Pürşur* – çox coşqun, həyəcanlı

## R

*Raki* – namaz qıldıqda əyilən
*Ratib* – nəm, rütubətli
*Rayigan* – müftə
*Raz* – sirr
*Rəbi'* – bahar
*Rəg* – damar
*Rəgzən* – qansaçan
*Rəhq* – qurtuluş
*Rəməq* – son nəfəs
*Rəmim* – çürük, çürümüş
*Rəncur* – incik, incimiş
*Rəsən* – ip, kəndir
*Rəst* – qurtulma, qurtuluş
*Rəşk* – qısqanma, paxıllıq, qibtə
*Rəvəndə* – gedən
*Rind* – hiyləgər, heç şeydən çəkinməyən
*Rindanə* – rind kimi
*Riş* – yara, yaralı
*Riştə* – əlaqə, bağ
*Riyayi* – ikiüzlü, riyakar
*Rizan* – tökülən, axan
*Ruhüləmin* – Cəbrayılın ləqəblərindən biri
*Ruzə* – oruc, orucluq
*Rüq'ə* – qumaş parçası; ərzi-hal
*Rümman* – nar
*Rümmani* – nar dənəsi rəngi
*Rümuz* – rəmzlər

## S

*Sabəq* – yarış, cıdır
*Sacid* – səcdə edən



*Safi* – saflıq, təmizlik, ürəyi təmiz
*Sahibqiran* – (qədim münəccimlərin fikrinə görə, Zöhrə və Müştəri ulduzunun bir bürcdə bir-birinə rast gəldiyi zaman dünyaya gəlmiş xoşbəxt) keçmişdə Şərqdə böyük hökmdarlara verilən ad
*Sahir* – cadugər, məftun edən
*Said* – bazu önü (dirsəkdən pəncəyə qədərki hissə)
*Saiqə* – ildırım
*Sairə* – seyr edən
*Salik* – bir yol ilə gedən, bir təriqətə mənsub olan
*Salus* – biyləgər, ikiüzlü
*Saman* – dövlət, sərvət
*Savad* – qaralıq; yazı-pozu
*Sayə* – kölgə, himayə
*Sayru* – xəstə
*Sazkar* – uyğun, müvafiq
*Seyd* – ov
*Səb'ə* – yeddi
*Səbəq* – mükafat, yarışda birincilik
*Səbu* – bardaq, kuzə
*Səbük* – yüngül, cəld
*Səb'ülməsani* – Quranın fatihə surəsinin ayələri
*Səccadə* – namaz qılmaq üçün istifadə edilən örtük
*Sə'd* – bəxtiyarlıq, uğurluluq, uğurlu ulduz
*Səəbl* – əsir, gənc
*Səhab* – bulud
*Səhabə* – Məhəmmədin tərəfdarları
*Səhəre* – cadugər
*Səhi* – qədd-qamətli
*Səhl* – asan, yüngül
*Səid* – bəxtiyar, uğurlu
*Səkran* – sərxoş, məst
*Səqamət* – xəstəlik
*Səqər* – cəhənnəm
*Səqim* – yalan, doğru olmayan
*Səqf* – göy, səma
*Səqqa* – suçu
*Səlasil* – silsilələr, zəncirlər
*Səlsəbil* – yüngül və ləzzətli su (guya cənnətdə olan əfsanəvi bir çeşmənin adından)
*Səməd* – əbədi, daimi

*Səmək* – balıq
*Səmən* – yasəmən ağacı və gülü
*Səmənbər* – yasəmən sinəli
*Səmin* – qiymətli, bahalı
*Səmm* – zəhər
*Səmrimək* – kökəlmək
*Səncileyin* – sənin kimi
*Səngin* – rəhmsiz, daşürəkli
*Səpişkən* – bulaşıcı, yayıcı
*Səraperdə* – saray pərdəsi, padşahlara məxsus olan otaq
*Sərbəzəmin* – başıaşağı, xəcalətli; ümidsiz
*Sərəfraz* – başı uca
*Sərfə* – ürəkbulanma, başgicəllənmə
*Sərgəştə* – başını itirmiş
*Sərih* – açıq, aydın
*Sərir* – taxt, yataq
*Sərkeş* – itaətsiz, sözə qulaq asmayan
*Sərkub* – məhv, darmadağın etmə
*Sərü kar* – iş-güc
*Sərzəniş* – danlaq, məzəmmət
*Səyahkar* – günahkar
*Sifal* – saxsı, kirəmit
*Simak* – iki işıqlı ulduz
*Simar* – səmərələr
*Simarlamaq* – əmanət etmək, tapşırmaq
*Simiya* – ovsun, cadu
*Sin* – ərəb əlifbasında hərf, "bismillahın" qısası
*Sinin* – illər
*Sipahi* – əsgər, döyüşçü
*Sirab* – sulu, sudan doymuş, dolğun
*Sirət* – mənəvi əhval, əxlaq
*Siriştə* – yoğrulmuş
*Sovməə* – ibadətgah, ibadət yeri, monastır
*Sud* – qazanc, fayda
*Suxtə* – yanmış
*Sunmaq* – doldurmaq, tökmək
*Suri* – qırmızı, qızılgül
*Suz* – yanma, alışma, kədər, qüssə
*Suzan* – kədərli, qəmli, yandıran
*Suziş* – ürək yanğısı



*Süci* – şərab
*Sücud* – namaz və ya ibadət zamanı üzü yerə sürtmə, səcdə etmə
*Süfəra* – səfirlər
*Süftə* – deşilmiş
*Sürur* – sevinc, şadlıq

## Ş

*Şab* – cavan, gənc
*Şabaş* – afərin, əhsən
*Şadan* – sevincək, məmnun
*Şafi* – şəfa verən, kafi
*Şahdanə* – iri inci dənəsi
*Şahvar* – hökmdara layiq
*Şayəd* – ola bilər ki, bəlkə
*Şayəgan* – layiq, firavan
*Şeşdər* – altı qapı (dünya və kainat); çıxılmaz vəziyyət
*Şəbər* – bəxşiş
*Şeyda* – dəlicəsinə vurğun
*Şəbəh* – oxşarlıq, eyni
*Şəbgir* – sübh çağı həzin səslə oxuyan quş, sübh çağı
*Şəbistan* – yataq otağı, şahların hərəmxanası; dərvişlərin ibadətlə məşğul olduqları və yatdıqları yer, hücrə
*Şəhr* – ay, şəhər
*Şəkərbar* – çox şirin
*Şəqavət* – bədbəxtlik
*Şəqiq* – doğma qardaş
*Şəmail* – şəkil, əks, surət; təbiətlər
*Şəmim* – gözəl iyli, yaxşı qoxu verən
*Şəms* – günəş, gün
*Şəmşir* – qılınc
*Şəng* – gözəl, göyçək, oğru, quldur
*Şə'r* – tük, saç
*Şərarə* – qığılcım; fəlakət
*Şərbin* – püstə, fıstıq ağacı
*Şərməndə* – utanan, utancaq
*Şərmsar* – xəcalətli
*Şəst* – xristianların riyazət əlaməti olaraq altdan bədənlərinə sarıdıqları sərt qurşaq; sümük barmaqça; zülf, saç hörüyü, kəmənd
*Şiftə* – vurğun, aşiq

## T

*Tamu* – cəhənnəm
*Tanux* – şahid
*Tapu* – hüzur, xidmət
*Tar* – qaranlıq
*Tari* – qəflətən, gözlənilmədən
*Tariq* – dan ulduzu, Zöhrə
*..lallah* – Allah yüksəkdir
*Təbər* – baltanın bir növü
*Təbərrü'* – ehsan vermə
*Tə'bir* – anlatma, yuxuyozma
*Təcdid* – yeniləmə
*Təcəlli* – əyan olma, təzahür
*Tədvir* – dolanma, çevirmə
*Təəlluq* – asılı, mənsub olma
*Təəllüm* – kədərlənmə
*Təəmmü* – düşünmə, mülahizə, mütaliə
*Təhlif* – and içmə, saziş bağlama
*Təfəhhüs* – tədqiq etmə, araşdırma
*Təfərrüc* – gəzmə, gəzinti
*Təğafül* – özünü bilməməzliyə qoyma, unutma, qəflət
*Təhəmmül* – qatlaşma, dözmə
*Təhəvvül* – dəyişmə, başqa hala keçmə
*Təhrir* – yazma
*Təhsin* – afərin, alqışlama, bəyənmə
*Təkəllüm* – danışmaq
*Təksir* – çoxaltma, artırma
*Təkyə* – dərvişlərin, müridlərin toplaşdıqları və zikrlə məşğul olduqları yer, şiələrin məhərrəm mərasimini keçirdiyi yığıncaq
*Tə'lil* – səbəb və bəhanə gətirmə
*Təlul* – xarabalıqlar
*Təmbil* – uzatma, uzadılma
*Tə'mə* – tamah, gözdikmə, acgözlük
*Təməkkün* – məkan salma, sakin olma
*Tərəh* – qəm, qüssə
*Tə'riz* – etiraz etmə
*Tərrar* – oğru
*Təsəlsül* – zəncirləmə, əlaqə
*Təsrif* – istədiyi kimi dəyişmə, çəkmə
*Təvaf* – bir şeyin ətrafına dolanma, Kəbənin ətrafını dolanmaqdan ibarət həcc mərasimi



*Təvəkkül* – gözdikmə, umma, tapşırma
*Tə'yib* – bəyənməmə, eyib sayma
*Təzəllül* – alçalma, müti olma, boyun əymə,
*Təzəlzül* – sarsınma, zəlzələyə düşmə
*Təzvir* – hiyləbazlıq
*Timar* – baxma, qayğısına qalma, qayğı
*Tir* – yaydan atılan ox
*Tiraş* – qırxma, yonma
*Tiraşə* – yonqar, talaşa
*Tirəndaz* – oxatan
*Tirü təbər* – ox və balta
*Tiz* – iti, diribaş
*Tizab* – azot turşusu
*Tomar* – lülə halında bükülmüş kağız, bağlama, boğça
*Tovhid* – Allahın birliyinə inanma
*Tö'mə* – azuqə, loğma
*Tuba* – əfsanəyə görə, cənnətdə hündür və gözəl bir ağac; hündürboylu
*Tutiya* – gözə sürtülən dərman
*Tutruğ* – sumax, kol-kos
*Tüffah* – alma
*Türab* – torpaq, toz; qəbir, məzar
*Türfə* – tapılmayan, nadir şey, qəribə, əcaib
*Türrə* – alından sallanan qıvrım tellər
*Turunc* – narıncı

## U

*Uçmaq* – cənnət
*Ud* – odun, Hindistanda bitən və yandırıldıqda xoş iy verən ağac, simli Şərq musiqi aləti
*Ulaşmaq* – qovuşmaq
*Umaxlu* – istəkli, umulan
*Uran* – ölçü, tənasüb
*Us* – ağıl
*Uş* – belə, bu
*Uyuz* – vərəm

## Ü

*Üdul* – adil; azma, yoldan çıxma
*Üftadə* – düşkün, yazıq, yıxılmış
*Üful* – batma, qürub

*Ügeyik* – quş adı
*Üğb* – özünü bəyənmə, məğrurluq
*Üqab* – qaraquş, qartal
*Üqba* – axirət, o biri dünya
*Üqdə* – düyün, nisgil
*Üqul* – ağıllar, ağıl, idrak
*Üləş* – pay, hissə
*Üləşmək* – bölüşdürmək
*Ülul-əlbab* – ağıllı adamlar
*Ülüvv* – yüksəklik, böyüklük
*Üşənmək* – tənbəlləşmək, ərinmək
*Üyun* – gözlər, çeşmələr, bulaqlar

V

*Vahi* – boş, mənasız, faydasız
*Vam* – borc
*Vayə* – nəsib, pay; məqsəd, səbəb
*Vazeh* – açıq, aydın, aşkar
*Vəbal* – günah, təqsir, cavabdehlik; əzab
*Vəch* – üz, sima; üsul, yol, ad, şöhrət
*Vədud* – sevən, məhəbbət bəsləyən
*Vəli* – lakin, amma; yaxın dost, qəyyum
*Vəlleyl* – gözəlin qara saçı; Quranda bir surənin adı
*Vərziş* – çalışma, səy
*Vəsail* – vəsilələr
*Vəşşəms* – "and olsun günəşə" (Quranda həmin ifadə ilə başlanan surənin adından götürülmüşdür)
*Vəzan* – əsən (külək)
*Vəzzüha* – and olsun çeşt vaxtına (səhər ilə günorta arasındakı vaxt)
*Vücuh* – dövr; əsilzadə; üz
*Vüslət* – vüsal
*Vüzu* – dəstəmaz

Y

*Yasamaq* – bəzəmək
*Yastanmaq* – qapanmaq, üzü üstə düşmək
*Yayaq* – piyada; şahmat fiqurunun adı
*Yeg, yig* – yaxşı



*Yeksan* – düz, bərabər
*Yelda* – qışın ən uzun gecəsi (22 dekabr)
*Yəd* – əl, kömək
*Yədi-bəyza* – ağ əl, əfsanəyə görə, Musanın möcüzə göstərdiyi ağ əli, bacarıqlı əl
*Yəmin* – sağ əl, sağ tərəf; and
*Yəsar* – var, dövlət; sol
*Yin* – yuva, hin
*Yuğ* – heç, yox
*Yüsrü yəsar* – rahatlıq, sərvət, dövlət

Z

*Zad* – doğulmuş, hasil olmuş; ərəb əlifbasında hərf
*Zail* – müvəqqəti, fani, batan (ay)
*Zaviyə* – guşə, bucaq
*Zaye* – pozulmuş, heç olmuş
*Zeyl* – ətək
*Zəhrə* – igidlik, cəsarət
*Zəxm* – yara, yaralama
*Zəqən* – saqqal
*Zəlal* — yanılma
*Zəlazil* – zəlzələlər
*Zəllə* – səhv
*Zəmhərir* – şaxta
*Zəmir* – iç üzü, batin, ürək
*Zəval* – zaval, məhv olma, göy cisimlərinin batması
*Zəvat* – əsillər, adamlar
*Zində* – diri, ruhlu, diribaş
*Zir* – alt, sazın ən çox səs çıxaran simi
*Zirü zəbər* – alt-üst, qarmaqarışıq
*Zivər* – zinət, bəzək
*Ziyadət* – artma, çox
*Zövrəq* – qayıq
*Zücac* – büllur, şüşə qab
*Zülal* – sərin, duru və şirin su
*Zünnar* – xristianların bağladıqları sərt qurşaq

## MÜNDƏRİCAT





**QAZİ BÜRHANƏDDİN**

**DİVAN**

"ÖNDƏR NƏŞRİYYAT"

BAKI–2005

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəşad Həmidov* |
| Korrektor: | *Pərvanə Məmmədova* |

Yığılmağa verilmişdir 21.05.2004. Çapa imzalanmışdır 05.07.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 45,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 177.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.